**SÜLEYMAN RƏHİMOV**

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

**İKİ CİLDDƏ**

**II CİLD**

"ŞƏRQ-QƏRB"
BAKI-2005

*Bu kitab* “***Süleyman Rəhimov.*** *Seçilmiş əsərləri. On cilddə. V cild*”
(*Bakı, Azərnəşr, 1974*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

**894.3613 - dc 21**
**AZE**
**Süleyman Rəhimov. Seçilmiş əsərləri.** İki cilddə. II cild. Bakı, “Şərq-Qərb”, 2005, 312 səh.

Azərbaycanın xalq yazıçısı Süleyman Rəhimovun “Seçilmiş əsərləri”nin bu cildində görkəmli nasirin “Mehman” povesti təqdim olunur. Ədib onu 1944-cü ildə qələmə almışdır. Realist-psixoloji üslubda yazılmış əsərdə bölgə prokurorunun həyat və mübarizəsi təsvir olunur. Qanunun aliliyi uğrunda mübarizə – povestin əsas ideyası kimi müəyyən edilə bilər.

Mehman əsərin baş qəhrəmanıdır və ədibin yaratdığı müsbət qəhrəmanlar qalereyasında özünəməxsus, fərdiləşdirilmiş xüsusiyyətlərə malik bir insan portreti kimi xüsusi yer tutur.

**ISBN 9952-418-85-7**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



# I

Tədris hissə müdiri Məlikə xanım onillik məktəb vəsiqəsini Mehmana təqdim edib, ayrılıq əlaməti olaraq, onun boynunu bərk-bərk qucaqladı. Məlikə xanımın qar kimi ağaran pərakəndə saçları Mehmanın şəvə kimi qara qıvrım saçlarına qarışdı.

– Oğlum, – deyə müəllimənin yaşaran gözləri doldu. – Düz on ildir ki, sən bizim bu məktəbdə oxuyursan. Düz, on il əvvəl, sən buraya balaca bir uşaq kimi, çantanı yerlə sürüyə-sürüyə gəlib, indi cavan bir oğlan kimi gedirsən... Bu on ilin çox yarısını, mən özüm sənə dərs vermişəm... Sən mənim sevimli balam olmusan... Bu on ildə məktəbdə mən səni həm əxlaqda, həm də oxumaqda bütün uşaqlara nümunə gətirmişəm... Bu gün mən, məktəbi bitirmək şəhadətnaməsini sənə təqdim edib yola salıram. – Məlikə xanım çəkilib Mehmanın gözlərinin içinə diqqətlə baxdı. – Mənim sənə analıq tövsiyəm vardır, – müəllimə göy damarlı əlini qəti bir qərarla qaldırıb: – Hər nə sənəti ürəyin sevsə, onun dalınca da gedərsən, – deyə qeyd etdi, – bu sənin öz işindir!.. Ancaq mənim sənə çox mühüm bir tapşırığım vardır... Hər halda, hansı işdə olursan ol, daxilən-vicdanın pak-təmiz ol!.. Heç kəs bilməsə, tək bir sən özün bilsən belə, mənəviyyatını gün kimi saf, ay kimi parlaq saxla! Heç bir zaman bir balaca nöqtə qədər olsa belə öz ürəyini ləkələmə! – Məlikə xanım qaynayan gözlərini silib əlavə etdi: – Sənin bu dünyada iki anan var, birisi səni doğan ana ki, sən ona həmişə hörmət etməlisən, ikincisi də sənə təlim verən anadır!.. Sən bil ki, bu sözləri sənə anan deyir!..

– Anama qəti söz verirəm, – deyə Mehman öz qarasaçlı başını müəllimənin qarşısında ehtiramla əydi, – söz verirəm!..

– Bəli, oğlum, daxili təmizlik, vicdani saflıq insan üçün böyük vüqardır!.. O, adamı cürətli, alnıaçıq, başıuca edər!.. Mənəvi təmizlik, insana məğlubedilməz qüdrət, vətən, xalq qarşısında hədsiz bir hörmət verər!.. Bu dünyada insan üçün, hər nə işdə olursa olsun, ürəyi ləkəli yaşamaqdan da ağır bir şey ola bilməz. Sən gəncsən, bizim dünyanın mənası məzmunlu, hikmətli və dərindir!..

Ağsaçlı müəllimə Mehmanın boynunu qucaqlayıb:

– Mənim öz övladım olmayıb, – deyə həyəcanlandı. – Səndə mən özüm üçün doğma bir bala sifətini tapmışam!..

Mehman müəllimənin göy damarlı əlini eyni ehtiramla öpüb vəsiqəsini götürdü. Ağsaçlı müəllimə titrəyən şəhadət barmağını uzadıb:

– Unutma ha!.. – deyə son tapşırıq verdi. – Unutma, ləkə çox pis şeydir, heç unutma!.. Ləkə insanı cürətsiz, başıaşağı edər. Heç kəs bilməsə belə, o, adamı xəcalət tərinin içində boğar, onun rahat yuxusunu göylərə çəkər!.. Bu sözlər indi yersiz görünsə belə, ürəyimdən gəldiyi üçün bir övladım kimi sənə deməli oldum, oğlum!..

## II

Məktəbin uzun dəhlizi oğlan-qızla dolmuşdu. Onlardan kimisi qol-qola gəzir, kimisi yığışılıb söhbət edir, kimisi onillik məktəbi qurtarmaq vəsiqəsini öz yoldaşına göstərib öyünür, bəzisi də başını aşağı salıb kəsir içində olduğu üçün məktəbdən bikefcə çıxırdı. Bir dəstə tələbə qapı ağzında dayanıb Mehmanın çıxacağını səbirsizliklə gözləyirdi. Onlardan bir çoxu hörmət, bəzisi də qibtə hissi ilə Mehmanın vəsiqəsinə baxmaq istəyirdi. Bunun üçün də hərə bir cür danışır, bir fikir söyləyirdi:

– Ali məktəbi də görək, bizim mülayim Mehman, belə əla qiymətlə qurtaracaqmı?

– Sən baxma, – deyə Mehmanın rəqiblərindən biri etiraz edirdi. – Ali məktəbdə müəllimlərin gözünə girmək olmaz. Orada möhkəm bilik, polad kimi mətin əsas gərəkdir!

– Məgər Mehmanın biliyi yoxdurmu?

– Bəyəm nə oldu, bircə kərə bir dərsdən də axsamadı, hər tərəfdən onun işi əla gətirdi?!

– Zalım oğlunun baxtı var baxtı! – deyə bir başqası partladı. – Hamı onu sevir, amma məni görəndə elə bil ki, yerdən bir daş götürüb pəncərələrinə çırpmışam!..

– Mehman öz zəhməti, səyi və çalışqanlığı nəticəsində həmişə əlaçı olmuşdur, – deyə ucaboylu gənc oğlan israrla cavab verdi. – Misal var ki, piyada atlıya gülməsə, bağrı çatlar!..

– Belə görünür ki, biz pay-piyada olmuşuq, hə?

– Bəli, çalışmayan, dərslərə ciddi fikir verməyən lap piyada qalır!

Tədris hissə müdirinin otağı qarşısında dayanan uşaqlar bu qayda ilə bayaqdan dəriyə danışmış, lakin indi bir az sakitləşmiş, hamısı da gözünü qapıya zilləmişdi. Müəllimə Mehmanı dəhlizə ötürərək qapını çəkib

yavaşca örtdü. "Bəlkə ona bir ali məktəbi tövsiyə etmək lazım idi? Nə üçün mən – hansı sənəti xoşlayırsan onu da seç – dedim?.. Məgər, sənətin özünün adamın gələcək taleyində əhəmiyyəti azdırmı?" Məlikə xanım, uzun bir müddət üçün balasından qoparılan mehriban və müztərib ana kimi ovuna bilmədi.

Yoldaşları Mehmanı dövrəyə alıb vəsiqəsini ona güclə açdırdılar. Bir kənarda üç qızla gəzinən ucaboylu, dolu əndamlı, sıx, qara saçlı Züleyxa yoldaşlarının qolundan yapışıb çəkə-çəkə onları da buraya gətirdi.

– Görək vəsiqənizi? – deyə Züleyxa qızara-qızara başını Mehmanın vəsiqəsinə tərəf uzatdı.

– Elə bir şey deyil, – deyə Mehman zərli şəhadətnaməsini qatlamağa, baxan gözlərdən gizlətməyə çalışdı.

– Yemirik ki, Mehman qağa, görək necə qurtarıbsınız? – deyə Züleyxa əlini uzadıb vəsiqəsini aldı. Qızlar hamısı boylanıb şəhadətnaməyə baxmağa başladılar:

– Uyyy, hamısıca, əlaaa, qızzz!!.

Burada olan oğlanlar qızardılar, Mehman özü də yamanca pərt oldu.

– Sağ olsun Mehman qağa! – deyə Züleyxa şəhadətnaməni ona qaytardı, – var olsun!..

Mehman pörtdüyündən, daha bir söz demədi, vəsiqəni gizlətməyə çalışdı.

Dəhliz boyu səs yayıldı. Uşaqlar bir ucdan buraya gəlməyə başladılar. Mehman birtəhər tələm-tələsik aradan çıxdı. Onuncuya keçən qızlar yenə də gəzinməyə, şaqqıldayıb gülməyə, sonra da söhbətə başlayıb:

– Ay qız Züleyxa, görəsən Mehman nə olacaq? – deyə ona söz atdılar.

– Mənciyəz doktor olacağam, – deyə Züleyxa ağızucu cavab verdi. – O nə olacaq olsun, mənə nə?..

– Niyə sənə nə, ay qız?.. Dörd dəftər qoşma qoşandan sonra, sənə nə?.. İndidən sözündən dönəcəksən?.. Onu da özünlə çək dokturluğa!

– Doktor da yəni bir şeydir?.. Həmişə baxırsan inilti, ah-uf! Həmişə azarlılarla əlləş!..

– Hamısından yaxşı mühəndislikdir, – deyə ayrı bir qız dilləndi. – Əsrimizin nəbzi texnikadır. Min ilin türkə-çarasından başlayıb gələn aciz təbabətdən nə olsun?.. Ölən ölür, qalan qalır, dəyirman bildiyin eləyir, çax-çux başın ağrıdır!..

– Mühəndislik üçün gərək riyaziyyatdan başın çıxsın, – deyə bir başqası yırğalandı. – Sən də ki, cəbrə gələndə, doğrudan da, böyük bir cəbrə düşürsən!..

– Ona baxma, bu yayı anam müəllim tutacaq, hazırlaşacağam, imtahanın qıl körpüsündən nəzirsiz-niyazsız oynaya-oynaya keçəcəyəm!..

O biri yanda dayanan yastı bir qız dilləndi:

– Mühəndis də bir şeydir, ay qız? – O, yanıxa-yanıxa başını buladı. – Həmişə mazutda, həmişə dəmirdə, həmişə tozda-torpaqda, qumda-əhəngdə!.. Gedirsən onlar işləyən yerə, baş açmırsan ki, fəhləsi kimdir, mühəndisi kim? Mən bu gül kimi tərtəmiz müəllimdən olacağam. Gündə dörd-beş saat ayaq üstə dərsini de, üç ay yayı da get, kefin istəyən yaylaqlarda dincəl, canına qulluq elə!

Qızlardan üçüncü birisi etiraz edib:

– Pah, tapdın, – dedi, – çənə-boğaz müəllim. Adamın çənəsi yuxuda da durmaz ki, hey dörd divar arasında səs-küy içində, az qala adamın beyni partlayır!..

– Bəs onda sən nə olacaqsan?, ay qız?

– Mən artistka olacağam!.. İndi məktəbin səhnəsinə çıxıram, bu üzümüzə gələn il də dramanın studiyasına yazılacağam... Qoy salondan səhnəyə sarı o qədər əl vursunlar ki, o qədər əl vursunlar ki!

– Allah özü saxlasın, sənin o ənlik-kirşanını! Gündə özgənin saçını keçir başına, gündə toy qurub ərə get! Nə var, nə var mən də bu dünyada özümə sənət tapmışam?.. Bir dəfə anamın yanında bu barədə söhbət açıldı, az qala arvad durub evi başımıza uçurmuşdu... Dediyimə də peşman oldum!

– Ay qız, hələ onuncunu qurtarmağa çox var, – deyə şuxluq edən başqa bir qız söz atdı, – mühəndislik də, doktorluq da, lap səhnə sənətkarlığının özü də bizim üçün çox-çox gərəklidir!.. Ancaq hələ bir sizləri görək!.. Görək hələ kim svidaniyadan, yəni görüş məntəqəsindən sağ-salamat qayıdacaq, kim qayıtmayıb oradan o yana birbaşa ərə gedəcək?..

– Məsələn, kim görüş məntəqəsindən qayıtmayacaq, qız?

Hamı dönüb Züleyxanın üzünə baxdı:

– "Qurbanın ollam, ay qız! Mehmanın ollam, ay balam!"

– Onda bəs niyə radioda oxumursan, ay qız?

– Elə hazırlaşıram ki, "Mehman və Züleyxa" havasını radiodan bütün dünyaya oxuyam!..

– Ay qız, əskik-əskik danışmayın, Allah ətinizi töksün, – deyə Züleyxa öz rəfiqələrini çəkib onu dövrəyə alan qızların əhatəsindən çıxdı.

Qızlar bir də zarafata girişib Züleyxa tərəfə söz yağdırmağa başladılar:

– Daha Mehman gəlməyəcək!

– Bir də Mehman görünməyəcək!

– Ay qız, Züleyxa özüdür. Mehman üçün oxuyan, yoxsa Mehman yatsa da yuxusuna bu Züleyxa girməz!..

– Bəs bu arada quş kimi qanad çalan məktublar?

– Heç bir məktubdan bir xəbər varmı?.. Kağızlar hey bir ucdan "Züleyxadan – Mehmana" qanad çala-çala gedir, ancaq heç bilmirsən hansı hara düşür?..

Züleyxa o yandan bəriyə qızların üstünə çımxırdı.

– Heç kəs heççə bir kəsin işinə qarışmasın!.. Yoxsa siz bu sözü saqqız kimi çeynəməkdən böyük bir həzz alırsınız?

## III

Çoxdan bəri qapı ağzında dayanıb oğlunun yolunu intizarla gözləyən Xatun Mehmanı evə buraxıb:

– Oğlum, şəhadətnaməni aldınmı? – deyə soruşdu.

Mehman şəhadətnaməsini çıxarıb anasına verdi. Xatun şəhadətnaməni alıb öpdü və əllərini göyə qaldırıb:

– Xudaya min şükür, – dedi, – on il addım-addım ötüb qurtardı.

Xatun, hər il məktəb bağlananda, oğlunun aldığı qiymətlə maraqlanırdı. O qabaqkılardan fərqli olan iri və zərli şəhadətnaməyə diqqətlə baxıb:

– Çeşnisindən-naxışından bilirəm ki, hamısı ucadır, – deyib Mehmanın boynuna sarılıb analığın müqəddəs həyəcanı ilə oğlunun nəfəsini sanki uddu. – Uca!.. Mənim oğlum, çox-çox uca!..

Xatun, oğlunun məktəbi qurtarmağı şərəfinə o biri günün axşamına yaxşı plov hazırladı. Mehman isə öz yaxın yoldaşlarını evlərinə dəvət etdi. Onlar xörək yedikcə Xatun əlində kəfgir dayanıb baxırdı:

– Evimizin səliqəsi olsaydı, sənin o ağsaçlı ananı da çağırardıq, – deyə Xatun balaca evinə nəzər saldı.

– Onu da evimizi yaxşı-yaxşı qurandan sonra çağırarıq! – deyə Mehman müəlliməyə qarşı tükənməz bir ehtiram hissilə cavab verdi, – mütləq Məlikə xanımı öz evimizə dəvət edərik, ana!..

– Bəli, bizim Məlikə xanım şəfqətli bir anadır, – deyə Mehmanın yaxın yoldaşlarından birisi olan Salman dilləndi. – Çox lütfkar bir insan, köhnə maarifçi, ictimai bir xadimdir!..

– Bəli, elədir, – deyə əyləşən gənclərdən Məsum da dilləndi. – Məlikə xanımın alicənab ürəyi bütün onillik məktəbi qızdırar!

– Elədir, o ömrünün böyük mənasını səadət toxumunu səpməkdə görür!

– Məlikə xanım, bizim Mehmanın dilinin əzbəridir, – deyə Xatun, Mehmanı və süfrə ətrafında əyləşən gəncləri qayğıkeş bir nəzərlə süzdü. – Yaxşı insanın adı, həmişə yaxşılıqda yad edilər!..

Bu növ ilə süfrənin axırına qədər Məlikə xanımın adı ehtiramla çəkildi.

Mehmanın yoldaşları xörək yeyib çay içəndən sonra durub evlərinə getdilər.

– Yaxşı söyləmirəmmi, oğul? – deyə Xatun keçən söhbətin güclü təsiri altında davam etdi. – Uca elmi qurtarıb evimizi yaxşı-yaxşı düzəldəndən sonra sənin o müəlliməni də çağırarıq, lap körpə vaxtından o, səni sevər, görən zaman mənə toxtaqlıq verərdi. "Qorxma, Xatun, – deyərdi, – Mehman səni öz gözlərinin üstündə saxlayacaq, bütün ağrı-acıların çıxacaqdır!" Mən başımı əyərdim, o hey danışardı. Baxardım ki, Məlikə xanım həm də məndən ötəri sənin qayğına çox qalır, – Xatun başını qaldırdı – yaxşı, çox yaxşı, lap yaxşı arvaddır, – Xatun bir an fikrə gedib birdən döndü: – Məktəbdən çıxanda müəllimə sənə nə söylədi? – Xatun təkidlə oğlundan soruşdu – o, səni sözsüz buraxmaz, bilir ki, atan yoxdur...

– Müəllimə mənə dedi ki, oğlum, daima öz ürəyini təmiz saxla, heç bir zaman onu ləkələmə!

– Belə çıxır ki, adını ləkələmə, eləmə?..

– Gözləri doldu, belə bir söz dedi, ana!

Xatun dayanıb yenə düşündü. Onun da gözləri ağsaçlı Məlikənin gözləri kimi doldu:

– Mən mətləbi başa düşüm, oğlum, mən də elə belə deyirəm!.. Təmiz ad, təmiz ürək bu dünyada qızıldan da, ləl-cavahiratdan da qiymətlidir!

## IV

Günlər çox sürətlə gəlib keçdi. Onilliyi qurtaran hər şagird ali məktəbə ərizə verib daxil olmaq üçün çalışdı. Mehman evlərinə gəlib anasını çağırdı.

– İndi məsləhətin nədir, ana, oxuyum, ya yox?..

– Oğlum, uca elmi qurtarmaq istəmirsənmi?

– Ana, elm dəryadır, onu tamam-kamal qurtarmaq çox çətindir. Mən hələ indi o dəryaya girmək üçün hazırlaşmışam!

– Belə... Yaxşı, axır fikrin nədir, – Xatun gözlərini oğlunun üzünə zillədi: – Nə qədər ki bu quru sinəmdə nəfəsim var, sən oxu, onillik

dərsdə uca olduğun kimi yuxarı elmdə də hamıdan uca ol! Mən yenə sənin şəhadətnamənin çeşnisinə baxanda gördüm ki, sən çox-çox ucasan!..

– Ana, indi burdan belə, elmin bir cərgə yolları var, – deyə Mehman anasına izah etməyə başladı, – hərə bir yolla gedir. Biri müəllim olur, biri həkim, biri də hüquqşünas... Kim hansı sənəti sevir sevsin, bütünlüklə bu sənətlərin hamısı vətən üçün faydalı, həm də adam üçün çox-çox gərəkdir!

– Sənin fikrin hansına getməkdir, oğul? – deyə Xatunun qırışıq yanaqlarından üzü aşağı sevinc yaşları axmağa başladı. – Sən bu sənət sahiblərinin hansından istəyirsən?..

– Mən sənin fikrini bilmək istəyirəm, ana!

– Mənim fikrimi deyirsənsə, həkim ol! – Xatun göz yaşları içində gülümsədi, – nədən ki, həkimlik həmişəlik peşədir, adı da yaxşıdır, geyimi də, xələti də tərtəmiz, ağ qar kimi!..

– Mən, ana, – deyə Mehman yerə baxdı, – ayrı bir elm istəyirəm!

– Nə elmi, oğlum?!

– Mən hüquqşünas olmaq istəyirəm, ana!

– O nədir, oğlum! Bayaq da adını çəkdin, baş tapmadım?..

– Hüquqşünas, ana!.. O həm qanunun, həm də insan hüququnun, namuslu vətəndaş hüququnun keşiyində durandır!

– Peşəsinin adı nədir, ay bala? Onun qulluğunun adı nədir?

– Qulluğunun adı budur ki, oranı qurtarandan sonra adam xalq hakimi ola bilər, müddəi-ümumi ola bilər, yəni prokuror...

– Yox, yox oğlum, yox! – deyə Xatun qəti etiraz elədi. – Bu cürə adamın dalısınca, baxırsan ki, alt-üst danışıq olur. Mən fikir vermişəm; Gülsümün oğlunun başına nələr gəldiyini də bilirəm. Bax, o günü ləkə dedin, yox, yox olmaz!.. Lap kənar, çox kənar bir elm olsun; bir parça təmiz çörək çıxsın, müəllim kimi, hamı – ata-ana razı olsun, ya həkim kimi xəstəyə şəfa verən, yoxsa iş ver, iş kəs, yox!..

– Yox, ana, mən də neçə vaxtdır ki, bu barədə düşünmüşəm, – Mehman israra başladı. – İndi də qəsdən səndən soruşdum. Mən hüquqşünas olmaq istəyirəm ana, mən istəyirəm ki, çox elmli və təmiz bir hüquqşünas olum. Bizim qanunu, bizim ictimai mülkiyyəti, həm də bizim saf, sədaqətli vətəndaşları müdafiə edim!..

Mehman bu barədə anası üçün çox danışdı, çox təkid etdi, nəhayət, anasını bir növ razı saldı.

– Nə deyim, oğlum, deyərlər: "Könül sevən göyçək olar". – Xatun qollarını yanına saldı. – Sən gedirsən, ancaq mənim əlim ürəyimin

üstündə qalır, – Xatun üzünü göy səmtinə tutdu, – xudaya, sən bu uşağın işinə özün fərəc ver, sən özün onu artıq-əskikdən saxla!..

Mehman əlini-əlinə vurub güldü:

– Hələ mən dörd il oxuyacağam, ana! Sənsə, yazıq Allahı indidən ətəkləmisən!

– Ürəyim heç "bəli" demir, oğlum. Mən dedim sən adam sağaldan olasan, adam tutub-buraxan yox!..

**V**

Mehman sənədlərini təqdim edib hüquq fakültəsinə daxil oldu. Builki qəbulun yekunları haqqında fakültənin dekanı professor Məlikzadə məruzə edəndə Mehmanın adı üzərində də böyük bir iftixarla dayandı:

– Kim deyə bilər ki, tələbələrin ən yaxşısı ancaq tibb institutuna, ya sənaye, ya başqa-başqa institutlara gedirlər?.. Yaxud bacarıb oralara girə bilməyənlər, sonra dönüb bizə gəlirlər?

Professor Məlikzadə o cümlədən Mehmanın onillik şəhadətnaməsini götürüb çeşməyini gözlərinə gətirdi, bütün fənləri oxudu: – Əla, əla, əla! – O qurtaranda bütün salon əl çaldı. Hamı yerindən dönüb boylandı. Mehman oturduğu yerdə sığışılıb balacalaşdı.

– Kimdir o?

– O kimdir?

Professor Məlikzadə gözlərini gəzdirib:

– Xahiş edirəm, adını çəkdiyim tələbə ayağa qalxsın! – deyə təklif etdi.

Hamı yan-yörəsinə baxdı. Mehmanı tər basdı. O, cıqqır çıxara bilmədi. Professor salona təkrar müraciət etdi.

– Yoxdurmu, Mehman?

– Yoxdur, yoxdur!

– Yəqin bura gəlməyibdir?

– Söz çatar!..

– Onunku indidən gətirdi!

– Bəli, burada da bəri başdan!..

Professor əlini qaldırınca səslər kəsildi, o məruzəsinə davam etdi. Mehmanın adı hüquq fakültəsinə yayıldı. Bir neçə gün sonra respublika qəzetində professor Məlikzadənin builki tələbə qəbulu haqqında geniş bir məqaləsi dərc edildi. Başqa qəbul edilənlərlə bərabər bu məqalədə Mehmanın adına da xeyli yer verilmişdi.

Mehman böyük həvəs və ciddiyyətlə dərsə girişdi. O tədris kitablarından başqa, ən qədim dövrlərdən başlayıb gələn hüquq elmlərinə aid kitabları da ciddi oxumağa başladı. Mehman fakültənin qiraətxanasından çıxmaq bilmir, qədim zamanlardan bəri insan hüququ barəsində gedən döyüş və mübarizələr onun marağını cəlb edirdi. Mehmanın şöhrəti getdikcə fakültədə artır və yayılırdı. Onun natiqlik məharəti isə hamını heyran etməyə başlayırdı.

Bir gün professor Məlikzadə öz kabinetində əyləşəndə ağsaçlı Məlikə xanım qapı arasından:

– İcazə varmı? – deyə nəzakətli bir səslə soruşdu. Professor başını qaldırıb:

– Buyurun, – dedi. Qapının ağzına yeriyib müəlliməni qarşıladı.

– Mənim oğlum sizin hüquq fakültəsində oxuyur... Ürəyim durmadı. Gəldim sizdən soruşam...

Professor müəlliməyə kürsü göstərdi, hər ikisi əyləşdi.

– Oğlunuz kimdir?

– Mehman!

Professor iftixar hissilə:

– Gözəl baladır, – dedi, – çox mahir bir natiqdir, – o, barmağını zəngin düyməsinə dayadı. Ucaboylu, ortayaşlı bir qadın gəldi. Professor qolundakı saata baxdı:

– On dəqiqədən sonra tənəffüs olacaq, Mehmanı yanıma çağırmağınızı xahiş edirəm!

Ucaboylu, ortayaşlı katibə xala çıxdı, papirosunu yandırıb damağına aldı: “Bəlkə bu xanımın da qızı, bizim Şəhla xanımın qızı Züleyxa kimi Mehmana vurğun kəsilibdir? – Katibə xalanın beyni tüstülər içində dumanlandı. – Görək...”

Professorla müəllimə söhbətə girişdi. Professorun Mehman haqqında olan tərifləri haqq-hesaba gəlməz oldu. O, ağsaçlı müəlliməsini görüncə gözləri yaşardı, onun qarşısında öz qara, qıvrımsaçlı başını əydi, müəllimənin əlini öpdü. Məlikə xanım mehmanın əlini tutub silkələdi, sonra onun boynunu qucaqlayıb geniş alnından öpdü. Professor təəccüblə:

– Siz bu şəhərdə ana-bala bir yerdə olmursunuzmu? – deyə soruşdu, – çox-çox qəribədir?!.

– Mən onun müəlliməsiyəm! – Məlikə xanım öz sabiq şagirdini şəfqət dolu bir nəzərlə süzdü, – ikinci anası...

Professor başı ilə:

– Çox gözəl, – deyə müəllimənin bu hərəkətini təqdir etdi, – çox doğru, çox da düzgün!

– Mehman utanır, mən özüm gəldim... Gəldim ki, görəm bizim uşaq necədir?.. Burada necə oxuyur?.. Bizim məktəbin bayrağını uca saxlaya bilirmı?

– Bəli, çox uca!

– Çünki biz məktəbimizin adını çox uca tuturuq!

– Böyük vətənpərvərlik konkret işdən başlayır!..

Bir azdan zəng vuruldu, müəllimə Mehmanı oxşayıb onu dərsə ötürdü.

– Hüquq elmi. Bəli, çox böyük elmdir, – deyə professor öz sahəsini tərifə başladı. – Çox böyük elmdir, Məlikə xanım! Bu inqilab və tarix boyu olan bir çox böyük qovğalar insan hüququ uğrunda olmuşdur! Vladimir İliç özü də bu elmi oxumuşdur. O, böyük insan öz ömrünü-gününü bu hüquq və ədalət yolunda vermişdir!

– Bu belədir, ancaq nədənsə tələbələr buraya bir qədər ağır gəlirlər, – deyə müəllimə təəssüf hissilə qeyd etdi.

– Niyə, niyə, daha indi çox yaxşı gəlirlər, – deyə professor etiraz etməyə başladı, – gəlirlər!.. Çox yaxşı gəlirlər. Mehman kimi gələcəkli gənclərin buraya gəlmələri sübut edir ki, bizim hüquq elminə çox böyük maraq vardır!.. Bizdə gözəl həkimə, gözəl mühəndisə, gözəl aqronoma, gözəl müəllimə olan ehtiyacdan, daha az olmayan bir ehtiyac həm də təmiz vicdanlı hüquqşünaslardır!.. Lakin bir həqiqət də var ki, ötüb keçmişin qalıqları, o ara düzəldənlər, o təkbir dəllallar da, arada heç bir iş görmürlər, – professor səsini həyəcanla qaldırdı. – Bir həqiqət var ki, orda-burda gizlənmiş o üfunətli tör-töküntülərdən olan ara adamları da bizim bəzi hüquq işçisinin ləkələnməsində heç az iş görmürlər!.. Cilddən-cildə girən bu bürüncəkli adamlara qarşı çox kəskin, çox amansız mübarizə aparmaq lazımdır ki, təmiz süd içindən çıxan qara milçəklər kimi, onlar təmiz könlü bulandırıb işlərimizin düz və sürətlə getməsinə əngəl törətməsinlər!

– Bəli, işıqlı iş mübarizəsiz olmur!..

Bu danışıqlardan sonra onlar öz söhbətlərini bitirdilər. Məlikə xanım bir ana qayğısı ilə Mehmanı professora təkrar-təkrar tapşırıb salamatlaşdı.

Fakültənin son kursuna keçəndən sonra Mehmanı təcrübəyə göndərdilər. O özünün güclü məntiqi, valehedici nitqi, işə tam bir vicdan və əda-

lətlə yanaşması ilə hamını heyran etməyə başlayırdı. Dekan Məlikzadə isə yeri düşdükcə bu hadisəni hər yerdə xüsusi sevinclə qeyd edirdi:

– Bizim xalqımız üçün nəzəriyyəçi hüquqşünaslardan ibarət ictimai xadimlər də çox-çox lazımdır!.. Biz istəyirik ki, bizim hüquq tarixi, bizim hüquq qaydaları, ta qədim dövrlərdən başlayaraq hərtərəfli, elmi surətdə tədqiq edilsin, dərindən dərinə öyrədilsin! – Professor Məlikzadə təkidlə göstərərək, – bu xüsusda gərək qalın-qalın, çoxcildli kitablar yaransın!.. Bir xalqın hüququ və dövləti varlığa hər hansı elmdən qabaq, hüquq elmində öz əksini tapır... Bizdə indi çox qüvvətli bir nəsil – gənclik yetişməyə başlamışdır! Mən istəyirəm ki, bizdə nəinki ali təhsilli hüquq işçiləri, bizdə hüquq alimləri, akademiklər belə yetişsin!.. Belə olduqda biz dövləti quruluş və ictimai inkişafımız üçün daha çox qazanmış olarıq!.. Bizdə gərək hüquq elmlərinin ali tədqiqat institutu düzəldilsin. Burada bizim keçmişin ağıllı və tərəqqipərvər dövlət xadimləri, onların qanun-qaydaları da dərindən dərinə öyrənilsin!..

Professor öz çıxışlarında bu cəhətləri inadla qeyd edir, gələcəyi olan gənclər içərisində Mehmanın adını xüsusi bir hiss ilə çəkirdi:

– Biz tamamən əmin oluruq ki, bizim elmə xüsusi bir sevgi bəsləyən, bu işə sönməz alov, ehtirasla yanaşan qeyrətli bir gənclik bu cəhəti də elmi bir yüksəkliyə qaldıracaqdır. Xalq kütlələrinin nəzərdə tutan hüquq elmi öz böyüklük və öz əzəmətini gündən-günə artırır!.. Ədalətlə düzəlmiş qanun vətəndaşların hüququnu təmin edir, yaradıcı, ictimai faydalı əməyin keşiyində dayanır, bizim inkişaf və yüksəlişimizə xidmət edir!

Professor, fakültənin rəhbəri kimi öz fikirlərini tələbələrinə aşılamağa çalışır, Mehmanı da o cümlədən gözdən qoymurdu, buranı qurtarandan sonra, onu hüquq fakültəsində saxlamağı, ondan böyük elmi işçi yetişdirməyi qərara alır, yeri düşdükcə bu fikrini söyləyirdi. Mehman isə bu barədə qəti fikrini hələ ki demir, professoru ancaq ehtiramla dinləyir, hüquq elminin üstünlüklərini etiraf və təsdiq edirdi...

## VI

Bu müddət ərzində Mehmanı gözdən qoymayıb, əldən buraxmayan Züleyxa yenə də ona aşiqanə məktublar yazır, gecələrin ağır yuxusuzluğundan, gündüzlərin dözülməz qərarsızlığından şikayətlənirdi. Mehman, Züleyxadan aldığı kağızları diqqətlə oxuyur, əlinə qələm alıb rədd cavabı yazmaq istəyir, ancaq qələmi dayandırıb, onu bir kənara buraxırdı... Hər

bir məktubu alanda o, cavabını bu gün-sabaha salır, sonra qayıdıb dərsə ciddiyyətlə girişir, yenə də arada məktubları unudurdu... Mehman fakültənin son kursuna keçəndə fakültənin tərtib etdiyi bütün müsamirələrə, Züleyxa öz xalası vasitəsilə çağırış vərəqəsi əldə edir, buraya müntəzəm gəlirdi. Müsamirlərin bir çoxunda o, Mehmanı görməsə belə, yenə buradan üzülmür, əl çəkmirdi. Bir axşam Dövlət Dram teatrında yeni bir əsərin ilk tamaşası gedirdi. Katibə xala bu tamaşa üçün əldə etdiyi iki biletin birini Züleyxaya, o birini də Mehmana vermişdi. Lakin Züleyxanın haman tamaşaya gedəcəyindən Mehmanı xəbərdar etməmişdi. Onlar hərəsi ayrı-ayrı gələrək qabaq sırada yan-yana oturmağa məcbur olmuşdular. Bu hal Züleyxanı ürəkdən açdığı halda Mehmanı darıxdırırdı. Teatra gələn tanış-biliş yoldaşlar Mehmana altdan-altdan baxır, onu üstüörtülü işarələrlə təbrik edirdilər... Tənəffüs zamanları Mehman Züleyxanı sırada qoyub, gəzintiyə təkcə özü çıxırdı. O, istəyirdi ki, tamaşanı yarımçıq buraxıb getsin, ancaq tamaşanın müvəffəqiyyəti, salonu doldurub titrədən alqış səsləri, bu qayda ilə səhnənin bütün salonu fəth etməsi, axır pərdələrin birisində müəllifin səhnəyə çıxarılacağı hər kəs kimi Mehmanı da tutub, burada saxlayırdı. Salonda əyləşənlər ya qoca olsun, ya cavan səhnə ilə yaşayırdı... Sənətin hakim əli öz xariqüladə qılıncını sıyırıb düz birbaş göyə qaldırmışdı. Hər bir kəs ürək döyüntüsü ilə bu qılıncın necə enəcəyini gözləyirdi. Axırıncı tənəffüs fasilələri artıq adamları darıxdırır, bütün ürəklər səhnə ilə birgə çırpınırdı. Sevgililər kimlə oturduqlarını, az qala necə oturduqlarını belə unudurdular. Mehmanla Züleyxanın yan-yana oturmağı get-gedə Mehmana təsir edirdi. Züleyxanın buruq-buruq olmuş qara saçları, uca boyu, qabarıq döşləri, cazibəli baxışları bu arada daha Mehman üçün biganə qalmırdı...

Axırıncı pərdə düşüb tamaşa bitincə onlar istər-istəməz qoşa çıxdılar...

Ay hərdən buludları yarıb onun arasından çıxır, buludlara tezcə girib batırdı. Onlar sakit addımlarla səssiz-səmirsiz yeriyir, hansı tərəfə getdiklərini özləri də bilmirdilər. Onlardan hər birisi o birisinin dilinin açılmağını səbirsizliklə gözləyirdi. Bir xeyli evlər adlayıb, küçələr keçəndən sonra:

– Mən evə tələsməliyəm, – deyə bu sükuta qarşı Züleyxa deyintili bir səslə dilləndi. – Anam məni gözləyəcək!

Mehman dinmədi, onlar yenə yeridilər.

– Bizim evimiz də elə dar döngədədir ki?! – deyə darıxan Züleyxa əlavə etməli oldu, – çox döngəli!..

– Mən sizi müşayiət edərəm, – deyə Mehman nəhayət dilləndi.
– Sizə zəhmət olmazmı?
– Sizi tək buraxmaq da yaramaz!..
– Mən qorxmuram! Eləcə deyirdim!.. Çox sağ olun, mən özüm tək gedərəm!
Züleyxa addımlarını yeyinlətdi. Mehman da sürətini artırıb Züleyxaya yanaşdı. O özü bilmədən hər hansı bir hiss ilə isə Züleyxanın qolundan yapışıb:
– Sizi tək buraxmaq olmaz, – dedi.
Züleyxa içəridə xoşhal oldu, onlar bir qədər də dinməzcə getdilər. Ömründə birinci dəfə qız qolundan yapışan Mehmanın bədənində bir qığılcım gəzirdi. Gənc qızın xoş və ətirli nəfəsi onu məst edirdi. Bu an Mehman necə addım atdığını bilmirdi.
– Eviniz uzaqdırmı?..
– Lap uzaq da olmasa, sizə zəhmət olar!..
– Mənə zəhmət olmaz!..
Züleyxa qəhərlənib doluxdu:
– Nə əcəb sizdən?..
– Çünki gecə vaxtı qızı döngəli yollarla tək buraxmaq yaramaz!
– Sizin üçün heç fərqi varmı?
– Fərqi budur ki, sizi öz evinizə sağ-salamat çıxarmaq indi mənə borc olmuşdur!..
– Bu qədərmi?..
– Daha nə qədər ola bilər?..
Züleyxa buludlar arasından çıxan aya baxıb:
– Siz kitablardan fərqli olaraq təbiəti də xoşlayırsınızmı? – deyə sözünü dəyişdirmək istədi.
– Mən kainatı da, təbiəti də xoşlayıram!
– Təbiət özü də böyük bir kitab deyilmi?
– Bəli, təbiət həm canlı, həm də çox əsrarlı bir kitabdır!
– Təbiət ağlayır, təbiət gülür, bax görürsünüzmü qaranlıqlaşır, bir azdan aydınlaşır. Təbiətdə hədsiz-hesabsız güllər açır, bülbüllər güllər üçün fəğan edir, bir sözlə təbiət yaşayır!
– Lakin kitabsız təbiəti dərk etmək olmaz!
– Bəlkə əksinə, təbiətsiz kitabı dərk etmək olmaz?
– Siz fəlsəfə də bilirsiniz, Züleyxa xanım!
– Fəlsəfə özü də bu təbiət hadisələrini izah etməkdən doğmamışdırmı?

– Siz indi təhsilə davam edirsiniz, yəni oxuyursunuzmu? – deyə Mehman, Züleyxanın təhsilə davam edib-etməməsilə ciddi maraqlandı. Züleyxa isə instituta girərkən imtahanlardan kəsildiyini, sonra modalı libaslar tikən dərzi xanımın yanına arabir getdiyini öz vüqarına sığışdıra bilmədiyi üçün qızarıb bozardı, utandığından tər tökdü:

– Yox, bu ili həkimlər məsləhət görmədi, – Züleyxa cürətsiz cavab verdi. – Dedilər, zəifsiniz!..

Züleyxanın canlı və möhkəm qolu Mehmanın əlində özünü hiss etdirdi.

– Həkimlər heç də az yanılmırlar!..

– Onlar ürəyimin zəif vurduğunu göstərirlər. Həkimlər göstərirlər ki, siz dərin iztirab keçirib ürəyinizi üzmüşsünüz!..

– Əbəs iztirablardan çəkinmək gərəkdir!..

Onlar bu qayda ilə atmacalı söhbət edə-edə Züleyxagilin qapısına çatdılar. Züleyxa ayağını saxladı, Mehman dayandı.

– Sizin ananız indi intizar, ya iztirab içindədir, eləmi?

– Mənimmi? – deyə Mehman gülümsündü, – oğlanlar üçün anaları bir o qədər də narahat olmurlar!..

– Bu qədər qanadlanıb uçan məktublara cavab verməyən bir oğlana nə ad vermək olar?..

Mehman sükut etdi.

– Siz yenə də bu barədə dinmirsiniz?

– Bu çox mürəkkəb bir məsələdir, Züleyxa!

– Mənim ürəyimə girib məni təhsildən qoyan da bu məsələdir!.. Məndə fikir dağınıqlığı əmələ gəlmişdir, Mehman!..

– Gənc adamın fikri oxumaqda olmalıdır, Züleyxa!..

– Hamı ürəklər bir olmursa?..

– İradə hər şeyə üstün gəlməlidir!..

– İradə acizlik göstərirsə!..

– Yenə də iradə, daxili, dönməz bir iradə!

– “İradə, daxili bir iradə”, – deyə Züleyxa hikkələnsə də büruzə vermədi. – Həkimlər deyir ki, siz həm də çox-çox əsəbi olmuşsunuz!

– Gənc, sağlam adam üçün nə əsəbilik?

– Siz daşürəklisiniz, Mehman!

– Haradan bilirsiniz?

– Bütün münasibətlərinizdən!.. Bütün illər uzunu çırpınan bir ürəyi cavabsız buraxmağınızdan!.. Bütün bu soyuq fəlsəfələrinizdən!..

– Bəli, münasibətlər gərək aldadıcı yox, aydın olsun!
– Aydın olmasa, mən belə birtərəfli iztirablara düşməzdim!..
– Mən özümü deyirəm, Züleyxa!
– Siz kitab adamısınız, Mehman!
– Mən həyat üçün, döyüş və mübarizə üçün hazırlaşıram!
– Həyat heç də qum kimi bir quruluq deyildir!
– Həyat çox böyük və mürəkkəb mübarizə prosesidir! Ziddiyyət və vəhdət!
– Bu da kitablardan?
– Kitab özü də həyat mübarizəsi materiallarının məcmuyudur!
– Siz adi söhbəti də mühazirəyə çevirirsiniz, Mehman!..
– Mən yüksək səviyyəli mühazirəni çox qiymətləndirirəm!..
– Siz daima quruluğa çəkirsiniz, Mehman!
– Mən elm və bilik kəsb etmək deyirəm! Mən sizi də buraya çağırıram!
– Nəhayət, ancaq nəsihət! Coşqun, qaynar bir ürək əvəzinə kitablardan gələn nəsihət!.. Bir vicdanım bilir ki, mən nə qədər əzab çəkirəm... Bir müztərib ürəyim bilir ki, mən nə qədər təhlükəli dalğalardayam; bir mən bilirəm ki, mən necə dəhşətli fırtınalardayam!..
– Bunlar hamısı səmimidirsə, çox böyük mənadır, Züleyxa!..
– Qız üçün təhqirli də olsa, mən eşqimə təslim olub çırpınan, həyəcanlı ürəyimi açdım, – deyə Züleyxa qaynayan göz yaşlarını ağ dəsmalla sildi.
Onlar qeyri-müəyyən bir sükut içində dayandılar, sonra birtəhər susqunluqla görüşüb ayrıldılar. Yol uzunu Mehmanı dalğalı bir fikir götürdü. Züleyxa onun gözləri qabağından çəkilib getmədi...

## VII

Hüquq fakültəsinin salonu xüsusi bir səliqə ilə bəzənmişdi. Beş yüzdən yuxarı sarılar geyim-kecimli adamla dolmuşdu. Xoş bir ətir salonu bürümüşdü... Buraxılışa həsr olunmuş bu gecədə tələbələrin bəzi yaxın-uzaq qohumları, tanış-bilişləri əyləşmişdi. Birinci sırada oturanların içərisində Züleyxa, onun sağ tərəfində anası Şəhla, sol tərəfində isə Katibə xala əyləşmişdi. Geniş səhnə allı-güllü çiçəklər, parlaq rəngli məxmərlər içində itmişdi...
Mehman rəyasət heyəti içərisində oturmuşdu. Professor Məlikzadə danışığını qurtarandan sonra hüquq fakültəsini əla qiymətlə bitirən

tələbədən on beş nəfərin adını çəkdi. Bugünkü təntənə şəraitində bir neçə tələbənin diplomunu verməyini lazım bildi. O, birinci olaraq Mehmanın diplomunu əlinə götürdü: təhsil müddəti içərisində onun əla qiymətlə hüquq fakültəsini qurtarmağını qeyd etdi. Professor diplomu qaldırıb yellətdi:

– Mehman!.. Mənim oğlum!..

Hamı əl çaldı. Mehman pörtə-qızara ayağa qalxıb diplomunu aldı. Professor Mehmanın boynunu qucaqlayıb alnından öpdü: bir neçə kəlmə də söz dedi. Yenə də salondan alqış səsi ucaldı. Hamı Mehmanın təhsil işindəki qələbəsini alqışladı. Züleyxanın əli hər kəsdən sonra dayandı, o yan-yörəsinə baxıb qıpqırmızı qızardı, başını aşağı saldı. Mehman qısıla-qısıla çəkilib öz yerində oturdu. O, dörd ay bundan qabaq cənazəsini çiynində apardığı ağsaçlı müəlliməsini xatırladı; sanki qar kimi ağsaçlı Məlikə xanım bu məclisdə idi, yenə də o, Mehmanı bir ana nəvazişi ilə dindirir, axırıncı vəsiyyətini edir. "Oğlum, təmiz vicdan, ləkəsiz ürək..." deyirdi. Mehman bu an salona göz gəzdirdi, çağırış verib dəvət etdiyi anasını burada görmək istədi. Ancaq Xatun gəlməmişdi. O yox idi. Mehmanın gözü Katibə xalaya, sonra da Züleyxaya sataşdı. Rəsmi hissə bitdi. Müsamirə başlandı. Müsamirə fasiləsində Katibə xala Mehmanı əldən qoymadı, onu bacısı Şəhla xanımla tanış etdi:

– Bizim Züleyxanın anasıdır, Mehman xan! – deyib güldü.

Qara krepdeşin libaslı, ortayaşlı, qarasaçlı, doluəndamlı qadın uzunkirpikli, iri gözlərini dolandırıb:

– Təbrik edirəm, oğul, – dedi, – ürəkdən sevinirəm! Mən məhz sizin xatiriniz üçün belə yerə gəlmişəm!..

Katibə xala Mehmanı kənara buraxmayıb öz yanında oturtdu, onlar axıra qədər birlikdə müsamirəyə tamaşa etdilər. Nə isə Mehmanı bir ağırlıq yenə də öz altına almışdı. "Necə olsun?" O, nə durub gedə bilir, nə də rahat otura bilirdi. "Bəs nə təhər olsun?.." Müsamirənin qurtarması elə bil ki, Mehmanı ağır bir əzabdan xilas etdi. Adamlar durub səs-küylə dağılışmağa başladılar. Mehman həyətə çıxdı, Katibə xala bir qədər də dil tökməklə onları müşayiət edib öz evinə yollandı. Şəhla xanım, Züleyxa və Mehman birlikdə addımladılar... Onlardan heç biri danışmırdı. Dünyagörmüş Şəhla xanım Mehmanın hər bir hərəkətini izləyirdi. İndi daha daxili bir vüqar, ağırtəmkinli bir sükut içində addım atan gənc oğlan Şəhlanın diqqətini özünə cəlb edirdi. Onlar Şəhla xanımgilin darvazasına çatan kimi Mehman ayağını saxlayıb:

– Məni bağışlayın! – dedi.
– Nə oldu? – Şəhla xanım heyrətlə soruşdu.
– İcazənizlə mən qayıdım, deyirəm!
Şəhla xanım gülə-gülə Mehmanın qolundan tutub:
– İndiyə kimi buraya siz ikiniz gəlmişsiniz, indi də buradan belə, mən sizin yolunuzu açıram, – deyə qəti bir ifadə ilə cavab verdi. – Bir də sizin ali məktəbi elə uca qiymətlə qurtarmağınız şərəfinə, sizi, özüm hazırladığım mürəbbə ilə ətirli bir çaya qonaq etmək istəyirəm... Sonrası da zəfəranlı bir plova!..
– Çox sağ olun, anam evdə təkdir!
Züleyxa qolundakı daş-qaşlı qızıl saata baxaraq:
– Hələ yatmaq vaxtı da deyil, – dedi, – haraya belə tələsirsiniz, Mehman?
– Doğrudan da, indi hələ yatmaq üçün çox tezdir, – deyə Şəhla xanım üzünə salıb Mehmanın qolundan yapışıb çəkdi. Onlar daş pilləkənlə üzüyuxarı, ikinci mərtəbəyə qalxdılar. Şəhla xanım barmağı ilə zəngin düyməsini basdı, xidmətçi qadın qapını açdı, onlar içəriyə girdilər.
Mehman yeni gördüyü evə nəzər saldı, onun zəngin bəzək-düzəyini ötəri seyr edib əyləşdi. Şəhla xanım özü-öz əlilə çay dəmləyib özü də buğlana-buğlana süzdü. Sonra o, çayları parıldayan podnosa düzüb üstünə ağ süfrə salınmış stolun üstünə gətirdi. Şəhla xanım kamodun siyirmələrini şaqşaraqla açdı, mürəbbə dolu bankaları gözdən keçirdi, nəhayət, süfrəyə beş cürə mürəbbə düzdü. Sonra da "şəkərbura"dan söz açıb özünü xeyli təriflədi. Şəhla xanım gülə-gülə, şaqqıldaya-şaqqıldaya danışdı, Mehmana və Züleyxaya söz atdı, cavanlığından söhbət açdı.
– Ömrün balı cavanlıqdır! – deyə xanım sürmələnmiş qaşlarını dartdı. – Ancaq getdikcə baxırsan ki, o, göy alça kimi turşuyur. Yadımdadır, bir gün bizim Mamayla tanış olduq!.. Hə, bəli, o vaxtın hər dəqiqəsi nəinki bir ay, bir ildən də qiymətli idi. – Şəhla xanım danışa-danışa qaşlarını çəkir, adəti üzrə, yüksək mədəniyyətini nümayiş etdirmək, Mehmana göstərmək istəyirdi. – Bir gün, bəli, görüş yerinə biçarə ləngimişdi. Mən də düzü, bərk darıxdım. O, gəldi çıxdı, mən üzümü yana döndərib küsdüm. O, cibindən həmin bu saatı çıxarıb qoluma bağladı. – Şəhla xanım qızının qolundakı qiymətli saatı göstərdi. – Dedi: "Təxirə səbəb budur". Mən razılaşmadım. Dedim: "Doğrudur, qadını qızıl ilə aldadarlar, ancaq mən öz soltanlığımı yüz belə sarı mədən parçasına vermərəm!.."

– Mamay da öz saatını tezcənə qabağa çəkir, – deyə Züleyxa anasına tərəf nəzər saldı. – Heç gör yeridir?..

– Yox, sözüm onda deyil, saat sənindir!.. Təzədən maman bu saatı bağlamış nə qayıracaqdır?.. Atanın yadigarı qızına çatar, əlbət!

– Yox, ilk sevginin yadigarı toxunulmazdır, deyə Züleyxa qolundakı saatı açdı, – əlbət, vaxt olar ki, biz də öz arzu etdiyimiz saatımızı bağlarıq!!.

Züleyxa bu sözləri deyib Mehmana altdan-altdan baxdı. Mehman əlini çay qaşığının qulpuna atdı, iri dənəli zoğal mürəbbəsindən götürdü. Şəhla xanım pörtən Mehmanı süzüb:

– Bizim Züleyxa bu neçə ildə bizim bu evdə, hey "Mehman qağa" deyib dilinin əzbəri eləyibdir, – deyə Şəhla xanım ara pərdələri yırtmağa başladı. – Axşam da məni zor-güc çəkə-çəkə konsertə aparıbdır!.. Hərçənd xalası da Züleyxaya köməkçi çıxıb, ancaq mən görürəm ki, sizin xatiriniz üçün getməyinə dəyərmiş!.. Çünki biz belə ürəyiaçıq yaranmışıq!.. Nə ki ürəyimizdədir, o da dilimizdədir!.. Biz ürəyimizi, sinəmizin altında gizləməyi bacarmırıq!.. Xoşlayırıq, deyirik xoşlayırıq!.. Züleyxa bu barədə lap mənə oxşayıb, mamasına!.. Bizim nəsildə qız bir cürə erkək olubdur!.. Düzü gülməli çıxsa da mən özüm o yazıq Mamayı elçiləmişəm, – Şəhla xanım dönüb divardakı xurmayıpapaqlı, burmabığlı, boğazına qara bant bağlanmış dolğun bir şəkli göstərdi. – Züleyxanın papasıdır, Mamay!.. Axırda elə eşq yetirdi ki, buradan durub başqa şəhərə ticarətə gedəndə teleqraf əlindən qapımızın zəngi kəsmədi. Bir cavab verməyəndə iki teleqram gələrdi "nigaranam". Ürəyimiz belə olubdur, mənim öz mamam da belə olub, düzü biz öz ürəyimizin əsiri olmuşuq!.. Yəni ürəyimiz tutanı, əlimiz buraxmaz!..

– Mama!.. Mama!..

– Düzü belədir, qız, gizlətməyinə dəyməz!.. Mən ki, dəftər-kitabı hələ başqa bir yana tullazlamamışam ki, – "mama başıma girmir". Əsəbilik, ürək döyüntüsü, həkim-həkim üstündən!..

– Mama, axı?

– Elə qəsdən deyirəm ki, bu qaradinməz Mehmanın da bilsin!

– O özü bu işləri mürəkkəb sayır!

– Mürəkkəb, ya qələm! Mən sənin iztirablı nəğmələrindən cəzana gəlmişəm!..

Mehman qəribə, doğrudan da çox mürəkkəb bir vəziyyət keçirirdi: "O, buraya niyə gəlmişdir?.. Gəlməsə olmazdımı?.. Nə üçün o belə

edir, kim, hansı bir qüvvə onu zor-güclə tutub, çəkə-çəkə buraya gətirir? Axı nə üçün o könülsüz olduğu halda tamamən qəti addımlarla bu evdən birdəfəlik üz çevirib uzaqlaşmır?.. Bu nə yarım addımdır?" – Mehman daxilən öz-özünü danladı, stəkandakı son qurtum çayı da içib nəlbəkini səsləndirdi.

– Məni bağışlayın, – deyə o, bu açılan söhbətə öz münasibətini bildirmədən durub getmək istədi. – Məni bağışlayın, mən gedim, – deyə Mehman ayağa qalxdı.

– Yox, mən heç də razı deyiləm! – deyə Şəhla xanım pırpızlı başını buladı. – Mən dedim ki, fakültəni qurtarmaq şərəfinə böyük bir ziyafət süfrəsi açacağam!.. Necə deyərlər, sizin bu təzə dildə, bu hələ kiçicik müqəddimədir!..

– Çox sağ olun, mən heç bu "mürəbbə-çay" zəhmətinə də razı olmazdım!

– Ana öz oğlunun yolunda zəhmət çəkməlidir!

– İcazənizlə, mən gedim!

– Yox, siz qalacaqsınız! – Şəhla xanım Mehmanın qolundan xüsusi bir ərklə yapışdı. – Mütləq qalacaqsınız!.. Mənim açıq söhbətim sizi əsla qorxutmasın!.. Mən ürəyimi açdım! Mən elə bilirəm ki, bu hal gec-tez beləcə açılacaqdı, mən ancaq tez açdım! Mən "mıs-mıs" yox, elə birbaşa "Mustafa" dedim.

– Çox sağ olun, məni anam qapı ağzında, sabaha qədər də olsa gözləyəcəkdir!

– Qoy ananız birdəfəlik oğlu üçün yol gözləməkdən gözünü çəksin!..

Züleyxa, Mehmanın getməyindən, özü də Şəhla xanımın bu söhbətlərindən hürküyə düşərək həmişəlik uzaqlaşacağından həyəcan keçirərək, nəvazişkarlıqla onun qarşısına yeriyib:

– Bəs siz deyirdiniz, analar ancaq qızları üçün narahat olurlar? – dedi və yenə də öz iri gözlərini gilələnmiş yaşla doldurdu.

– Qız-oğlan, hər kəs üçün ana ürəyi narahatdır!

Şəhla xanım gülə-gülə:

– Bu lap doğrudur, hər kəs üçün ana ürəyi titrəyir!

– Çox sağ olun, mən üzr istəyirəm!

Şəhla xanım ara qapını açıb lampanı yandırdı, bəzəkli otaq çilçıraq içində parıldayırdı.

– Bax, sizin yerinizdir, qorxmayın, rahat olarsınız!..

– Mən heç bir zaman başqa yerdə yatmamışam!

– Ana qoynundan çıxmaq, ayrılmaq lazımdır!

– İcazənizlə, mən gedim!

– İcazəmizlə getməyəcəksiniz, – deyə Züleyxa qıpqırmızı qızarsa da belə hikkələnib birdən-birə Mehmanın qolundan tutub sallaşdı, – qız əmr edən yerdə oğlan susar!

– Sizi bilmirəm, Mamayla bizim sevgimiz açıq idi. – Şəhla xanım qızına köməkçi çıxdı.

Mehman pırçım-pırçım tər tökürdü.

– İcazənizlə, – deyə o, bir də hərəkət etdi.

– İcazə yoxdur! – deyə Züleyxa ərklə inad etdi. Şəhla xanım içəriyə girib çarpayını açdı:

– Bir qızım var, qoy bir də oğlum olsun!..

– Anası gözləyir, – deyə Züleyxa divara tərəf əyilib gözlərini sildi. "Qızlar o qədər danışıblar, mənim adımı bu Mehmanla o qədər çəkiblər ki, mən özüm də o qədər inada düşmüşəm ki, bütün dünya gülsə də o qədər bağlanmışam ki!.. Axır, mən, Allah da bilir, bütün rəfiqələrim də, başqa bir adı dilimə gətirməmişəm... Bəs necə olacaqdır?.." – Qızlara xas olmayan kobud yollarla da olsa, Züleyxanın həyəcanı artır, o öz hərəkətləri ilə qızların dil-dişinə düşdüyündən, tutduğu bu yoldan heç bir vəchlə dönmək istəmirdi... Adətən, oğlanlar özlərini göstərər, qızlar isə ürəklərini gizlərlər!.. İndi isə qəribədir, bəlkə adətdən xaric də olsa, Züleyxa bu işi belə başlamış, əzəldən çəkinməmiş, beləcə təbii axan bir hisslə davam etmişdi. O, xəyalən Mehmanla az əylənməmiş, öz yuxularında Mehmanı az görməmişdi... İndi, Mehman əldən çıxıb birdəfəlik gedərsə, bəs onda Züleyxanın bu iztirabları necə olar?.. Əgər Mehman bir qədərdən, öz gələcək həyatını başqa bir qızla qurarsa, Züleyxa nə edər?.. Züleyxanın xəyalı dolanırdı... Deməli, iş belə bir düyünə, belə bir təzada düşür?!. Mehman da qayıdıb oturduğu halda, bu səssizlik içində özünə haqq-hesab verirdi. Əgər, Mehmanda Züleyxaya qarşı, cüzi də olsa bir meyl artmağa başlasa da, o, əsla bu krepdeşin geyimli Şəhla xanımın hərəkətlərini öz ürəyinə sığışdıra bilməyəcəkdi!.. Gələcəkdə kimi atmaq, kimi tutmaq məsələsinə gəlincə, Züleyxa necə hərəkət edəcək, nə deyəcəkdi?.. Bu cəhət bütün ziddiyyətlərilə Mehmanın təsəvvüründə canlanmağa başlayırdı...

Saat iki radələrində Mehman yan otağa keçib soyundu. Yumşaq çarpayıya uzandı. Mehmanın ürəyini müəmmalı bir həyəcan götürür, sanki çarpayıdan ağ bir alov qalxırdı.

– İcazənizlə, – deyə bir səs gəldi. Mehman çarpayıda yığışıldı. Kirpikləri quruyub cütləşmiş Züleyxa qapının qanadını açıb içəriyə girdi:

– Siz yatmamısınız, Mehman?

– Xeyr!..

Züleyxa əl atıb lampanı yandırdı və:

– Mən ki, mütaliəyə keçmişəm, – deyə kədərli də olsa gülümsədi, – görürsünüzmü, Füzulidir!

– Füzuli çox böyük şairdir!

– Siz də Füzulini oxumusunuzmu?

– Az-çox xəbərim var!

– Onda, – deyə Züleyxa həyəcanla kitabı açıb:

– "Yarəb, bəlayi eşq ilə qıl aşina məni, –
Bir dəm bəlayi eşqdən etmə cüda məni.
Az eyləmə inayətini əhli-dərdidən,
Yəni ki, çox bəlalara qıl mübtəla məni".

– deyə oxudu.

Hər ikisi bir anlığa susdu, sonra Züleyxa kitabdan gözünü ayırıb:

– Cinayət-cəza məcəlləsi Füzulini bu şeir üstündə məsuliyyətə cəlb etmirmi? – deyə daxili bir kinayə ilə soruşdu.

– Bizim hüquq elmi hər hansı zorakılığın, haqsızlığın əleyhinədir!

– Haqsızlıq özü də şərti deyilmi? – Züleyxa kitab əlində deyintili bir hərəkətlə yumşaq stulda oturdu.

– Necə deyər, hansı nöqteyi-nəzərdən?

– Bu nöqteyi-nəzərdən ki, biri qova, biri qaça, hər ikisi də Allahı çağıra, kim haqlıdır!..

– Səbəblərini ayırd etmək, sonra müəyyən etmək olar!

– Səbəbi aydın olmayan çox mürəkkəb bir sirr olarsa?..

– Bu dünyada hər hansı bir hadisənin səbəbini izah etmək mümkündür!

– Hüquq elmiləmi? Yaxud fəlsəfə ilə?

– Əlbəttə hər ikisi ilə!

– Bəs Füzulini?..

– Füzuli şahin şəhpərli bir şairdir!

– Onun eşq divanını nəzərə almayan, bəs cinayət-cəza məcəlləsinin hansı bir maddəsi ilə cəzaya cəlb olunur?

– Dedim o, hər iki tərəf üçün eyni müvazinətdə olmalıdır!
– Tərəfin biri bədbəxtliyindən alov, o birisi xoşbəxtliyindən buz olarsa?..
– Bu çox böyük fəlsəfədir!
– Fəlsəfə qocaldıqca hikmət kəsb edir, insan qocaldıqca ölür!
– Bizim zəmanəmizin gəncliyi üçün ölüm biganədir!
– Eşq divanı diqqətsiz buraxılan yerdə ölüm ən doğru hakim deyilmi?
– Özünə qəsd edənlərin böyük cəzası vardır!
– Bəs vadar edənlər necə?
– Onun da cəzası vardır!
Şəhla xanım o biri otaqdan dilləndi:
– Ay qız, belə gəl, qoy uşaq yatsın!.. Mənim də yuxum gəlir!..
– Onsuz da adam yaşadığından çox yatacaqdır. Vay ondadır ki, yaşayanda da yatasan. Belə deyilmi, Mehman? Hüquq elmində belə bir maddə varmı?
– Hüquq elmi böyük məsələlər qoyur!
– Yaşamaqdan da böyük bu dünyada nə məsələ ola bilər?
– Ay qız, gəl qoy uşaq yatsın!
– Qoy əlaçı tələbə imtahan versin, ana! – Züleyxanın kədərli gözləri iztirablı yaşla doldu.
– Ay balam, imtahan komissiyası deyilsən ki?!.
– Mən komissiyayam, məcəlləm də Füzulinin divanıdır. Qoy Mehman mənə axırıncı imtahan versin!
– Ay qız, belə gəl! – deyə Şəhla xanım gəlib Züleyxanın qolundan tutub çəkdi və qapını örtdü:
– Qoysana, bir uşaq yata, qız!
– Qoysana, ana, xəncərləyəm, – Züleyxa üçüncü otağa keçdi, için-için hıçqırdı – mən bədbəxtəm!..
– Bəli, bizim qız da buz kimi bir oğlan divanəsi olmuşdur!..
Mehman, sabaha kimi yerinə odlu bir qor dolmuş kimi əlləşdi, hava işıqlananda qurcalanıb durdu, geyinib ayaq barmaqlarının ucunda evdən çıxdı. Günəş dənizdən qalxır, onun qızılı saçları şəhərin qalın divarlarını örtürdü. Mehman küçələrdən tez-tez keçib döngələri döndü, dalana tələsik çatdı. Böyük intizarla Mehmanın yolunu gözləyən ana özünü oraya-buraya çırpmış, sonra bükülərək ağsaçlı başını öz arıq dizlərinin üstünə qoymuş, solğun bir sifətlə qapı astanasında mürgüləmişdi...

## VIII

Hüquq fakültəsinin böyük və zəngin kitabxanasında, göy xələtli kitabxanaçılar çalışıb-əlləşir, tələbələri, müəllimləri, professorları, elmi işçiləri istədikləri kitablarla təmin edirdilər... Onlar yan tərəfdəki qiraət salonunda səssiz-səmirsiz oxuyur, kağız üzərində qeydlər edirdilər. Diqqətlə qulaq asanda buradan, yalnız üzərində qələm işlənən kağızların xışıltısı eşidilirdi... Küncdəki balaca stolun arxasında oturan Mehman da, çoxdan əlləşirdi. O, buraxılışdan sonra verilən məzuniyyətdən istifadə edərək çalışırdı. Mehman çox düşünüb, çox mühakimə etdikdən sonra verilən məzuniyyətdən istifadə edərək çalışırdı. Mehman çox düşünüb, çox mühakimə etdikdən sonra "Azərbaycanın qədim dövrünə aid hüquq tariximizdən" adında bir elmi əsər üzərində işləməyi qərara almışdı. O hələ neçə ay idi ki, bu mövzu üstündə çalışır, kitabxananı çox arayır, az şey tapırdı. Professor Məlikzadə Mehmanın bu fikrindən xəbər tutaraq çox şad olmuşdu. Buna görə də o öz sevimli tələbəsinə baş çəkmək, ona məsləhət vermək qərarına gəlmişdi. Professor qapını arxa tərəfdən yavaşca açıb içəriyə girdi, əlini Mehmanın çiyninə qoydu. İşarə ilə qiraət salonundan qaldırıb kitabxanaya gətirdi. Şkaflar ağzınacan qalın cildli kitablarla dolu idi.

– Çox zəngin kitabxanadır, – deyə professor böyük maraqla kitab dolu rəfləri göstərdi, – çox böyük dövlətdir!.. Bax burada hər bir dildə əsər tapmaq olar. – Professor əlini kitab qəfəsələrində gəzdirdi. – Bu dünyada hər şeydən artıq, hüquqa dair əsər yazılmışdır. – Professor gülümsəyib Mehmandan soruşdu. – Bilirsinizmi niyə? – Özü də cavab verdi, – çünki bu dünyada bizim sosialist inqilabına qədər zorakılıq, haqsızlıq hər şeydən çox olmuşdur!.. Bunun da dərin iqtisadi-siyasi səbəbləri vardır!.. Mən sizə məsləhət görürəm ki, elmi işiniz üçün bu cəhətləri nəzərə alasınız... Çünki dərin tədqiqat, böyük əmək və yuxusuz gecələr olmadan elmi əsər yarana bilməz!..

– Düzü, professor, mən bizim Azərbaycan dövlət hüququna aid tarixi materialı az tapıram!

– Məyus olmayın, dama-dama göl olar!

– Professor, mənim mövzumu bəyəndinizmi?

– Bəyəndim, ancaq çox çətindir, çox da vacibdir!

– Mən fikirləşdim ki, Fransada filan kralın dövründə hüquq məsələsini, ya da qədim Romada köləlik dövrünə aid filan şeyi yazınca, buradan

başlayım!.. Necə deyərlər, "özünə umac ova bilməyir, özgəyə əriştə doğrayır" məsələsi olmasın. "Fransada filan Lüdviqin hakimiyyəti dövründə hüquq normaları", yaxud "Qədim Romada filan hüququ?!"

– Bunları da bilmək lazımdır, oğul, – deyə professor Məlikzadə əlini Mehmanın çiyninə qoydu. – Bunlarsız da qədim dövrü dərk edib bir dəyərli elmi əsər yaratmaq olmaz!.. Çünki elm genişlik, çərçivələri qırmağı tələb edir!.. Ancaq öz zəmindən və tamam-kamal əlini üzüb qopmaq olmaz!.. Mən ürəkdən çox şad oluram ki, bizim gənclik belə məsələlərin qoyulmasını dərk etmişdir. Xalqa "böyük, böyük" deməklə, öz-özünə axınla böyük olmaz! Xalqın mənəvi böyüklüyü, görürsənmi, bu qalın cildli, yer-yurd tutmayan kitablarla ölçülür... Məsələn, sayca böyük olmayan yunan xalqı baxın, tarix üçün, elm və fəlsəfə üçün də nə kimi başla böyük əsər yaranır, xırda bir başla nə yarana bilər? Xırda baş ancaq öz böyük qarnını güdər!

Professor danışa-danışa kitabxanaçını çağırdı, gəzə-gəzə gedib səqfə qədər mərtəbələrə dolmuş kitabların qabağında dayandı. Xeyli baxdı, pilləkəni düzəldib yuxarı qalxdı, iki kitab endirib Mehmana verdi:

– Bu pilləkənlə biz ki, belə yuxarı qalxırıq, yəqin ki, yüksələcəyik! – Məlikzadə dolu döşlə güldü, onun ağ bığları, çənəsindəki ağ saqqalı titrəyib əsdi. – Mən şadam, çox-çox şadam ki, siz elm yolunu tutursunuz, bax bu pilləkən yolunu!.. Mənim məsləhətim belədir ki, heç bir inzibati işə getməyəsiniz. Çünki insan ömrü özü də vaxtdır, onu əsla itirmək, hədər yerə sərf etmək olmaz!.. Bəli, mən sizə fakültənin aşağı siniflərində dərs düzəldərəm. Burada çalışarsınız, böyük hüquqşünaslardan birisi olaraq yetişərsiniz. Təkrar edirəm, ölüncə də deyəcəyəm: bizim xalq üçün böyük əql və məntiq sahibi çox-çox böyük hüquqşünaslar lazımdır!

– Mən indi, professor, elmi tədqiqatımı təcrübə ilə bağlamaq üçün bir neçə il işə getmək istəyirəm.

– Hara belə?

– Bir rayona!

– Rayonamı? Yox, oğlum, mən razı ola bilməyəcəyəm, bir əldə iki qarpız?.. Çox çətindir!

– Bəs hüquq fakültəsi nə üçündür, professor?

– Mən bu barədə sizinlə əsla razı ola bilməyəcəyəm... Heç razı ola bilməyəcəyəm! – Məlikzadə əlini qaldırıb yellədi, – aralanmaq, elmdən qopmaq? Yox əsla!.. Elm müntəzəm işləyən yaradıcı bir baş, gecəli-

gündüzlü stoldan qopmayan bir kəllə istəyir! Elm qurğuşun kimi ağırlıq, özü də çox möhkəm bir sanbal istəyir!... Saytal adam olmaq üçün sanballı bir kəlləyə malik olmaq gərəkdir!.. Yoxsa dik-diringilə heç bir əsər yaranmaz! Oturmaq, ağır oturub batman gəlmək lazımdır!..

– Professor, axı hərəkətsiz inkişaf yoxdur, deyiblər!

– Ayaqdan qabaq, başla hərəkət! Yox, yox otur bax, burada, bu qalın cildli kitabların arasında! Rayon nədir? Yox, yox mən razı ola bilməyəcəyəm!

– Nə üçün belə bir ifrata varmaq, professor?

– Çünki, əzizim, səndən yaxşı bir elmi işçi çıxar! Çünki hüquq elminin sənin kimi gələcəkli gənclərə ehtiyacı çoxdur! – Professor dəsmalını çıxarıb alnında muncuqlanan tərini sildi. – Qal, qal! Sən burada, bu kitabxanada qal! Mən səndən böyük bir elm adamı gözləyirəm! Sən əgər belə yüngül müqavimət yolu ilə getsən, mən səndən nə gözləyəcəyəm? – Professor bu dəfə də dəsmalı ilə acışan gözlərini sildi. – Böyük dərddir, qanunu sənə tapşırsınlar, sən özün də nəticədə dolaşıb həbs ediləsən?.. Bəlkə başqası düşünmür, mən bu barədə düşünürəm!.. matməəttələm. – Məlikzadə əllərini dizlərinə çırpdı, – lap məəttəl!..

– Səbəbini izah etsəniz olmazmı, professor?

– Səbəbi? Səbəbi, ləkə! Kimsə, hansı vicdansızsa hansı qayəsizməsləksiz, hansı qaranlıq, xəlvəti bir küncdə-bucaqda, hər hansı bir cilddə isə gizlənib gözə girir, girəvə düşən kimi bizim, gül kimi aydan arı, sudan duru adamlarımızı alçaqcasına ləkələyir! Gül kimi uşaqlar qurtarır, axırı nə olur?.. Qal, qal burada!.. Deyib də məni əsəbiləşdirdiniz!

– Bağışlayın, professor, bizim hüquq fakültəsi məgər yalnız bu kitabxanalar üçündürmü?..

Professor daha da əsəbiləşdi, o addımlayıb Mehmandan uzaqlaşa-uzaqlaşa:

– Daha mən onu bilmirəm! – dedi. – Heç bir şey bilmirəm! Mən sizdən dərin bilikli bir alim gözləyirdim!

– Elm həyat üçün, mübarizə, tərəqqi, inkişaf üçündür, – deyə Mehman özlüyündə söyləndi, – yoxsa bizim hörmətli professor, elmi həyatdan qoparmaqla mücərrədliyə, ulduzlara gedir?!.

Sonra Mehman, qoltuğunda kitab dayanıb fikir içində kitabxanaya xeyli baxdı: "Bu da doğrudur ki, bizə belə qalın cildli kitablar yaratmaq lazımdır! Biz kitabsız, quru, boş əllə hüquq elmini öyrənə bilmərik!"

O qiraət salonunun qapısını açıb stulun üstündə əyləşdi.

“Təcrübə də lazımdır, həyat da!.. Elmi də, həyatı da!.. Adam özü təmiz bir adam olandan sonra, onu necə ləkələyə bilərlər?.. Bizim hörmətli professor bu barədə hansı bir yanlış hissə isə qapılır, qoca birtərəfli düşünür, bilmir ki, kitab həyat üçündür!”

Mehman professor verdiyi kitabların birisini açdı, vərəqlədi, burada onu maraqlandıran xeyli material olduğunu görüb çox sevindi. Gözəl professordur, heyif ki, bir az şəkkak, həm də bir xeyli əsəbidir!.. Mən bilmirəm, həyatla bağlanmayan, onda gündə-gündə xidmət etməyən bir elm kimə gərəkdir? Mehman qələmi götürüb bir neçə vərəq yazdı, oxuyub sükuta getdi. “Olacaqdır, çıxacaqdır!.. Mütləq çıxacaqdır!.. Qalın cildlərlə bizim hüquq əsərlərini yazmaq da lazım olacaqdır!.. Professorun dediyi kimi hüquqşünaslarımız belə bir hiss ilə yaşasalar əlbəttə, belə kitablar yaranar”. – Mehman düşündüyü zaman Katibə xala əlini Mehmanın çiyninə yavaşca qoyub:

– Sizi çağırırlar, – dedi.

– Kim?.. Professormu? – Mehman sevindi, professoru əsəbiləşdirdiyi üçün ondan üzr istəmək, mümkün qədər qocaya izahat vermək istədi. – Professor öz kabinetindədirmi?

– Yox!

– Bəs məni kim çağırır?

– Qayınanan, – Katibə xala usta bir mədəniyyətlə gülümsədi, – Şəhla bacım çağırır!

– Nə barədə?

– Yoxsa telefona da getmək istəmirsiniz?

– Nə üçün?..

– İcazə verin deyim ki, Mehman burada yoxdur!

– Yox, yalan demək yaramaz!

– Nə üçün, əgər istəmirsinizsə?..

– Mən burada olduğum halda necə elə demək olar?

– Onda buyurun!

– Ancaq?.. Yaxşı! – deyə Mehman ayağa durub getdi, Katibə xalanın yan tərəfdən asdığı telefon dəstəyini götürdü.

– Qulaq asıram... Bəli, salam... Çox sağ olun... yaxşıyam... Başım çox qarışıqdır... Yox, söz verə bilmərəm, çünki çox mühüm işim var... Xeyr. Füzuli divanə çəksə də, mən ondan üzr istəyirəm!.. Heç olmazsa biz də Füzulinin yüzdə biri qədər yadigar qoymalıyıq! Yox... Xeyr!.. Üzr istəyirəm!..

Mehmanı çağıran Şəhla xanım olsa da danışan Züleyxa idi. Güman ki, anası özü, öz əlilə telefon dəstəyini qızına vermişdi, Züleyxa Mehmanın bu cür soyuq rəftarını, yenə də qeyri-müəyyən cavabını görüb pərt oldu, dəstəyi yerinə qoymaq istəyincə, Şəhla xanım dəstəyi ondan aldı:

– Danışan Şəhladır. Axşam saat yeddi tamamda sizi gözləyirəm! – deyə tez dəstəyi öz yerindən asdı. Mehman cavab verə bilmədi.

Katibə xala bu təzadlı mənzərəni hiyləgər bir nəzərlə süzüb:

Çəkişməsən bərkişməzsən, – dedi. – Nə var, cavan oğlan?!

– Elə bir şey yoxdur. – Mehman çəkilib yenə də öz iş stoluna getdi. O, kitabları nə qədər vərəqlədi, əlinə qələm alıb yazmaq istədi, təəccüblü görünsə də bir şey çıxmadı. Mehman kitablarını, yazılarını stolun gözünə yığıb kilidlədi, açarı cibinə qoyub çıxdı...

## IX

Qırmızı rəngli tramvaylar şəhərin içilə zırınqazırınqla hərəkət edirdi. Ağ libaslı adamlar küçə boyu izdihamla axışır, dalğalanan Xəzər sahilinə doğru yeriyirdilər. Mehman dolaşıq fikirlər içində dəniz sahilinə doğru hərəkət etdi. O, adamları yara-yara yeridi. Yastı balabanlar, tütəklər çalınır, dəflər, nağaralar vurulur, gənclər bəzəkli qayıqlara doluşur, Xəzərdə gəzintiyə çıxırdılar. Mehman sahil boyu xeyli gəzib dolandı. O, dalğaların süpürləşməsinə, qoşa gəzib dolanan oğlan-qızların balaca-balaca qayıqlara doluşmalarına xeyli tamaşa etdi. Nəhayət, Mehman da keçib qayıqda əyləşdi. Göy köpüklü dalğalar arası qayığın necə getdiyini, necə dolanıb gəzdiyini bilmədi. Mehman xof ilə rica arasında qalmışdı: "Gedim, getməyim?.. Yaxşı olmaz, gedim!.. Yox, gedim birdəfəlik cavab verim ki, anam-bacım mən bu işdə yoxam!" – Mehman tərəddüd içində dolaşdı. Onun ürəyi gənc sinəsi altında sanki bir çapar kimi çapır, köksünə sığmaq istəmirdi. O çox mürəkkəb bir hal keçirir, çox vacib bir məsələnin həlli üçün qərar çıxarmaq istəyirdi. Mehman hələ də bu xüsusda anasına heç bir söz açıb deməmişdi. O, illər uzunu arzu etmişdi ki, ali təhsil alsın, anasının böyük qayğılarına cavab olaraq doyunca ona xidmət etsin, anasını evarası işlərdən, yaşına uyğun olmayan artıq zəhmətlərdən xilas etsin. "Ana, bax bu qədər mənim məvacibim, o da atamdan yana sənə verilən təqaüd!.. Bax, gör heç bu pulu yığışdırmaq olarmı!" desin... "Bax indi sən rahatlana bilərsən, mənim borcum sənə doyunca xidmət etmək, sənin ümman qədər yaxşılığına bir az da olsa cavab verməkdir!.."

İndi?.. Bəs indi hansı bir hiss ona güc gəlmək istəyir? Nə üçün Mehman bu barədə anasına öz sirrini açmaqdan çəkinir?.. Hansı bir qüvvədir ki, Mehmanın mühakimə və şüurunun əleyhinə çıxmaq, bu yolda ona qılınc çəkib güc gəlmək istəyir? Bu vaxta qədər Mehman baş qaldırıb yad bir gözlə qıza baxmamış, bu haqda o, heç öz-özlüyündə olsa belə bir müzakirə açmamışdı. Lakin Züleyxa ilə olan söhbətlər, onun üzə düşüb Şəhla xanımın təklifindən çıxa bilməməsi, Mehmanın o evdə gecələməsi, Züleyxanın səmimi görünən çox dərin iztirabları Mehman üçün elə beləcə də ötüb keçməmiş, görünür, ona çox dərin təsirlər buraxmışdı...

Fikirləşdikcə, düşündükcə Mehmanın həyəcanı artır, vücudu qızışır, daxildə dalğalanıb çırpınan bir hiss ona qalib gəlirdi. Mehman bu kəşməkəşli dalğalar içində qol-qanad çalır, gəncliyin tükənməz, coşqun hissi, ecazkar bir sirr kimi, onun mühakimələrinə üstün gəlməyə başlayırdı... Mehman evlərinə dönmədən Şəhla xanımgilə tərəf yol aldı, dərin ürək çırpıntıları içində addımladı, nəhayət o, dolana-dolana gedib Şəhla xanımgilə çıxdı. Şəhla xanım, yenə də Mehmanı xoş-beşlə qarşılayıb onun qolundan tutdu, divarda hərəkət edən saatı göstərdi:

– Nə deyir?

– Üzr istəyirəm, çünki...

– Üzr yox, cəza!..

Mehman stula oturdu. Bayaqdan geyinib-kecinmiş, hazırlanmış Züleyxa üzünü yan tərəfə tutub pəncərədən bayıra baxmağa başladı. Şəhla xanım əlüstü çay gətirdi, yenə müxtəlif mürəbbələrdən stola düzdü. Mehman "sağ ol", – deyib bir qurtum da çay içmədi. Lampalar tez-tez yanmağa, şəhəri bir çilçırağa döndərməyə başladı. Hövsələsi darıxan Şəhla xanım ayağa qalxıb:

– Mən burada oturub sizin üçün küsülü barışdıran deyiləm, – deyib mətləbə keçdi, – xalası parka getmək üçün iki bilet göndərmişdi. Dedim ikimiz gedək, gördüm ki, mən daha bu xanım qızın yaraşığını yad eləyirəm. Dedim ki, onda ikiniz gedin! Gördüm ki, qızın çiçəyi çırtladı. Sən də ki, belə gəlib çıxdın, oğul!

– Mənim işim var idi, üzr istəyirəm, – deyə Mehman, mümkün dairədə pərdəni açmaq, öz münasibətini bildirmək istəyirdi. Buna görə o yer-yurdu qurdalayıb döşəmə üzərinə salınmış fərşin naxışlarını sayır kimi qırıq-qırıq danışmağa başladı, – mən, düzü, sizin çağırışınıza görə gəlməmişəm, Şəhla xanım... Gəlmişəm ki, bir qədər də açıq danışaq, mətləb aydın olsun!..

– Küsülü yerdə nə açıq-aydın danışmaq? – deyə Şəhla xanım Züleyxanın və Mehmanın qolundan yapışıb, üstünü vurmadan zarafata saldı, onları ərklə itələyə-itələyə gətirib qapıdan bayıra çıxardı.

– Mən burada hakim deyiləm, gedin özünüz bilin!.. Onlar istər-istəməz pilləkəndən aşağı düşdülər. İkisi də birlikdə üzüaşağı enib zırınqıltılı tramvaya çatdılar. Bir neçə dolu tramvay buraxıb axırda nisbətən asudə bir tramvaya mindilər, şəhər küçələrini keçib park səmtinə gedən tramvaya əyləşdilər, parkın qabağında düşdülər. Züleyxa qapı yanında duran nəzarətçiyə iki bilet göstərdi, onlar parka girdilər, xeyli dinməz-söyləməz gəzib dolandılar. Yaşıllıq içində üzən parkı musiqi səsləri bürümüşdü. Gülmək, şaqqıldamaq göyün yeddi qatına çıxmışdı. Oğlan-qızla dolu uçuncaqlar, yelləncəklər havada fırlanırdı. Ağaclar altında qoyulmuş stol ətrafında əyləşən adamlardan kimisi içir, kimisi yeyirdi. Onlar hər ikisi düşünür, getdikcə Züleyxanın küskünlüyü görünür, Mehmanın rəhmi artır, bu səmimi görünən həqiqi iztiraba qarşı onun ürəyi yumşalırdı. İndi Mehman bu iztiraba cavab vermək istəyirdi. Görünür ki, Mehman üçün qaçmaq yolları bir-bir örtülüb tezcə-tezcə bağlanırdı. Züleyxa isə artıq üzücü iztirablarına nəhayət vermək, özünü Mehmanda baş qaldıran məhəbbət hissinə təslim etmək, dözülməz yorğunluqdan özünü xilas etmək istəyirdi. Beləliklə onlar gəzə-dolana, kölgəli ardıc ağaclarının altında, dəmir ayaqlı skamyanın üstündə qərar tutdular. Səssiz və iztirablı dəqiqələr, nəfəsi qaldıracaq bir ağırlıqda gəlib keçdi... Birdən, Züleyxa boğuqca ağlamağa, belə bir qeyri-müəyyən sükuta qarşı etiraz səslərini büruzə verməyə başladı.

İndiyə qədər Züleyxadan bir növ çəkinib-qaçan Mehmanda indi nə isə gizli bir bağlılıq özünü büruzə verdi... qızın çox ətirli saçlarını qoxulamaq, hətta onu öpməyə cəsarət etmədən, mat-məəttəl dayanıb durmaq özü belə Mehmanda xoş bir hiss doğurdu... Bu əsrarlı hiss yaxıcı bir od, bir atəş kimi təpədən dırnağa qədər, Mehmanı bürüyüb, sarsıtmağa başladı. Danışmaq istəməyən Mehmanın nitqi tutulurdu... Burada, bu bağda özü də bu vəziyyətdə üzə gəlib açılışmaq hansı dillə Züleyxaya rədd cavabı verib: “Mən səni sevmirəm!” demək, nəinki Mehman üçün çətindi, hətta mümkün deyildi. Əksinə, indi Mehman get-gedə təslim olduğunu hansı, bir cazibə qüvvəsiləsə bu kövrələn qıza bağlandığını duyur, indiyə qədər qızın iztirabla dolu məktublarına cavab verməməklə özünü müqəssir sayırdı. Mehman, başını artıq onun köksünə söykəyən, aramsız göz yaşları axıdan qızın iztirablarına şərik olurdu... Niyə indiyə

qədər soyuq, etinasız görünən Mehman indi Züleyxaya sözsüz təslim olur, onu çulğayan alovlu atəşin müqabilində acizlik edirdi?.. Bu hiss indi burada birdən-birəmi əmələ gəlmişdi!.. Yox, yox, bu hiss Mehmanın qıza qarşı qəti, müəyyən bir mövqe tutmamağında, indiyə qədər ona rədd cavabı verməməyində, bir tərəddüdün, bəlkə də Mehmanın özünə belə aydın olmayan bir tərəddüdün, vurub bir sahilə çıxmamağında "hə", "yox" deyə apaydın cavab verməməyində idi?!. Ayrı cürə yaraşmayan bir oyunbazlığa girişməyinə dəyərdimi?.. Mehman quru təbiətli olsa da onun fitrəti saxtakarlığa, hoqqabazlığa biganə idi! Getdikcə burada coşub-daşan bir hiss Mehmana güc gəlir, gənc oğlanın sinəsi qabarıb-enir, onun əli göz yaşlarını axıdan Züleyxanın saçlarında aramla gəzir, titrək barmaqları Züleyxanın pərakəndələşən sıx qara saçlarını alnından geriyə darayır, ancaq bu mövqedə yenə də açılışıb qəti bir söz deyə bilmirdi... Züleyxa isə bu üstüörtülü etirazın müqabilində ərköyünlüklə kövrəlir, iztirablarına cavab aldığını yəqin edib göz yaşlarını axıtmaqdan doymurdu. Onlardan bir kəs dillənməsə də döyünən ürəkləri bir-birilə danışırdı...

## X

Hüquq fakültəsinin buraxılışı üçün verilmiş məzuniyyətin vaxtı bitmişdi. Tələbələr bir-bir kabinetə daxil olub çıxır, müəyyən rayonlara təyin edilib vəzifəyə göndərilirdilər. Onlardan kimisi öz təyinatından razı qalıb sevinir, kimisi də narazı olub deyinirdi. Mehman da öz növbəsində içəriyə girib respublika prokuroruna salam verdi, ortaboylu, enlikürəkli respublika prokuroru ayağa qalxıb Mehmanla görüşdü:

– Professor Məlikzadə sizdən çox söyləmişdir, – deyə o siyahıda etdiyi qeydə baxdı, – mən də, düzü, bu təklifi müdafiə edirəm. Doğrudan da, siz hüquq fakültəsində qalıb həm elmi işlə məşğul olar, həm də aşağı siniflərdə dərs deyə bilərsiniz.

Mehman dinmədən fikirli gözlərilə ona baxdı, respublika prokuroru Mehmanın bu təkliflə razılaşmadığını hiss edərək:

– Nə fikirləşirsiniz? – deyə təkrar ona müraciət etdi. – Bu təklifdən yaxşı sizin üçün nə ola bilər? Çox böyük xoşbəxtlikdir! Görünür ki, təbiət sizdən istedadı əsirgəməyibdir!.. Bizim respublikada nəzəriyyəçi hüquqşünaslara çox böyük ehtiyac var! Siz də hələ gəncsiniz, çalışmaq üçün nə qədər də vaxtınız vardır!.. Bizim quruluşda hər hansı ictimai

faydalı istedada nə qədər desən geniş yol vardır!.. Xalq öz böyük hüquqşünası, natiqi ilə də, başqa-başqa alim, şair, sənətkarı kimi fəxr etməlidir. Bu cəhət həm də xalqın yetkinliyini daha bariz surətdə sübut edə bilər!..

Mehman bu yüksək qiymətə qarşı qıpqırmızı qızarıb:

– Hamı belə deyir, qiymətli adamlar məmləkətin sərvətidir, – dedi. – Ancaq mən əsla özümü bu yüksək qiymətə layiq görə bilmərəm. Mən adi bir məzunam, mən ancaq vətən qarşısında hədsiz dərəcədə borcluyam!.. Bizim fakültədə məndən də qat-qat yüksək, əlaçı tələbələr vardır!.. Mənsə hələ borcunu ödəməmiş bir borcluyam, vəssalam!

Bu əsnada telefon səsləndi, Mehman sözünü kəsdi, respublika prokuroru dəstəyi götürüb:

– Bəli, – deyə cavab verdi, müəyyən fasilədən sonra əlavə etdi. – Bəli, gəlmişdir, – dedi. O, qırmızı karandaşını götürüb Mehmanın adının altından iri bir cızıq çəkdi. – İndi elə o barədə söhbət edirik... Məncə razı olar!.. Başqaları şəhərdə, burada aparatda qalmaq üçün yüz cür minnətçi salır!.. Yox, hələ özü elə başabatan bir söz demir. Siz arxayın olun, professor, sizin tələbənizi elmi işdən ayırmayacağıq!

Prokuror dəstəyi telefonun üstünə qoyub:

– Professordur, – dedi, – sizi soruşurdu. Çox narahat olur. Dünən bizim evə də zəng etmişdi. Bir neçə gün əvvəl buraya da gəlmişdi. Biz sizi axtardıq, tapa bilmədik. Dedik, gənc adamdır, əlbət ağır təhsil illərindən sonra, nəfəs alır, dincəlir. – Prokuror güldü. – Nə üçün?.. Dincəlmək də olar! Gənclik ömrün bahar çağıdır. Onu da mənasız yerə ötürüb buraxmaq olmaz!.. Mən məna deyirəm, boşluq, ya düşünülməmiş hərəkətlər yox!.. Sofi kimi yatmaq, əyyaş kimi məst olub mürgüləmək də olmaz! Gəncliyin mənası dərindir; həqiqi mənasında işləmək, namusla yaşamaq lazımdır!

Prokuror bir qədər danışdıqdan sonra, axırda əlini Mehmana uzadıb:

– Böyük müvəffəqiyyətlər diləyirəm, – dedi. – Sizin kimi bir neçə məzunun, hər bir buraxılışında üç-dörd nəfərin elmi-nəzəri işdə saxlanması bizim üçün işlərimizə, o cümlədən gələcək təcrübi işlərimizi özünə də çox böyük faydası ola biləcəyi şübhəsizdir! Elm təcrübənin fənəridir!

Mehman təmkinlə ayağa qalxıb:

– Mən isə öz həyatımı ayrı cürə qurmağı düşünürəm, – dedi.

– Siz necə düşünürsünüz?..

– Mən tamam on dörd il skamyada oturmuşam. Adam dörd divar arasında bütün ömrü uzunu otura bilməz! Mən istəyirəm divarlardan çıxıb adi, geniş kütlə ilə işləyim... Hüquq elmini də həyatımda təcrübə edim. Bir neçə il sonra icazənizlə sizə müraciət edib buraya, Bakıya qayıdaram. Mən üzərində işlədiyim kitabları da özümlə götürəcəyəm! Gündüzləri vəzifədə çalışıb axşamları elmi işlə məşğul olacağam!.. Bu barədə mən özüm gedib professordan üzr istəyib ondan icazə ala bilərəm!

– Siz açılan elm qapısını niyə öz əllərinizlə qapayırsınız, oğlan?

– Mən həyatı da, özümü də sınamaq istəyirəm, yoldaş respublika prokuroru!

– Siz neçə ildən sonra qayıtmaq istəyirsiniz? – deyə prokuror əlini qısa bığlarına apardı. – Sonra maraq sönməzmi, sizin üçün gec olmazmı?

– İki-üç ildən sonra dönmək istərdim!

– Gec olacaq! – deyə respublika prokuroru öz narazılığını bildirdi. – Biz yaxın illər ərzində, bir dəstə bilikli hüquqşünaslar hazırlamaq istəyirik!

– Bəli, təqdirə layiq bir təşəbbüsdür!

– Bəs siz niyə təqdirə layiq təşəbbüsə qol qoymursunuz?

– Mən öz yolumu başqa cürə seçmişəm, yoldaş respublika prokuroru!

– Könülə güc olmaz, – deyə respublika prokuroru öz qırmızı karandaşını qaldırıb stolun şüşəsinə vurdu. – Ancaq Məlikzadə heç bir gənc məzun üzərində bu qədər təkid etməmişdi!

– Mənim də həm professora, həm də sizə tükənməz ehtiramım vardır! Özüm də çalışacağam ki, mənə tapşırılan bu hörmət və etibarı doğruldum, sizin qarşınızda alnıaçıq dayanım!

– Bəli, alnıaçıqlıq, bu çox böyük, çox əsaslı məsələ, həm də birinci şərtdir! – deyə respublika prokuroru altdan yuxarı Mehmanı gözdən keçirtdi. – Özü də bizim işimizdə! Qanun qılıncı polad kimi möhkəm, güzgüdən də parlaq olmalıdır! Ona heç bir pas, heç bir ləkə düşməməlidir! Yoxsa bu qılınc korşalar! – Respublika prokuroru danışa-danışa rayonlar yazılmış uzun siyahını nəzərdən keçirtdi. – Bəli, gənc oğlan mən yenə sizə fikirləşmək üçün imkan verirəm!..

– Xeyr, mənim sözüm qətidir, yoldaş respublika prokuroru!

– Onda cavan oğlan, yaxın, yaxşı rayonların birisinə, Belə ki, Bakıdan, professordan üzülməyəsiniz!

– Nə barədə?

– O barədə ki, elmi işə qarşı marağınız soyumasın!

Prokuror rayonları yenə nəzərdən keçirib:

– Yenə də sizə mümkünat verirəm, – dedi. – yaxın, yaşı rayonların birisinə!

– Mənim üçün rayonun heç bir fərqi yoxdur, – deyə Mehman cavab verdi. – Ancaq mən xahiş edirəm ki, hansı rayonda qanun çox təhrif olunursa, məni oraya göndərəsiniz!

Respublika prokuroru dəstəyi götürüb professora zəng etdi... Onlar çox danışdılar, axırda professorun:

– Daha özü bilər, – deyə telefon dəstəyindən yayılan acıqlı səsini Mehman özü də eşitdi və başını aşağı saldı.

Prokuror rayonları təkrar-təkrar nəzərdən keçirib axırda:

– İndi ki, inad edirsiniz, bax buraya, – deyə rayonun adını çəkdi. – düzünü desəm, bizim canımızı bura lap xirtdəyimizə yığıbdır! Biz buraya adam göndərməkdən yorulmuşuq, orada kimlərisə ləkələməkdən yorulmayıblar!..

Prokurorun ağzından ayrı bir kinayə ilə çıxan bu "ləkə" sözü müqabilində, Mehman bir an sükuta getdi. Bayaqdan işarələr və təşbehlərlə danışan respublika prokuroru bu "ləkə" məfhumunu xüsusi bir ahənglə qeyd etdi, Mehmanı ayıq salmaq üçün bəri başdan onu xəbərdar etmək istədi. Bu zaman ağsaçlı Məlikə xanımın siması da gəlib Mehmanın gözləri qabağında canlandı.

– Nə fikirləşirsiniz?

– Mən bu sözü eşitmişəm, yoldaş respublika prokuroru!

– Siz çox gəncsiniz, mən bəri başdan oranın xüsusi şəraitini sizə deməyə məcbur oldum!

– Eyb etməz, ona görə də elə mən oraya getmək, özümü də sınaqdan çıxarmaq istəyirəm!..

## XI

Mehmanın anası böyük bir təlaşla oğlunun şeylərini yığışdırır, təzə gəlin isə küncdəki balaca ayna qabağında özünü düzəldirdi.

– Mən də gedəcəyəm, ana!

– Sən hara, bala? Qoy Mehman getsin, yer-yurdunu bir düzəltsin, biz də baxaq görək, getməli yerdir, ya yox?

Bu zaman sir-sifətində yorğunluq görünən, ancaq öz məqsədinə nail olan Mehman qapıdan içəri girib:

– Daha tamam üzülüşdük, – dedi. – Sabah mütləq yola düşməli olacağam! – O, şeylərinə baxdı, çamadanını düzəltdi.
– Mehman mən də gedəcəyəm!
– Hara, Züleyxa?
– Sən hara, mən də ora!
– İndi yaramaz, Züleyxa!
– Yaramaz, gəzib gələrəm!
Ailədə bu söhbət xeyli uzandı, lakin Züleyxa Mehmandan qopmaq istəmədən öz dediyində dayandı:
– Mən mütləq gedəcəyəm, Mehman!
– Bəlkə ora çox narahatçılıqdır?
– Hər nə isə mən bilmirəm!..
Xatun, mübahisənin uzanmağını, pərdənin tez bir zamanda yırtılmağını istəməyib:
– Mən də heç sizi tək buraxa bilmərəm! – dedi.
– Yox, ana, siz hələ qalın, – deyə Züleyxa israr etdi. – Mən gedərəm, sonra yerimiz yaxşı olarsa, gəlib sizi özüm götürüb apararam!
– Yox, yox, qızım, belə olduğu zaman, sizi özbaşına buraxmaq olmaz!
Söz bir qədər də çəkdi. Züleyxa durub görüş üçün anasıgilə getdi. Xatun oğlunun əlindən tutub:
– Sizi tək buraxa bilmərəm, – dedi. – İkiniz də çox bilməmişsiniz. Özü də, Allah xeyir versin, bilmədim niyə tələsdin, bala?.. Bax, neçə gündür indidən belə qaşıq döyüşü?.. Özü əsla pis uşaq deyil, əgər onun forsu yeri-göyü yırtan o maması Şəhla xanım olmasaydı...
Mehman bu sözlərə cavab vermədən anasının könlünü almağa çalışdı, anası isə təkid edib, – “Sizi tək buraxa bilmərəm”, – deyib durdu. Çox danışıqdan sonra onlar iki gün içərisində tamamilə yığışıb hazırlaşdılar. Bilet aldılar, vaxt çatanda şeyləri bayıra çıxardılar, qapını çəkib bağladılar. Ana bir də qapını yoxlayıb qonum-qonşu ilə görüşdü.
Xatun öz evini həyət süpürgəçisi Nuru kişiyə tapşırıb:
– Ay Nuru qardaş, – deyə qəhərləndi, – siz allah bu ev-eşiyi gözləyin, haram əl dəyməsin!
– Arxayın olun, ay Xatun bacı, – deyə Nuru kişidən qabaq, arvadı Nuriyyə dilləndi. – Lap qızıl tökülsün!..
– Məsələ qızılda deyil, Nuriyyə bacı, məsələ halal olacağımızda haram əlin gəzməməyindədir!
– Öz evimiz kimi baxarıq, – deyə Nuriyyə, Xatun arvadın boynunu qucaqladı, – yaxşı yol, Allah özü xeyir versin!..

Hər ikisi ağladı.

– Elə bil dünyadan həmişəlik, ayrılıram, Nuru qardaş!

– Elə bizim üçün də çətindir, – deyə Nuru kişi öskürə-öskürə dilləndi.

– Barı bizim Nəriman da bu gün evdə yoxdur, – deyə Nuriyyə xala narazı halda dilləndi, – barı sizin şey-şüyə kömək edəydi vağzalacan!

Nuru kişi özü şey-şüyə əl atdı:

– Mehmanın qoca dayısı ölməyib ki, bacımı özüm yola salacağam!

Onlar çox çəkmədən vağzala çatdılar. Şəhla xanım və Katibə xala da gül dəstəsi ilə vağzala gəldilər. Qatar dəmiryol üzərinə verildi. Parovoz dərindən fısıldadı. Mehmanın anası birinci dəfə idi ki, yola, belə uzun bir səfərə çıxırdı. Onun rəngi ağardı, gözünü oğlundan çəkmədi. Şəhla xanım və Katibə xala Mehmanı əldən qoymurdular.

– Züleyxa ərköyün böyüyüb, bax ki, xəstələnməsin, Mehman!

Katibə xala isə bacısı Şəhlaya macal vermədən:

– Mən özüm də professordan icazə alıb bir həftəliyə gələcəyəm! – deyir, Mehmanın ağ pencəyinin düymələrini çəkişdirirdi. – İşdir, bir şey olsa, tükü-tükə tutdurun, mən zümrüd quşu kimi qulluğunuzda hazıram. Bir də ürəyinizi qısmayın, lap dağ boyda bir işiniz düşsə, o aparatda mən aşıraram! Çünki müavin Əbdülqədir özümüzünküdür, bibiqızının kürəkənidir!

Züleyxa tərs nəzərlərilə Katibə xalasını süzüb:

– Çox sağ olun, – dedi, – çox razıyıq, xalası! Sizə zəhmət olar! Bir də bizim öz anamız öz yanımızdadır!

Şəhla xanım aralıda, şeylərin yanında dayanan Xatuna nəzər saldı. Sərnişinlər qatarın hərəkəti barəsində radio vasitəsilə xəbərdar edildi. Adamlar qatara tərəf hərəkət etdilər. Şəhla xanım əvvəlcə Züleyxanı, sonra Mehmanı öpdü, axırda üzünü Xatuna tərəf tutub:

– Ay arvad, – dedi, – gedirsən get, ancaq bu uşaqlardan muğayat ol!.. Nədən ki, sən bir az başısoyuqsan!..

Xatun dönüb Şəhla xanıma kəc bir nəzər saldı, ona tutarlı bir söz demək istədi, ancaq sözü boğazında boğdu.

– Deyirəm ki, uşaqlardan muğayat ol, eşidirsənmi?

Xatun cavab vermədi.

– Mehman işləyəcək, Züleyxa da körpə uşaqdır, – deyə Şəhla xanım sözünü təkrar edib özünü dartdı. – Gərək onun da istirahətini bir düzəldən olsun, onu demək istəyirəm, ay arvad!

Onlar vaqona yığıldılar, Katibə xala da həm Züleyxanı, həm də Mehmanı öpdü. Züleyxa isə xalasına qarşı acıqlanıb qısqanclıqla:

– Yaxşı, qatar indicə tərpənər – dedi, – Məkkəyə getmirik ki!

## XII

Mehmanın ailəsi, çox da böyük olmayan, yanı mətbəxli bir otaqda yerləşdi. Züleyxa otağa nə qədər bəzək-düzək vurmaq istədisə, yenə də əmələ gəlmədi; suvağın üstündən vurulan kağızlar hamısı qabarmışdı. Əvvəlki prokuror Zalovdan sonra otaq ağzı bağlı qalmış, rütubət çəkən divarların naxışlı kağızları cırılmışdı.

İcraiyyə komitəsi sədri Kamilovun təkidinə baxmayaraq, müstəntiq Murtuzov bu otağa köçməmişdi; kənarda, ağzı düzə açılan köhnə mənzilində qalmışdı.

– Balam, bu xarabalıqdan bir abadanlığa çıxsana, ay Murtuz Murtuzov! – deyə Kamilov iltifat göstərmişdi.

– Yoldaş ispalkom, çox razıyam, ancaq sizin sağlığınıza təsdiqim gələndən sonra!.. Birdən mən öz köhnə yuvamı uçurub oraya köçdüm, təzə prokuror da vurub bu yandan gəldi, – Murtuzov boynunu sallamışdı, – sonrası bəs necə olsun?

– İş yerdədir, – deyə Kamilov özünü uca dağlar bərabərinə çəkmişdi. – Balam dağdan ağır adamıq, ağzımızda sənə bir quranlıq söz deyirik, sən də yassar kimi gözlərini döyürsən!.. Belə də iş olar, heç, Murtuzov?.. Adam da heç bu qədər şəkkak olar, vasvası olar, balam?.. İş burada yerli təşkilatdadır! Biz, yerli hökumət qərar qoyandan sonra, oradan daha nə ola bilər?.. Bir də "Vlast namestax!" deyiblər, balam! Lap mən özüm də bir kəndə gedəndə, yerli ispalkomun yanına gedirəm! Niyə? Çünki bünövrədir! Neçə ilin silistçisi ola-ola yerində dayanıb sayırsan!.. Bir irəliyə getməlisən, ya yox, balam?

Murtuzov:

– Mən sizdən çox razıyam, bu gün, başınız üçün, yoldaş raykoma da dedim, çox razıyam, yerdən göyə razıyam, – demişdi.

– Yoldaş raykom? – deyə Kamilov özünü çox yuxarı dartmışdı. – Ədə, adam ol ey, adam! Mən şəxsən özüm sənin məsələni qoymuşam. O gün büroda qoymuşam, katib Vahidova da demişəm, bu adam ki, belə tərtəmiz, özü də qönçədən çıxmış gül kimi, vicdanla işləyir, bu irəliyə getməlidir, ya geriyə? Mən məsələni qoyandan sonra, bir neçəsi etiraz edəndən sonra axırda mən sübut etmişəm ki, bu adam irəliyə getməlidir, əlbəttə getməlidir, irəliyə!

– Mənə bax, bu söz o qarlı dağdan yuxarıdır... Prokurorluğun işi tamamilə silistçidən asılıdır. Mən də sizi arxayın edirəm ki, son damla

qanıma qədər, bu yaramazların kökünü bu rayondan kəsəcəyəm! Bütün bu kulaq-mulaq qalıqlarının!

– Kəsmək lazımdır, bunların köklərini! Lazımdır birdəfəlik kəsmək, bu yaramazların köklərini üstündə də yekə-yekə ağaclardan tonqal qalamaq gərəkdir ki, daha cücərib bir də üzə çıxmasınlar!

– Düzü mən sizinlə məsləhət edib işə doğru-düzgün istiqamət verəndən sonra, hələ bir kərrə də görməmişəm ki, yuxarıdan, ali məhkəmədən bir işimizə etiraz edib bir barmaq qoyan olsun!

– Məsləhətli don gen olar, bala, – deyə Kamilov stuldan durub otaq boyu ağır-ağır gəzinmişdi. – Doğrudur, mən yurist-zad deyiləm, ancaq qandıqlarımdan məsləhət verə bilərəm. Doğrudur, mən elə sən deyən bir məktəbdə filanda da oxumamışam, ancaq bu praktika ki, var, kitab-mitab onun qabağında bir çürük qozdur!

– Buna heç söz ola bilməz, heç bir söz ola bilməz, yoldaş sədr, – deyə Murtuzov, Kamilovun daha da artıq xoşuna gəlmək üçün sivrilib dəridən çıxmağa çalışmışdı. – Təcrübə hər şeydir! Bir də sizin kimi böyük başın təcrübəsi! Məsələn, uşaqlar oturub-durub on il məktəbdə-filanda sümük sındırıb, kurs qurtarıb qayıdırlar, baxırsan ki, bir toyuq oğrusunu da yoluna qoya bilmirlər!

Kamilov yayıla-yayıla gülərək:

– Toyuğa da baş lazımdır, – deyə əlini uzatmışdı, – lap xoruza da, oğul!.. Əlbəttə, yurist gərək yumurtadan da baş çıxarsın. Yoxsa yumurta olmasa toyuq haradan çıxar? Yurist gərək bilsin ki, bunların hansı qabaqca əmələ gəlibdir?

Murtuzov böyük bir maraqla:

– Yoldaş sədr, siz yəqin bilərsiniz toyuq yumurtadan çıxıb, ya yumurta toyuqdan? – deyə xüsusi bir aləm kəşf edəcək kimi ağzıaçıq soruşmağa başlamışdı. – O gün yeməkxanada toyuqdan söz düşdü, mən dedim ki, o kişi belə müşkülləri açmaqda əllamə olar!

– Toyuq yumurtadan, yumurta da toyuqdan, ikisi də bir-birindən! – Kamilov hazırcavab bir adam kimi arxayınca cavab verdi.

– Hansı əvvəl, hansı sonra, yəqin ki, siz bilməmiş olmazsınız, yoldaş Kamilov, hə?

– İkisi də əvvəl, ikisi də sonra, qandınmı?.. Dialektika!.. Başa düşdünmü, küt balası, küt! Biz təzə yuristlərdən danışırıq, sən Əbucəhl oğlu, Əbucəhl, burada durub balaca bir yumurtadan dağ boyda dastan açıb söz güləşdirirsən!

– Aydındır, başın üçün!.. Tamam-kamal aydındır!..

– Bəs necə? Çağa da bilir ki, toyuq nədir, yumurta nə! Yoxsa çərən-pərən boşboğazlıq kimə gərəkdir?

– Bəli!.. Tamamən düz buyurursunuz!

– Onda qalan adamı da öyrət, qoy yetişsinlər! Yoxsa nə qədər kal qarpız olub qalmaq olar, balam?

– Başa düşdüm, ancaq insafən...

– Nə insafən?

– İnsafən mən də heç öz biliyimi heç birisindən əsirgəmirəm, ancaq özləri nankor çıxır...

– Qoy onda özlərindən küssünlər! Sən bilik ver, qoy götürən götürsün, götürməyən öz bəxtindən küssün! Arifə bir işarə, nadana min kötək!

– Bəli, mən işarəni başa düşdüm... Mən onu bilirəm ki, siz bu dünyanın altını da elə bil öz əlinizlə qoymusunuz, üstünü də, başınız üçün!

– Yaxşı, yaxşı, bu qədər də məni şişirtmə!

Sədr Murtuzova etiraz etsə də, bu sözlər onun canına sarı yağ kimi yayılmışdı. İndi birdən-birə yeni prokurorun buraya gəlməyi, Mehmanın birbaş işə başlamağı, Murtuzovun başındakı "xəyal-plovu" yerə tökmüş gecə də, gündüz də prokuror olmaq həvəsini gözlənilmədən alt-üst etmişdi. Murtuzov açıb-ağartmasa da, bərk-bərk gizlətməyə çalışsa da, Mehmanın buraya gəlməsi bir güllə olub Murtuzovun ciyərindən keçmişdi. "Bəxt gərək, bəxt!.. Yazıq Əbdülqədirin çalışmağı da görünür bada gedir?.." – deyə Murtuzov yanıxırdı... "Müavin Əbdülqədir daha nə eləsin?" O, respublika prokuroru müavinlərindən olan əziz dostu Əbdülqədirin də zəhmətinə yanırdı.

"Yazıq nə eləsin?.. Şərt dəryaya bir neçə dəfə tor atmaqda deyil, balıq çıxmaqdadır!.. Bu kişi, Kamilov buradan, o kişi, Əbdülqədir oradan, vurhavur çalışırlar, ancaq mənim torum boş çıxır ki, boş çıxır!.." Onunku-bununku qızılbalıq gətirir, mənim bəxtimə bir "ilanbalığı" da çıxmır!.. Çıxmır bir balıq ki, baxıb səksənəsən!.. Hey çopur yekə daş kimi bir yerdəyəm, bir yerdə! Deyirlər: – "Daş düşdüyü yerdə ağır olar". Bəyəm nə qədər, neçə il bu daş düşdüyü yerdə daş olub qalar! Axı bu bəxtəvər daşdır, mən diribaşlı adamam. – Elə bil ki, Murtuzovu gürzə vurmuşdu. – Yox, bu saçıburma oğlanın özünü gürzə kimi qəfildən çalmaq, bir nəfəsə başını yemək gərəkdir... Bəs nə ilə?.. Qılığına girmək, etibarını dəstələyib ələ almaq, zəhəri altdan-altdan yeridib ürəyinə çatdırmaq. Yoxsa biz Adəmdən Hatəmə burada gözümüzü ölü qoyun kimi döyüb qala bilmərik!.."

Murtuzov ilk dəqiqədən prokurorluğun xidmətçisi Qaloşlu adama Mehman haqqında işarə etmişdi. Murtuzov kimisini çaya susuz aparıb susuz da gətirməyi bacaran Qaloşlu adam işarəsiz də öz vəzifəsini bütün təfərrüatına qədər başa düşmüşdü:

## XIII

Bəli, Qaloşlu adam prokuror idarəsinin həyət-bacasını arxayın-arxayın süpürür, yerə səpələnmiş kağız qırıntılarını, papiros qır-qırıntılarını və kör-kötüklərini tərtəmiz yığırdı.

Mehman bu yeni mənzildə yerləşən gündən o, ev-eşiyi də təmizləyir; şey-şüyləri yerbəyer edir, qan-tər tökürdü. Qocanın bu halını görən Mehman anasına tapşırırdı ki, bu kişidən muğayat ol, həmişə işini qurtarandan sonra ona çörək ver, onu razı sal, yazıq fağır bir adamdır, görünür, kimi-kimsənəsi yoxdur.

Züleyxa bu kişinin qaloşuna, qaloşun ortadan kəndirlənməsinə, dizi yamaqlı, daram qalife şalvarına, yastılanıb üzü kimi qırışmış və bozarmış kepkasına baxanda gülməyə bilmirdi:

– Ay Mehman, sənin o qanun kitablarını bu kişi heç yerindən qaldıra bilməz, – deyir, qızara-qızara işvə ilə gülür və uğunub gedirdi, – məzəlidir, paltarı min bir rəng çalır, ala-bəzək bir şey...

– Qocaya gülmək olmaz! – deyə Mehman Züleyxanın üstünə acıqlanırdı, – qocaya hörmət eləmək, onun yolunu saxlamaq lazımdır!

– Yox, lap birtəhər qocadır, oranqutan kimi bir şey!..

– Yaramaz, Züleyxa, bu sözlər!..

– Zarafatdır edirik, Mehman!

– Zarafat nəzakətli olmalıdır, daha təhqiramiz yox!

Buna baxmayaraq Qaloşlu adam hər növ ilə özünü bu ailəyə canıyanan və yaxın adam kimi göstərməyə çalışırdı.

– Qadan alım qızım, quş südünə qədər nə buyruğun olsa, mən "Babayi-Əmir" kimi hazıram!

Züleyxa gülməyini boğazında boğub:

– Çox sağ ol əmi can, – deyə cavab verirdi, – razıyıq biz sizdən!..

Qaloşlu adam indi bu səhər də həyəti süpürmək bəhanəsilə özünü gənc prokurora göstərmək, onun pişvazına çıxmaq istəyirdi.

Mehman yorğun olduğundan yuxudan bu səhər bir az gec qalxmışdı. O əl-üzünü yuyaraq, bir fincan çay içib idarəyə getməyə hazırlaşırdı. Züleyxa yenə də zarafatla onu əyləndirmək istədi, lakin Mehman gülüm-

səyərək yaxasını bir təhərlə Züleyxadan qurtarıb qapıdan çıxdı, “darıxma, Züleyxa”, – deyərək eyvandan həyətə düşdü. Züleyxa yol boyu gözü işlədikcə ərini süzüb, müşayiət etdi. Mehman idarə həyətinə çatanda Qaloşlu adam süpürgəsini saxlayıb yenə də öz tərli alnını sildi:

– Xoş buyurubsan, başına dönüm, – dedi, – bu idarə də, bu yer də, bu yurd da, hamısı sənə qurbandır, başına dönüm!

Mehman Qaloşlu adama razılıq edərək idarəyə girdi. Qaloşlu adam arxadan:

– Boyuna qurban olum, bacıoğlu, – dedi, yan-yörəsinə baxıb qotur dişlərini qıcayıb əlavə etdi: – “Mənim lap doğma bacım oğlu!..”

Mehman içəri girərkən stol arxasında əyləşən Murtuzov yenə də ehtiramla ayağa qalxıb:

– Buyurun, yoldaş prokuror, – dedi. Mehmanın arxasınca kabinetə girib onun üçün stul çəkdi. – Doğrudan da, bu neçə ay ərzində sizin yolunuzu mən özüm şəxsən çox gözləmişəm! Hələ lap neçə kərə mənə barmaqla göstəriblər ki, o otağa, yəni sizin yaşadığınız otağa köç, mən razı olmamışam, demişəm balam, bəlkə kişi lap günü sabahdan gəldi, bəs dağdan ağır adam harda qalsın?.. Düzü, yoldaş prokuror, görəcəksiniz, burada hüquq işçiləri üçün şərait deyiləndən bir şey yoxdur!

Mehman stolun arxasına keçərək:

– Hüquq işçiləri, – dedi, – özləri şəraiti yaratmalıdır!

Murtuzov gözlərini qıyıb:

– Nəzərə alan olsa!.. – deyib çiyinlərini çəkdi. – Mən elə qanunu müdafiə etməkdən, bu rayonda pis kişi olmamışammı?.. İndi siz cavan prokuror, görəcəksiniz, burada az qala telefonçu da kəlləsindən qanun çıxarmaq istəyir!..

– Biz təhriflərin qabağını alırıq, – deyə Mehman söhbəti dəyişdirib müstəntiqə işarə verdi. – Biz vətəndaş hüququnu müdafiə etməyi bacarırıq!.. Ancaq həbs olunanların və həbsə alınası adamların işlərini mənə vermənizi xahiş edirəm!

Mehmanın bu qəti sərəncamı müqabilində Murtuzov şkafın ağzını açıb bir-birinin üstünə qalaqlanmış işləri çəkib çıxarmağa çalışdı.

– Bunlar hamısı yerli təşkilatların tələbi ilə olan işlərdir, möhtərəm prokuror!

Mehman üst-üstə qoyulmuş işləri bir-bir nəzərdən keçirməyə başladı. Bu zaman telefon zəng etdi, Mehman telefonun dəstəyini əlinə götürdü.

– Bəli, mənəm, rayon prokuroru, Mehman!

– Poçt idarəsindəndir, – deyə səs gəldi, – yoldaş naçalnik şəxsən özü mənə tapşırıb ki, sizin telefonu xüsusi olaraq yoxlayam, görüm necə işləyir? Burada təzə bir trubka da var, telefon dəstəyi, indi gətirib asacağam!..

Adəti üzrə poçt naçalniki rütbə sahiblərinin telefon dəstəklərini onlar dəyişdikcə dəyişdirir, beləliklə, gözə girib öz yerini bərkidir, mərkəzdən göndərilən qəzet-kitabın kəndlərə necə yayılıb-yayılmamağına fikir vermədən gününü buğlanan çay qabağında keçirib, nərdtaxtasını rahatca vururdu.

Mehman isə poçt rəisinin qulluq göstərməyinin səbəbini bilmədiyindən telefonla montyora razılıq edib dəstəyi yerinə qoydu; işlərə baxıb kənarında qeydlər etməyə başladı.

– Bir neçə gün içində bu işlər tamamilə bir də təzədən yoxlanmalıdır! – deyə o, qərar verdi. – Heç bir zaman həqiqi sovet vətəndaşına qarşı zorakılığa yol vermək olmaz! Biz birinci növbədə buraya qanunun doğru, düzgün həyata keçirilməsi üçün qoyulmuşuq!..

Murtuz Murtuzovun sinəsi qalxıb endi:

– Eh, görəcəksiniz, – deyə o yanıqlı nəfəs aldı, – yaxşı ki, gəldiniz!.. Özünüz hamısını görəcəksiniz... Qabaqkı prokuror zalım oğlu Zalova da neçə dəfə dedim ki, onun-bunun sözünə baxıb qanunu əymək olmaz, qulaq asmadı. Axırda işi kələf kimi dolaşdırıb özü də açılmaz bir dolaşığa düşdü.

Mehman Murtuzova altdan-altdan baxdı:

– Siz burada müavin deyildinizmi?

– Əlbəttə, müavin idim... Müavinəm də... Ancaq sözümə baxan olsa... – O, Mehmanın ciddi baxışları müqabilində yaranmağa başladı. – Siz gələn dəqiqədən mənim ürəyimə damıb ki, düzü, yuxuda da sizi beləcə görmüşəm ki, eyb də olmasın, bizim baş yoldaşı Yavərə də sabahdan duranda nağıl eləmişəm ki, bir cavan oğlan mənim rəhbərim olacaqdır!.. Doğrudan da, indi baxıram ki, siz müstəqil işləmək istəyirsiniz!

– Kömək lazımdır, – deyə Mehman üst-üstə qalaqlanmış işləri vərəqlədi. – Siz özünüzmü istintaqı aparırsınız?.. Aydın, lap aydın yazmaq lazımdır!

– Qoyurlar ki, aydın yazasan?!

– Aydın yazılmalıdır! Bunlar kağız deyil, adam müqəddəratıdır! – Mehman yavaş-yavaş əlinin arxasını vərəqlərə çırpdı. – Bunların hər bir sətrində bir adamın, bəlkə də bir ailənin müqəddəratı var!.. Müqəssirə

sübut və dəlillə cəza vermək gərəkdir!.. Təqsirsiz bir adamın işdən uzaqlaşdırılıb həbsə alınması kimə fayda verər? – Mehman başını qaldırıb müstəntiqin üzünə dik baxdı. – Təqsirsiz adamla zarafat etmək olmaz, müstəntiq!

Murtuzov udqunub:

– Doğrudur, – dedi, – olmaz təqsirsiz vətəndaşlarla...

– Bəli, təqsirli azad gəzsə, təqsirsiz həbsə alınsa, bizim bu rayonda qanunun ədalətinə kimi inandırmaq olar?

– Bu məsələni, yoldaş prokuror, xahiş eləyirəm, özünüz bu başdanca ispalkoma deyəsiniz, – Murtuzov yaxasını dartışdırmağa, əl aparıb, qan gətirməyə, indidən, bəri başdan şütüyüb araya girməyə başladı. – Mən tək idim, mənə çox bərk təzyiq edirdilər. Bəlkə də olmuş təqsirim?.. Bəlkə də mən sizin qabağınızda lap cinayət-cəza məcəlləsinin "vəzifədən sui-istifadə" maddəsi ilə müqəssir də olam?!.

Mehman işə nəzər yetirməyində davam etdi. Telefon yenə zəng etdi.

– Bəli, xeyr, prokurordur!

Yorğun, xırıltılı bir səs gəldi:

– Trubkanı Murtuzova vermək olarmı?

– İndicə öz kabinetinə gedər, zəhmət olmazsa, ora zəng edərsiniz!

Səs gəldi:

– Danışan icrakomdandır!

– Deyirəm, müstəntiq özü sizə zəng edər!

Eyni səs bir az da qəzəbli gəldi:

– De ki, təcili kabinetə zəng etsin, Kamilova!

– Mən sizinlə, yoldaş sədr, görüşə gələcək idim! – Mehman qulaq verdi, səs gəlmədi.

Mehman işlə tanış olub yığışıldı, işin axırına yaxın icraiyyə komitəsinin binasına yollandı. Xəbər alıb sədrin kabinetinə yaxınlaşdı. Kabinet qapısı ağzında dayanan katib Sərrafzadə, Mehmanın qabağını kəsdi, onun kim olduğunu bilə-bilə soruşdu:

– Siz kimsiniz?

– Mən yeni gəlmişəm, prokuroram, sədr ilə görüşmək istəyirəm! Bir neçə gündür, işlə tanış olurdum ki, görüş zamanı, həm də sədrə vəziyyət barəsində məlumat verim!..

– İndi yoldaş sədrin başı bərk qarışıqdır, – deyə Sərrafzadə qıza oxşar üzünü turşutdu, – zəhmət olmasa burada durun, – deyə, Mehman pəncərə qabağındakı sınıq stulu göstərdi. – Burada bir az...

Mehman əyləşdi, kürsünün ayaqları əsdi. Bir qədərdən sonra Sərrafzadə içəriyə girdi, bağırtı qalxdı. O tez geri döndü:

– Yoldaş Kamilov buyurur ki, özüm çağıraram onu!..

Mehman ayağa durub mənzilinə tərəf yollandı və tez evinə çatdı. O öz pərtliyini həm anasından, həm də Züleyxadan gizlətməyə çalışdı.

– Nə olub belə, oğul?

– Heç bir şey, ana!.. Gör nə var, qoy süfrəyə!

Züleyxa giley-güzarla dilləndi:

– Burada bir şey tapılır məgər? Yazıq anam özü bazara getdi, əliboş qayıtdı. Yaxşı ki, sənin o Qaloşlu kişin bir kasa qatıq tapıb gətirdi.

– Nə olar, qatıqdan da faydalı nə var, Züleyxa!..

– Qatıq-çörək! Təzə qulluğun mübarək, Mehman, qatıq-çörək! – deyə Züleyxa başını buladı. – Anama yazacağam korluq çəkirik, bizə şəhərdən ayın-oyun göndər!

Xatun dilləndi:

– Az yeməklə adama heç bir şey olmaz, bu da nemətdir, qızım, şükür, nemət yaxşı şeydir! Hələ biz də təzəyik, bazarı da yaxşı-yaxşı bilmirik, abi-havasına alışmamışıq, vaxt gələr, hər şey düzələr!

Züleyxa bir kənara:

– Allah buranın bu tüklü qatığını heç düşmənimə də qismət eləməsin, – dedi. – İlişsin boğazına, görəsən nə şükür nemətdir?!. – Züleyxa ərklə hikkələndi, çarpayıda oturub onu yırğalatdı. – Bəli, yoldaş prokuror!..

Axşam işinə çıxıb burada eşələnən, qovluqları vərəqləyib hər bir sətri diqqətlə oxuyan, yoruluncaya qədər, möhkəmcə çalışan Mehman mənzilinə qayıdan – baş yerinə girən kimi daş kimi düşüb, yuxuya getdi... Ancaq adətinə görə o yenə də sübh tezdən ayıldı, çarpayıdan sürüşüb döşəməyə düşüncə qollarını yanlara gərən, mükəddər yatan Züleyxanın balışa sərilən saçlarını əlilə yana toplayıb onun allanan yanaqlarından astaca öpdü... Züleyxa qurcalanıb yığışıldı, yorğanı başına çəkib üz-gözünü turşutdu... Mehman isə küsəyən Züleyxanı narahat etmədən geyindi, yuyundu, balaca mətbəxdə ensiz dəmir çarpayıda yatan anasının erkən durduğunu, yenə də çay-çörək hazırladığını görüb:

– Sabahın xeyir, ana, – deyə anasını salamladı.

– Hər vaxtın xeyir, oğlum! – Xatun oğlunu gözdən keçirdi.

Mehmanın müstəqil işə başlamağı, onun prokuror kimi çox mühüm bir rütbənin sahibi olmağı, anada doğan qürur hissini yavaş-yavaş daha da

gücləndirirdi... Mehman ali məktəbə girən zaman Xatun ciddən etiraz etmiş olsa belə indi, oğlunun böyük vəzifə tutduğunu dərk edir, bacardığı qədər ona dayaq durmaq istəyirdi... Xatun müztərib ana qəlbilə tək balasına hayan olmaq, artıq-əskik söz-sovdan onu qorqanıb tərtəmiz saxlamaq istəyirdi. Dünən işdən dönən baş Mehmanla Züleyxanın arasında baş verən ixtilafı hələ də unutmayıb, bütün gecəni qurcalanıb narahat mürgüləyən, hey oyan-buyana aşan Xatun oğlunun həmişə gözü-könlü tox olmağını, artıq tamaha yol verib, cüzi bir şeylə də olsa öz təmiz adını ləkələməməyini, atası, Murada layiq tərtəmiz bir oğul olmağını öz aramsız ürək çırpıntılarıyla arzu edirdi... Bəlkə də məhz bu cəhət Xatunu öz yuvasından tərpədib Bakıdan bu ucqara gətirmişdi... Öz tək oğluna göz olmaq, onu yuva ağızlardan, şər və böhtanlardan qorğanmağı ana özü üçün vacibdən də vacib sayırdı!.. Ana ürəyi necə də səksəkədə idi... Sadə həyat keçirən, əldə etdiyinə qənaət edən, ömründə heç bir israfa yol verməyən, ehtiyacın nə olduğunu yaxşıca bilən, bir vaxt öz kirpiklərilə od götürən Xatun həyatın həmvar olmadığını dərk edirdi... Çarlığın devrilişindən sonrakı ağır sınaq illərində, həftələrlə bir parça qara çörək üzü görməyən, dür-düyünçəsində gizlətdiyi qoz-fındıq ləpələrindən gündə bir neçəsini qənaətlə Mehmana verən, onu ovunduran Xatun üçün Mehmanın indiki həyatı gözəl və firavan görünürdü! İndi, doğrudan da, Xatun öz oğlunun təmiz ad-sanla yaşamağını, hər hansı dünya nemətindən, qiymətdar sərvətindən ucada tuturdu. Buna görə də Xatun vahid oğlunun üstündə necə deyərlər, nanə yarpağı kimi əsir, ötən prokuror Rüstəm Zalov haqqında bir şüar kimi yayılan, qanadlanıb, hər yanı gəzən "rüşvətxor" sözünün bu həndəvərdə dolanmasını belə istəmirdi. Xatun tərbiyə edib, yetişdirdiyi oğlunun bu vəzifədə batmasını deyil, onun parlayıb daha da yüksəlməsini, müəyyən müddətdən sonra Bakıya dönüb böyük rütbəyə çatmasını arzu edir. Mehmanın ilk oxunun daşa dəyməsindən qorxur, hətta vahiməyə düşürdü... Xatun eyni zamanda oğlunun sağlam ailə qurmağını bir tək Allahından diləyir, şirinliyi bir əfsanə kimi dildən-dilə gəzəni nəvəni görmək, qız olsun, ya oğlan, körpənin qayğısına qalıb, Mehmanın balasını böyütmək, tək oğlu üçün möhkəm arxa düzəltmək, nəhayət, get-gedə balasını oğullu-övladlı görmək, onu bir növü cavan "bacılı-qardaşlı" etmək istəyirdi. Dinməz, dilsiz görünən, ömründə çox az danışan Xatunun ürəyində ülvi arzular yatırdı... Bunun üçün də o, bir an belə oğlundan qopub üzülmək, onu yad bir adama tapşırıb arxayın olmaq istəmirdi... Ancaq bütün bu arzu və diləklər içərisində onun gözü

gəlini Züleyxadan su içmir, xüsusən "uşağın" Şəhla xanımın təsirinə düşməyindən dönüb, "Şəhla xanımın oğlu" olmağından ehtiyat eləyirdi. Əlbəttə, Xatun heç də başqa qayınanalar kimi öz gəlinini hey dimdikləmək, onu tez-tez öz yerindən qaldırmaq, hey dabandöyən bir əlbuyruqçusuna çevirib xırım-xırda işlərdə üzmək, gəlinin yaraşığını, gözəlliyini itirib onu erkən bir qarıya çevirmək istəmirdi. Xatun öz gəlininin yaraşıqlı olmağını, oğlu üçün bir tamaşa, solmaz bir şəkil kimi qalmağını istəyirdi... Buna görə də Xatun özünü çox sakit aparır, bütün ev işlərini özü görür, xırım-xırda sözə yol vermir, "ətlə dırnaq arasına girmək" istəmirdi. Təmizlik, sakitlik, ləkəsizlik!.. Bu məqsədlə, yenə də Xatun alaqaranlıqdan öz yerindən qalxmış, astaca sil-süpür etmiş, üçkünclü balaca mətbəxi təmizləmiş, oğlunu yedirib-içirib yola salmaq, sonra ardınca onun yerişinə tamaşa etmək istəmişdi. Oğul ilə ananın arasında: "sabahın xeyir, ana", "hər vaxtın xeyir, oğul" – nəzakətli müraciətlər vərdiş halını almışdı. Bəli, Mehman otağına dönüb yır-yığış edəndən sonra, ara qapını çəkib yavaşca örtdü, mətbəxə girib küncə qoyulan kiçicik stola yanaşdı, buğlanan çayı, kəsilib üst-üstə yığılan isti təndir çörəyini, bəzəkli çini qabda dayanan ılıq yumurtaları görüb:

– Lap qiyamət eləmisən! – deyə Mehman anasının boynunu qucaqlayıb onun iki yana aralanan ağ saçlarının arasından öpdü. – Yamanca qiyamət eləmisən!

– Bu sabah sübhdən bazara özüm getmişdim.

– Sübhün gözü açılmamış... ala-qaranlıqda?

– Özüm əldən düşən Qaloşlu qocanı tərpətmək istəmədim, – deyə Xatun oğlunu qayğı ilə süzdü. – Bir də axı biz xozeyin deyilik. – Xatun sözünü cəld döndərdi. – Bir də deyər külfətin içi-içində, çölü-çölündə qalsa, yaxşıdır!

– Mənim əqilli-kamallı başçım! – deyə Mehman anasının sözünü təsdiq etdi. – Gərək külfətə yad əl uzanmasın! Külfətin içində biganə əli gəzib, fitnə-fəsad toxumu səpməsin!

– Rəhmətlik atam, sənin baban Kitabüllah həmişə deyərdi: "Kor əzabsız, külfət savaşsız olmaz!.." Ancaq gərək külfətin sözü külfətin öz içində qalsın, quş kimi dişarıdə qanad çalmasın. "Qarğa məndə qoz var" deməsin. – Xatun qayğılı gözlərini döndərib hazırladığı çay-çörəyi yaxına çəkincə, həyətdə nallı at ayaqlarının səsi gəldi, ana-oğul balaca pəncərədən boylanıb baxdı, hündür, kürən atın üstündən düşən bir gözü qara sarıqla çəpəki örtülən adam göründü.

– Prokuror Atamoğlanovun evi buradırmı? – deyə gözü sarıqlı adam soruşunca:

– Bəli, buradır!– deyə bir az əvvəl, yerindən duran, pal-paltarını geyinən, bu evə qulaq vermək üçün gəlib küncdə büzüşən, indi yaxın gəlib atın cilovundan yapışmaq istəyən Qaloşlu adam cavab verdi. – Buradır, düz buyurmuşsunuz, yoldaş Mirzəoğlu!

– Bəs Atamoğlanovun özü haradadır, Qaloş?

– Hələ ki, evdədir, yoldaş Mirzəoğlu!

– Mən elə xoruzbanı yola çıxmışam ki, ta rayon iclasları qızışana qədər, taza prokuroru bir sakit yerdə yaxalaya bilim!

– Bəs haradan belə taza prokurorun səsi oralara qədər yayıldı? – deyə Qaloşlu adam əyilə-əyilə soruşdu, zəhmli Mirzəoğlunun müqabilində kiçilib kirpiyə döndü: – bu tezliklə səs-səda sizin dağlara da nə tez yetişdi?

– Mənim qulağım elə Rüstəm Zalovdan sonra darı dəlirdi, Qaloş! – Mirzəoğlu gözünə şübhəli dəyən Qaloşlu adamı qəzəblə süzdü, Qaloş isə bu zəhmli gözdən yayınmaq üçün yer axtardı. Ancaq nə qaçmağa, nə yayınıb gizlənməyə imkan olmadığı üçün ayaqlarını yerə dirəyib qəddini açdı:

– Xeyir ola, yoldaş Mirzəoğlu? – deyə Qaloşlu adam irişə-irişə torbalanan gözlərini qıydı. – Dağ boyda kişi deyirəm, belə xoruzbanı yola düşməkdə xeyir olsun barı!

– Onu daha mən özüm bilərəm! – Mirzəoğlu zərbdən qızaran gözü ilə Qaloşlu adamı bir daha ciddən nəzərdən keçirdi. Qaloşlu adam söz döndərmədən köpüklənən kürəni həyətin cağına bağlayıb: – mən idarəni səliqə-sahmana salmalıyam, – deyə bükülüb, donqalanıb əkildi. “Bu zalım Mirzəoğlunu görəndə, elə bil Əzrəqi-Şami görürəm”. – Gözü sarıqlı adamdan yaxa qurtardığı üçün sevindi. – “Bu kol heç girməli deyil!” – deyə əlavə edib, özünü prokurorluğun həyətinə çatdırıb əzinik vedrəni, kötüyü qalan köhnə süpürgəni götürdü. “Mən süpürgəçi babayam, vəssalam!” Qaloşlu adam qoyub gedəndən sonra Mirzəoğlu atın cağa necə bağlandığını yoxlayıb, üst-başını düzəltdi, boğazlı çəkmələrini dizlərinə tərəf çəkdi, çiynindən həmayili aşırdığı taxta qoburlu mauzerini yana itələyib ağac pilləkəni üzüyuxarı qalxdı, ara qapını taqqıldatdı, bayırı gözdən-qulaqdan qoymayan Xatun mətbəxdən çıxıb:

– Sizə nə lazım ola, qardaş? – deyə qəribə adamı ehtiyatla süzüb soruşdu.

– Mən bizim taza prokuroru görməyə gəlmişəm! – deyə Mirzəoğlu də tək gözü ilə Xatuna diqqət yetirdi.

– İndicə idarəsinə gedəcəkdir, qardaş! – deyə oğlunun hal-əhvalına bələd olan Xatun birbaşa cavab verdi. – Onun dəftərxanası oradadır, qulluq yerində!

– Mən onu öz evində görmək istəyirəm! Yoxsa sizdə qonağı qapıdan qaytarmaq adətdir?!

– Onda içəri buyurun! – Mirzəoğlunun gözünün sarığına görə, bu arada sayılan adam olduğunu zənn edib Xatun yaşmağını burnuna gətirib kənara çəkildi, Mehman qonağı dəhlizdə qarşıladı. Gözüsarıqlı, yanı taxta mauzerli adam əlini birbaş Mehmana uzatdı:

– Mirzəoğlu!

– Mehman!

– Atamoğlanov, eləmi?

– Bəli, Atamoğlanov!

– Muradoğlu?

– Bəli, Muradoğlu!

– Çox gözəl, çox da əcəb! – deyə gözü sarıqlı adam, qulluğun adamı necə qurutduğuna qarşı dodaqucu gülümsəyib mətbəxin açıq qapısından içəri baxdı. – Yarımca saat vaxtınızı almaq istəyirəm!

– Nə barədə?

– Çox vacib, çox mühüm bir iş barədə!

– Qulluq işinə aiddir, eləmi?

– Bəli!

– Onda burada çay içək, orada söhbət edək!

– Burada xudmanı söhbət daha yaxşıdır! – Mirzəoğlu yağışdan yana günlüyü əyilən papağını götürüb divardakı mismarda asdı. Mehman onun qara saçlarının arasında düyünlənən bir gözünü tamamən örtən qara sarığına diqqətlə baxdı.

– Şimalda Denikinlə, döşləşəndə olubdur! – deyə qalife şalvarlı Mirzəoğlu ona maraqla baxan Mehmana məlumat verdi, tabureti çəkib əyləşdi. Xatun bir stəkan çay süzüb qonağın qarşısına qoydu. Mirzəoğlu söz açdı, vaxtilə, Bakıda, muradla neft mədənlərində çalışdığını söylədi. Mehman tutulub bu barədə heç bir sual vermədi. Mirzəoğlu da öz qüruruna sığışdırmayıb üstündən ötdü, ümumən Mirzəoğlu inqilabi hərəkatdan, öz iştirakından, Şura hökumətinin yolunda aparılan gərgin mübarizələrdən tez-tez danışdı. Elə də o, ötən otuzuncu ilin kollektivləşmə-

sindən, qolçomaqlara qarşı aparılan vuruşlardan deyib, nəhayət, mətləbi kəndlərin hazırkı vəziyyətinə gətirdi, bəzi məsələlər barəsində öz narazılığını da bildirdi. O, rayonda baş verən qanunsuzluqlardan danışıb, ümdə olaraq əbəs yerə tutulan, nahaq yerə həbsdə yatan, briqadir Salamatovdan söz saldı. Onun qondarma şahidlərə, uydurma kağız-kuğuzlara görə qazamatda çürüdüyünə hiddətləndi, Şura hökumətinin yaranmasında kolxozların təşkilindəki fəaliyyətindən bir neçə misal da gətirdi. Mirzəoğlunu dinləyən Mehman başını qaldırıb qısaca şəkildə cavab verdi:

– Məşğul olarıq!

– Yəni mənim dediklərimə şübhəniz var? – Mehmanın belə qısa cavabından rəncidə olan Mirzəoğlu mətbəxə göz gəzdirdi. Kənar söhbətə qarışmaq istəməyən Xatunun çıxıb getdiyini görüncə ayağa qalxıb özü üçün bir stəkan çay süzdü, daha söz çevirmədən evdən çıxıb atına mindi, gözdən itdi. Qəribə qonağın buradan deyintili getməyini hiss edən Mehman əlini qıvrım saçlarında gəzdirib:

– Şişirdilmiş sözlər olsa da həqiqət də az deyil! – deyə istintaq altında olan adamlarla, birinci növbədə briqadir Salamatovun işilə ciddən məşğul olmağı, qanun üzrə hərəkət etməyi və qəti ölçü götürməyi qərara aldı...

Mirzəoğlu qoyub gedəndən sonra Mehman yuxudan ayılmış kimi oldu. Qonaqla rəsmi rəftarına görə özünü danladı, Muraddan söz açan adamı belə tez buraxdığına görə təəssüf etdi...

Axır, o üzünü doyunca görmədiyi atası barəsində söz eşitmək, bilmək istəyirdi. Bu halda ki, Mehman Muradın xatirəsindən söhbət açan adamları arayıb tapmaq, onlarla tanış olmaq, dilləşib-danışmaq fikrində idi. Mehman atası barəsində xeyli öyrənmək istəyirdi. Bu hal özü də az maraqlı deyildi: “Kimsən, kimin oğlusan, atan-baban kimdir, nəçidir? Məgər öyrənmək-bilmək pismi olardı?” Muradın solğun surəti oğlunun uşaqlıq təsəvvüründə qalsa, yenə də oğlu, Muradın özünə görə inqilabi iş-gücündən azmı-çoxmu nə isə bilmək istəyirdi. O, daha ətraflı olaraq müəyyən etmək istəyirdi ki, atası necə, nə təhərə adam olmuşdur?.. Bir də Mehmanın bu işlə şəhərdə məşğul olmamağı, Muradla birgə işləyən damları axtarıb tapmamağı indi özünə əfvedilməz görünürdü. Axır Mehman Bakıda olarkən neft mədənlərinə getməmiş, burada Muradla birgə çalışan qocaman neftçilərdən birisini də arayıb-axtarıb tapmamış, onlarla heç nə danışmamışdı; Murad barəsində onların heç birindən heç nə öyrənməmişdi. Mehman başqaları kimi öz ictimai vəziyyətini gözə

çarpdırmaq, öz zəminini möhkəmlətmək məqsədilə heç də bəziləri kimi dövlət arxivlərində eşələnməmiş, atasının inqilabi hərəkatda hansı bir mövqedə dayandığını müəyyən etməmiş, bir yerdə də öz ictimai vəziyyətindən dəm vurub sinəsinə döyməmişdi. Düzdür, Mehman üçün anası Xatun bir dünya bir aləm idi! Bəs atası Murad necə? Bəs mazutlu iş paltarında neft mədənlərindən əzinik dönən öz cibindən kağıza bükülü qara, quru çörək çıxarıb oğluna verən, bənizi sarala-sarala ac yatan ata nə təhər? Bəs o ata ki, körpə Mehmanı öz tüklü-saqqallı sinəsinə sıxıb ovundurub, yatırtmışdı, bəs ona nə cürə yanaşmaq?.. Belə bir atanın xatirəsini fikirdən-xəyaldan silib atmaqmı, yaxud onun xatirəsini əzizləyib, saxlamaq, onun kiçik əksini böyütdürüb, zərli bir çərçivəyə salıb, mötəbər bir yerdən asmaqmı, düşəndə onunla dilləşir kimi danışmaqmı?.. İndi bu ucqarın ucqarında birdən-birə, gözətlənmədən Muradı bilib, tanıyan bir adam göydən Mehmanın əlinə düşdüyü halda o gözü sarıqlı kişinin tündməcazlığına görə əyləndirib saxlamamış, istər-istəməz onun qəlbinə toxunub yola salmışdır?!. Görəsən bu yerlərdə qonağı necə qəbul edirlər?. Qonağa necə sifət göstərib, onu hansı qayda-qanunla yola salırlar!.. Bəlkə də raykom katibindən soruşub xəbər almaq, vətəndaş müharibəsində bir gözünü itirən inqilabçının yer-yurdunu öyrənib bilmək, onu təkrar rayona çağırmaq, onu öz evinə dəvət etmək, ondan üzr istəmək!.. Mehman özünü danlayıb düşündü. Birdən inadkar görkəmli Mirzəoğlu müqəssir olmadığı halda prokurorun çağırışına boyun əyib gəlmədi, onda bəs necə?.. Yaxud boyun əyib gəldi, ancaq üzə açılışıb Mehmanı doyunca danladı, onda bəs nə təhər?.. Yox, Mirzəoğlunu buraya çağırmaq bir daha əlli yaşlı qoca bir kişini izafi incitmək, onun kövrək qəlbinə toxunmaq olardı. – Mehman vurnuxurdu. – Bəlkə onda elə artıq həyəcan və iztiraba düşmədən gözləmək ki, Mirzəoğlu bir də özü dönüb hansı bir iş üçünsə rayon mərkəzinə gəlsin, onda bu adamla görüşmək mümkün olsun?.. Yox, Mehman təhəmmül edə bilməzdi! Bir halda ki, Mirzəoğlu briqadir Salamat Salamatovun doğru-düzgünlüyündən danışmaq üçün atlanıb uca dağlardan buraya gəlmişdi!..

Doğru-düzgün adamı da əbəs yerdən həbsdə saxlamaq, cinayətdən də artıq cinayət deyilmi? Nəinki təqsirsiz adamı bir gün, bir saat belə azadlıqdan məhrum etmək cinayətdir. Mehmana görə axır, günahsız vətəndaşı bir saniyə belə azadlıqdan məhrum etmək qəbahətdir. Mirzəoğlu atına minib qanadlanıb uçandan sonra belə peşmançılıq keçirən Mehman arıq əllərini ovuşdurdu, uzun quru barmaqlarını şaq-şaraqla

əzişdirdi, evdə dayanmadan durub prokurorluğa yollandı. Mehman yuxarı dağlıq kəndlərə çıxmağı, bu kəndlərin güzəranını görməyi – Mirzəoğlunun kəndinə gedib onun evində qonaq qalmağı, həm də kəndin özündə Salamat Salamatov barəsində yaxşı-yamanı öyrənməyi istintaqa dəxli olmasa hüquqi cəhətdən zəruri sayılmasa belə ətraflı öyrənib bilməyi vacib saydı. Lakin Mehman diqqətlə baxanda dağlar, ormanlar ona qəribə, ətürpədici göründü... Axır, Mehman öz cavan ömründə bircə günlüyünə də olsa Bakıdan kənara çıxmamışdı. O, başını aşağı salıb hey oxumuş-oxumuş, açdığı cild-cild kitabın üstündən başqa bir yana qalxmış, kitablara az qala bitişib qalmışdı... “Onda necə səfər etmək, dağ-obalara kimlə getmək?” – deyə Mehman düşünüb dayandı, yox-yox yenə də öz təbiətinə uyğun olaraq həll etdi. – Lap təkcə getmək, – dedi. – Onda bəs necə getmək, kimdən nə xəbər almaq? Murtuzovdanmı?.. Yox, Qaloşludanmı? – Yenə də yox!” Mehman ürəyinə yatımlı olan Cabirovu çağırmaq, onunla yolu haqqında danışmaq, bilmək istədi. O, belə də etdi. Bir azdan özünü çatdıran Cabirov tövşüyə-tövşüyə özünə xas şadyanalıqla ayaqlarını cütləyib canlı gövdəsilə dik dayanıb rəsmi salam verdi, Mehman əyləşmək üçün Cabirova kürsü göstərdi.

– Siz gözüsarıqlı Mirzəoğlunu tanıyırsınızmı?

– Əcəbdən də əcəb tanıyıram!

– Onun kəndi hayandadır, necə deyər, bax o dağların hansı birisinin tuşundadır?

Cabirov ayağa durub pəncərə qabağına gəldi, qanadlarını taybatay açıb baş-başa verən “Yeddi qardaş” adlanan dağlar səmtini göstərdi. Mehman öz tökmə tunc bədənilə pəncərəni tutan milis rəisinə yanaşdı. Cabirov bir az geriyə çəkildi, onlar qoşalaşdı, Mehman “Yeddi qardaş”ı, başı qarlı dağlar səmtini seyr etdi.

– Bax, Mirzəoğlu orada, düz “Yeddi qardaş”ın ətəklərində “Yeni həyat” deyilən bir cəncəl kolxozda sədrdir!

Cabirov geriyə dönüb gözüsarıqlı kişinin dastana layiq tərcümeyi-halından danışdı, özünün də bu kişi ilə dost olduğunu bildirdi. Bu gün nə isə Mirzəoğlunun rayon mərkəzinə tez gəlib tez qayıtdığına, ona baş vurmadığına təəccüb etdi. Mehman söhbətin üstünü vurmadı. Mirzəoğlunun deyintili döndüyünü demədi.

– Mən elə “Yeddi qardaş”a getmək istəyirəm!

– Haçan, nə zaman, nə tez?

– Lap günü sabah!

– İkimiz birlikdə gedərik. Mən sizə "Yeddi qardaş"dan yeddi nağıl danışaram!

– Əgər mən "Yeddi qardaş"a özüm tək-tənha getmək istəyirəmsə?

– Əgər mən də prokurorla birlikdə getmək fikrindəyəmsə?

Söhbət uzandı, Mehman birgə getməyə razılıq vermədi, Cabirov nəfəsini dərdi.

– Onda mən sizə müsəlləh bir milis verərəm!

– Nə üçün, müsəlləh milis?

– Bələdçi, həm də mühafiz!..

– Bələdçi, mühafiz?!

– Bəli, mütləq! – Cabirov davam etdi. – Borcumuz, vəzifəmiz bizdən belə tələb edir!

– Əgər mən "Yeddi qardaş"a tək getmək, bütün o aləmi düşünə-düşünə dolanmaq istəyirəmsə?.. İxtiyarım yoxdurmu?

– Əlbəttə ixtiyarınız vardır!

– Onda mən bu ixtiyardan bəhrələnmək istəyirəm!

– Müsəlləh milis heç də sizə mane olmaz!

– Əgər, mən heç bir mühafiz istəmədən tək-təkinə getməyi qət etmişəmsə?

– Onda... Onda... – Cabirovun fikri dolandı. – "Bəlkə bir sirr vardır? Bəlkə lap mənim əleyhimə bir iş vardır? – Onda... onda" – deyə sözünü qıran adamdan Mehman soruşdu:

– Onda nə?

– Düzü o yol, "Yeddi qardaş" sıldırımları elə də əmin-amanlıq da deyildir...

– Sizi indi necə başa düşmək?

– Düzü mən sizin həyatınıza cavabdehəndəyəm! – Milis rəisi nəfəsini dərə-dərə danışırdı. – canımızla, başımızla cavabdehəndəyik!

– İstəyirsiniz öz dəsti-xəttimlə yazıb verim ki, bu səfərdə mənə nə qəza üz versə milis rəisi Bənnaoğlu yox, mən özüm cavabdehəndəyəm!

– Yox, yox – deyə milis rəisi qətiyyən razılaşmaq istəmirdi. – Mən şəxsən sizin həyatınız üçün də məsuliyyət daşıyıram. Axı qanun silahı bizə etibar edibdir! Bir də ki, siz Xatun nənənin tənha oğlusunuz... dünən gəlmisiniz... Bağışlayın, həm də cavansınız... "Uşaqsınız!" – Bənnaoğlu nə qədər təkid etdisə də Mehman dediyində dayandı, Cabirov daha kürsünü yırğalayıb ayağa qalxdı.

– Mən gedə bilərəmmi?
– Buyura bilərsiniz!
Cabirov prokurorun kabinetindən incik və yelli çıxdı. Cabirov nə qədər hirslənsə belə onun ürəyinə üşütmə düşdü. “Birdən bu tərs oğlanın yolunu mamırlılardan kəsən olar?” – Milis rəisinin fikri qaraldı:
– Yaxşı, siz sizlikdə prokuror oğlan, biz də bizlikdə! – Cabirov get-gedə söyləndi. – Heç zaman o biçarə arvadın göz yaşlarının burada axmağına razı olmaz!.. Bir də bu oğlan nə qədər tərs görünsə canına qıyılası deyildir axı...
Prokurorluğun qapısında hərim-hərim hərlənən, zahirən təmizlik işləri ilə məşğul olan, əslində cavan prokurorun heç bir hərəkət və davranışını gözündən qaçırmayan, qulaqlarını ustalıqla açıb şəkləyən, qırışıq torba içindəki boz fındıq gözlərini qıyan, kim gəldi, kim getdi, nə danışdı, nə dedi ilə maraqlanan Qaloşlu adam yenə də işdən gec çıxan Mehmanı həyətdə qarşılayıb ona təzim edib arğaz belini donqaltdı... Mehman əl işarəsi ilə qocanı yanına çağırdı. Qaloşlu adam gəlib əmrə müntəzir kimi xidməti vəziyyətdə dayandı. Mehman sabah sübh tezdən səkili yəhərləyib, yüyənləyib gətirib qocaya bildirdi.
– Xeyir ola, başına dönüm? – Qaloşlu adam qayğıkeşliklə öz nigarançılığını bildirib qarayanıq əllərini ovuşdurdu. – Barı xeyir olsun, başına dönüm!.. – Lənət şərə, qoca, – deyə Mehman təkidi tapşırıq verdi. – Sən deyilənə əməl et, atı hazırla, öz vaxtında gətir!
Qaloşlu adam üzünə salıb üzülmək istəmədi:
– Belə səfərin hayanadır, başına dönüm?.. Məgər bilmək günahdır?!.
Mehman ötüb keçdi, Qaloşlu adam yanlarını arıq dəvəsayağı basa-basa cavan adamı mənzilinə qədər müşayiət etdi, pilləkəni qalxan müddəi-ümuminin altdan-altdan nəzər saldığını görüncə yenə də əllərini ovuşdurub mütiliklə donqalanıb əyilə-əyilə geriyə çəkildi, sonra qəddini düzəldib prokurorun sabahkı səfərindən Murtuzovu xəbərdar etmək üçün qocalığından iz-əlamət yoxmuş kimi qoparaqlandı... Mehman içəriyə daxil olub anasına salam verdi, yorğun-əzgin olmasına baxmayaraq, Züleyxaya müraciət edib qaşqabaqlı gəlini dilləndirmək istədi. Ancaq bir an əvvəl bağça müdirəsi Zərrintacın yanından dönən, orada təlimlənən, üfürülüb doldurulan Züleyxa ərinin nəzakətinə əhəmiyyət vermədən qat-qarışıq dillə deyindi. Mehman gülümsədi, arvadının bu hərəkətini bir şıltaqlıq və ərkinaz saydı. Nəhayət, ailə üzvləri mətbəxin küncündəki balaca stolun üstündə açılan süfrə ətrafına toplandı. Xatun hazırladığı xö-

rəyi süfrəyə gətirdi. Acmış Mehman iştaha ilə, Züleyxa isə üz-gözünü turşuda-turşuda yedi. Gəlinin bu hərəkəti qayınananı hiddətləndirsə də o, üzə açılışıb bir söz demədi.

– Bəs sən özün, ana? – Mehman başını qaldırıb ağbirçəyi pərakəndələşən Xatunun tutqunlaşıb bulud kimi dolan sifətinə baxdı. – Sabahdan burada əlləşmisən, indi də əyləşib bir tikəni bizimlə rahat yemirsən!

– Sən ye xörəyini ye, oğlum! – deyə Xatun küncdəki maşınkanın alovunu azaltdı, bir azdan iki stəkan çay gətirib süfrənin üstünə qoydu.

– Bəs sən haçan öz isti xörəyini yeyəcəksən, ana? – deyə Mehman narahatlıqla xəbər aldı. – Axır biz sənə qulluq etməliyik.

– Sonra, Mehman, sonra! – deyə sözün çək-çövür olmasını istəməyən Xatun dönüb dəhlizə çıxdı, nə isə buranı səliqə-sahmana salmağa başladı. Xatun gəlini ilə öz arasında saxlamağa çalışdığı pərdəni yırtmaq istəmirdi.

Bəli, Züleyxa, pörtə-qızara, buğlanan çayı da içib, yatdıqları otağa çəkildi, pallı-paltarlı çarpayıya sərilib, fıs-fıs fısıldadı:

– Bu da bir ruzigardır guya?!.

Mehman da durub Züleyxa sərilən otağa keçdi, barıt dəbbəsi kimi dolanan Züleyxanı tərpədib partlatmaq istəmədi. O, sabahkı səfəri barəsində raykom katibi Vahidova zəng etdi. Dəstəyi götürən Vahidov salam-kalamdan sonra bir neçə söz demək, tapşırıq vermək istədi.

Mehman raykom katibini dinləyir, onun səsində bir qayğıkeşlik hiss edirdi. Buna görə də, birdən: – təşəkkür edirəm, – deyə öz razılığını bildirincə:

– Bizim vəzifəmiz, sizin qanuni hərəkətlərinizə kömək etməkdir, – deyə Vahidov cavan adamın boynuna minnət qoymaq istəmədən mülayimliklə davam etdi: – Lakin səhvlərinizi də göstərməkdən, necə deyər qeyri-qanuni ölçülərinizə qarşı etiraz etməkdən çəkinməyəcəyik!

– Mən də ancaq doğru sözü dinləyib qanuna zidd olmayan təklifi qəbul edəcəyəm, – deyə cavan prokuror kobud gövdəli icrakom sədrini gözləri qabağına gətirincə əsəbiləşməyə başladı. – Ancaq sədrin qanunsuz hərəkətlərinə, kobud rəftarına qarşı mübarizə aparmağı da mən zəruri sayacağam!..

– Ancaq sizin kimi insan müqəddəratı ilə məşğul olan bir vəzifədaş üçün tez-tələsik qərar vermək gərək deyildir, – Vahidov cavan prokuroru təmkinli olmağa çağırdı. – Bax, elə də o briqadir Salamatov məsələsi... İndi sabahdan kəndlərə çıxdığınız zaman bir növ istintaqdan xaric

yolla olsa soruşmaq, camaatın rəyini bilmək pis olmazdı... Belə ki, qoy orada heç bir şəkk-şübhə qalmasın!

– Təqsirsiz sovet vətəndaşını bircə an belə azadlıqdan məhrum etmək olmaz! – deyə Mehman gözlərini gəzdirincə sanki qanunu zorlayan Kamilovu gördü. Sanki cüzi tutacaq yeri tapan Kamilovun tör-tökülü sir-sifəti açılır, əlini yastı, iri çənəsinə aparıb, seyrək saçlı, ətli başını yırğalayır, "biz bu yolda at çapıb saç ağartmamışıq, bala!" – deyə istehza ilə gözlərini qıyır, yer-yurdu cırmaqlayan Mehmana gülür, onun təcrübəsiz, ağzı süd qoxusu verən, özününsə dünyanı yorub-yortan bir kişi olduğuna, neçə-neçə belə uşaq-muşağın ağız-burnunu əzib-əzişdirməyilə öyünürdü. Qələbələrinə ümid bəsləyən Kamilov şişir, dam boyda böyüyürdü... "Baxarıq balası, görərik qadası – deyə cavan prokurora icəşirdi. – Baxarıq qadası, görərik balası?!"

Sanki elə bu anın özündə Mehmanın təsəvvürünə gələn Kamilov raykom katibi, Mərdan Vahidovun da gözlərinə görünür, Vahidov onun necə də iri ayaqları ilə Mehmanın yoluna daş-kötük yomalatdığını seçir, buna görə də Mehman himayəkarlıq edib onun güclü rəqibinə qarşı hiddətlənirdi. – "Kim nə deyir desin, nə edir etsin, biz sovet qanunu təkərinin altına kör-kötük yamalayanlara meydan verməyəcəyik! Biz heç zaman heç bir təqsirsiz adamı inqilabın bəxş etdiyi azadlıq nemətlərindən məhrum etməyə yol verməyəcəyik!"

– Bəlkə onda elə mən Salamatovu azad edib kəndlərə çıxım? – deyə Mehman nəfəsini dərdi, sol əlilə alnında muncuqlanan tərini sildi. – Bəlkə mən bu düyünü birdəfəlik açım, qurtarıb işinə getsin, yoldaş raykom katibi?

– Bu vəziyyətdə – deyə Vahidov özü hiddətlənmiş olsa qızışmağa başlayan, iztirabdan-iztiraba düşən gənci yavaşıtmaq üçün öyüd-nəsihət təriqilə danışmağı lazım bildi. – Məncə, Kamilovun yerlimi-yersizmi inadkarlığını məhz özünə sübut etmək, onun ayaqlarını yerdən üzmək üçün bir daha Salamatovun şəxsiyyətini yaxşı-yaxşı yoxlamaq gərəksiz olmazdı!.. Qoy sizin inamınız da, əlinizin altında toplanan qanuni sənədləriniz də daha möhkəm olsun! Daha əsaslı, şəksiz-şübhəsiz olsun!.. Birkərəmlik, axırıncı olsun!.. Qoy sabah şikayət respublika prokurorluğuna çatdığı zaman sizin mövqeyiniz möhkəm-möhkəm olsun! Heç bir qoca hüquqşünas qurdun özü belə sizi büdrətməsin!

Belə söz-söhbətdən, öyüd-nəsihətdən sonra Mehman telefonun dəstəyini yerinə qoydu. Züleyxanın da, necə yorğan-döşəyə sərildiyini unut-

muş kimi döndü, möhkəm addımlarla gəzindi. Vahidovun dediklərini bir daha öz düşüncələrində yoxladı. Nəhayət, mülayim danışıqlı raykom katibilə razılaşdı, sonra səsini qaldırıb əsəbiləşdiyi üçün utandı... Mehman evində əylənib, dincəlmədən çıxdı, prokurorluğa yetişib, kabinetin qapısını açıb içəriyə girdi, işlərin arasından Salamatovun işini çəkib çıxardı, stola sərdi, özü də əyləşib qələmi əlinə götürdü, daşına-düşünə yeni-yeni qeydlər etməyə başladı. Divardakı əqrəb əqrəbi əvəz etdi, bayırda qaranlıq qatılaşdı, gecə saat birə işləyincə elektrik lampaları göz qırpmağa, xəbərdarlıq verməyə başladı. Mehman yır-yığış edincə lampalar söndü.

– Heç belə işləməyə dəmir də dözməz, deyə sınıq-sökük kürsünü qapıya bitişdirən Qaloşlu adam ağızdolusu əsnədi. – Heç polad da dözməz, bu işə başına dönüm!

– Sən niyə mənzilinə gedib, yıxılıb yatmamısan, qoca! – deyə Mehman, qaranlıq dəhlizdə yumurlanıb qalan qocaya tərəf baxdı, onun qaranlıq içində zülmət pərdəsi kimi dayandığını hiss etdi.

– Nə üçün bu vaxtacan yatmamısan? – Qaloşlu adam yenə də yaxınlıq göstərib Mehmana sığınmaq istədi.

– Yuxusu göyə çəkilən qoca necə sizin kimi cavanı işdə-gücdə qoysun, özü də rahatlanıb, körük kimi fısıldasın?

– Sən nahaq yerə yatmamısan! Sən yıxıl yat, qoca! – Mehman dəhlizdən çıxıb, pilləkəndən düşdü, çala-çuxura fikir vermədən addımladı:

– Qocaya istirahət gərəkdir!

– Qocaya qəbir gərəkdir! – deyə Qaloşlu adam mırıldana-mırıldana addımlarını yeyinlədib, yenə də Mehmana yanaşdı, – yəqin ki, işdən belə gec dönməkdə, daha sabah səfərə çıxmazsan, başına dönüm?

– Yox, sabah mütləq çıxacağam, yola düşəcəyəm! – deyə Mehman qəti qərarını bildirdi. – Sən səkili hazırla, qaranlıqda çıxacağam!

– Nə üçün alaqaranlıqdan, başına dönüm? – deyə at milçəyi kimi suvaşan Qaloşlu adam qopmaq bilmədi, – özü bu ucqar aləmə, bu ətürpədən dağ-daşa?! Özü də kor kimi nabələd?!. Heç günün günorta çağında o dağılmış xarabalarda tərpənmək olmur!..

Mehman Qaloşlu adamı özündən birtəhər üzsə də, o qaloşunu sürüyə-sürüyə addımlarını yeyinlətdi.

– Gecəniz xeyirli olsun, – deyə nəhayət, Mehman mənzilinin həyətində ayaq saxladı. Qaloşlu adam xıtıcılandı:

– Ürəyim durmur, qulluğun böyük olsa da özün körpəsən, ana balasısan!

Bütün günü dinclik bilmədən çalışan, Kamilovun gözə görünən və görünməyən müqavimətlərinə qarşı mübarizə aparan Mehman Qaloşlu adamdan üzüldüyündən özündə bir yüngüllük hiss etdi, onun fikri xəyal sürətilə gəzib dolandı, "görək gələcək nə göstərir?" – deyə qabağı açıq eyvanda dayanıb durdu, müqabil tərəfdə, gecənin sal qaranlığı içəri yüksələn cəsamətli dağlara nəzər saldı. "Görək, görək?" O, dərindən nəfəs aldı, həyat girdablarının necə də dərin burulğanlardan ibarət olduğunu, bu dalğaların necə amansız olduğunu görür kimi seyr etdi; yox mübarizə üzdə deyil, dərindədir, – deyə başı ilə təsdiq etdi, o biri yandan da Züleyxanın xoşagəlməz hərəkətləri müqabilində ürəyinin üşüdüyünü hiss etdi... Bir azdan Mehman içəri dəhlizə girdi. Xatun oğlunu qarşılayıb, mətbəx tərəfə döndərdi, çay süzüb, küncdəki stolun üstünə qoydu. – İndicə dəmləmişəm, oğlum!

Qabaqca əllərini, sonra da yorulduğu üçün üzünü yuyan, qurulanan Mehman dalbadal üç stəkan çay içdi. Xatun bayaq yeməyib, oğluna saxladığı xörəyi stolun üstünə gətirdi.

– Ye, oğlum! Ye əldən düşüb, üzülmə!

– Yox, ana! – deyə Mehman, Xatunun müztərib sifətini seyr etdi. – Sən çox da narahat olma, ana!

– Sən ye, Mehman, bir-iki tikə də olsa, ət bişmişidir, ye!

– Yorğunam, ana, qoy sabaha qalsın, – deyə Mehman sabahkı səfərindən söhbət açmaq istəsə də, açmadı, bütün gecəni Xatunu narahat etmək istəmədi. Mehman bildi ki, anası bütün gecəni yatmayacaq, oğlunu sorğu-suala tutacaq – yox, oğlum, deyib ağlayıb, sıtqayacaq. – Bəs necə olsun?.. "Axşamın xeyrindən sabahın şəri!"

Mehman o biri otağa keçdi, Züleyxanı hələ də öz yerində eşim-eşim eşələnib əzik-üzük etdiyi libasında sərili qalan gördü... Mehman anasının yandırıb pəncərəyə qoyduğu lampanın işığını artırıb, əli ilə Züleyxanı tərpətdi, qəzəbnak Züleyxa çarpayıdan yerə düşüb hər iki əlilə gözlərini ovmağa başladı. Mehman yataq yerini açıb soyundu, yerinə girdi.

"Bəli, Züleyxa, – deyə Mehman içəridən nəfəsini dərib öz-özünə söyləndi: – Yusif Kənanın başına min bir oyun açılmasına səbəbkar Züleyxa!" hələ də hikkəsindən hıq-hıq hıqqıldayan Züleyxa pal-paltarını çıxarıb hərəsini bir yana tulladı, başqa çarpayı olmadığından, zıqqıldaya-zıqqıldaya ərinin böyrünə girdi. Mehman arvadının gur və pərakəndə saçlarını tumarlasa da Züleyxa yorğanın bir qanadını çəkib pır-pırtdaşıq başını gizlədi. "Bu da mənə qupquru, qanunbaz bir ər olubdur? Mətbəxdə,

küncdə, maşınkanın his-pasında, zirzəmidə yaşayan süpürgəçilər. Barmaqlarını yalaya-yalaya xörək-çörək yeyənlər. Çəngəlsiz-bıçaqsız, servizsiz-zadsız!.. Acgöz-acgöz!.. Qazancsız, pulsuz-parasız, geyimsiz-kecimsiz!..” Züleyxa haqqıldayır, başı burulu olsa da, ürəyindən keçən giley-güzarı eşitməsə Mehman bu hıqqıltının nədən ibarət olduğunu dərk edir, ancaq işin işdən adladığını, böyürə-böyürə yatdığı Züleyxa xanımla arada yaman bir uçurum olduğunu duyur, bəzən də qadın nəfəsi onun kişilik hisslərinə güc gəlirdi... Nə etmək olardı?.. İstər-istəməz acizləşdiyi halda necə hərəkət etmək, hansı qüvvə ilə bu allahsız gözəli götürüb kənara atmaq olar?!. Mehmandakı dəmir iradə ilə coşqun hiss necə də bir-birilə çarpışırdı?!. Qəribə, çox qəribə deyilmi?!..

Bəli, gecənin əridiyini, dan yerinin söküldüyünü, tək pəncərənin ağardığını görən Mehman ayağa qalxıb, geyindi, çöl eyvanın sütununa vurulan əlüzyuyanda yuyundu. Mehmanın belə erkən yerindən qalxdığını görən Xatun da hövlnak ayağa durdu, oğluna yanaşdı.

– Hara belə, Mehman, bu dan yeri sökülər-sökülməz?

– Kəndlərə çıxacağam! – deyə Mehman sifəti xəzan yarpağı kimi sapsarı saralan, qar kimi ağ saçları pərakəndələşən anasını süzdü, daha gizləməyinə dəyməz. Əhvalatı açan Mehman dönüb anasının alnından öpdü.

– Kimlərlə belə səfərə yollanırsan? – deyə Xatun narazı, narahat səslə soruşdu.

– Heç bir kəslə, mənim anam, heççə bir kəslə!

– Necə heç kəslə, heççə bir kəslə, Mehman?

– Yoxsa oğlunun, oğulluğuna inanmırsan, ana? – deyə Mehman gülümsədi. – Fərqi nədir kiminlə, mənim göyçək anam?

Mehman mətbəxə girib məhrəbanı götürüb əl-üzünü silib quruladı, qara, qıvrım saçlarını barmaqlarıyla üzüyuxarı daradı:

– Ana, ana, ana!..

– Dilə basma! – deyə Xatun tək oğlunun qolundan bərk-bərk yapışdı. – Doğrudan, kimlərlə gedirsən, Mehman?

– Fərqi nədir kimlərlə? – Mehman anasının ağaran saçlarını tumarlayıb, onun sarı qırış alnından bir körpə kimi öpdü-öpdü: – Fərqi nədir, ana can?

– Fərqi çox-çoxdur, bala!

– Nə üçün belə narahatlıqla, özü də belə çox təkidlə xəbər alırsan, ana can?

– Əgər, mən bilsəm sən kimlərlə gedirsən? – deyə Xatun analığının özünə xas olan həm mehriban, həm də amir səsini qaldırdı. – Necə bəyəm, mən heççə nə bilməyim?

– Əgər sənin tək oğlun tək-tənha gedirsə?

– Heç zaman! – Xatunun titrək səsi qalxdı, istər-istəməz gəlini köməyinə çağırmaq, ikilikdə Mehmanın yolunu kəsmək istədi. – Bu yolsuz-irizsiz dağda-daşda, tək-təkinə? Heç yox, heççə zaman, yox! Hələ burada qolçomaq deyilən azğın tayfanın güllə səsi dağlardan gəlir... Gündə yol kəsilir, adam ölür! – Kövrələn Xatun yaylığın ucunu gözlərinə gətirib, analığın odlu göz yaşlarını o tərəf-bu tərəfə sildi. – Sən nə vaxtacan özbaşına olacaqsan, Mehman?

– Nə vaxtacan?

– Bəli, nə vaxtacan?

– Bəs o dağlarda necə yaşayırlar? – Mehman sübhün tüluində süd kimi ağarıb əfsanəvi aləmə çevrilən yal-yamacı göstərdi, – yoxsa onlar bəşər deyil, mənim mehriban anam!

– Onlar yerlidir, Mehman! Onlar, yurdludur, oğlum!

– Bəs mən haralıyam, ana can? Mən bu torpağın oğlu deyiləmmi?

– Sən burada lap təksən! Sən yarsız-yoldaşsız bir uşaqsan, qəribsən! – Xatun başına atdığı qara kəlağayısının ucundan tutub saxladı, yenə də aramsız qaynayan gözlərini silməyə başladı. – Mən səni heççə yana, özü də tək-təkinə buraxmaram!

– Vəzifəm belədir, mənim mərhəmətli anam! Qulluğum belədir!

– Elə ona görə də lap əzəl başdan mən əsla razı deyildim, – deyə Xatunun bulaq kimi qaynayan göz yaşları, daha birbaşa qarışıq yanaqları aşağı axdı. – Mən dedim sən olasan adam sağaldan həkim!.. Daha demədim adam tutan prokuror olasan!..

– Bəs prokuror kim olardı? – deyə Qaloşlu adamın haçan səkili gətirəcəyini gözləyən Mehman həyəcanla boylandı, – soruşuram, prokuror kim olardı?

– Beş-on oğlu olanlardan birisi də prokuror olardı! – Xatun qara kəlağayısının ucundan yapışıb yanaqlarını sildi.

– Demək, belə görünür, tək oğul gərək anasının qoynundan çıxmasın, eləmi?

– Çıxsın, amma belə də qanadlanıb dağa-daşa uçmasın.

– Anam, mənim hamıdan rəhmdil anam, – deyə Mehman günləri iztirabla keçən anasını sinəsinə basdı, aram bilməyən, hey qaynar bulaq kimi qaynayan göz yaşlarını əzinik dəsmalına sildi. – Mənim gözəl, göyçək,

qəşəng anam! Bütün yer üzündə bir tək anam, bir tək atam, bir tək bacım, bircə tək qardaşım, günüm ruzigarım, məkkəm-mədinəm, qibləgahım!

– Sən məni kitab dilinə tutma, Mehman! – deyə Xatun dartınıb oğlunun əlindən çıxdı. – Səni heççə yana buraxmaram! – Səbri tükənən Xatun qayıdıb qapını dartıb açdı, gəlinin yatıb-yatmadığını hesaba almadan, – bax Züleyxa da! – deyə çarpayıda qurcalanan hələ də büründüyü yorğandan başını çıxarmayan gəlininə tərəf söyləndi, – bax bu qız da razı deyil! – Gəlin səsini içinə salıb dinmədi, ananın iztirablarına cavab vermədi. Ömründə az-az özündən çıxan Xatun dönüb Mehmanın yanına qayıtdı:

– Səni heççə yana buraxdı yoxdur! – deyə inad göstərdi, – heççə yana, əsla!

– Əgər sən mənim mehriban anam, mənim hər addımımı belə ölçübiçiyə salsan, mən öz vəzifəmi yerinə yetirə bilmərəm! – deyə Mehman yır-yığış elədi, nəhayət, Qaloşlu adamın yəhərlənib-yüyənlənib gətirdiyi səkil at qapıda kişnədi, əsrarlı ürək döyüntüsü keçirən Xatunun vücudu uyuşub açıldı...

İşin işdən keçdiyini, Mehmanı yolundan saxlamaq mümkün olmadığını kəsdirən Xatun daha müvazinətini saxlamağa, yad adam yanında pərdəni yırtmamağa çalışdı. O dönüb axşamdan qalan həmin xörəyi əlüstü qızdırdı... Mehman ananı incitməmək üçün erkən olsa belə süfrəyə qoyulanı yedi, ağac pilləkəni aşağı düşdü.

– Bir tək Allah, sən özün bu uşağa yar ol! – deyə ana bəzəkli piyaləni su ilə doldurdu, Mehman atın belinə qalxıb tərpənincə o suyu oğlunun ardınca atdı, ağaran su Mehmanın yolunu işıqlandırdı.

– Od içindən də salamat çıxar! – deyə əlacı kəsilən ana oğlunun səfərini xeyirliyə yozdu: – Tək oğlumu tək Allah özü pənahında saxlayacaqdır...

Səkilin yorğa yerişini dərin qibtə hissilə süzən Qaloşlu adam ata-anadan yetim qalan yanıq uşaq kimi hər iki əlini qoynuna qoyub büzüşdü, çıxıq çiyinlərini çatıb kədərli görkəm aldı. Onun günlüyü qısalıb əyilən kepkasını bürüyən, çal qırçın saçları yanlardan pırtlaşıb leylək yuvasını andırdı. O, başını məna ilə buladı, sual işarəsini andıran əyri-üyrü görkəm alıb mübhəm bir vəziyyətə düşdü. O, Mehmanın sözə baxmayan tərsliyi barəsində hıq-zıqqıla deyindi, Xatunun qarşısında özünün Mehman üçün ən canıyanan adam olduğunu nümayiş etdirdi. Ürəyi, atlanan oğlundan üzülməyən, Xatun dönüb eyvana qalxdı, məhəccərə söykəndi, birinci dəfə at belində gedən, birinci dəfə at belinə qalxan oğlunu müşayiət etdi, – “uğurlar olsun!” Ana udquna-udquna, təkrar-təkrar xeyir-dua

verdi, – “Allah sən özün mənim bircəmə qıyma!.. Xudavənda, sən özün mənim bircəmi özcə qanadında saxla!”

Səkil belində quruşulan, cilovu əlində dəstələməkdə acizlik çəkən adamın minici olmadığını lap birinci dəfə, yəhərə qalxdığı andan duymuşdu... Bunun üçün də səkil hələ də şıltaqlıq edir, yəhər altında öz çiyinlərini oynadırdı! Enişin başına enincə, belindəki minicini götürüb yerə vurmaq üçün hoqquldayırdı. Öz vəziyyətinin gerginliyini duyan, səkildən ehtiyat edən Mehman qorxu qarşısında birdən özünü ələ alıb yığışdırdı, cilovu əlində çevikliklə topladı, səkil başını döndərib alışıb qızaran gözləri ilə təzə minicisinin üzəngindəki ayaqlarını süzdü. Qalın qozlu dərəni keçən Mehman öz oturuşunu düzəldən zaman qənşərə çıxdı. Atın səkil ayaqlarından tutmuş minicinin başına qədər hamısı eyvanda dayanan anaya, elə də indicə içəridən çıxıb məhəccərə söykənən Züleyxaya, hələ də bir küncdə büzüşən Qaloşlu adama göründü... Xatunun saralan sifəti yavaş-yavaş açıldı, sanki ananın üzündən tala buludlar çəkildi... Züleyxanın yuxulu şişkin gözləri genişləndi, Qaloşlu adamın sir-sifəti getdikcə quzey meşəsinin cır alması kimi turşudu:

– Söyləyəndə ki, oğlan, sənin üçün bu vəhşi dağ-daşa düşmək hələ tezdir, bu sıldırım yollar qorxuludur. – Qaloşlu adam hiyləgərliklə açılışıb-oyalandı: – İndi vursun, bu səfərdə bir kəsgi, bir xata-bala olsun?!. Daha durub, düşünüb, demir qoca anam var, cavanəzən gəlinim var?!

– Kişi sən o küncdən bəriyə nəs-nəs danışma! – Xatun hiddətləndi. – Avandına düşən işi tərsinə yozma. – Xatun bayquş avazlı qırışıq kölgəli qocanı susdurmaq, onun xeyirə açılmayan ağzını hər iki əliylə yummaq istədi: – Uğurlu olsun, de! İşi bəduğur yozmaq yaramaz!

Qaloşlu adam udqunub “Qoy o quş kimi səkən səkilin yalmanı qanlı gəlsin, ağıçısayağı kişnəyə-kişnəyə, qara xəbər gətirsin! – deyə mənhus nəfsilə cavan yolçuya qarğıdı. İlk gəldiyi gündən gözləri su içməyən ədalı oğlana bədduaçı olub nifrin etdi: – Beləsi nə qədər tez ürəyindən oxlansa bir o qədər yaxşıdır!” Xatunun iti nəzərləri gizli bədduaçını süzdü, Qaloşlu adam başını çiyni üstə qoyub, fəqir görkəm aldı. Getdikcə səkilin belində özünü daha yaxşı cəmləşdirən Mehman dolayını ötüb qarşıdakı dərəyə endi, sonra yuxarıya, “Yeddi qardaş”a doğru dırmanıb, ardıcıl meşədə gözdən itdi. Qürur və nigarançılıq içində nəfəsini dərən Xatun dönüb Züleyxaya diqqətlə zənn etdi, gəlinin gözlərində muncuqlanan gilələr görüncə sevindi: “Allah özü elə eləsin ki, bunların ulduzları barışsın!” – Xatun gözlərini göy səmtinə döndərdi: – “Elə olsun ki, xeyirli olsun! Elə olsun ki, bu bir körpəyə bir zaval toxunmasın!”

Ardıcıl meşəyə girən Mehman əyri-üyrü cığırla bir daha daşlı dərəyə düşüb yastı-yastı təpələrə qalxdı, nəhayət, dağların arası ilə üzüaşağı, Araza doğru axan çayın kənarına düşüb rahatlandı. Səkil öz minicisi ilə razılaşmış kimi kilkanlı quyruğunu qaldırıb qulaqlarını qoşalayıb dördəm gedir, üstündəki cavan adamı götürüb başı qarlı "Yeddi qardaş" dağlarına doğru aparırdı. Mehman tənhalaşdığı üçün yenə də öz vəzifəsinin məsuliyyətinə dönürdü. Mehman öz iradəsini toplamaq, bu ucqar dağlı-dərəli dairədə itib-batmadan işləmək, inqilabi qanunçuluğu möhkəmlətmək, öhdəsinə düşən işləri vicdanla yerinə yetirmək istəyirdi... Mehman hələ təhsil zamanı istehsalat təcrübəsində göndərildiyi vaxt, rayon məhkəmələrinin və müddəi-ümmuiliklərinin işlərinin gedişindən duyub dərk etmişdi ki, camaatın arasına girmək, kütlələrin səsini eşitmək, yazılmayan, imzalanmayan güclü hökmləri oxumaq, ecazkar sirləri öyrənmək zəruridir... Bəlkə, Mehmanın Bakıda nəzərdə tutduğu elmi mövzusunun özü də burada, zəruri tələblərə görə dəyişdi? Bəlkə o, yeni mövzu seçib işlədi?.. Ancaq indi düzünə gəlincə Mehmanın elmi əsəri işləmək üçün vaxtı yox idi. Bəlkə o, burada təcrübi işdə çalışa-çalışa göz açdı, müəyyən bir qərara gəldi?.. Bəlkə o, işləri öyrənəndən sonra mümkün edib iş arasında elmi işini işlədi, Bakıya dönürkən Məlikzadəyə bəyəndirdi, onun razılığını aldı?

Səkilin belində gedən Mehmanın xəyalı yuxarı-aşağı cövlan edir, görmədiyi dağ-daşı nə qədər seyr etsə də, yenə də öz daxili aləmindən üzülə bilmir, bu səfərindən ümdə məqsəd nə olduğunu daha da müəyyənləşdirmək və dürüstləşdirmək istəyirdi... Raykom katibi Vahidov prokurorun kəndlərə çıxmağını, camaatla görüşüb danışmağını, necə deyər dilləşməyini məsləhət bilmişdi!.. Əlbəttə, belə olduqda Mehmanın nüfuzu artar, onu tanıyıb, bilənlər çoxalar, o özü də müəyyən dərəcədə görüb-götürər, özünü-sözünü daha da bərkidib, möhkəmləndirərdi. Deməк, onda cavan prokuror, bu qanunu təhrif edən, ipə-sapa yatmayan Kamilovu da bu səkil kimi cilovlamağı bacarar, onu öz cızığından çıxmağa, dəli bir buğa kimi böyürüb, bağırmağa qoymazdı!.. Bəli, azğın əyani yaxşıca cilovlamaq üçün çox möhkəm zəmin, sarsılmayan dayaq gərəkdir, həmin dayaq da kütlələr tərəfindən qat-qarış halda gələn, – doğrudur, düzdür, – sədalarıdır! Demək, elə hökm vermək gərəkdir ki, eşidən-bilən vicdanlı əks təsdiq edib, qol qoyub, möhür bassın... Yoxsa prokurorun tələb etdiyi cəza, məhkəmənin çıxardığı hökm kütlələr tərəfindən təsvib edilməyəcəksə, başlar şübhə ilə tərpənəcəksə, demək uçurum vardır, özü də indi Mehmana görünən uçurumdan da dəhşətli uçurum vardır!

Ancaq o uçurumla bu uçurum arasında böyük fərq vardır. Bu uçurum gözə göründüyü halda, o uçurum açıq halda, gözə görünmür, bəzən də Murtuz kimi daz başlar uçurumun üstünü məharətlə malalayır, yeri gələndə adamı birdən itələyib çıxılmaz uçuruma salır. Bu uçuruma düşərkən çıxmaq, yeri-yurdu cırmaqlayıb qalxmaq mümkün olduğu halda, o uçurumdan çıxmaq, yuxarıya qalxmaq mümkün olmur, əbədi məhvin amansız hökmü sənin qulaqlarında səslənir...

Mehman təbiət mənzərələri aləmində belə öz iş-gücünə dair mühakimə edir, oxuduğu müdrik kəlamları xatırlayır, sanki ağıllı-kamallı adamların öyüd-nəsihətlərini eşidirdi... Səkil belindəki adama alışmış kimi dördnala yeriyirdi... Birdən Mehman gözlərini döndərib yuxarı dağlardan üzüaşağı tökülüb gələn qıjıltılı çaylara baxır, bu çayların daş-qayalara çırpıla-çırpıla necə getdiyini görürdü. Mehmanın ciyərlərinə təmiz dağ havası dolur, o, köksü dolusu nəfəs alırdı... Baxırsan yuxarıya "Yeddi qardaş" dağları əfsanəvidir!.. Daşlar cürbəcür, rəngbərəngdir!.. Bax, yuxarıdakı qoç daşlar necə də buynuz-buynuza, kəllə-kəlləyə dayanmışlar... Sanki onlar indicə geriyə çəkilib yamanca toqquşacaqlar... Sanki hansı qoçunsa kəlləsi çat verəcək, başı zədələnəcək, beyni qatıq kimi dağılacaqdır?.. – Mehman əlindəki qamçını yuxarıya qaldırıb səkilin sağrısına vurmadan havada saxladı, əfsanəvi mənzərənin əsrarlı təmtərağı qarşısında heyran qaldı... İndi qoçları buradan qoparıb, şəhərin müəyyən muzeyinə aparmaq yaxşı olardı, yaxud tərpənmədən burada belə bitili saxlamaq? – Mehman əlindəki qamçını aramla endirib, yoxuşu dırmanan səkilin yalmanından yapışdı, daha dərinlərə qulaq verdi... Güclü səs-səmir, haradansa gələn fışqırıq, aləmə yayılan nəğmə bir-birinə qarışırdı... Mehman dinləyə-dinləyə dönüb yenə də baxdı... Qoçlardan yuxarıda boy tutan buynuzlu buğaları da gördü... Sonra da o, sal qayaların üstündə işlənən qılınc-qalxanlı cəngavərlərin əmrə müntəzir dayandıqlarına tamaşa etdi... Bir az o yanda sökük məqbərə – abidə görünürdü. "Demək mən bu ucqar aləmi seçməklə vətənimin gözəl bir guşəsini seçmişəm", – deyən Mehman elə bir guşə seçmişdir ki, bəlkə də heç öyrənilməmişdi?.. Bu yerlərin nə eli, nə adəti öyrənilmiş, nə bir kəs tərəfindən qələmə alınmış, nə bir sətir yazılmışdır... Halbuki bu yerlərin özünə görə qədim-qədim tarixi, bu qoçların, buğaların, qılınc-qalxanlı süvarilərin, başqa yanda görünən günbəzlərin, məqbərə və abidələrin bir sirri, mənası vardır. – Mehman bu yerləri seyr edib, düşündükcə, bütün bu yeni, eyni zamanda qədimdən qalan aləm ona mənalı, əsrarlı görü-

nürdü. Mehman belə bir əfsanəvi mənzərə aləminə bələd olmadan təqribi gəlsə də, indi burada gözlərini açdıqca yeni və maraqlı aləmlər görür, izdihamlı şəhəri qoyub, bu torpağa gəlməyindən heç də peşman olmur, Züleyxa xanım kimi ah-uf eləmirdi. Əlbəttə, Mehmanın ümdə məqsədi bu aləmi seyr etməklə bu abidələri, nişangahları harayasa köçürməklə, yaxud buranın özündə belə mühafizə edib-etməməkdə deyildi. Bir prokuror olaraq Mehmanın işi canlı insanların talelərilə məşğul olmaqdan ibarət idi. Mehmanın işi-gücü səssiz-küysüz ötüb keçən aləmdə deyil, səsli-küylü çığırdıla-çığırdıla sökülüb-tökülən, uçurulan, yenidən qurulub tikilən bir aləmdə idi. O, meşəli dağ-daşın arasıyla at belində dolana-dolana qalxdı, birdən əlini gözlərinin üstünə gətirib yuxarı dağın döşünə baxdı, evləri bir-birinə bitişən, boz tüstüsü başı qarlı dağların zirvəsinə doğru ucalan seyrək-seyrək obaları gördü... Mehman atın cilovunu çəkib başını döndərdi, darısqal, əyri-üyrü cığırla üzüyuxarı dırmandı, dağın gərdəninə sancılan günəşin şüaları gözlərinə düşdüyündən, başını yana çevirdi. Bu yerlərə bələd olan, bənd-bərələri bilən səkil at daşlı-qayalı cığırı bir erkəc kimi adlaya-adlaya bu biri yandakı obanın qənşərinə yetişib, qulaqlarını kürələyib, burunlarını pərələyib, güclü kişnərtilə kişnədi. At minmək, at belində gəzib-dolanmaq, xüsusən belə ucqarları seyr etmək özü də Mehmana görə bir dünya deyildimi? Təbiət aləminə düşən, kişnərtili köhlənin belində özünü bərkidən Mehman boylanıb yerə yapışan evləri sınayır kimi gözdən keçirdi...

Açıq sinədə, balaca klubun qabağında iclasdan yenicə çıxan cavanlar qaynaşır, iclas bağlansa belə sanki mabədi burada davam edir, əllər qalxır, qollar ölçülür, deyəsən elə söhbət də Kamilovun bu kolxoza verdiyi sonuncu göstərişin haqlı-haqsızlığı barəsində gedirdi... Mehman səkilini məhmizləyib cavanların qaynaşdığı yerə yetişdi, qızğın söz-sov yarandı, gənc süvari icma qarşısında baş əyib, salam verdi, çevrilib səkilin belindən düşdü. Heç kəs müəllim geyimli prokuroru tanımadı. Hətta bir cavan oğlan:

– Müəllim xoş gəlib! – deyə qonağın əlini qızğınlıqla sıxdı. Ancaq içəridə başı iclas protokolunu düzəltməyə qarışan komsomol katibi çıxınca, qonağın müəllim deyil, prokuror olduğunu işarə ilə bildirdi, sonra da cavan prokurorun işə möhkəmcə girişdiyini, hətta icraiyyə komitəsi sədri Kamilovun özü ilə belə dilləşdiyini komsomolçulara çatdırdı. Gözlər qıyıldı, arada atmacalar dolandı:

– Elə prokurorun özü də komsomolçuya bənzəyir, qıs-qıvraq!

– Nə olar komsomolçudan prokuror olanda, balam?
– İcrakom sədri də komsomolçu olsa nə əcəb olardı!
– Amma da çalsaqqalı olmayandan hökumət qoydular, ha?!
– Kamilov kötük kimi yolumuza yamanıbdır!
– Bu kötüyü dağlardan gələn bir bahar seli aparacaqdır!
– Bəs haçan, bəs nə zaman? Yoxsa qum göyərəndə?
Baş-başa verən cavanların arasında pırtlaşma getdi:
– Zalım oğlu Kamilov biz komsomoldan bircəciyini kənd içində görəndə, elə baxır ki, elə bil ki, dəvə nalbəndə baxır!
– Əgər Kamilov özü dəvə də olsa biz onu nallayacağıq!
– Onda dünya üzünü su alar, Nuhun tufanı qopar!
– Qoy tufan qopsun!
Mehmanla ayrılıqda söhbətə girişən rayon komsomol katibi Altayı tez-tez yada salıb onun adından danışıb, elə də Kamilovun kölgəsini qılınclayan, tez-tələsik, özünü Mehmangillərə yaxın olduğunu büruzə verən komsomol təşkilatçısı kənardakı söhbətə qarışıb:
– Ay uşaq, lap belə də ağ eləməyin! – deyə guya ədəb-ərkana riayət etmək istəyirdi. – Kamilovun qarşısını firqəmiz özü alacaqdır!
– Qoy elə yoldaş prokuror da bəri başdan eşidib, bilsin ki, Kamilov qolçomağa da olmasa, onun quyruğuna güzəştə gedəndir!
– Onu sonra, onu öz yerində! – deyə komsomol rəhbəri əlini qaldırıb endirdi: "guya iclasın sirrini dağıtmaq olmaz", – deyə tapşırıq verdi.
Söhbət bu yerə yetişincə kənardakı komsomolçular da o tərəfdən, bu tərəfə gəldilər, cavan prokurorla birbəbir görüşüb onu dövrəyə aldılar. Müəyyən söz-söhbətdən sonra komsomol katibi qonağı öz evlərinə dəvət etdi. Komsomol katibinin qarı nənəsi qabağa çıxıb, adəti üzrə, qonağa xoş gəldin elədi, cavan totuq gəlinini çağırıb çolpa tutmağı, çığırtma tədarükü görməyi qulağına xısıldadı.
– Bəs az olmazmı, nənə, bu qədər cavanların qabağında bir çolpa? – deyə gəlin Mehmanı müşayiət edən dəstəni göstərdi. Qarı nənə gözlərini gəlininə ağartdı, bununla da böyüyün kiçiyə qulaq asmalı olduğunu bildirdi. "Bu qızdan olsa, bir gündə bu evi komsomolun sel-suyuna verib buranı fot qoyar", – deyən qarı nənə dodaqaltı söylənib, qaynaşan cavanları süzdü. Qarı sərt və xəsis olsa da cavanlar ondan incimir, qarı nənəyə dolaşmadan, bəzən onu cinləndirib acıqlandırmaqdan, bəzən də könlünü alıb, güldürməkdən doymaq bilmirdilər... lakin bir anlığa yumşalan qarı tezcənə özünü bərkidib sərt sima alırdı...

qarı evin vahid hökmdarı, komsomol təşkilatçısı nəvəsinin də yeganə sahibkarı, ərinin qırxı çıxar-çıxmaz, tezcənə qoyub ərə gedən, bununla da zülmkar qayınanasına yanıq verən sabiq gəlinin hələ də barışmaz düşməni idi. Deməli, qarının azmı-çoxmu hakimliyə haqqı vardı. Bunu həm buraya toplaşan cavanlar, həm də komsomolçu gəlin bilməmiş deyildi... qarı qonaq qabağında qızarmayan, ancaq necə deyər, izafə yerə yumruğundan bir tək darı sızdırmayan idi. Deməli, bizim qarı nənə söhbətə var, süfrəyə yox idi! "Yoxsa bu iclaspərəstlər bu dam-daşı da yeyərlər, burada diş qurtdalamağa bir çöp də qoymazlar". – Qarı var-yoxunu ona-buna yedirib özünü qonşu möhtacı etmək istəməz, daş tərəzidə haqq-hesabını dolaşdırmaz, gəlirinə görə çıxarını təyin edər, yorğanına görə ayağını uzadar, yatanda belə büzüşüb yatardı... Qarı nənə öz işini bilən, əvvəlcə oğlunun, indi də komsomolçu nəvəsinin tüstüsünü düz çıxaran, qohum-qonşuya əl açmağı sevməyən, bir salım duz belə istəməyi xoşlamayan bir qarı, izafi adam üçün yox, öz qonağının xörəyi-çörəyi üçün əlləşdi, toran qovuşub, qaranlıq düşüncə qarının xasiyyətinə bələd olan cavanlar, bir-birinə göz vurub, yavaşca evlərinə yan aldılar. Daha vaxtdır deyən, gəlininə işarə edən qarı eyvanda, palıd taxtalarından düzəltdirdiyi geniş çarpayının üstündə yığcam süfrə açdı. Komsomolçu gəlin gah yaşmağını qaldırıb, qızaran yanaqlarını örtür, gah da qarının hökmranlığını unudub yaşmağını çənəsinə buraxır, onun qıpqırmızı dodaqları arasından sədəf kimi ağ dişləri görünürdü. Bizim təşkilat katibi Muğan bu kənddə hər bir işə qarışıb bir qulp qoyduğu halda, qarı nənəsinin işinə qarışıb heç bir qulp qoya bilmir, qarışmaq istəyəndə belə mütləq tutarlı zərbə alıb məğlubiyyətə uğrayıb geriyə çəkilirdi. Təzə qonaq başını qaldırıb hər şeyə baxmasa da gözaltı baxır, bir çox şeyi görürdü. Bu ailənin də üç nəfərdən ibarət olduğunu Mehman müəyyən edir, istər-istəməz bu ailəni öz ailəsilə müqayisə edirdi.

– Yox, Xatun fəqir anadır! – deyə Mehman anasının bu an necə nigarançılıq içində olduğunu, bəlkə indi orada qaranlığın içində, eyvanın məhəccərinə dayanıb, dağlar səmtinə baxdığını, göz çəkmədiyini təsəvvürünə gətirirdi... Ancaq bu gəlin başqa, o gəlin də başqadır!.. Burada çit paltarlı, balaca boylu gəlin qarı nənənin qulluğunda mövcud durub, düyəçə kimi fırlanır, ancaq orada hirsli-hikkəli Züleyxa xanım tovuz kimi sallana-sallana dolanır... Görünür, Züleyxanın anası Şəhla xanım onu elə böyütmüşdür. Totuq komsomolçu gəlini öz anası necə böyütmüşsə indi belə bir zabitəli qarının əlinə düşmüşdü. Qarı nənə öz sümüklü

yumruğuyla daş-dəmiri yumşaldır, o ki, belə 18-19 yaşlı yupyumşaq bir gəlin ola?! Bu komsomolçu gəlin hər necə böyüdülmüş olsa da, qarı nənənin yumruğu altında bərmuma dönməli idi!.. Demək həyat müxtəlif, ailələr də müxtəlif, nənələr də müxtəlifdir! İndi Züleyxa görəsən nə eləyir? – deyə Mehman nəfəsini dərdi, onun təsəvvüründə ağac məhəccərə söykənən, həyəcan içində dayanıb, zülmət qaranlıqda öz oğlunun intizarını çəkən mülayim mehriban Xatun canlandı.

Üz-gözündən zəhm-zabitə yağan qarı hazırladığı çolpa çığırtmasının çox payını qərib qonaq üçün çəkib süfrəyə, Mehmanın qabağına qoydu... Sonra da qarı ağ beçə bal gətirtdi. Qarı nənə, nəvəsi üçün yüngül pay çəkdi, qazançanın dibində bir cüzi özünə və yumru gəlininə saxladı:

– Yeyin balalarım! – deyə qarı dönüb, mehribanlıqla Mehmana üz tutdu. – Yoxsa bir azdan bizim Muğanın komsomolu tökülüb gələcək, sizə göz açmağa imkan verməyəcəkdir. – Qarı nənə gülüb dişsiz ağzını açdı. – Bircə bu kənddə komsomollar məndən qorxurlar, yoxsa heç Allahdan da çəki-bəkiləri yoxdur... – Muğan başını bulasa da, açıq danışmağa adət edən, yaxşı-yamanı ürəyində gizləməyən qarı sayı-hesabı olmayan, gündə bir neçə dəfə axınıb gələn komsomolçuların müqabilində dayana bilməyəcəyini, "çəyirtkə dəstəsi"nə yeyib-içmək çatdıra bilməyəcəyini etirafa məcbur olub özlüyündə qərar vermişdi: bir su, bir də qovurğa-qoz! Qarı nənənin xasiyyətinə bələd olan komsomolçular xörək-çörək barədə qarını qızartmaz, onun qovurğa-çərəzini, əpələyə-səpələyə yeyib gülüşər, qarı qızışınca evdən çıxıb qaçardılar. Komsomol axınının təkrar başlanacağını, onların qonağın başına toplanacağını təsəvvürünə gətirən qarı:

– Ye, qızım! – deyə çığırtma qazanını ortaya qoydu, – mən tikəmi yağına batıracağam, sən sür-sümüyünə baxma, gəmir getsin, qab-qacağı yığıb-yığışdıraq qurtarsın!

Muğan altdan Mehmana nəzər salıb nənənin qoruq-qaytaq bilməyən sözləri müqabilində qızara-qızara başını yelləyib gülümsədi, qarının dəmir qanunu qarşısında acizlik çəkdiyini etirafa məcbur oldu. Mehman dinməzcə hərəkət etsə də, bu dağlı evindəki hər bir tərpənişə fikir verirdi. O gördü ki, burada həyat necə rəngsiz, boyasızdır, hətta içəridə olan nöqsanları belə gizləmir, başqalarının yanında ört-basdır etmirdilər. Bu həyat Mehman üçün yeni həyat idi. Zahirən nə qədər nəzakətsiz görünsə də bu doğru idi, düz idi. Şəhla xanımın, onun bacısı Katibə xalanın, onlardan təlim-tərbiyə alan Züleyxanın həyat və hərəkətində nə isə bir başqalıq, zahiri nəzakət, daxili bir fitnəkarlıq vardır...

Acıxan Mehman qarı nənənin çolpa çığırtmasını çox da böyük olmayan dairəvi yuxa çörəklə yeyib qurtarınca, qarı nənənin ehtiyat etdiyi komsomolun qabağı açıldı. Onlar özlərini istər-istəməz çaya çatdırdılar. Kolxoz sədrinin, qonşuluqdakı sovet sədrindən, elə də kolxozçulardan, kolxozçu qadınlardan belə müəyyən bir qisim adam da bir-bir tökülüb qonağın görüşünə gəldi. Hamı Mehmanla görüşüb, xoş-beş elədi... Müəyyən söz-söhbətdən sonra adam olan çözələndi, bəzisi dil-cavabı şikayət etdi, bəzisi də yazdırdığı ərizəsini prokurora yetirdi... Axırda özünü saxlaşdıra bilməyən qarı nənə qahmar çıxıb:

– Balam, bu dağın başı bəyəm sizdən ötəri divanxana dəftərxanasıdır? – deyə öz arıq taxta sinəsini gərdi. Söz-söhbət dəyişə-dəyişə dolandı, əyri ya düz məsuliyyətə alınanlar barədə getdi, sözarası Salamatovdan da söz açıldı. Mehman danışığa fikir verdi, Salamatovun bədinə gedən olmadığını kəsdirdi. Uzaqdan-uzağa olsa da, onun əliəyriliyini, xəyanətini söyləyən olmadı. Hətta qarı nənə də açılışdı, körpə külfət sahibi Salamatovun nahaqdan qazamata düşdüyünü bildirdi. Ədalətsiz işlər barədə Kamilovla nəvəsi Muğan arasında baş verən ixtilafdan danışıb nəvəsinin tayında durdu.

– Olmaz ki, sən yağlı-qaymaqlı yerə düşüb, haqqı nahaqqa verəsən! – deyə qarı nənə hökmdarsayağı hiddətləndi, nəvəsinin başından bir tük əskik olsa, onu şərə-şürə salmaq istəyən olsa, bütün dünyanı bir-birinə vuracağını Kamilovun kölgəsi saydığı sovet sədrinə barmaq hədəsi elan etdi.

– Ay Tükəzban nənə, bura heç yeri deyil! – deyə sovet sədri rəisinin namini əldən verməsə də, Tükəzbanın qaraqışqırığı müqabilində mumladı.

Mehman fikir verir, buranın özündə gedən gərgin mübarizəni görürdü. Mehman görürdü ki, yaxşı da, yaman da dalğalanıb yayılır, qurulamaqda olan yeni həyatla artıq kökündən sökülən köhnə həyat arasında ölüm-dirim mübarizəsi gedir. Kamilovun qanunsuz hərəkətləri heç zaman orada onun öz kabinetində bitib qalmır, bu dağlıq obalar da yayılıb öz əks-sədasını verir, Mehman öz təbiətinə görə hər bir söz-söhbəti qiymətləndirir və mənalandırırdı. Beləliklə o, axşamına burada adamlarla söhbət edib, bir çox şey öyrəndi, tanış olmadığı aləmə baş vurdu, gecəni yatdı: sabah sübh tezdən yerindən qalxdı; qarı nənənin açdığı süfrədə çörək kəsib, bişirib-gətirdiyi qayğanaqdan yeyib, iki stəkan içdi, sonra onu əhatə edən adamlarla görüşüb, qarı nənəyə razılıq

edib, səkilin belinə qalxdı. Mehman öz səfərində uca, başıqarlı dağların ətəklərinə yapışan obaları gəzib dolandı, yenə də bir çox şey gördü, bir çox söz eşitdi, bir çox ərizə aldı... Dördüncü günü o səkilin başını Mirzəoğlu yaşayan obaya tərəf döndərdi... Mehman bu obaya getməklə Mirzəoğlundan atası Murad barəsində söz eşitmək, mərhumun xatirəsinə hörmət olaraq Mirzəoğlunu dinləmək, onunla ağıllı-başlı danışmaq istəyirdi. Mehman bir neçə gün əvvəl göydən əlinə düşən Mirzəoğlunu tezcənə əlindən buraxdığına peşman idi... Bəlkə də, Mehmanın öz qonağıyla rəsmi rəftarı və bir növ quruluğu-qaraqabaqlığı atasının dostunu qaçırmışdı?.. Ancaq Mirzəoğlu rayon mərkəzini qoyub qayıdandan sonra Mehman sarsılmış və sarsıntısını bir kəsə, o cümlədən anası Xatuna da bildirməmişdi. İndi o, atası Muradın inqilabi cəbhədə, Şura hakimiyyəti uğrunda necə vuruşub, necə həlak olması barəsində bütün təfərrüatıyla hər şeyi bilmək istəyirdi. Eyni zamanda o, prokurorluq vəzifəsi mövcibincə Salamatovun nə dərəcədə günahkar olub-olmadığını da, bir daha dürüstləşməklə əlavə məlumat almaq istəyirdi... dağa-daşa baxan, səkilin cilovunu əlindən buraxmayan, xəyaldan üzülməyən, vəzifəsinin məsuliyyətindən qopmayan Mehman istəyirdi ki, qarşısındakı mühüm vəzifənin öhdəsindən gəlsin; dəyərli iş görsün. Axı o, Mehman təhsil illərində tapşırılanı oxumaqla kifayətlənməmişdir, dərinlərə, xəyal aləminə də getmiş, arzular da etmişdi. İndi Mehman görürdü ki, arzular heç də öz-özünə çiçək açmır. Əksinə, gözəl arzular qəti müqavimətlərə, mürəkkəb mübarizələrə, Kamilov kimi dürlü-dürlü, kələ-kötür kötüklərin dözülməz dərəcədə ağır təzyiqlərinə rast gəlir...

Qulaqlarını kürələyib dağa-daşa baxan səkilin cilovunu əlindən buraxmayan, Mehman toran qovuşa-qovuşa isnad verilən dağ kəndinə girdi, başını qaldıran itlər ünləşib hürə-hürə atlıya cumdular. Naxırı döndərən naxırçılar, qoyun sürülərini qaytaran çomaqlı çoban-çoluqlar köpəklərə acıqlanıb atlının ətrafından qovdular.

– Mirzəoğlunun evi haradır? – deyə Mehman soruşunca saqqalına dən düşən gövdəli bir çoban əlaltısını səsləyib qərib qonağı yuxarıda ağ kirəcli qayanın dibində yerləşən Mirzə kişinin həyətinə çatdırmağı tapşırdı. Şişpapaqlı, qırmızı sifətli cavan oğlan qabağa düşüb atlını doqqaz çəpərli həyətə yetirdi. Səkil ev sahibini xəbərdar edirmiş kimi uca səsilə bir kişnədi, çiyinləri büzmə çuxalı, ucaboylu, ağ uzunsaqqallı qoca kirəcliyə yapışan komasından çıxıb:

– Qonaq bizim evimizə xoş gəlibdir! – deyə atlını süzüb ona əl verdi, dönüb içərini hayqırdı.

– Ay uşaq, harada ölmüsünüz?

– Biz hamımız buradayıq, baba! – deyə dəstə çoluq-çocuq həyəti bürüdü. Mirzə kişi:

– Ay uşaq, qonağın atını tutun! – deyə qışqırdı, "mən-mən!" səsi bir-birinə qarışdı, oğul-uşaq dəstəsilə səkilin zaqqasından* yapışdı.

– Əyə, əlimi cırmaqladınız!

– Əyə, qolumu qırdınız!

– Bay atonnan, bunların dəcəlliyinə bax ha! – deyə Mirzə kişi top-top uşağa acıqlandı, yorğun düşən Mehman atdan aşırıldı, qoca, qonağın qolundan tutub onu eyvana dəvət etdi. Ortaboylu, tökməvücudlu arvad yanar lampa ilə eyvana çıxdı, ətrafı seyrək işıq bürüdü... Bir azdan qonşu obadan olan, üç para kəndin birləşmiş kolxoz sədrliyini aparan Mirzəoğlu da gəlib çıxdı. O, aşırılıb atından düşdü, eyvanda ağac çarpayı üstündə əyləşən Mehmanı görüncə:

– Qardaşoğlu bizim komaya xoş gəlibdir! – deyə qollarını açıb yeridi, Mehmanı qucaqlayıb onun üz-gözündən öpdü, rayondakı rəsmiyyəti, ürəyində yatıb qalan umu-küsünü kənara buraxdı. – Bizim Muradın oğludur, Atamoğlan Muradın oğlu! – deyə o, tək gözünü gəzdirib qonağı atasına təqdim etdi.

– Həmin Bakıdakı nöyüt buruqçusununmu? Sənin siğə qardaşının?

– Həmin, həmin! – Mirzəoğlu doğma bir əmi nəvazişilə Mehmanın kürəyinə vurub, qıvrım saçlarını tumarladı, – Mehman! Bizim rayonun qanunpərəst qupquru prokuroru!

Mehman ev sahibinin nəyə işarə etdiyini dərk edib, istər-istəməz yerə baxdı, qoca kişi dil-ağızla:

– Olsun-olsun, qulluğu daha böyük olsun! – deyə cavan oğlana zənn etdi, sonra da uzun arxalığının cibindən qırmızı qarağat saplı demisini çıxarıb tənbəki çör-çöpü ilə doldurdu:

– Öz evin, öz əməyin, daha dürüstü babayın ocağıdır! – Mirzəoğlu Muradın balasına olmazın xoşsifət göstərib, dilmanclığını atmağa, tündməcazlığını boğmağa çalışdı. Mirzə kişi qarısına, qarı da ortaboylu, tökməvücudlu gəlinə nə isə tapşırdı. Bir qədərdən sarı samovarda çay dəmləndi, üstündən plov hazırlandı, böyük süfrə açıldı. Bütün külfət yaxın, uzaq qohum-qardaşdan belə otuz-qırxa yaxın adam toplandı, onlar ağ

---

* *Zaqqa* – cilovun atın çənəsinə bitişən yeri

lavaşdan parçalayıb məcməyidə qalaqlanan əmlik-plova girişdilər. Qərib qonaq da utana-utana bir az yedi, üstündən üç stəkan pürrəng çay içdi. Söhbət hərləndi. Mirzəoğlu köhnə dostu Muraddan söz saldı. O, Muradın inqilabi fəaliyyətindən, düşmənlərə qarşı döyüşündən, Şura hökumətinin yolunda canını əsirgəmədiyindən qızğınlıqla, özü də xeyli danışdı. O, cavan oğlanın necə bir kişi oğlu olduğunu həmkəndlilərinə bildirdi. Mirzəoğlunun sözlərinə Mehman diqqətlə qulaq asır, təsəvvüründə canlanan atasının xatirəsini yad edir, sanki Murad kişi Xatunu oğlu Mehmana tapşırırdı:

– Oğlum, anadan muğayat ol, onun əzab-əziyyəti çox-çoxdur!

Murad sanki söhbətə müdaxilə edir, Mehmanın evində yaranan vəziyyətdən, mamayevlərlə olan qohumluğundan narahat olduğunu bildirirdi, – “Oğlum, adımızı təmiz saxla, bizi qara ləkədən gözlə!” Burada, bu ucqar dağın döşündə, bu söhbət zamanı, belə, atasının xəyalı da belə ona həmin məşum “ləkə”ni xatırladır, oğlunu xəbərdar edir. Bu nə olan, necə olan şeydir?.. Niyə Mehman bu eybəcər “ləkə” xəbərdarlığını dönə-dönə eşitsin? Olmazmı bu xəbərdarlıq bir dəfə, bir adam tərəfindən olsun, birdəfəlik qurtarsın?.. Ləkə, ləkə, zəhrimar, qara ləkə!.. Qoy bu “ləkə” sözü bir daha təkrar edilməsin, Mehmanın ürəyinə heç bir qara xal düşməsin!..

Mehmanın həm narahat, həm də udquna-udquna uşaq aludəliyilə dinlədiyini görən Mirzəoğlu təfərrüatına varmadan dayanmır, dostu Muradın və Murad kimilərinin unudulmaz qəhrəmanlıqlarından dastan açır, bu mübarizlərin fəaliyyətlərini qiymətləndirir, Şura hökumətinin necə ağır-ağır, çətin-çətin yolla milyon-milyon adamların pak qanları bahasına başa gəldiyini cavan oğlana aşılamaq istəyirdi. Nəinki bir tək Mehman, elə də qoca Mirzədən başlamış qoca qarılar, hətta ətrafda dövrə vuran uşaqlar, qızlar belə cıqqır çıxarmadan öz sağ gözünü döyüşlərdə itirən adamı dinləyir, nəfəslərini dərmirdilər...

Mirzəoğlu canlı bir kitab kimi açılıb vərəqləndikcə vərəqlənir, sanki Mehman bir çox döyüş səhnələrini öz gözlərilə görüb, iştirak edir, belə ağır qan bahasına başa gələn hökumətin yolunda öz varlığını əsirgəməyəcəyini təkrarən qət edirdi. “Bu qanlara qiymət qoymamaq nə qədər də vicdansızlıq, ədalətsizlik olardı!.. Rütubətli, qaranlıq zindanlar, səsli, qandallı sürgünlər, qarlı-tufanlı, çovğunlu Sibir çölləri!.. Yox-yox, Muradın da, bütün bu mərd, mübariz adamların da qanı adamın üzünə durub cüzi haqsızlığa və xəyanətə üsyan edərlər! Məlikə müəllimə deyən, indi

bir an əvvəl Muradın xatırladığı addımbaşına eşidilən, bu məlun, mənfur, eybəcər qırxağızlı, qırxayaqlı, "ləkə"ni götürüb adamın üzünə də yox, düz gözünün içinə, bəbəyinin ortasına çırparlar!.. Deyərlər, biz dövlət qurmamışıq ki, siz – dünən gələn onu rüşvətlə, bizim qanımızla yazdığımız qanunu xəyanətlə ləkələyəsiniz! Deyərlər, deməzlər? – Əlbəttə, deyərlər!.. Bəli, həm hazırına gəlmək, həm də verilən, nəqd göz kimi sayılan donluqla kifayətlənməyib, harınlaşmaq, Şura qanununa xəyanət etmək, özünü, öz vicdanını kömür kimi qaralayıb ləkələmək xəyanətdən də xəyanət, cinayətdən də cinayət olardı!.. Nəhayət və nəticə etibarilə əksinqilabçılığa bərabər ağır bir hərəkət olardı, dözülməz olardı, satqınlıqdan da artıq satqınlıq olardı. Rüşvət almaq, Şura qanununu hörmətdən salmaq, düşmənin dəyirmanına güclü su, çırağına yağlı nöyüt tökmək olardı!.. Mehman yığılıb-açılır, onun qulaqları cingildəyirdi.

Mirzəoğlunun canlı danışığı, ötən döyüş dünyası Mehmanın oxuduğu hər hansı kitabdan da artıq ona təsir edir, dərin izlər buraxırdı. Hətta adamlar dağılışıb gedəndən, Mehman yataq yerinə girəndən sonra belə əzgin-yorğun olmağına baxmayaraq xeyli vurnuxdu, götür-qoy etdi. İndi də atası Muradla anası Xatun birlikdə gəlib onun gözləri qabağında qoşa dayandılar. Mehman öz vəzifəsinin qurğuşun kimi ağırlığını, böyük vicdan məsuliyyətini ciddən, daha dərindən dərk edir, ancaq cənab mamayevalardan yana, onun dalağı sancır, belə bir ailə ilə bağlanmağın nə olduğunu aydın edə bilməsə də, üşütməsini keçirirdi. Girdablara düşən Mehman birdən qalın yorğanın altında titrədi, onun vücudu üyüşüb açıldı... Sonra da cavan adam istər-istəməz cazibədar arvadı Züleyxanı xatırladı, qıvrılıb açıldı, çətinliklə də olsa yuxuya getdi. O, yuxusunda gördü ki, Züleyxa ona şərbət yerinə zəhər içirdir... Mehman hərasan olub ayıldı, bu hadisənin yuxuda olduğunu görüb qeyri-iradi sevindi, ancaq yenə də fikir dəryasına cumdu. O, yuxuya inanmasa belə, Züleyxanın mübhəm baxışlarından xoşu gəlmədiyini, çox bərk narahat olduğunu müəyyən edib nəfəsini dərdi, yenə də yorğana bürünüb-bükülüb bərk-bərk büzüşdü, bir azdan üstünə nə isə bir örtü sərildiyini hiss etdi. Sübh tezdən baş verən səs-küy, yeni yetişən taxıl biçini üçün göndərilən adamların, xüsusən qadınların cır səsləri Mehmanı da tərpədib qaldırdı. Hay-haraydan sonra kövşənə gedən getdi, obada qalan qaldı... Mirzəoğlu özünün rayona etdiyi səfər barəsində hələ də bir söz açmır, Salamatov haqqında heç nə demirdi. İndi artıq Mehman geriyə, rayon mərkəzinə, vəzifə başına dönməli idi. Buna görə də Mehman vurnuxur, özünü bir

prokuror kimi göstərmədən təbii bir yolla açılışmaq, rəsmiyyətdən kənar söhbət aparmaq, Salamatov barəsində mötəbər və inandırıcı rəy bilmək istəyirdi...

Çörək yeyilib, çay içiləndən sonra kirpiklərinə qədər üzünə yaşmaq tutan bir qadın iri-xırdalı bir dəstə qızla çəkinə-çəkinə həyətə girdi. Gələn qadın dili ilə yox, başı ilə qonağa salam verdi. Qızlar dəstəsi qərib qonağı gözdən keçirib dörd yandan analarını əhatə etdilər.

– Bu topa ki var, həmin Salamatın çolma-çocuğudur. – Mirzə kişi uzun çubuqlu demisini sümürüb üzüyuxarı tüstülətdi. – Əhvalatın nə yerdə olduğunu da yəqin ki, sədrimiz, siz prokurora bəyan eləyibdir!

Mehman etiraf edib bu işi çoxdan gözləyirmiş kimi maraq göstərdi, qocanı dinləməyə hazır olduğunu bildirdi. Bərkdən öskürüb sinəsini arıtlayan qoca:

– Bax bu arvad ki, var, abırlı-ismətli bir gəlindir! – deyə demisini çomaq kimi dolayıb tutdu. – Bu da tutulan Salamatın bir çətən qız külfətidir, hürkütməsən sanamaq olmaz, südəcərə-südəcərə yeddi bacı!

– Bəs o qazamatda yatan Salamatın öz təqsiri necə, baba? – deyə Mehman ona tərəf zillənən, dinməsələr belə prokurordan imdad gözləyən gözlər qarşısında bir tərəfdən sarsılmağa, o biri tərəfdən də daşı quyuya salan Kamilova qarşı qəzəblənməyə başladı. – Bəs o tutulanın günahı nədir, hörmətli baba?

– Yəni Salamatın, təqsiri, günahı, – deyə qoca, prokurorun sorğusunu dəqiqləşdirmək naminə demisini bərk-bərk sümürüb, tüstüsünü havaya buraxdı.

– Bəli, mən sizdən, möhtərəm baba, Salamatın özü barəsində doğru-dürüst söz eşitmək istərdim, – deyə Mehman ayağa durub ağac çarpayının qılçasına söykəndi. – Rica edirəm, baba!

– Bizim bu oğlan ki, var, səni bu əmin çox dikbaşdır! – deyə qoca qırmızı qarağat saplı demisini uzadıb oğlunu göstərdi, – özü də köhnədən Bakı bolşeviyidir, özü də hamısını nağıl eləyib, sizə ərz elədi!..

– Bunun mətləbə dəxli varmı, baba? – deyə Mehman ehtiyatla davranıb, möhtərəm qocanı əsl mətləb üstünə nəzakətlə gətirməyə cəhd etdi, – mən bizim işə dəxli olan mətləbi bilmək istərdim.

– Dəxli belədir ki, – qoca ağ qaşlarını çatıb intizarlı gözlərilə imdad diləyən qız külfətinə nəzər saldı. – Dəxli budur ki, Kamilov ki var, içi küfül, özü yopyoğun bir palıd kötüyüdür!

– Bəli, baba, buyurun!.. Mən sizi səbirlə dinləyirəm!..

– Bəli o küfül, palıd kötüyü hey bizim bu kolxoz sədrinin bostanına daş-qaya atar!

– Niyə daş-qaya atar, baba?

– Ürkür, sənin bu qəzəbnak əmindən, sənin atan Muradın bu gözü-sarıqlı dostundan ürkür... Ürkür ki, birdən bunu dartıb aparıb taxtı-səltənətində əyləşdirərlər!

– Atam da saqqal tərpədib söz danışdı ha! – deyə Mirzəoğlu tək-gözü qızara-qızara başını buladı. – Atam da oturub-durub, uzun saqqal tərpədib söz danışdı!

– Saqqal tərpədib söz danışmağa gələndə ya uzun olsun, ya gödək olsun! – deyə hirslənən qoca qarağat demisini çomaq kimi əlində oynatdı. – Sözün düzü də budur ki, burada bizim bir qacalov tayfa var, ömür-gününü haramxorluqda keçirən, mayaları da haramxorluqla tutulan... Hə, özü də Kamilovun düşərgə yeri! Özləri də başdan-başa qeyrətdən qırıq, arvadı özünə çəpərçəkən dəyyus qurumsaqdılar!

– Ata, ata! – deyə oğul ataya irad tutdu. – Belə sözü dilə gətirmək sənə yaraşmaz, qoca!

– Düz çözələməsən kələf açılmaz, oğul!

– Mətləb üstünə gəl, ata, mətləb üstünə!

– Bəli, mətləb üstünə, baba!

Qoca ağır-ağır, tələsmədən demisini sümürüb tüstülətdi, sonra da "hə, bəli" deyib davam etdi:

– Hə, bəli, Kamilov ki var, əsil günahkarı çayın o yanında qoyub, yəni bizim oğlanın ayağının altını qazıyan adamı o tərəfdə qoyub, tutub bunun sağ əlini dirsəkdən kəsibdir!

– Necə sağ əlini dirsəkdən kəsibdir, baba? – deyə Mehman soruşdu, – kimdir o sağ əl, möhtərəm baba?

– Salamat! Bizim bu şirkətin dirəyi! Bizim bu sədrin də sağ əli idi!

– Biz də elə, möhtərəm baba, həmin vətəndaş Salamatovun həbsə alınmasının səbəbini dərindən aydınlaşdırmaq istəyirik, – deyə Mehman, cıqqır çıxarmayan, nə isə buradan işıq ucu gözləyən qız-qadın külfətini nəzərdən keçirdi. – Biz qanun və ədalət naminə aydın etməyə çalışırıq!

– Bir də, iki də, üç də, beş də aydın eləyin, – deyə qoca qarağat demisini daşa döyüb boşaltdı, bir də yenidən doldurdu. – Ancaq heç zaman bu dünya üzündə haqqı nahaqqa verməyin, oğlum! – Qocanın ağ qaşları dartıldı, gözləri genişləndi. – Elə eləyin ki, mənim əziz balam, günahkar kefdə, günahsız qəzəmətdə, bir çətən qız külfəti də belə gözü yaşda,

sər-sərgərdan qalmasın. – Qoca tüstülənən demisilə qadını dövrələyən, gözləri yaşaran tor-top qızları göstərdi. – Bax, o Salamat günahkar olsa da, nə mən, nə də mənim bolşevoy oğlum sən prokurora ağız açıb, dil tərpətməz!.. Bir məsəl var deyirlər: "Zülm ilə abad olan ədlilə bərbad olar". Düz də eləyibdir, bu savaşqan qacalov yolkəsən, quldur-qaçaq başçılarını qolçomaq dəftərinə saldırıbdır!

– Gecə kitab açma, ata! – deyə yenə də Mirzəoğlu atasının mətləbdən uzaqlaşmağına etiraz etdi, – gecə kitab açma, kişi! Salamatovun üstünə gəl, aydın söylə, o, düzdür, ya dələduzdur?

– Niyə açmayım, gecə kitabı? – deyə qoca tüstülənən qarağat demisini qaldırdı. – Gərək, hər şeyi bu cavan prokuror yerli-yataqlı bilsin ki, özünə gün kimi aydın eləsin o kişi düzdür, ya dələduz? Yoxsa işdə tala-duman oldumu, kölgə salar, haqq nahaqqa qatışıb, zülmətdə itər. Qaranlıq-zülmət işdə də əyri yana yayınar, düz-düzdə qalıb nahaqdan dolaşığa düşər! – Qoca mahir bir natiq kimi qəzəblə ayağa durub, səsini qaldırdı: – Gərək Salamatın işi, bizim bu gözüyaşlı qızların atasının hərəkəti, bizim bu cavan prokurora, bir divanbəyi kimi, əl içi kimi aydın görünə ki, o düzü düz, əyrini əyri kəsə, dələduzun yerini bildirə!.. – Bu təfsili təşbehli sözlərlə qoca isbat etmək istəyirdi ki, Salamata isnad edilən günah başdan-başa qondarmadır, burada heç bir əsas, heç bir bünövrə yoxdur.

– Kim deyir ki, günahkar tutulmasın? Heç kim? Gərək əyri-üyrü, bic-dələduz, haramxor, rüşvətxor, yolkəsən, başkəsən tutulsun ki, düzlə əyri ayırd edilsin! – Qəzəbli qoca yeni bir dil açmış kimi demisilə danışırdı: – Yoxsa Nikolay zamanı bəy kəsən başa sorğu yox idi! Düz qəzəmətdə çürüyürdü, əyri at belində, yanıqılınclı gəzirdi!.. Niyə? Nədən ötəri? Çünki oğul, zəmanə bəy, xan, quldur-qaçaq zəmanəsi idi! Gərək bu zamanda əyriyə aman, düzə zaval olmasın!.. – Qoca öz demisini tovlayıb qayıtdı, ağac çarpayının küncündə, öz əvvəlki yerində qərar tutdu, demisini həmin çör-çöplü tənbəkisilə doldurub yandırdı, hirslə çəkib tüstülətməyə başladı.

Bir vaxt Mehman əlini cibinə atıb, dəftərçəsini çıxartdı, qızların adlarını bir-bir soruşub yazmağa başladı. Mehman gözüyaşlı qızların şeh bürüyən gül-çiçəkdən ibarət: – Yasəmən, Bənövşə, Qərənfil, Sünbül, Lalə, Nərgiz, Tərgül olduqlarını görüb – "Yox, bu çiçəkləri soldurmaq olmaz!" – dedi, and içir kimi dik dayandı... O bu işdə ancaq qanun üzrə haqq-ədalətlə hərəkət edəcəyini, kim olursa olsun düzə düzlüklə kömək

edəcəyini bildirdi. Mehmanın danışığı qarağat demili qocanın xoşuna gəldi. Qoca da yenidən dik qalxdı, həyətin kənarına yeriyib ətraf komaları, evləri səslədi. Az müddət ərzində özü kimi qarağat demili qocalardan on nəfərə yaxın adamı buraya topladı, gələn qocalar Mehmanla görüşdü, bir də təzədən söhbət qızışdı. Qocaların çoxu Salamatın düzlüyünə, onun salamat adam olduğuna zəmanət verdi. Ancaq bir neçəsi də, həqiqəti aça bilmədən, ağızlarına su alıb dinmədilər. Bunlar qacalov tayfanın imansız qocaları idi. Lakin Mehman haqq-ədalətlə danışan hər bir qocanı diqqətlə dinləyirdi. Söhbət zamanı qocalar bəhsə-bəhsə düşmüş kimi qarağat demilərinə güc verir, sümürürdülər. Meydana girən qocalar cavan prokurorun hüzurunda, bəzi mərifət dairəsini keçib, qızışır, xüsusən onlardan üç-dörd nəfəri bir-birinə macal vermir, İman-Qurana and içib dediklərinin doğruluğunu sübuta çalışırdılar. Əlbəttə, danışanların hamısı bir cürə danışmır, əli titrəyə-titrəyə nala-mıxa vuranı da olurdu. Ancaq bu qocalardan heç birisi Salamat Salamatovun dələduz adam olduğunu demir, "bir ayağı burda, bir ayağı gorda" olduğu zamanmı, ya cavan prokurorun ədalət adamı olduğunu duyduqları üçünmü Salamat barəsində uydurulan ittihamlara qol qoya bilmirdilər:

– Yox, yox, bizim imkanımız var, biz yalan-palan danışıb nə Salamatın babalını, nə də bu qızların ah-naləsini boynumuza götürə bilmərik! – deyə döşü atlanan "imanlı qocalar" öz sözlərini xülasə edirdilər, – gor var, qıl körpü var, qır qazan var, biz oraya yıxılıb, şaqqur-şuqqur yana bilmərik!..

Salamatın bir çətən qız külfəti saqqalları tərpənən qocaların söhbəti zamanı tərpənmir, heç kəs o biri kəsdən qopub aralanmır, bir kəs belə cıqqır çıxarmırdı. Əksinə, hər qoca danışdıqca qızlar analarına sıxlaşır, ağlıkəsən qızların doğru ümidverici sözlərdən yana sevinclərindən gözləri yaşarır, körpələr isə hansı bir hiss ilə duyurdular ki, söhbət onların xeyrinə gedir. Mehman səbir və təmkinlə, bir kəs alt-üst bassa belə öz əlini qaldırıb sözünü kəsmir, ancaq birdən alt-üst vuranda, söz-sözü tutmayanda gülümsəyirdi. Beləliklə, o, söhbəti başa çatdırıb ayağa qalxdı, qocalarla görüşüb xudahafizləşdi, nəhayət, Salamatın topa külfətinə yanaşıb:

– Siz arxayın olun, qızlar! – deyə Mehman onlara təsəlli verdi.

– Biz atamızı Şura hökumətindən istəyirik! – deyə qızların tutuquşunu andıran səsləri bir-birinə qarışdı.

Qızların anası heç bir söz deməyib yaşmağını kirpiklərinə qədər qaldırdı, həyəcanından titrəsə də öz hisslərini gizləməyə çalışdı. Əgər

Salamat əbəs yerdən beş-on ilə həbsə, sürgünə gedirdisə, bəs onda Güləbətin bu boyda qız külfətini necə saxlar, başı papaqsız evi necə dolandırardı?.. Yox, Güləbətin dinməsə də öz dərdini Mehmana danışmış, öz ürək sözünü ədalət gözlədiyi prokurora çatdırmışdı. Doğrudan da Güləbətinin üzə açılışıb, dinməməyi, çığır-bağır salmamağı, qarayaxalıq etməməyi Mehmana çox-çox söz demiş, ona deyəcəklərindən güclü təsir etmişdi. Mehman belə bir külfəti günahsız yerdən başıkəsik qoymağın necə ağır bir dərd olduğunu dərk edirdi. O öz yerində gözüylə gördüyü, qulaqlarıyla eşitdiyi üçün, o bu işin hər hansı sözlərlə yazılan kağızdan, tərtib edilən möhür basılan sənəddən də artıq təsirini duyurdu. Demək kağızlar, sənədlər hüquqi nöqteyi-nəzərdən nə qədər zəruri və nə qədər gərəksə, belə üzbəüz söhbətlərin özü də heç az gərək deyildir!..

– Görün, heç bu qədər də qız uşağını boynuburuq qoymaq olarmı? – deyə Mehmanın dolub tutulduğunu görən, cavan prokurorun ədalətlə hərəkət edəcəyinə şübhə etməyən Mirzə kişi adını tutmasa belə, Kamilovu əkən gorbagor ataya lənət yağdırıb, küfr olmamaq üçün ağ, uzun saqqalını uzanasına tumarlayıb, oğlunun gözünü yayındırıb salavat çəkdi, qalan qocalar da eynən saqqallarına tumar verdilər. Bununla da bu saç-saqqalda yalan danışmadıqlarını, bir daha prokurora yetirdilər. Mehman bayaqdan bəriyə hirsini yeyib özünü güclə saxlayan Kamilovun qarasına söyüb-söylənməyən, Mirzəoğluna müraciətlə səkilin gətirilməsini xahiş etdi. Mirzəoğlu səsi dolusu böyük oğlunun üstünə bağırıb:

– Ədə, Xanlar! – deyə açılışdı, – qardaşoğlunun atını tez yəhərləyib, yüyünləyib, gətirib gəlin!

İşin pis tutmadığını görən Mirzəoğlu özü də səfərə hazırlaşdı, o, taxtaqaburlu mauzerini çiynindən aşırdı.

– Sən haraya! – deyə qoca oğlundan xəbər aldı.

– Mən də qardaşoğlunu bu qabaqkı bənd-bərələrdən keçirim! – deyə təkgöz adam cavab verdi, qoca başını yelləyib qarağat demisini tüstülətdi, qalan qocalar da bu fikrə şərik olub, qarağat demilərini tüstülətməyə girişdilər. İnqilabi fırtınalardan, Şimali Qafqaz döyüşlərindən çıxmış, elə burada da sağ gözünü itirən Mirzəoğlu atın belinə qalxdı. Mehman da yəhərlənib, yüyünlənən səkili mindi. Səkil bütün kəndlə salamatlaşır kimi kişnəyib nəinki bir tək bu obaya, hətta ətraf dağ-daşa səs saldı. Müəyyən gör-görüşdən sonra süvarilər tərpəndi. Mirzəoğlu atını səyirdib qabağa düşdü. Səkil hoqquldayıb özünü ətəyə saldı. Birdən xəbər tutmuş kimi tökülüb gələn köpəklər quyruğunu qaldırıb götürülən səkili

dövrəyə aldılar. Səkil bir qıllı köpəyin kəlləsinə öz nallı təpiyi ilə elə ilişdirdi ki, köpək zir-zir zingildədi, Mirzəoğlunun zəhmli səsindən qalan köpəklər də dağılışıb, çal-çəpərin içində gizləndilər. Hər iki atlı qoşalaşıb yanaşı süzməyə başladı.

– Hələ bu uşağın ağzından süd qoxusu gəlir, – deyə kəmetiqad bir qoca dalınca söz atdı, – qorxuram o Kamilovun müqabilində bu uşağın ağzı heç qatıq da kəsməyə!

Qonağın haqqında nagüvara söz eşitmək istəməyən Mirzə kişi qarağat demisinə qullab vurub:

– "Əqil yaşda deyil başdadır!" – deyə dədə-baba misalıyla cavab verdi.

– Daş da kəsər, dəmir də!.. Əgər rüşvət qılıncını paslandırmasa, dilini qısaltmasa? – deyə başqa bir qoca yanındakı şəkkakı çiyinlədi.

– Dadandırarlar, yan-yörəsindəki Qaloş kimisi, quzunu duza dadandıran kimi bunu da rüşvətə dadandırar, – deyə kəmetiqad qoca əlavə etdi. – Bu dünyaya peyğəmbər gələn, axırda gora kəfənsoyan gedir!

– Elədir, atam, elədir! – deyə bayaqları nala-mıxa vuran qocalar söyləndilər: – Bəni-insanın təməhi ki var, həzrət Əlinin qılıncından da itidir!.. Bu cavan uşaq elə dartıb-dağıdan rüşvətxor olsun ki, qabaqkılar bunun yanında muştuluq olsunlar!

– O özünü elə ləkələyib, dilini elə qısaltsın ki, Qaloşun əlində baldan çıxan bərəmuma dönsün!..

Mehman ilə Mirzəoğlu öz atlarını yanaşı sürürdü. Ancaq Mehmanın gözləri aludə olduğu "Yeddi qardaş"dan doymurdu. O, rəngarəng təbiət mənzərələrindən gözlərini çəkmirdi. Mirzəoğlu isə arada öz tatarısını hərləyib ta uzaqlardan bəriyə sədri olduğu kolxozun ərazisini göstərir, öyünə-öyünə öz iş-gücündən nəql edirdi. Mehman Mirzəoğlunu dinləsə belə onun gözləri bu mənzərədən o birisinə keçirdi. Sıldırım dağların döşündən paqqıldayıb çıxan bulaqlar daşa-daşa daşır, tərtəmiz qar kimi ağara-ağara üzüaşağı axır. "Yeddi qardaş"ın sinələrindəki çınqıllıq içindən qırmızı özək baldırğanlar üzüyuxarı qalxır, qıjıltılı körpülər baldırğanların başında oynayırdı. Bu sədalar "Yeddi qardaş"a səs salır, başıqarlı dağlardan güclü-gurultulu əks-sədalar qayıdır, bütün bu aləmi doldurur, Mehman üçün eşitmədiyi musiqili dünya yaranırdı... Arada bir Mirzəoğlu atüstü üzəngidə dikəlir, Mehmana onun seçmədiyi əlavə şəlalələri də göstərir, çox da uzaq çəkmədən təbiətin bu bitib-tükənməz qüvvəsindən istifadə edəcəyini, nəinki bir tək öz kəndlərinə, ətraf kəndlərə belə işıq verəcəyini söyləyir, icrakom sədri Kamilovun belə

xeyirxah işlərə havadar olmadığını yanıqlı-yanıqlı deyirdi. Əsrarəngiz təbiət aləminə məftun olan Mehman aradabir dönüb Mirzəoğluna cavab verir, tezcə də susub xəyala dalırdı. Mehman başıqarlı dağların əfsanəvi aləminə düşdüyü üçün onun ürəyi qanadlanır, vətən mülkünün gözəlliyi qarşısında ürəyi qürurla dolurdu. Bir-birindən aralıda dayanan "Yeddi qardaş"ın sinəsinə yapışan balaca-balaca obalardan gömgöy tüstülər uzanır, qarlı dağların zirvələrinə doğru qalxırdı, Mehman indiyə qədər görmədiyi aləmə boylanıb baxmaqdan çəkinmir, gözləri alışıb-yanan səkilin cilovunu əlindən buraxmırdı. Baxdıqca allı-güllü, yamyaşıl çəmənlərdə gümüş kimi parıldayan dəryazlar işləyir, yenicə çallayan arpa zəmilərində oraqlar, çinlər təzəcə işə düşür, nisbətən daha çox sahələri tutan buğda zəmiləri isə buğuma qalxırdı.

– Bax, bu yeddi para kəndin adamı ancaq bir kişinin törəməsidir! – deyə Mirzəoğlu köhnə dostunun oğluna məlumat verməyi özünə borc bilirdi. – Vaxtilə, Qaraqoyunlu tayfasından ayrılıb, "Yeddi qardaş" dağlarına öz köçünü sürən Mirzəalı kişi burada bünövrə qoyubdur. Özü də yeddi oğluna arxalanıb arana düşməyibdir... Yeddi qardaş bu dağların güney üzündə qoyun saxlayıbdır... Hər oğlu ayrıldıqca qoca bax bu dağların birisinin ətəyini göstəribdir. Onların hər birisi özünə ayrı-ayrı dam-daş salıb, ev olub tüstü çıxarıblar... Deyir, qıllı-qüvvətli köpəklərin hürüşməsindən bu dağlar dillənərmiş, bir-birinə arxalanan köpəklər qurd basarmışlar, onların qorxusundan bu dağlarda quşlar qanad salarmışlar... Bəli, belə-belə onlar artıb-törəyib, hərəsi bir oba olubdur.

– İndi bu obanın hərəsi bir neçə evdən ibarət olar? – deyə Mehman gözlərini qəribə aləmdən çəkməsə də soruşdu.

– Üst-üstə götürsən otuzu aşar, – deyə, Mirzəoğlu cavab verdi

– Demək, sizin birləşmiş kolxozda yüzdən artıq təsərrüfat birləşibdir?

– Bəli, elə olar!

– Deməli, "Yeddi qardaş"ın əvvəli də, axırı da birdir!

– Bəli, belə çıxır!

– Onda gərək sizin kolxozda bir ailə mehribançılığı olsun!

– Yox, arada ağlasığışmaz qanlıçılıq da az olmayıbdır! – deyə Mirzəoğlu vaxtilə törəmələr arasında baş verən qanlı ədavətlərdən: qız qaçırmaq, bir-birini gülləyə tutmaq hadisələrindən, torpaq, otlaq üstündə gedən amansız çəkişmələrdən xeyli danışıb əlavə etdi. – Əslinə qalsa elə Salamatın işinə də köhnə qanlıçılıq qarışıbdır!

– Demək sinfi mübarizə ilə qanlıçılıq bir-birinə qarışıbdır?

– Heyif ki, belə olubdur, – deyə Mirzəoğlu açıq söhbətə keçib söylədi ki, necə bu oba ilə o oba tamam yad-yadırğalar kimi varlanmaq, yer, torpaq tutmaq üstündə əldə silah bir-birilə vuruşub, hətta bir-birisinin evini belə od-alov veribdir.

– Bizim dildə desək bəlkə sinfi mübarizə şiddət kəsb edibdir, – deyə təbiət mənzərələrindən üzülə bilməyən Mehman soruşdu.

Mirzəoğlu atını məhmizləyib:

– Hə, elədir, – deyə qohumluq əlaqələrini unutmuş kimi qışqırdı. Sanki qulaqlarından üzülüb getməyən güclü şəlalələrin şırıltılarına qarşı hayqırdı. – Sinfi mübarizə, sinfi mübarizədir!.. – Mirzəoğlu dönüb qarşısında duran çətinliklərdən, elə də silsilə dağlarda qalan, öz tüfənglərini əlindən yerə qoymayan bandit dəstələrindən danışdı. Əli yerdən-göydən üzülən adamların qana susadıqlarını söylədi, nəhayət, onların aqibətlərinə daş atılacağını qeyzlə dedi.

– Əslində cəmi iki-üç nəfəri qolçomaqdır! – deyə Mirzəoğlu nəfəsini dərdi.

– Bəs qalanları? – Mehman maraqlandı: – Bəs o biriləri?

– Qalanları da onların quyruğuna düşən axmaqlar, sarsaqlardır!

– Onda onları çağırmaq, başa salmaq lazımdır ki, daha öz əllərini qana batırmasınlar!

– İş-işdən keçib, – deyə Mirzəoğlu qamçısını yellədi. – Daha istər-istəməz onlar düşmən səngərində durublar.

– Bəs Salamat bu səngərlərə necə baxır? Yəni hansı birisindədir?

– Düzü banditlər Salamatın qanına susayırlar!

– Bəs Kamilov barədə nə təhər?

– Kamilovun onlarla heç bir əlaqəsi olmasa da, – deyə Mirzəoğlu at üstündə dağlar səmtinə boylana-boylana cavab verdi. – Onlar ürəklərində Kamilovdan incik deyillər.

– Niyə?.. Nə üçün bandit olan kəs icraiyyə komitəsi sədrindən kiçik olmasın?

– Çünki Kamilov çığırtmapərəstdir, – deyə Mirzəoğlunun tək gözü qızardı, – o kişi bu dünya üzündə qu tükünün: yumşaq yorğan-döşəyin ölüsüdür!

– Məgər Kamilov əlinə silah götürüb sinfi döyüşlərdə heç də iştirak etməyibdir?

– Kamilov ancaq bağırıbdır!.. Ancaq düzünə gəlincə Kamilovun böyük gövdəsində düşmən cırnağının izi belə yoxdur!

– Bəs Kamilov ki, mübarizlikdən dəm vurur.

– Ancaq klub səhnəsindən! – Mirzəoğlu hirslənib qılınc zərbəsindən çapılan gözünün qara sarığını dartışdırdı. Kamilov kimilərindən kar aşmayacağını söylədi. O dedi ki, köhnə dünyanı öz halında qoymaq olmazdı... Hakimiyyəti ələ almaqla durub dayanmaq olmazdı...

Mirzəoğlu kənd təsərrüfatının bugünkü kollektivləşməsindən, onun sabahından, gələcəyindən nikbinliklə danışdı. Eyni zamanda keçən ilin çovğunlu qışında kolxozlaşmanın ilk günlərində hələ kolxozda sədr olmayıb banditlərlə vuruşan kommunist dəstələrindən birinə başçılıq etdiyi zaman baş verən əcaib hadisələrdən söz açdı. O, qışın qəhətliyindən, bu zaman mal-qaranın baxımsızlıq üzündən qırılmağından, obalar arası kəsməyən söyüşlərdən, cəncəllərdən danışdı. Mirzəoğlu göstərdi ki, yeni dünya köhnə dünyanın bətnindən necə də əzab-əziyyətlə, qışqıra-qışqıra doğur...

Mirzəoğlu cavan qonağının arzusunu duymuş kimi köhnə dostu Muradın oğlu Mehmana atasının necə sadə, ancaq inadcıl, işgüzar, gizli tapşırıqları yerbəyer yerinə yetirən qorxmaz bir ər olduğunu inamla, ayrı-ayrı misallarla söylədi. Mehman isə izafi sual verməyib, atası barədə yerli-yataqlı cavab aldığından sevindi, nə isə onun ürəyinə razılıq hissi yayıldı. Mehmanın ürəyində qürur hissi doğdu. Mirzəoğlu cavan oğlanı yaxın bir adam kimi başa salmaq istədi ki, bəs Şura hökumətini qurmaq nə qədər qan bahasına başa gəlibdir. O, dostunun oğluna demək istədi ki, Şura hökumətini möhkəmcə qoruyub saxlamaq, köhnə dünyanın qalıqlarını söküb dağıtmaq, yeni dünyanı möhkəmcə-möhkəmcə qurmaq, elə də qansız-qurbansız olmur... Mirzəoğlu kolxozun bugünkü saya-hesaba gəlməyən çətinliklərindən başlayıb, sabahından, bax o axar çayın ətrafında böyük kənd salına biləcəyindən nağıl açdı... Bu zaman Mirzəoğlunun qızaran tək gözü yaşarıb doldu.

– Əgər ömür bizə vəfa eləməsə də, gərək sizin kimi cavanlar bizim işimizi, arzumuzu başa vursunlar, – deyə Mirzəoğlu əlindəki şallağı qaldırıb atının sağrısına endirdi. Bu zəmanədə işin çətin hissəsinin kimin, ya kimlərin payına düşdüyünü də söylədi: – Yaxşı ki, çətin iş bizim payımıza düşübdür, – deyə Mirzəoğlu yumruğunu qaldırdı. – Çünki biz Nikolay zamanında kirpiyimizlə od endirmişik-qaldırmışıq! Şura inqilabının yolunda az da yox, çox-çox qurban verib, Murad kimi qurban verib can qoymuşuq! İndi bəzisinə Şura hökuməti dəmə qoyulan hazır plov görünür. Qədrini, qiymətini bilmək gərəkdir Şura hökumətinin! – Mirzəoğlu

düşmən üstünə hücuma keçir kimi at belində dikildi. – Bu hökuməti quranların qanlarına qiymət vermək, təmiz işləmək, ləkəsiz işləmək gərəkdir. – Mirzəoğlu bir sərt ata kimi cavan prokurora hiss etdirmək istədi ki, onun qulluğu çətin, gəlirli, mədaxilli qulluqdur. Ancaq bu qulluqda gözü-könlü tox olmaq gərəkdir... Belə olsun ki, artıq tamah baş yarmasın!.. Murad kimilərin qanı hədərə getməsin! Belə ki, prokurorun özünə bir göz qırpımında yüz min də rüşvət verən tapılar... Mirzəoğlu, cavan prokuroru ayıq-sayıq salmaq üçün dedi ki, bəs o dazbaş Murtuz siçovul kimi kəndir çeynəyəndir. O, sözarası guya uşaqlarını dolandıra bilmədiyinə görə göz yaşı axıdıb ağlayır... Murtuzu bir addım belə gözdən qoymaq olmaz! Çünki ya Murtuz, ya da leş sökən kök bir quzğun! Arada heç bir təfavütü yoxdur! Mirzəoğlu bu sözləri dostu Muradın oğluna söyləməyi özünə vacib bildi. O, Murtuz kimisinin tələyə düşəcəyini, mütləq bir oğru kimi girə keçəcəyini söyləyib Mehmanın özünü kirdən-ləkədən qorumalı olduğunu tövsiyə halında dedi. Mehman fikir verib bu kişinin inqilaba, Şura hökumətinə necə ürəkdən-candan bağlı olduğunu kəsdirdi. Mehman müəyyən etdi ki, elə atası Murad da bax beləcə odlu-atəşli bir adam olmuşdur. Mirzəoğlu və Murad kimiləri daxili məna etibarilə təqlidə layiq insanlardır!.. Mehman bu söhbətlərdən nəticə çıxararaq əsl mətləbə, özünün cavabdehində olduğu işinə keçmək istədi. O bildi ki, Mirzəoğlu bu sözləri ancaq bir xatirə kimi demir, o, söz arasında Mehmana çatdırmaq istəyir ki, gərək o, nə öz adının ləkələnməyinə, nə də atası Muradın xatirəsinin çirklənməyinə yol versin. Onillik məktəbdən, Məlikə xanımdan başlamış, indiyə qədər edilən bu xəbərdarlıq qəribə deyildimi? Bütün bu xəbərdarlıqlar daha artıq görünmürmü, bu məfhum özü həddini aşıb, istər-istəməz Mehmanı təqib etməyə başlamırmı?.. Mehman düşünə-düşünə, çalxalana-çalxalana, sarsıyır kimi mətləbə keçdi, nə isə onun ürəyi küsəyən Züleyxadan üşəndi. Mehman yuxuya, səbrə inanmasa belə, nə isə bütün xəbərdarlıqlardan ürəyinə qara bir şübhə damcısının damdığını duydu. Bax, bu daxili xəstəlik açılıb-ağardıla bilməyən, çətin xəstəlik!.. Görək, aqibəti nə olacaqdır?.. Görək, Mehmanın bu alışıq-dolaşıq hissləri nə göstərəcəkdir?.. Bütün bu gözəl, əfsanəvi aləmdə, Mehmanın ürəyini sıxan, aradabir dönüb onu üşütməyə salan bir daxili xof və ehtiyat yenə də Mehmanın ürəyindən uzaqlaşmır, onu bərkcə sıxırdı. Niyə belə olur ki, Mehmanın ürəyinin içindən ara-ara özü də üzülüb getməyən bir titrəmə başlayır? O, bir buz soyuqluğunun bədəninə yayıldığını duyur, özü də

açıq yox, cizlicə, xəlvətcə olduğunu duyur. Niyə bu qara-qura hiss birdəfəlik rədd olub, daxilən tərtəmiz olduğu halda Mehmandan biryolluq uzaqlaşmır?.. Mehman ki, öz işində, vəzifəsində ayıqdır, sayıqdır, qanuni qərarında qətidir! O, özünə arxayın, öz hərəkətlərinə əmindir. Onda haradan bu üşütmə?! "Ləkə"dən, bu əcaib məfhumdan gələn bu buzlu üşütmə, bu uğursuz bayquşvarı üşütmə, aradabir onsuz da qaşqabaqlı Mehmanın olan-qalan nəşəsini pozub onun bədənində belə vahiməli əsrarla dolanır?! Niyə hər kəs özünü Mehmana yaxın hiss etdirincə, dönüb ona təmizlikdən, ləkəsizlikdən danışır? Bəlkə Mehmanın vəzifəsi çox məsul, tutduğu qulluğu belədir?.. Bəlkə təmiz və vicdanlı adamlar cavan prokurorlara belə deyirlər?.. Prokurorluq vəzifəsi mürəkkəbdir, çətindir, odla oynamaqdır! Prokurorun oynadığı od nədir? – Rüşvət!.. Güclü sel kimi daşa-daşa gələn pul, rüşvət təmiz adamı tamahlandırar, onu məhv edə bilər?!. Ancaq bəs Mehmanın başbir yastığa qoyduğu o gözəl, göyçək Züleyxa necə? Gözəl, göyçək Züleyxa ayaqlarını yorğanına görə uzatmaq istəyirmi? Mehman içəri aləmi bilmədiyi, bilə bilmədiyi, bəlkə də əqlinə sığışdıra bilmədiyi halda onun baş yoldaşı Züleyxa xanım bağça müdirəsi Zərrintac xanım kimilərindən aralanmağa, uzaqlaşmağa çalışırdımı, ya vaxtında uzaqlaşmağa çalışacaqdımı?.. Müəmmadır, çətindir, görünür Mehman üçün sehrdir, onun arxayınlaşmadığı haldır?! Bəli, özündən asılı olmayaraq Mehmanın cəsarətli ürəyinə haradansa soyuq sazaq əsir, Mehmanın ürəyi bu gözəl mənzərə içində belə buz içinə düşən kimi üşüyürdü. "Ləkə"dən söz açılınca, bu barədə cüzi bir işarə edilincə istər-istəməz Mehmanın zehnini, şüurunu məşğul edib onun ürəyini məngənə arasına almış kimi sıxır, Mehman isə indi bu qara kölgələrdən uzaqlaşır kimi səkili tərpətməyə, çaparaqlayıb, uzaqlaşmağa çalışır, çayın kənarına yetişib Mirzəoğlu ilə yanaşı sürməyə başlayırdı.

– Görünür, "Yeddi qardaş" bizim qardaşoğluna qərib gəlir, – deyə Mirzəoğlu Mehmanın dərin düşüncələrə getdiyini, nə ilə isə məşğul olduğunu, yaxud nəyin barəsində dərindən ehtiyatla fikirləşdiyini, ya bəlkə də bütün bu aləmə ayrıca aludə olduğunu güman edirdi.

– Sizin kolxozun sərhədini keçməmişik ki, – deyə ürəyindəki üşütməni rədd etməyə cəhd edən Mehman səkilin üstündən qanrılıb Mirzəoğlundan soruşdu. Özünü başqa işlə, güclü bir aləmlə, nikbin bir dünya ilə bağlamağa cəhd etdi. O istədi ki, hayqırsın və cəsarətlə desin ki, mən, Mirzəoğlu, sənin qarşında, atam Muradın gözlərim qarşısında canlanan xatirəsinə and içmək istəyirəm ki, mənim hərəkətim əsla Muradın ru-

huna qara bir ləkə gətirməyəcəkdir! Lakin Mehman bütün bunları artıq saydı, öz daxili iştibah və həyəcanlarının mürurla zayıl ola biləcəyinə qarşı öz nikbin ümidini itirmək istəmədi.

– Bizim kövşən bax o qabaqkı dikləmə dağda qurtarır, – deyə təzə yolçunun necə bir sirrin düyününü açmaq istədiyini duymayan Mirzəoğlu qamçısını qabağa uzatdı. – Düz Çalgüneyin ətəklərində!

– Onda siz buradan qayıdın, mən də öz yoluma tək davam edim, – deyə Mehman artıq öz-özü ilə qalmaq məqsədilə təkidə başladı, qoşa sürülən atlar burunlaşıb fınxırışdılar.

– Görürsünüzmü, atlar bizim aralanmağımızı istəmirlər, – deyə Mirzəoğlu səkilin belində səksəkəli oturan cavanın bu dağların başını alan tala-tala buludlar kimi tutulub-qaraldığını gördü, onun tüstülənən könlünü açmaq istədi.

– Mən sizə dərin minnətdarlıq hissilə təşəkkür edirəm! – deyə Mehman ağırlaşan başını səkilin üstündən üzüaşağı əydi. – Mən sizdən, atamın dostundan çox-çox razıyam!.. Mən çox razıyam ki, sizi tapdım, Muradın yaxın dostlarından birini görmək mənə müyəssər oldu...

– Yox, mən sizi, – deyə Mirzəoğlu inadkarlıqla bildirdi, – rayon mərkəzinə çatdırmamış dönən deyiləm!

– Axır siz işdən-gücdən qalarsınız, əmican!

– Mirzəoğlu “əmican” sözündən qızındı, atını tərpədib qabağa keçdi, sonra çiyni üstə dönüb bir dəstə şuluqçunun müqabil sıldırımlı dağlardan, bu tərəf bəndərgahlara endiyini söyləyib əlavə etdi ki, bəs neçə seldən axan kəs öz əlini saman çöpünə atır, elə də bu qolçomaq deyilən kəslər inqilab bəhrələrinin təkərləri altına dağ-daşdan, qayadan beləsinə helləyib güc göstərmək istəyirlər. Ancaq onu başa düşmürlər ki, qanmırlar, dərk etmirlər ki, onların kökünün üstündə neçə-neçə tonqal çatılıbdır! Üstündən əsrlər də ötsə, onlar nə cücərər, nə də pöhrələyər.

Günəş yüksək-yüksək zirvələri qarla örtülən, quşqonmaz dağların başına sancılar-sancılmaz onlar silsilə dağların ətəklərində qaralan qara qayalığa çatdılar... Mehman daxili iştibah və üşütmədən üzülə bilmədən yenə də göz gəzdirdi. Sanki yumru-yumru əlləmə daşlar göydən yerə nəhəng dolular kimi yağmışdılar. Hər yan, hər yer qapqara qayalıqla dolmuşdu. Bu sərt sıldırımlarda bitən kol-koslardan yana adamın tükləri ürpəşirdi. Bir də indiyə qədər heç kəs öz əlinə bir alət götürüb buradan nə bir yol, nə də gediş-gəliş üçün darısqal bir cığır belə açmışdı. Ancaq hərəkətdə olan at-ulaq öz nalları ilə burada asılan bir pilləkən

düzəltmişdi. Bu daş pilləkənlər üzüyuxarı qalxır, şiş qayaların arasında sallana-sallana keçirdi... Birdən nəyi isə duymuş kimi Mirzəoğlu boylanıb ətrafa baxdı, öz vuruş təcrübəsindən bəlkə də ürəyinə nəyinsə damdığından tezcə müəyyən etdi ki, bəs bax bu baş pilləkənin qurtar-haqurtar pilləsində nə isə bir hadisə olacaqdır?! Axır bir də hər kəs bir kəsin qəsdinə durmaq istərdisə, ta qədimlərdən bəriyə öz qara niyyətini burada yerinə yetirərdi!.. At üstündə daş pilləkəni qalxan Mehman dönüb geriyə baxdı, qorxmaz cəngavər kimi görünən Mirzəoğlunun sifətində bir nigarançılıq duydu. Demək, bu kişini narahat edən bu bəndərgah, bu daş pilləkənin qurtaracağı imiş?!. Onlar bu qədər də daş pillələri at belində çaqçaraqla üzüyuxarı dırmandılar. Mirzəoğlu cüzi bir ötüş yeri sezincə atını mahmızladı, özünü qabağa atdı. Hər iki köhlənin genişlənən burunlarından örük-körük nəfəs çıxırdı. Atların gözləri qaranlıqlaşan havada, qızaran gözlər kimi alovlanıb yanırdı. Mehman bu aləmə dönür, ətraf ona macəralı nağıllar kimi gəlirdi. Doğrudan da, həyat heç də səliqə-sahmanlı məktəblərdən, nizam-intizamlı küçə hərəkətlərindən ibarət deyilmiş! Belə sərt sıldırımlı cığırlar, enişli-yoxuşlu daş pilləkənlər varmış!.. Bədənində rəşə gəzən Mehman əlini atıb səkilin saçaqlı yalmanından yapışdı, onlar bir qədər də bir-birinin ardınca üzüyuxarı qalxdılar. Üstü örtülməyən yanlardan daralıb sıxılan bir daş qəbrin içinə girdilər. Birdən nagahani atışma başladı, qara qayalardan yuxarı qalxdı, barıt qoxusu yenə də dağları doldurdu. Ağır güllə yarası alan səkil at isti-isti qanadlanıb aradan çıxdı, bəndərgahı o biri üzə aşar-aşmaz havada düşən qartal kimi yerə sərildi. Mehman isə səkidən aralı yıxıldı. Bir azdan partıldaşan güllə səsləri xırp kəsdi. Mehman tez yerindən qalxdı. Səkili qıpqırmızı qan içində görə bildi, bəlkə də görməkdən artıq seçə bildi. Əlini cibinə atan Mehman ağ dəsmalını çıxardı, qaynayan göz yaşlarını sildi. Bir azdan çoban libasına girən Bənnaoğlu Cabir ilə Mirzəoğlu gəlib çıxdılar. Müəyyən oldu ki, Bənnaoğlu tərəfdən bir nəfər milis ağır yara almış, düşmən tərəfdən isə bir sarsaq gəbərmiş, qalan yolkəsənlər isə yenə də qaçıb aradan çıxmışlar.

– Bax, qardaşoğlu, – deyə gözü sarıqlı Mirzəoğlu əlindəki zağlı mauzerini taxta qoburuna qoydu. – Heç zaman Şura hökuməti havayıdan yaranıbdır! Bax belə od-ölüm içindən yaranmayıbdır!.. Mən bayaqları bunu deyirdim!.. Siz Şura hökumətini də, onun sizə tapşırılan qanununu da göz giləsi kimi qoruyun! Yoxsa salamat kimisini qəzəmətdə çürüdüb belələrini dağda-daşda qoymaq cinayətdir, bunu da bizim ki-

misi, nə də Murad kimisinin ruhu keçməz!.. Qanla hökumət quranlar, dönüb sənə qanun tapşırıblar, sən də özünü "ləkə"dən gözləməyib, rüşvət alasan. Murtuz kimi xorum-xorum yesən, bilmirəm onda mən də, Muradın ruhu da səndən necə üz döndərərik!..

Mirzəoğlunun belə bir ayaqda atmaca kimi atılan sözləri baş verən bu boyda hadisə içində yenə də Mehmanı daxili bir üşütməyə saldı.

## XIV

Müstəntiq Murtuzov təlaş göstərib, pərakəndə işləri sahmana salıb, bir-bir nəzərdən keçirir, prokurorun gəlməsini gözləyirdi. Elektrik işığı yanır, Murtuzovun sarı daz başını işıldadırdı.

– İndi prokuror gələcək, izahat vermək lazımdır, – deyə o, maraqlı söhbət üçün mövzu axtarırdı, – gərək elə edəsən ki, gözünə girəsən, inansın!.. Yoxsa ayrı cürə iş uduzular.

Prokuror içəriyə gircək o, adəti üzrə yenə ayağa qalxıb dik dayandı. Mehman stolun arxasına keçdi.

Hər ikisi dönüb işləri birlikdə nəzərdən keçirməyə başladılar. Murtuzov münasib fürsət tapınca:

– Siz bilirsinizmi, yoldaş prokuror, – deyib söhbət açdı, – burada rayonda biz, bəzən, düzünü deyim ki, qanunu kampaniyaya tabe edirik!

– Məsələn?..

– Məsələn, tutaq ki, yaz əkini getmir, icrakom qərar çıxarır ki, tapşırılsın prokurora bir neçə səhlənkarı məsuliyyətə cəlb etsin, yaz əkininin gedişini sürətləndirsin!

– Əlbəttə, səhlənkarı məsuliyyətə almaq lazımdır! Biz əkin-çörək üçün də məsuliyyət daşıyırıq!

– Səhlənkar tapılmasa bəs necə?

– Axtarıb səhlənkarı tapmaq lazımdır! Müqəssir kim olursa olsun tapılmalı, məsuliyyətə cəlb edilməlidir! Bizim cəmiyyətin inkişafına mane olan sinfi düşmən ünsürləri mütləq qanuni zərbə almalıdırlar!.. Ancaq mən qanunsuzluğa qarşı mübarizə dedikdə, müqəssiri yox, təqsirsiz vətəndaşın toxunulmaz böyük hüquqlarını nəzərdə tuturam!

– Mən də elə bunların hamısını əcəbcə bilirəm. Hünərin var iş tərtib edib səhlənkarı tapma?!. Bəli, müqəssir olmamaq üçün özün istər-istəməz gərək bir səhlənkar düzəldib tapasan. Beləliklə, bir də baxıb görürsən ki, qanun gəldi, bu cürə çətin işlənən bir mətləbə tabe oldu!..

– Qanunu heç bir kənar mətləbə tabe etmək olmaz, bu, qanunu təhrif etmək olardı, – deyə Mehman əlindəki işi qatlayıb kənara qoydu, o biri işi çəkdi. Murtuzov, prokurorun əlində olan işə diqqətlə baxıb:

– Bu da həmin mətləbdəndir, – dedi, – baxırsınızmı? Əsasında Kamilovun qərarı vardır!

– Rayon icraiyyə komitəsinin də düz olmayan qərarına müddəi-ümumilik heç bir zaman yol verə bilməz!

– Doğrudur, – deyə Murtuzov süni bir sevinclə səsini qaldırdı. – Mən onu lap sizi görən saniyədən başa düşmüşəm. Başınız üçün, demək bir az da əlimin içi kimi görmüşəm. Ümumiyyətlə, mən padxalim deyiləm, həm də yaltaq-padxalim deyiləm mən! İndi baxırsan ki, bütün rayon anlayır ki, rayona qanun nəzarətçisi gəlibdir. Xalis xozeyini, sahibi!..

– Yaxşı, bu nə şahiddir belə? – deyə Mehman vərəqi göstərdi. Murtuzov boğazını uzadıb diqqətlə baxdı:

– Düzü, vallah, təşkil etmişik. – O, burnunda güldü, sarı, daz başındakı damarlar şişib qızardı.

– "Təşkil etmişik?.." Bunu necə anlamaq olar, müstəntiq?

Murtuzov ayağa durub xeyli əyildi və başını kağızın üzərinə salladı:

– Belə ki, qərarı yerinə yetirmək lazımdır. – O, vərəqi oxudu. – Görürsünüzmü?.. Düzəltmişik, qanun qəlibinə salmışıq!

– Düz qərar deyil, biz süni sənədlərlə heç bir sadiq vətəndaşı incidə bilmərik!

Prokuror oxuyub-oxuyub birdən hirsləndi:

– Bilmək lazımdır ki, sosialist inqilabı əməkçi insanların böyük hüquqları üçün olubdur! Vətəndaşı öz hüquqlarından süni və qondarma yolla məhrum etmək, böyük inqilabın bəhrələrinə xəyanət etməkdir!

Murtuzov cib dəftərini çıxarıb:

"Sosialist inqilabı əməkçi insanların böyük hüquqları üçün olubdur" – deyə yazdı, məmnuniyyətlə nəfəs aldı:

– Çox gözəl, – deyə o qeyd etdi. – Ancaq bizim Kamilovu başa salan gərək!.. Bir iş olacaq, baxırsan ki, bar-bar bağıracaq, özündən çıxacaq, əlini stola vurub, az qala, yazıq şüşəni çilik-çilik eləyəcək, deyəcək: "Hökumət mənəm, ya sən?.. Hökumət yerdədir, ya göydə?". Üstünə düşəcək, sözünü göyərtməyincə, qatığa qara dedirtməyincə səndən əl çəkməyəcək, sən də əlacsız qalıb deyəcəksən: "Elədir!". Hünərin var bir sözünü iki eləyib qabağına bir çöp sal...

– Niyə?.. Məgər özbaşınalıqdır?

Murtuzov karandaşı dəftərinin arasında saxladı.

– Nə buyururdunuz, yoldaş prokuror?

– Deyirəm ki, qanunu möhkəm tutmaq lazımdır!

“Qanunu möhkəm tutmaq lazımdır”. – O, tələsik yazıb başını qaldırdı.

– Kamilovu anladan olsa! Bəli, yoldaş prokuror, onu dünyada başa salan olsa!.. Bir dərnək olmaz ki, ondan mən geriyə qalam. Bir qiymətli söz olmaz ki, mən onu buraxıb dəftərimə yazmayım!.. Dərnəyə də hamıdan qabaq gələrəm, hamıdan sonra gedərəm. Ona görə də bütün hamı bilir ki, mən nə təhər aktivəm!.. Mən bir dəfə görməmişəm ki, Kamilov dərnəyin qapısını açıb burnunu içəriyə sala... Dərnək hələ o yanda qalsın, lap bir kitabın cildini açıb beşcə sətirini axıra qədər gözdən keçirə... Uzunçuluqda da bu dünyada misli-bərabəri yoxdur. Düzü, mən özüm uzunçuluğu sevmərəm. Mən iki kəlməni xoşlaram: “Hə” ya “yox!” Doğrudan da belə ha! Nə dəxli var mətləbə ki, durub uzun-uzadı uzunçuluq eləyəsən?.. Bir də görürsən çağırır, danışdıqca danışar, uzatdıqca uzadar, uzadar, ha, bir sicim uzunluğunda, ha!.. Baxırsan ki, ona elə gəlir ki, ağzından dürr tökülür, ancaq qanıb bunu dürrü yerdən-yurddan yığan yoxdur!..

Mehman diqqətlə baxıb Murtuzovun atmilçəyi kimi sıvaşmağından darıxdı, əlini qaldırıb endirdi:

– Boş danışığı eşitmək də lazım deyil, Murtuzov!

– Di, buyur onda Kamilovun danışıqlarının tək bircə kəlməsini eşitmə, yoldaş prokuror, o haqq-salam haqqı, bircə hərfini eşitməsən, qulaqardına versən, səninlə qanlıbıçaq olar. Kamilov elə bilir ki, bu dünyanı o özü yaradıbdır. Necə deyərlər: “Burda mənəm, Bağdadda kor xəlfə”. Elə bilir ki, o olmazsa, lap günün üzü tutular, dünya qara bağlar...

– Onda bu Kamilov çox məzəli bir tipdir ki!..

– Bəli, çox qəribə bir tipdir! Lap bizim klub səhnəsinin o “qudurmuş əyan” tiplərindən bir addım belə geriyə qalmayan, ağzıköpüklü bir tipdir!

Mehman kağızlara baxa-baxa gülümsədi, karandaşı ilə qeyd etdi. Murtuzov, prokurorun belə yumşaq gülümsəməsinə qüvvət vermək məqsədilə, əlini-əlinə vurub şaqqa çəkdi.

– Vay səni, Kamilov, belə ha! – deyə dostunun qarasınca danışmağa başladı. – Belə görünür ki, bir gün bu Kamilov özü klubda skamyada oturacaq, tipi səhnədə gəzəcək, bu zaman, öz-özünə baxıb əl çalacaq!.. Bəlkə adı Kamilov olmayıb Kamalov olacaqdır!.. Bağışlayın,

bir də görürsən ki, ağzı köpükləndi, qanunlu-qanunsuz basıb bağladı, beş pencədən-tayadan biçdi, bu Kamilovun hərəkətlərini heç zaman vicdana sığışdırmaq olmur! Birdən adam durub demək istəyir ki, axır, balam, Kamilov, sənin bu qaba hərəkətlərin qanuna uyğun deyildir?.. Olmur, demək olmur!.. Baxırsan ki, o zaman o, dünyanı uçurmağa başladı: – "Ədə, ay korafəhm oğlu korafəhm, bu boyda mənə nə qanun?"

– Dünyanı uçurmaq yox, tikmək lazımdır! Murtuzov, siz deyirsiniz, bu iş ancaq Kamilovun qərarı üzrə təşkil olunub, hə?

Murtuzov oturduğu yerdə özünü çəkib:

– Bəli, – dedi, – belə olubdur!

– Daha ayrı bir əsas varmı?

Murtuzov başını bulayıb:

– Heç bir əsas, – dedi. – Vicdanım var mənim, heç bir əsas!

Mehman öz işinə davam etdi. Murtuzov udqunub:

– Bəli, Kamilov belədir, – dedi, – stolun arxasında bir sifət alar ki, naşı adam baxanda deyər, bəs kişinin başında dünya yerləşibdir...

– Onda stoldan aralı ona baxmaq lazımdır!

– Necə stoldan aralı? – Murtuzov yeni bir qeyd etmək üçün dəftərçəsinə baxdı. "Adama, stola bitişik yox, stoldan aralı baxmaq". – Bəli, çox əcəb!

– Bəli, belə adamın qanunsuzluğunu, ağılsızlığını dövlət stolu ilə birləşdirmək olmaz! Stol ağılsıza qalxan ola bilməz! Əksinə, adam stola öz əqli ilə zinət verməlidir!

– Bu çox doğru, qızıl kimi qiymətli sözdür, yoldaş!

– Ona görə də belə boş əsaslar üzrə bizim sadiq vətəndaşları heç adi sorğuya da çağırmaq olmaz!

Murtuzov qollarını yana açdı:

– Vallah, Kamilovun hökmü qabağında mən lap bir qanadı qırıq cücəyəm! Bunu heç gizləməyinə dəyməz, o bir fildir, mən bir boz sərçəyəm, vallah!

– Fil də olsa, özbaşınalığa qarşı ardıcıl və müntəzəm mübarizə gərəkdir, müstəntiq!

– Mənim düzü, yoldaş prokuror, bir cüt balam var, gözlərini də ancaq mənim o cədvəldəki bir neçə yüz manatlıq donluğuma tikiblər!

– Bəs bu əbəs yerdən məsuliyyətə aldığınızın bir cüt balası yoxdurmu?

– Var, adam gərək düzünü desin, var. Əlbəttə, balası olan da var!

Mehman kağızları büküb bir tərəfə qoydu:

– Təzədən özüm istintaqa başlayacağam. Bu iş üzrə məsuliyyətə alınan briqadir Salamatovu buraxmaq gərəkdir, görünür iş puç olacaq!

– Bəs, Kamilov, onda?

– Hamı qanuna tabedir! – deyə Mehman Murtuzova tərs-tərs baxıb iş üzərində öz fikrini yazıb qəti imza etdi.

Müstəntiq gözlərini döydü, prokuror əlavə etdi.

– Bəribaşdan mən sizi xəbərdar edirəm, Murtuzov!..

– Mən əmrə itaət edirəm, yoldaş prokuror... Mənim də vicdanım bu ədalətə səs verir!

## XV

Murtuzov geri-geri addımlayaraq öz otağına çəkildi, işləri qabağına töküb nəzərdən keçirməyə başladı. Bir az keçdi, qonşu otaqdan zəng səsi gəldi. O, qulaq verdi, raykom katibi Vahidov, Mehmana zəng edirdi. Murtuzov yavaşca ayağa durub astanadan o yan-bu yana boylandı, tez-tələsik özünü icraiyyə komitəsinə saldı. Kamilov təkcə oturmuşdu. O, əllərini boynunun ardında daraqladığı halda yırğalanır, astadan fışdırıq çalırdı.

– Nə var, silistçi? – deyə o, iri əllərini boynu ardından çəkmədən ağzını çuval kimi açıb əsnədikcə əsnədi, – təzə nə xəbər?..

– Sağlığın, yoldaş Kamilov! – deyə Murtuzov təzimlə başını əydi, – sizin gözəlliyiniz!..

– Gördün də, qərarımızı necə bir yana qoyub, yuxarıdan öz adamlarını göndərdilər! – Bu dəfə irigövdəli sədr böyük kürsüdə yırğalandı... – Belə çıxır ki, biz əbəs yerə burada qaşıq içi çıxarırıq?

– Sizin sağlığınız mənə bəsdir. – Murtuzov yavaşca stulda əyləşdi. – Fərqi nədir, bir deyilmi?

– Fərqi budur ki, hökumət yerdədir, ya göydə? – deyə Kamilov əllərini boynu ardından çəkib ayağa durdu. – Fərqi çoxdur, özü də çox-çoxdur, Murtuz Murtuzov!

– O düzdür, ancaq siz sağ olun, nə eybi var ki! – Murtuzov bənizi qaçıq bir halda gülümsədi, – nə olar?

Kamilov əsnəyi əsnək üstdən gətirib:

– Yox, mən yazacağam, – deyə sağ ayağını döşəməyə dayayıb pəncəsi ilə yeri şappıldatdı. – Belə də yaramaz!.. Biz ilan kimi qabıq qoyuruq,

kolxoz qururuq, ferma yaradırıq, möhkəmlədirik, ancaq mərkəzdəkilər yumşaq kresloda yayxanıb bizim qərarımıza belə barmaqarası baxırlar!..

Kamilov şirli qutusundan papiros çıxarıb, odlayıb sümürdü, tüstüsünü havaya buraxıb soruşdu:

– Bəs təzə prokuror cənabları nə buyurur?..

– Çox şey! Sabahdan bəri şəxsən düşüb sizin qərarınızın üstünə!

– Niyə oğrudan, qolçomaq quyruğundan başlamaq əvəzinə, yerli hökumətin qərarından başlayır!

– Vallah, nə bilim, deyir ki, hər hansı qanunsuzluğa qarşı mübarizə, – elə oğru-əyriliyə, qolçomağa, qolçomaq quyruğuna qarşı mübarizə deməkdir!..

– Demədin, sən atayın ərvahı, get özünə peşə tap, bala? Demədin, bala, dayçayın başını yığ, demədinmi bunları?

– Dedim, bəs necə demədim?

– Yaxşı, gəlib çatmamış, bizim qərarın üstünə niyə belə ikiəlli sərilib? – Kamilov əlini yumruqlayıb stola çırpdı. – Bu saat mən onu çağırıb onun abrını ətəyinə bükərəm!.. Onun ki, ağzından süd iyi gəlir. Ona çatdır ki, yoldaş Kamilov deyir ki, səni iyirmi dörd saatın müddətində bu rayondan sürgün edərəm! Bu saatı molniya!.. – Kamilov yumruqlanmış əlini açıb barmağını düyməyə dayadı, cınqıraq uzun-uzadı çalındı, ancaq katib gəlib çıxmadı, əvəzində gözüyuxulu kuryer durub gəldi.

– Ə, haradadır, bu Sərrafzadə küçük!

– Bayaqdan hara isə getdi, yoldaş Kamilov!

– Yerdən-göydən, lap o mürgülü gözünün ortasından tap gətir mənə, eşitdinmi? Baxıram saata, üç dəqiqəyə o gədəni tap, başa düşdünmü? Düz üççə dəqiqəyə, qandınmı? – Kamilov qolundakı mürəbbə nəlbəkisi böyüklüyündəki saatına baxdı. – Sayıram dəqiqələri, cəld, ya Allah, get!

Kuryer getdi. Kamilov papirosunu sümürüb kötüyünü atdı, nə fikirləşib beyni qızışdısa, dönüb birbaş müstəntiqin üstünə düşdü:

– Ölüsən, ölü!.. Kişi deyilsən!.. Nakişisən, nakişi! Heyif, səd heyif!.. Ona görə də elə səni təsdiq eləmədilər! Lap görünür yerində olubdur! – Kamilov bayaqkı sözlərini indi, tezcə tərsinə çevirməyə başladı.

– Yavaş-yavaş, mışıl-mışıl, xirik qurdu kimi, xəlvət-xəlvət, pəltək-pəltək “Vətəndaş, atanın adı nədir?” – Hey soruşursan, cızırsan, yazırsan, pozursan!.. Boyuna xam ip tutum, sən dazbaş donuzun!..

– Yoldaş Kamilov, mən sizin qarşınızda...

Kamilov əlini stola çırpdı, şüşələr cing-cing cingildədi.

– Kiri, boyuna ip də yox, bir qarğı, qamış ölçüm!

Murtuzov gözlərini döyə-döyə:

– Vallah, haqqın var, – dedi, – bu qızıl kəlama nə söz?.. "Boyuna ip, qarğı, qamış..."

– Yaxşı, kiri! "Haqqın var... qızıl kalam..." dünən yumurtadan çıxan bir cücə gəlib bura, düşüb inqilabın ilk günündən bünövrəsi burada qoyulan icraiyyə komitəsinin qərarının üstünə, sən də orada yoluq bir cücə kimi qanadlarını sallaya-sallaya cükküldəyirsən!.. – Kamilov gəzinməyə başladı, döşəmə onun ağır ayaqlarının altında səsləndi.

– At dedin, verdik, ata arpa dedin, düzəltdik, atın yəhər-əsabı yoxdu, onu da Murtuz Murtuzov üçün aldıq! Dedin, at qarayalındır, onu da sənin üçün ipçin nallatdıq!.. Sonra da Murtuz Murtuzovun üzəngisini basıb, "ya Allah!.." deyə ata mindirdik. Bu dərya yaxşılığın qabağında ağzın qatıq da kəsmir! Belə olan surətdə, səni nəinki prokurorluğa təsdiq etmək, hələ lap bu silistçilikdən də qovmaq lazımdır... Ağız lazımdır, diş!

– Mənim, dişim... düzü... lax deyil!

– Bilirəm, bilirəm, çox əcəbcə, əlimin içi kimi bilirəm! Başın tökülüb ovuc içi kimi, ancaq dişin çox salamat qalıb, cənabi Murtuz!

– Vallah, mən bu Salamatovu həbsə almaq barəsində sizin şəxsi imzanızla o möhürlü qərarın üstündə onunla lap atı daşlığa sürdüm!

– Hansı at ilə, hansı daşlığa?.. Sabahdan düz birbaşa atı geri yatırarsan! Biz qanunsuz yerə hökumətin pulunu sərf edib sənin şəsti-pəstini ata mindirə bilmərik!.. Qaytararsan sabahdan atı, vəssalam!

Kamilov çəpəki nəzər ilə Murtuzova baxdı. Murtuzov üstünə çalağan şığıyan yetim bir cücə kimi sığınmaq üçün özünə kol da tapmadı. Kamilov əlini xortumlu şalvarının cibinə soxub yenə də çox ağır löngərlə gəzindi. Bu dəfə otaq da titrəyirdi.

– Qaytararsan atı!

Murtuzov çəkinə-çəkinə:

– Haqqınız var, – dedi, – çox haqqınız!

– Haqqınız var!.. Atı qaytar, vəssalam!

– Baş üstə, bir at olmasın, min at olsun!

– Yəhər-cilovu da, lap qırıq noxtasını da!

– Baş üstə, yoldaş Kamilov!

– Ölüm olsun, ölüm, sən Murtuz Murtuzova!
– Baş üstə, yoldaş Kamilov!
– “Baş üstə, yoldaş Kamilov!”
– Haqqınız var, yoldaş Kamilov!
Murtuz Murtuzov saralmış halda ayağa durub titrəyən əllərini ovuşdurdu:
– O dedi, həmin kolxoz briqadiri o uzun Salamatovu zamına vermək lazımdır, mən dirənib bərk etiraz etdim!
Kamilov xışmla qayıdıb Murtuzovun üstünə şığıdı:
– Mənim qərarımla tutulan adamı zamına vermək?
Bəs demədin yoldaş Kamilov sənin... – Kamilov dodaqlarını çeynəm-çeynəm elədi. O, əllərini kor-kobud dizlərinə çırpdı. – Bu da kömək?! Yox, məsələni bu başdan yuxarıya bildirmək lazımdır! Ömrüm uzunu bu rüşvətxor prokurorlar ilə mübarizə etməkdən lap təngə gəldim! Şəvə başım pambıq kimi ağardı, dişim yerindən töküldü. Bu saatı qoy yoldaş raykom özü!.. – Kamilov əlini telefonun dəstəyinə atdı. Silistçi gəlib yavaşcadan onun biləyindən yapışdı:
– O indi özü oradadır! – deyib pıçıldadı.
– Kim?
– Təzə prokuror!
– Kim çağırdı bəs onu ora?
– Raykom özü, Vahidov!
– Nə tez belə dost oldular? O da, Vahidov da yağlı yeri yaxşı tanıyır... Özü çağırdı, yoxsa çağırtdırdı?..
– Özü çağırdı!..
– Bu palaz qulaqlarınla özün eşitdinmi?
– Bil, başın üçün özüm qulağımla eşitdim!..
Kamilov dəstəyi telefona çırpdı:
– İndidən Vahidov, onun ayağının altına daş qoyub bizim boynumuza mindirməsə yaxşıdır?!.

## XVI

Rayon partiya komitəsindən təkrar zəng edildi. Mehman stolu və şkafı örtdü, iki böyük iş qovluğunu da qoltuğuna vurub çıxdı, qapını bağladı, açarı cibinə qoydu, müstəntiqi özü ilə aparmaq məqsədilə səs-

lədi, küncdə, başını stol üstünə qoyub yatan Qaloşlu adam oyandı, gözünü ova-ova:

– Yoldaş prokuror, o hara isə bayaqdan getdi, – deyə xəbər verdi, – xeyli vaxt olar!

Mehman qaranlıq küncə yaxınlaşıb:

– Kişi, nə əcəb gedib yatmamısan? – deyə qocaya qarşı qayğı göstərib soruşdu. – Sənin yuxusuzluğundan kimə nə fayda?!

– Başına dönüm, bəlkə bir buyruq oldu?

– Yox, kişi, sən get yat, rahatlan!

Mehman həyətə çıxdı. Qaloşlu adam mehribançılıqla dil töküb ondan ayrılmadı. O, Mehmanı Vahidovun kabinetinə salıb qapı ağzında dayandı.

Mehman salam verdi. Vahidov ayağa durub onun salamını aldı və bir neçə addım irəliyə gəlib Mehmanla görüşdü. Vahidov gənc Mehmanı başdan-ayağa süzüb ona yer göstərdi. Özü də stula əyləşdi.

– Bilirsinizmi, – deyə Vahidov iyirmi vərəqdən ibarət olan yazılı kağızları göstərdi. – Kəndlərdən bu axşamüstü dönüb baxmağa başlamışam. İndi işimiz az deyildir. Ona görə sizə xəbər çatdırdım ki, mən dönüncə işlərlə tanış olsun, görüşərik. – Vahidov vərəqlərin üstündə əlini gəzdirdi. – Bax, müəllimlərə gələn sənaye malını talan ediblər. Bizim komissiya düz iki həftə gecə-gündüz işləyib. Oxudum, vərəqlədim, məni od götürdü. Sizdən xahiş edirəm, özünüz məşğul olub ölçü götürəsiniz. Xalq müəlliminə qarşı belə rəftar dözülməzdir. Ticarət orqanlarına soxulmuş ayrı-ayrı sinfi düşmən qalıqları əllərindən gələni əsirgəmirlər. Elə də kolxoza soxulmuş bu qolçomaq qalıqları öz pozucu işlərini aparırlar. Sayıqlıq kütləşən yerdə düşmən kəndir çeynəyir. – Vahidov danışa-danışa aktın üstünə öz fikrini yazıb gənc prokurora verdi: – Siz olasınız, iltizamsız verməzsiniz, – deyə raykom katibi Mehmanı gülər sifətlə, ürəyəyatan mehribanlıqla süzdü. – Deyirsiniz, sənədə qol çəkin, sonra!.. Biz isə etibar edirik. – Vahidov gülümsünməyində davam etdi, onun solğun yanaqları bir balaca qızardı. – Etibar edirik, ancaq yoxlayırıq!..

Mehman kağızları vərəqləyib nəzərdən keçirtdi, sonra cildin arasına qoydu.

– Xəbər verdilər ki, rayona prokuror gəlib, güman etdim, görəsən hansı rayonları gəzənlərdəndir. – Vahidov xüsusi bir ehtiramla gənc adamı süzdü. – Görünür ki, siz məktəbi təzə qurtarmısınız.

– Bəli, bu keçən yayda qurtardım!

– Çox gözəl çalışın, yaxşı işləyin, adınıza bir söz-sov çıxmasın, bir söz deyilməsin!.. Bizim Salman da onilliyi qurtarıbdır, o da hüquqşünas olmaq istəyir. Mən deyirəm, oğul, doktor ol, o, inad edir!

– Çox da yaxşı edir. Hüquq elminin özünə də onun inkişafına da çox böyük ehtiyacımız vardır. Bizdə bu elm nə qədər inkişaf edərsə, o qədər də cinayətlər azalmış olar, o qədər də bizim adamların görüş dairəsi genişlənər!

– Görək, necə olacaq? – Vahidov sözü yenə də əsl mətləb üstünə gətirmək istədi. O, kolxozlarda baş verən ayrı-ayrı cinayətlərdən, orda-burda gizlənmiş kooperativ oğrularından, ictimai əmlaka uzanan əyri əllərdən danışıb dərindən nəfəsini dərdi. – Hər kəs, hər bir kəs öz əməyinin məhsulunu namusla yesə nə var idi!.. Müftəxor, tüfeyli ünsürlərin kökündə od qalamaq da, görünür, hələ azdır! Biz yeni yaranan, üstündən üç-dörd il keçsə də, hələ lazımınca bərkiməyən kolxozları bərkitsək, sinfi düşmən qalıqlarının pozucu hərəkətlərinə qarşı mübarizəni daha da gücləndirsək, inqilabi qanunçuluğun kəsərini bu rayon üzrə daha da artırsaq, burada çox böyük quruculuq işləri görmüş olarıq!

– Orası tamamən doğrudur. Qorki demişdir: "Düşmən təslim olmursa, onu məhv etmək gərəkdir".

– Bax, prokuror birinci növbədə gərək buradan da başlasın! Doğrudur, sosializm quruluşu qalib gəlib. "Kim-kimi" məsələsi bizim xeyrimizə, düşmənin zərərinə həll edibdir!.. Ancaq ayrı-ayrı düşmənlər vardır ki, onlar öz düşmənçiliyindən əl çəkmir, oğurluq edir, sayıqlıq kütləşən yerdə vəzifələrə soxulub rüşvətxorluq edir, bizim inkişaf təkərinin altına daş-qaya yumalayırlar!

– Elə bilirəm ki, belə alçaq düşmənlərə aman olmayacaqdır! Lakin bununla birlikdə mən çalışacağam ki, heç bir qanunsuzluğa da yol verilməsin!.. Çünki bizim qanunun təhrif edilməsinə yol vermək, inqilabın bizim vətəndaşlara bəxş etdiyi böyük hüquqlara təcavüz etmək olardı!.. Bir neçə gündə bəzi para işlərdə elə qanunsuzluğa təsadüf etmişəm ki, heç deməli deyil! Əbəs yerdən sadiq sovet vətəndaşını incitmək kimə lazımdır? İcraiyyə komitəsinin qərarı ilə olan bir iş barəsində... – deyə Mehman yekə iş qovluğunu götürüb raykom katibinə tərəf uzatdı, Vahidov işi götürüb nəzərdən keçirə-keçirə vərəqlədi.

– Bizim Kamilovun belə at işləməz yolları vardır, – deyə Vahidov əlini telefon dəstəyinə atdı. – Sizi onunla tanış ediblərmi? – Vahidov zəng edib Kamilovun kabinetini aldı, onun rayon partiya komitəsinə gəlməyini xahiş edir.

Kamilov pərakəndə halda stol üstünə sərilmiş bəzi para ehsaiyyə məlumatlarını, təzə alınan teleqramlarını tələm-tələsik yığışdırıb köhnə bir qəzetə bükdü, Sərrafzadəni çağırdı. Qan-tər içində olan qoca kuryer içəri girib Sərrafzadəni tapmadığını bildirdi.

Kamilov başını bulayıb dişini qıcadı, stula bitişmiş Murtuz Murtuzova:

– Görürsən də, – dedi, – silistçi, görürsən də, necə səhlənkar oğlu səhlənkardır bu Sərrafzadə!

– Bil, elədir, bu Sərrafzadə çox itəyəndir, – deyə Murtuzov sallanmış başını qaldırdı. – Neçə yol siz onu axtaranda, mən şəxsən özüm onun özünü yaxalayıb demişəm ki, adam ol, Sərrafzadə! Yoldaş Kamilov sənə dünyanın xətrini qoyubdur, sən qanun cızığından çıxma! Özün də ki, bir tərəfdən bir balaca şübhəli ünsürsən! Qurban ol o kişinin kölgəsinə, dolan gündə beş kərə o kişinin qənimət başına! Görünür ki, zatı xarabdır, yoxsa kim olsa indi sizin əlinizin altında dönüb bir professor olardı, azı, özüm ölüm, professor!

Kamilov:

– Yaxşı, yaxşı, basıb-bağlama, – dedi. – O da sənin tayındır!

– Düz buyurursunuz, o da mənim kimi bir qədər korafəhmdir!

– Kor-koru tapar, su çuxuru, sizin nərdinizin şaqqıltısından az qala bu rayon köçür!

– Doğrudur, mən özüm neçə kərə demişəm, Sərrafzadə, adam ol, bu daşları yavaş çırp, beynim tərpəndi, ancaq baxırsan ki, mərəzlidir, şaqqıldatmasa olmur!

– İkiniz də birsiniz, – deyə Kamilov barmaqlarını qoşalayıb uzatdı. – Bax belə, ayrılmaz cüt bacı! Ancaq biri gözəl qıza oxşayır, biri kaftar bir kifirə!

Murtuzovun qırışıq üzü daha da qırışdı. Onlar durub kabinetdən çıxdılar. Yol uzunu Murtuzov çox bərk hıqqıldadı, ağzını açıb bir neçə söz də demək istədi, ancaq cürət etmədi. Onlar raykomun həyətinə yaxınlaşınca Murtuzov ayağını sürüyüb udqundu:

– Bir sözüm də var idi... – dedi, – mən qayıdacağam.

Kamilov yerində dayanıb:

– Buyur, ikisi olsun, Murtuz Murtuzov! Boş nərdtaxtan qulağımızı da aparıbdır! Gərək səni silistçi yox, nərdtaxta dərnəyinin məccani rəhbəri təyin edəydilər!

– Doğrudur, yoldaş Kamilov, – deyə Murtuzov nərdtaxta söhbətindən artıq öz dərdinə qalmaq istədi. – Hirslisiniz, ancaq hər bir barədə bizim üstümüzdə o böyük dağlardan da ağır bir haqqınız var! Ancaq

orada xahişim budur ki, bildirməyəsiniz ki, mən sizə Həmin Salamatov haqda olan qərar barəsində bir xəbər-zad vermişəm. Nədən ki, sonrası var. Bu başdan yaxşı deyil ki, pərdə yırtılsın. Qoy aramızda inam olsun. O mənə inansa, bizim işə bir dünya fayda verər!

Kamilov iri pəncəsilə Murtuzovu döşündən itələyib:

– Yaxşı, yaxşı! – dedi, – mənə əlifbeydən dərs demə, get sabahdan o atı təhvil ver! Yoxsa tülkü atanı qəbirdən çıxardıb dalına şəllərəm, quyruğu yer ilə sürünər!

Murtuzov, bu sözdən xoşu gəlir kimi, qaranlıqda irişdi, onun iri iti dişləri cərgəsilə göründü.

– Baş üstə, – dedi və ətli dodaqlarını dili ilə yaladı. – Nə olar ki, nəinki atı, lap canımı da istəsəniz təhvil verərəm!

– Onda yaxşı, zəhmət çək əl-ayağa dolaşma!

– Baş üstə! Biz ancaq sizin kölgənizə güvənirik.

– Tülküoğlunun peşəsi sapma-supmadır, kiri!

– Baş üstə! Ancaq sizə görə demək istəyirdim, yəni atı daşlığa sürməyəsiniz!

Kamilov əlini qaldırıb:

– Atı təhvil ver! – dedi. – Vəssalam! Yoxsa qərar qoyub qanuna salaram!

Murtuzov qabağa keçib başını əydi və əlini qılınc kimi qaldırıb boynuna çəkdi.

– Əşi, bu bir yetim başa nə söz axı!..

Kamilov əlini uzadıb Murtuzovu yolundan bir kənara itələdi.

– Yaxşı, qılçalarıma sırmanma, qayıt!

– Mən deyirəm ki, yəni gönü suya vermək olmaz!

– Sən dabbağ atayın ərvahı, mənə cib-cib öyrətmə!..

## XVII

Kabinetin qapısı bir qədər yelli açıldı, uzun koridorda əyləşib sükuta gedən qapıçı ilə Qaloşlu adam səksəndilər, Kamilov onları görüb saymadan pufuldaya-pufuldaya içəriyə girdi, ağızucu salam verib stulu qapdı, stolun baş tərəfindən qoyub oturdu. O, əlindəki lülələnmiş kağızı tez açıb stolun üstünə sərməyə başladı.

– Başdan-ayağa həngamədir, – deyə şikayətləndi. – Bu Baş Yağ İdarəsi iki ayağını bir başmağa qoyub boçka vermir ki, vermir, yağını yığıb göndərəsən özünə! Rayondan gedən hər bir teleqrama da boçka əvəzinə bir-birinin quyruğuna düyülmüş beş teleqram çəkir!.. Surəti is-

palkoma, surəti raykoma, surəti artelə, surəti hara-hara?!. Yuxarıda boş-bekar oturub aşağıdan özünü sığortalayır bu Baş Yağ İdarəsi! Bir baxın, – deyə Kamilov teleqramları çıxardıb Vahidova göstərdi. – Pir olmuş, deyəsən bəs mən özümü burda boçka qayıracağam?!.

Raykom katibi Vahidov döşü atlanmış Kamilovu birtəhər dayandırıb onu prokurorla tanış etdi:

– Bizim cavan prokurordur, tanış olun!

Mehman ayağa durub əlini Kamilova uzatdı. Kamilovun barmaqları onun ovcunda xəmir kimi yoğruldu. Kamilov yeni gəlmiş prokurora etina etmədən yenə öz sözünə davam etdi:

– Bu da ki, bu kolətəyi kolxozlarının işidir! Əgər şəxsən özüm getməsəydim, bilmirəm heç bu kolxozlarda kulak quyruqları nə həngamə çıxaracaqdır!.. Neçə gün qabaq bu qayaboynu kolxozları da belə idi... Şəxsən özüm getmişəm, şəxsən hesab-kitab işlərinə qədər düzəltmişəm, axırda şəxsən demişəm: "Bala, belə işləyin!.." İşləyən yoxdur, yoldaş Vahidov!.. Siz bir o qədər də hələ bələd olmamısınız, təzəsiniz, burada işləyən kişi yoxdur! Üç şey bilirlər: biri yemək, biri yatmaq, biri də ki, nərdtaxta çırpmaq! iki adam da bu rayonda fil olsa belə nə qayırar? Kimi təhkim edib kəndə göndərirsən, özünü verir toyuq-cücə çığırtmasına! Lap silistçisindən, prokurorundan belə! O keçən prokuror... famili nəmənə idi onun?!.. Hə, Zalov, yadıma düşdü. Sizin canınız üçün, Rüstəm-Zaldan da çox yeyirdi, baxanda deyirdin, bəs bu haranın minbatmanıdır? Təkəş-tükəş yeriyəndə, az qalırdı yer çatlaya! Düz sentner yarım! Min dəfə dedim: "– Ay Rüstəm-Zal, az ye, qusarsan". Özünü düzəltmək əvəzinə dönüb mənə məcəllədən dərs dedi. Dedim: "– balam, mən özüm də elə o məcəlləyə qol qoyub, barmaq qaldıranlardan biriyəm!". Dedim: – "Adam prokuror olanda nə olar? Sən mənim bir şöbəmsən, ya yox?" Min dedim, olmadı, minbir dedim, olmadı, axıra da vurdu kəlləçarxa, tribunala düşdü!.. Mən ona dedim: "Balam, prokuror hökumətin qılıncı olmalıdır", olmadı, baş tutmadı. "Mən kimi deyirəm, yerli hökumət kimi deyir, sən də onu kəs!" Olmadı ki, olmadı! Axırı nə oldu? Axırı özü uçuruma getdi! Məsləhət, məşvərət lazımdır hər yerdə! – Vahidov, bu adamın indi nə demək istədiyini bilmək üçün qəsdən onun sözünü kəsmir, danışmağına imkan verirdi. Kamilov isə başqalarına hədə-qorxu gəlməklə öz gücünü Mehmana bildirmək istəyir, o, bəri başdan prokurorun gözünün odunu almaq, onu ovcunun içinə alıb sığışdırmaq istəyirdi. "Yox, yox, ağzından süd qoxusu gələnin birisi də mənə qanun dərsi oxuyacaq, bu yekəlikdə dağı bir qoz qabığına sığışdı-

racaqdır?" – Kamilov fasilə vermədən danışır, keçmiş prokuror Zalovun kölgəsini qılınclamaqla sakit görünüşlü gənc Mehmana top gəlirdi. – Nə olar, adamın əlinə ixtiyar yazıb verəndə, məgər adam "dəli Nəzərəm, belə gəzərəm" deyə sağa-sola qılınc çalıb, at oynadıb böyük-kiçik deməzmi? – Kamilov baxdı, sonra torpaq şöbəsi müdiri Cabbarzadənin üzərinə keçdi. – Biri də olsun bu torpaq şöbəsi Cabbarzadə, başınız üçün, məni lap xirtdəyimə yığıb ha, düz buraya! Yüz dəfə şəxsən özüm başa salıram, yenə baxıram ki, korafəhmin biridir! O günləri demişəm, bala, sənin aqronomluq dərsin ola-ola daha Mərdan Vahidov gəlib sənin əvəzində kolxozlarda işləməyəcək?!. Donluqdur, alırsan, işlə də, – Kamilov pəncəli əlini oynada-oynada danışırdı. – O biriləri də onun tayı: bu sığorta da hər qotur atın dərisinə bir akt bağlayıb hökumətin pulunu çölə səpələyir! Bu kassadan da heç gözüm su içmir, əmanətdən! Baxırsan ki, çotqa dənələrinin şaqqıltısında nə isə bir qaranlıq iş var. Bu zayomlarda nə isə bir kəfgetmə var! Belədir, yoldaş prokuror, – deyə Kamilov dönüb Mehmanı süzdü. – Görürsünüz də, mən deyirəm, siz də eşidəsiniz, necə deyərlər şərti şumda kəsək ki, xırmanda yabalaşmayaq. – Kamilov əzilmiş dəsmalını çıxardıb ət basmış gözlərini sildi. – Belədir, yox, bala?.. Özü də lap xırda oğlum yerindəsən! Siz ki, varsınız, əslən bizim icraiyyə komitəsinin bir şöbəsisiniz! Necə deyərlər, bizim kəsərli qılıncımız! Sabahdan başlamış bu çürük-mürüyü kəsin, rədd eləyin getsin! Bu kulaq-mulaq qalıq-quluqlarını!

Mehman iş qovluğuna baxdı, nəhayət, Vahidov Kamilovu dayandırdı. O:

– Yoldaş prokuror, – deyə Mehmanı göstərdi, – bu neçə gündə işlərlə tanış olduğu zaman sizin qərarınızı tapıb, indi ona etiraz eləyir.

– Necə? Bizim? – deyə Kamilov otaqdolusu partladı. – Zəhmətkeş deputatları Sovetinin qərarını?!

Mehman sakit bir hərəkətlə iş götürüb çıxarışı göstərdi.

– Burada heç bir qanuni əsas yoxdur, – deyə o, kağızı inamla uzatdı. – Kolxoz briqadiri Salamatov heç də az iş görməmişdir. Onun ifadəsi göstərdi ki, sinfi düşmən qalıqları o kişini toxum səpinində şərə salıbdır!

Kamilov dilləndi:

– Demək belə görünür ki, biz maymaq olmuşuq!

– Hər halda qərar düz deyil! O kişini azad edib işi dərindən yoxlamaq, əsl müqəssirləri tapıb məsuliyyətə almaq lazım gələcəkdir!

– Bəs bizim o boyda qərarımız? – deyə Kamilov Mehmana tərs-tərs baxdı. – Bəs bu boyda biz?..

– Sizin yanlış qərarınız bizə əsas ola bilməz, biz qanun qabağında məsuliyyət daşıyırıq!

– Yerli hökumətin qərarı ən böyük əsasdır! – Kamilov öskürə-öskürə qaralırdı. – Nə əsas, bala? – deyə o, dam kimi şişirdi. – Bizə nə əsas, bala! Biz burada hökumət oturmuşuq, daha bundan artıq nə əsas, oğul? Əsas odur ki, biz yazaq! Biz yazdıq, oldu əsas!.. Təzədən nə əsas? Baş tapmıram, hansı əsası deyirsiniz? Siz bu əsas oğlu əsası haradan tapmısınız? Əsas! Yerli-köklü "əsas" deyiləni siz indidən yadınızdan çıxarın! Görünür, Rüstəm-Zal yazıb qoyubdur ki, siz də gələn dəqiqədən bərk-bərk "əsas" deyə yapışmısınız əsasın boğazından! O keçən prokuror Zalova da iş tapşıranda "əsas" deyərdi. Zəhmətkeş deputatları Sovetinin qərarından böyük daha nə əsas, nə qanun, balası?

– Mən qanuni əsas deyirəm!

– Qanun deyəndə, bala, biz bilirik, onu necə düzəldirik! Yuxarılarda düzələndə, azdan-çoxdan biz də oluruq, özü də barmaq qaldırırıq! O Rüstəm Zalov da mənə həmişə qanun kitabları gətirərdi. Bir gün onu tutub qapını örtdüm, dedim ki, bu qanun kitabları sənə lazımdır, mənə yox! Dedim: "Yaxşı, yaxşı öyrən, çünki mən bünövrə daşını qoyanlardanam, lap himnini!" – Kamilov əlini pırtlaşıq saçlarına çəkdi. Sanki onun cod, çal saçları yavaş-yavaş qabarıb üzüyuxarı dikəldi. – Zalov da çox bəd başlamışdı, xam dayı şap-şapa öyrədən kimi, onu da yavaş-yavaş rüşvətə öyrətdilər. Bax, bu yoldaş Vahidov yox idi, mən qolundan yapışdım, dedim ki: – Ay Zalov, belə olmaz, – Kamilov Vahidovun oturduğu stulu göstərərək: – Bax bu stulda bir başqası oturmuşdu, onun dostu! Bu kişi, yəni yoldaş Vahidov sonra gəldi... Sözüm onda deyil, keçmiş prokuror sürüşüb girdi rüşvətin qara lehməsinə, özünü də qarğa kimi qapqara qaraltdı! Bilirsənmi, prokuror gərək qaralmasın. O, gərək oğru-əyriyə qarşı siyirmə qılınc mübarizə etsin, nəinki icraiyyə komitəsinin qərarını irreviziyəyə başlasın! Kişi gərək ləkəsiz olsun, gül kimi! Nəinki o Rüstəm Zalov kimi bir dağ gövdəli ləkəyə çevrilsin! Bizim qərarın yox, öz ləkəsinin dərdini çəkmək gərək idi! Yoxsa qanundan bu gün dərs deyib gözümüzə kül üfürməklə sabahkı ləkəyə, bir çayı da bağlasan yuyub təmiz olmayacaqdır! – Kamilov tövşüyə-tövşüyə nəfəsini dərdi, bu "ləkə" sözü burada da Mehmanın qulağını dırmaladı. Xoşlamadığı bu kəlməni bayaqdan bəri iki adamın ağzından eşidirdi.

Vahidov, hələ ki, Kamilova cavab vermədən Mehmanın fikrə getdiyini görüb:

– Niyə xəyala getdiniz, gənc oğlan? – dedi. – Həyat mübarizədir, bu mübarizədə o adamlar qalib gələ bilər ki, onlar həm iradəli, həm də vicdanlı olsunlar! Fikir verdim, bayaq mən deyəndə də rənginiz qaçdı!.. Siz cavansınız, mən sizə bəri başdan tapşırmaq istərdim. Bizim bütün işlərdə ayna kimi təmiz, ləkəsiz olmaq lazımdır! Siz hələ çox gənc, çox təmiz, ləkəsiz bir oğlansınız! Kəskin mübarizə etmək, canilərlə döşləşmək, onları qanun qabağında diz çökdürmək üçün daxili təmizlik, daxili qüvvə alınmaz bir istehkamdır!

– Bəli, belə tövsiyəni almışam!

– Daha yaxşı, – deyə Vahidov Mehmanı mehribancasına süzdü, hələlik qəti bir söz deməsə də, içəridən ürəyinin Mehman tərəfə döyündüyünü hiss etdi. – "Mənim oğlum Salman da hüquqşünas olmaq istəyir..."

"Prokuror gərək ləkəsiz olsun!" – Kamilov Vahidovun bu sözlərindən zahirən xoşlanıb:

– Lap düzdür, – dedi, – siz cavan uşaqsınız, özünüzü belənçik şeylərdən gözləyin! Yoxsa stola keçməmiş, yerli hökumətin qərarına "əsas" deyib qulp qoymayın! Mən boyda adamın yazdığından da artıq sənə nə "əsas" – Sonra Kamilov gözlənilmədən bədənində bir sızıltı gəzdiyini duydu. O, birdən yumşalıb: – Mən ölüm, bu əsas oğlu əsası, burax getsin! – dedi və əli ilə özünü göstərərək, – bu Kamilovun ölmüşünə, burax, oğlum!

Tutulmuş və pörtmüş Mehman qəti bir qərarla:

– Yox, mən o adamı buraxacağam, – dedi, – o Salamatovu bu yaxın zamanda buraxacağam!

– Nə haqq ilə, bala! – deyə Kamilov könülsüz güldü. – Lap zarafatsız ha, mən ölüm?

– Mən özüm bilirəm!

– Bəs siz? Bəs biz hər ikimiz? Mən də, yoldaş Vahidov da o briqadir Salamatovu birdən-birə açıb buraxmağa icazə verməri̇k!

– Qanun özü icazə verir. Qanunsuzluğu düzəltmək üçün heç bir icazəyə ehtiyac yoxdur!

– Balası, gəlsənə, gəmidə oturub gəmiçi ilə dalaşmayasan! – deyə Kamilov Mehmanın əl-qolunu bağlamaq, yeri gəldikcə onu çıxılmaz bir uçuruma itələmək, sonra əlini-əlinə vurub gülmək, öz nüfuzunu daha da gücləndirmək istəyirdi...

Ancaq Mehman gənc olsa da belə gəldiyi gündən əmələ gəldiyi bu vəziyyəti anlayırdı. Buna görə də o, eyni təkidlə:

– O adam müqəssir deyil, istintaq zamanı bəraət qazanmalı, böhtançılar isə cəzalanmalıdır, – deyə cavab qaytardı. Kamilov üzünü Vahidova tutaraq:

– Belə ki, görürəm, – dedi, – biz bu rayon üçün Murtuzovdan yaxşısını tapa bilməyəcəyik! – Kamilov əllərini ovuşdurdu. – İnsafən bizim burada, bu raykomun, orada o ispalkomun nə kimi bir qərarı olsa, o kişi sivrilib dərisindən çıxar, ancaq yerinə yetirər. Doğrudan da Murtuzov yerli təşkilatın qərarlarını təftiş edib daha "əsas" deyə başqa bir şey axtarmaz! "Tut-tut, burax-burax!" – Yoxsa o, daha belə bizimlə çadıra çıxıb söz güləşdirməz, bizim aramızda belə inciklik salmaz!

– İndi Murtuzov birbaş ancaq mənə tabedir! – deyə Mehman yerində yığışıldı. – Müstəntiqin prokurordan ayrı və gizli iş görməyə heç bir ixtiyarı yoxdur!

– İxtiyarı olmayanda nə olar ki, balam? Öyrənmək eyib deyil! Öyrən şəraiti, öyrən təcrübəni! Axı belə də yaxşı deyil! – Kamilov yenə də qızışdığını başa düşüb, hələ ki, işin üstünü malalamaq, sonra yeri gələndə də ağır bir zərbə endirmək istəyirdi. Mehman isə bəri başdan bu "qudurmuş əyanla" toqquşmaqdan çəkinmir, ilk əvvəldən açıqcasına öz dediyində dayanırdı. Kamilov isə hər növ ilə olsa, öz əlaltısı Murtuzovu müdafiə edir, onu bir kənara buraxmaq istəmirdi. Müstəntiqə qarşı azacıq da bir şübhə oyatmağın zərərli olduğunu isbat etməyə çalışırdı:

– O da köhnə yuristdir, – yaxşı deyil ki, onu ayağının altına qoyub kütlə içində ayaqlayıb nüfuzdan salasan. Mən ona at verib nüfuzunu qaldırmışam, sizsə onu atdan yerə salıb məsğərəyə qoymaq istəyirsiniz!..

– Məndə məlumat var ki, Murtuzov təmiz adam deyil! – deyə daxili mühakimədən sonra Vahidov dilləndi. – Qoy gənc prokuror da elə bəri başdan bilsin! Bayaq "ləkə" dediyim elə bəlkə bu Murtuzovun özüdür. Məndə məlumat var ki, o kooperativ anbardarı, o nədir, – Vahidov bloknotunu vərəqləyib altından iki cızıq çəkdiyi bir adı oxudu, – hə, Məmmədxan, onunla çox yamanca qardaşdır!

Kamilov gözlənilmədən özünün təkləndiyini görüb, Mehmanı qeyri-adi bir nəzərlə süzüb üzünü Vahidova tutdu:

– Yoldaş raykom katibi, – deyə boynunu tir kimi uzatdı, – mənim özümün onunla əslən elə aram da yoxdur, – deyib yerində hərəkətlə gəldi. – Ancaq insafa gəldikdə, mən sizi inandırıram ki, o Murtuz Murtuzovun vicdanı güldən də təmizdir!.. Burada on ildən yuxarıdır silistçidir, məmə yeyəndən pəpə yeyənə, hər kəs onu tanıyır, lap elə adam da var ki, o Murtuzovun başına and da içir. Adam gərək imam üçün ağla-

yanda yezid üçün də ağlasın, belə ki, obyektiv olsun. Bir də ki, nə çox bu tutulan ünsürlərin dişini qıcıyan adamları!.. Bəlkə də kişini hələ bir ləkələmək də istəsinlər!.. Bax, bu kişi ki var, bu Salamatov, bu işin özünü dağıtmağa neçə min desən nəqd basar! Yoxsa bu tezliklə o kargüzar bu işi niyə təzə prokurorun öz hüzuruna çıxarırdı?

– Kargüzarsız mən özüm tapmışam, – deyə Mehman cavab verdi, – heç bir kəssiz mən özüm tapmışam!..

Kamilov birdən-birə əsli sınanmış üsula – bağırtıya keçib:

– Tapmış, bəyəm, əksinqilabçıdır, balam?! – O, xırıltılı səslə qışqırdı, boğazının damarları barmaqları yoğunluqda şişdi. – Sabahdan ikinci qərar yazıb sən prokurora təklif edərik ki, birinci qərarı yerinə yetir, vəssalam! Yoxsa üç gün deyil gəldiyin, bu dağ boyda adamı çeçələ barmağına sarımaq istəyirsən? Biz sənə ata kimi öyüd veririk, sən hələ bu başdan bizimlə "qılınc-qalxan"a çıxmaq istəyirsən?!.

– Mən qanunsuz qərarı yerinə yetirə bilmərəm. – Mehman əyləşdiyi yerdən tərpənməsə də belə, içəridən onun dikəldiyi duyuldu, – bu qərar haqqında respublika prokuroruna da yazacağam! Bu məsələni bütün kəskinliyi ilə respublika üzrə qaldıracağam!

– Aman günüdür, bizə rəhm et! Yazıq olmuşuq, yoldaş prokuror, lap əldən düşüb fəqir olmuşuq!.. – Kamilov barışmaz, "ağzından süd iyi gələn" bir gənclə üz-üzə gəldiyini gördü, onun gözləri sanki kəlləsinə çıxdı. O dönüb dil-dodağını gəmirdi. Vahidov Kamilovun üstünə bərkdən acıqlandı, onun kabinetində özünü bu cür əli-qolu açıq aparan adama acığı tutdu:

– Bir qədər özünüzü yığışdırın! – deyə Vahidov ona gözü ilə qapını göstərdi. – Məntiq əvəzinə havayı bağırtı kimə gərəkdir? Yaxud sənə müavin sayılan Cabbarzadə kimi gecə-gündüz işləyən adama daş atma kimə gərəkdir?!

– Ay yoldaş Vahidov, – deyə Kamilov ustalıqla aradan çıxmaq, öz köpünü bir az yatırtmaq istədi. Beləliklə o, iki tərəfdən birini öz əlində saxlamaq istəyirdi. – Görmürsən, yoldaş Vahidov?.. Görmürsən mən boyda, mən yaşda at belində mürgüləyən bir kişini bu oğul-uşaq necə özündən çıxarır?.. Bu oğlan mənə necə hədə gəlir?.. Mənə, özü də, bax mənim xırda oğlumun yerindədir! Dünən bir, bu gün iki, döşünə döyür ki, gəl çirmənib güştü tutaq! Vallah, bu kəndlərdə deyilən kimi, keçinin əcəli gələndə çobanın çomağına sürtünən kimi, bu da bizim əl-qolumuza dolaşır ha!.. – Bu son sözlər Kamilovun boğazından boğula-boğula çıxdı. – Adamın cinini belə də kəlləsinə çıxarmaq olar!..

Nə olar ki, iki kəlmə əlifbey deyib qalstuk bağlayanda? Ya bu Mehman olsun, ya o Cabbarzadə!

Kamilov nə qədər roldan-rola girsə də, Mehman ilk zərbəsinin tutarlı olduğunu dərk edib, qalib bir istehza ilə irigövdəli Kamilovu süzdü. Kamilov bu istehzalı baxışların müqabilində çapalayaraq titrəyən ətli əlini enli toqqasına keçirib:

– Siz belə haradan gəlmisiniz, bala? – dedi. – Biz heç sizin vəsiqənizi də yoxlamamışıq!

– Yoldaş Kamilov, bura ştabdır! – Vahidov şəhadət barmağını qaldırdı, – unutmayın ki, siz haradasınız? Mən yoldaş Mehman haqqında olan təyinatdan çıxarış almışam.

Vahidov iş qovluğunun arasından möhürlü bir vərəq çıxarıb göstərdi: – Mərkəzi Komitə bürosu təsdiq etmişdir... Mehman Murad oğlu Atamoğlanov...

– Yoldaş Vahidov, mən bu son sözü, elə sözgəlişi dedim... Ancaq bir görürsünüzmü, dünənki bir körpə Oğlanov, bu gün bizə necə qanundan təlimat dərsi keçir?.. Onu da görün! Düzü necə olsa hər bir kəsin zatını dönə-dönə yoxlamaq lazımdır! Görək bu oğlan "əsas" pərdəsi altında kimin qisasını kimdən almaq istəyir? Bunlardır, indi "əsas" sözü altında, inqilabın ilk ağırlığını öz çiyinlərində daşıyanlara hücum çəkən! Bunlardır, "əsası" bir qılınca çevrilib, başımızın üstündə tovlayan!.. Düzdür, elədir, sayıqlıq, yoldaş katib, hər kəsin zatının kökünü, hansı bir qərar olsa da, bir də təkrar-təkrar, dərindən-dərinə yoxlamağın heç eybi yoxdur! – Kamilov yekə gövdəsi ilə hirsindən çiyinlərini ata-ata, yenə də özünü unutmuş kimi yırğalana-yırğalana güldü. – Belədir, bir də "Azbuka kommunizmanı" bir az-maz vərəqləmişik!.. Nə olar, beş-üç il o yuxarı dərsi alanda?!.

Mehman inamla işləri bir-birinin üstünə topladı.

– Qoy ağzının alovu o yana çevrilib sinfi düşmənləri yandırsın, bala – deyə Kamilov Mehmanın bu təmkini müqabilində nəfəsini dərədərə deyindi. – Yoxsa dəvəni xizəklə qorxutmaq olmaz! Burada təcrübə dərsi almaqdan, özündən böyükdən təcrübə dərsi götürməkdənsə, ağacağaca qoymaq kimə gərəkdir?!.

– Bu rayon üzrə dövlət qanununu doğru-düzgün həyata keçirmək mənə tapşırılıbdır!

– Bizə də qaşıq içi çıxarmaq, eləmi?

– Əsla yox.

– Bəs onda?..

– Biz qanunu təhrif edənlərə qarşı mübarizə aparacağıq, kim nə təhər əsəbiləşsə də! – Sanki Mehmanın da zahiri sakitliyi bu an pozulur, onun daxili, gizli cürəti üzə çıxırdı, o daha nəfəsini dərir, mübarizənin qaraqışqırıq qoparıb belə "uşaq adamlarla" üz-üzə gəldiyini özü üçün xırdalıq hesab etsə də, yenə də "azdan-çox törər", – deyə öz şöhrətinə toz qonmağını istəmirdi. Vahidov isə Kamilovun çox yamanca baş apardığını görüb, qayıdıb onun üstünə düşdü:

– Kifayətdir! – dedi. – Bəsdir, yoldaş Kamilov! Yoxsa bu hündür-hündür dağları da siz yaratmışsınız! Bir təvazökarlıq da lazımdır, ya yox!.. Yoxsa özünü tək görüb başqalarını yeralması hesab etmək olmaz!

Kamilov qaşqabağını sallayıb gecə kimi qaraldı.

– Daha bu rayonda nə hökumətlik oldu, – deyib stulda yırğalandı. – Onun ki qərarı gündə bir şübhə altına alındı, nə olsun?

– Yaxşı, bu gənc oğlan özü sonra aydın edər, – deyə Vahidov bu deyişməyə xitam vermək istədi. – Qanun üzrə aydın edər!

– Mən aydın etmişəm, yoldaş Vahidov! – Mehman bir addım belə geriyə çəkilmək istəmədi. – Qərarımın üstündə dayanıram!

Vahidov ağ dəsmalını çıxarıb alnında muncuqlanan tərini sildi:

– Bir neçə gün də yoxlasanız, pis olmaz!..

– Təqsirsiz vətəndaşı heç bir dəqiqə də həbsdə saxlamaq olmaz!

Kamilov "uşaq" saydığı adamın belə inadı qarşısında sanki səndirlədi, o:

– Görürsünüzmü?, yoldaş Vahidov! – deyə Mehmana qarşı şübhə oyatmaq istədi. Mehman isə qalan şeylərini inamla yığışdırdı. Vahidovla xudahafizləşib çıxdı. Gözlərini ovan Qaloşlu adam Mehmanın yanına düşdü. Kamilov ayağa qalxıb içəri tərəfdən qapını bir az da bərkitdi:

– Gördünmü, yoldaş katib? – deyə o iri gövdəsilə yırğalandı. – Siz bilin ki, bizim hər ikimizin qərarı bir qərar deməkdir! Mən hara getsəm də mənim qibləgahım buradır, raykom! Dünən bir, bu gün iki, hələ mən bir kənara, siz saç-saqqalda kişini belə eşitmir. Demir daha baxaram, yoldaş Vahidov. Yox, "ölər Koroğlu, dönməz bu yoldan". – Kamilov otağa göz gəzdirib əlavə etdi: – Görünür haradasa, yuxarıda bunun bir dayısı var!.. Yoxsa bu uşaq belə öfkəli-öfkəli danışmaz! – Kamilov qeyzlə qapıya tərəf baxdı. – Əgər ayağının altına qoyub cırrım çəkərsən, deyərlər ki, bu saqqalda utanmırsan, kişi?.. Siz də ki, yoldaş Vahidov, burada heç bir kəs yoxdur, "demokratiya" – deyib oğul-uşağa bu qədər meydan verirsiniz! Biz gərək əlbir işləyək. Yoxsa belə getsə, bu rayonda bizim işləməyimiz çox çətin olacaqdır!..

Vahidov başını qaldırıb Kamilovun gözlərinin içinə:

– Əsassız qərarı heç bir vəchlə müdafiə etmək olmaz, – dedi. – Yaxşısı budur ki, özünüz elə günü sabah bir qərar çıxarıb bu əyri qərarınızı geriyə götürəsiniz!

– Onda gərək mən o gizli kassanın açar-uçarını burada təhvil verib Kamilov yox, Kamalov, ya Camalov olam! – Kamilov öz-özlüyündə deyinib qapıdan çıxdı.

– Doğrudan da "qudurmuş əyan" – deyə Vahidov mənə ilə başını yırğaladı. – Bax, cərgədən çıxmaq nəyə deyərlər?.. Bax, Mehman kimi bir gənclə üz-üzə gəlməyə, Cabbarzadə kimi ali təhsilli aqronomun kölgəsini qılınclamağa nə deyərlər?!.

## XVIII

Anbardar Məmmədxan ağzına qədər müxtəlif mallarla dolu anbarın içində, dəmir gözlüklü balaca pəncərə qabağında oturub sənədlərini də stolun üstünə sərmişdi. O, son zamanlar, rayonda başlanan ciddi təftişlər nəticəsində öz yazı-pozularını təkrarən diqqətlə nəzərdən keçirir, sahmana salırdı. İndiyə kimi fürsət tapıb Murtuz Murtuzovla görüşə bilməməyi onu çox bərk darıxdırırdı. Bu arada neçə dəfə o, Yavər Murtuzovanın yanına getmiş, müstəntiqi soruşmuş, onun idarədə bərk məşğul olduğunu bilərək əvvəlcə büzüşmüş, sonra qəddini düzəldərək şax addımlarla geriyə qayıtmışdı. Məmmədxanın bu dərəcədə narahatlığını eşidən Murtuzov aradabir fürsət tapıb işarası özünü anbara saldı. Ağzınacan şəkər tayları, yağ boçkaları, arşın malı bağlamalar və s. şeylərlə dolu olan anbar Murtuzovun ağzını sulandırdı. O, bir müstəntiq görkəmi alıb anbarın mallarını yoxladı; toza bulanmış halda qayıdıb balaca stolun yanına gəldi.

– Bilirsənmi, aşna, işin çox yaman yaşdır, – deyə o, rəsmiyyət ahəngi ilə dilləndi. – Az da yox, çox-çox yaşdır!.. Hələ bilmirəm bu stola sərdiyin cızma-qara kağızlarda nə var?.. Ancaq diqqətlə baxanda, anbar siçanla doludur. – Murtuzovun qırışıq üzü açıldı, o səsini qaldırdı. – Hər şeyin bir qaydası var, aşna! Özünü də gündə dörd kərə başıalovlu bizə atırsan! Sən bəyəm qanıb bilmirsənmi ki, bu yer üzündə mənim dolaşıq işi görməyə gözüm də yoxdur?!.

Məmmədxan sənədləri toplayıb bir-birinin üstünə yığdı, mürəkkəb qurudanı da götürüb onların üstünə qoydu, özünü cürətli göstərmək məqsədilə:

– Sən də çox yaxşı bilirsən ki, – deyə o da tamam rəsmi sifət aldı, – neçə kərə ireviziya olub, ancaq sağlığında, mən də gül kimi, aydan arı, gündən duru çıxmışam. Bir parça halal çörəyim, bir balaca dolanacağım var, bu da mənə bəsdir. Daha mən İran şahı deyiləm ki, tamahım Murtuza əlinin qılıncından kəskin ola!.. Ancaq bilmək istəyirdim, bu nə qəfil ireviziya azarıdır ki, hər yeri tutubdur?.. Ayrı dərdim vardı, mən sənə onu demək istəyirdim Murtuz! – deyə Məmmədxan daha rəsmiyyətdən adlayıb, bir sirdaş kimi yaxınlığa keçdi. – Məmmədxan yeri-yurdu qurdalayıb, göz qapaqlarını qaldırdı. – Bizim bu arvad xanım çox ayaqlanıb!.. Sən bilirsən ki, – Məmmədxan stolun üstünü qurdalayıb mürəkkəbə bulanmış kağızdan bir parça cırıb yumurlamağa başladı, – mənimki, bu arvad tayfasilə bu işıqlı aləmdə düz gətirmir... Birisini buraxıb o birisini alıram, o birisini buraxıb bu birisini alıram, deyirəm, bəlkə birisi adam çıxdı, olmur ki, olmur! Bəxt yaxşı şeydir, hər adamın əli bir yerdə gətirmir, mənimki də arvadda!.. Bilmirəm heç bu qara bəxtimin axırı nə olacaqdır?

Murtuzov yanını stula qoyub:

– Nə olub, – dedi. Ədə, yoxsa bu Balış qızı da yola vermirsən, ədə?

– Allah onun Balış olduğu yerdə başına bir çopur qara daş salsın! – Məmmədxan sinəsini gərib ah çəkdi. – Əşi, o qızıldan qiymətli başın üçün, düşüb dalımca pusquya, kölgə kimi izimdən üzülmür!.. O günü az qala məni qana batırmışdı...

– Nə qan? – deyə Murtuzov maraq və heyrətlə soruşdu. – Nə qan, ədə?.. Sarsaqsan, nəsən?..

– Gecə getmişəm evə, görmüşəm evdə yoxdur. Oturub gözləmişəm, heç kişi də arvadının yolunu gecə zamanı gözlərmi?

– Niyə gözləmir, bərabərhüquqlu deyilikmi?..

Məmmədxan yumurlanmış kağızı barmaqlarının arasında əzməyə başlayıb:

– Düzdür, dedi, – bərabərlikdir, ancaq şeytan vurub məni təbdən çıxardır. Demişəm gələndə cücəboğaz eləyib gedəcəyəm birbaşa qazamata!

Murtuzov dodaqlarını gəmirərək:

– Onda lap özüm güllələrəm səni, – dedi. – Ə, qudurmamısan, ki?! Lap ağsaqqallıqla özüm güllələrəm, sən öl, səni!

– Əşi, neyləyim? – deyə Məmmədxan öz böyüyünün qabağında əlacsız qalan bir adam kimi qollarını yana salıb çiyinlərini çatdı. – Yaxşı ki, hirsim soyuyandan sonra gəlib çıxdı, bu vicdansız qızı, Balış!

– Yaxşı, soyuqqanlı soruşaydın ki, haradasan, Balış, bala?

– Soruşdum, o əziz qızıldan qiymətli başın üçün soruşdum. Üzümə durdu ki, səni axtarırdım. Soruşuram, balam, mən kişiyəm, ya yox?.. Evində otursana, mən də gəlib çıxaram! Dönüb üzümə çımxırdı. Başın üçün, Murtuzov, – o kağızı barmaqları arasında hələ də əzməyində davam edirdi. – Sən bilirsən ki, biz necə bir ayrılmaz ürək dostuyuq, sinə dostu! – Məmmədxan cani sifətilə birdən qətiləşib pəncərədən bayıra boylandı. – Bilirsən ki, bizim bircə arvadımız eyib olmasın, ayrıdır... Silistçi olanda nə olar ki?

Murtuzov əlini yavaş-yavaş stola vuraraq:

– Mən səni rəsmi xəbərdar edirəm, – dedi, – "qulluq qulluğunda, dostluq da dostluğunda!" O günləri arvadların iclasında mən özüm qadın hüququndan danışanda, həmin bu məsələni qaldırdılar ki, Məmmədxan kooperativ anbardarıdır, yoxsa arvad dəllalı?

– Mən?.. Dəllal?.. Başın üçün, əşi lap yanıb-yaxılıram ha! Odsuz-ocaqsız od tutub bu qara bəxtimin içində alovlanıram!..

Məmmədxan quruyan dodaqlarını yaladı. Murtuzov titrəyən əlini qaldırıb onun oynayan çiyninə qoydu.

Məmmədxan hiss içində öz istinadgahının hələ də dayanmaqda olduğunu görüb istər-istəməz irişdi, Murtuzov da yumşalıb:

– Yaxşı, yaxşı, – dedi, – dost dostun bəs nəyinə gərəkdir?.. Səfasını görən dost gərək cəfasına da şərik olsun! Mən arvadlara, düzü cavab verdim. Dedim, azadəlikdir, burada təcavüz yoxdur!.. Ancaq, Məmmədxan, öz aramızda qalsın, alıb-boşamaqda lap ağ eləmisən! Bu Balışı da boşasan, arvadlar üsyan qaldıracaqlar, lap mən özüm də sənin bu qoşa qulağından yapışacağam!

– Necə yola gedim? Deyir ki, avara gəzirsən, bufetçi Narışa, mənim saatımı niyə bağışlamısan?.. Mən öz saatımı onun qolunda görmüşəm?!. Əşi, sənin o qızıldan qiymətli başın üçün, saat özümdədir, saatsaza vermək adına almışam, indi Balış əlinə bir tut götürüb, coşdurub, o evə dürtülür, sonra qayıdıb bu evə dürtülür! Hər yanda xəbər yayır ki, bəs Məmmədxan bufetçi Narışla "siçan-pişik" oynayır!.. Əşi, görün heç bu da sözdür? Evin sirrini çöldə-bayırda yaymaq, onu güclü küləklərə verib dünyaya dağıtmaq heç görün nə deməkdir?

– Əlində sübut nədir?

– Bax bu zəhrimar "çıq-çıq" saat, bax bu da həmin dava dağarcığı qızıl saatı çıxartdı. – Bax, bu balaca bir şey bir dəyirman daşına çevrilib düşüb bu yastıağız Balışın başına!

– Sən də qoy evdə, gözü görsün, ürəyi də səndən bulanmasın, – deyə Murtuzov bir ağsaqqal kimi dostuna məsləhət gördü.

– Qoyuram evdə qoluna bağlayır, gedir birbaş kluba, – deyə Məmmədxan pörtüb qızardı. – Orada da rayon böyüklərinin arvadları pıçapıç eləyir ki, bu qızıl saat, bu xırda adamın arvadında haradandır?

– O da düzdür, gərək özünü yaman gözdən qoruyasan!

– Mən də deyirəm, balam, “qarğa məndə qoz var” deyib, meydana atılma!

– Bəs cavabı nə olur?

– Cavabında gürzə kimi başını dikəldib yalmanır, üzümə qabarır ki, mənim azadlıq hüququmu əlimdən alma!

– “Azadlıq hüququmu əlimdən alma?” – Murtuzov çəkmələrinin burnuna baxdı, – bu, daha zarafatdan o yana keçib, gəlib qanuna çıxır!

– Hə, dönüb belə aktiv olub! O gün görəm ki, klubun o qəlbi yerində çıxıb məşq eləyir. Bir teli burma lotu tarı dınqıldadır, bu da qabağında gözlərini süzdürə-süzdürə, özünü də sındıra-sındıra diringi vurur. Deyəndə ki, bala, sənin orada nə işin var? Deyir ki, hüququmu əlimdən alma!.. Düzü, bir od olub, beş alov, yapışıb mənim yaxamdan! Baxıram ki, gündə ənnik-kirşana güc verir, aynanın qabağında qaşlarını dartıb rol hazırlayır, yeni bir ərə getmək eşqilə xumarlanır... Baxıram əlim titrəyir, özümü saxlaya bilmirəm!

– Elə isə boşa! – deyə Murtuzov məsləhət gördü. – Dişin ağrıdı çəkdir qurtar, qonşun pisdir köç qurtar, arvadın şuluxdur boşa qurtar!

– Boşamağa də təhər qalmayıb, – deyə Məmmədxan kinli-kinli fısıldayıb dərindən nəfəs aldı, – deyir: Hünərin var, tərpən, sabahı gör necə paxırını açıb səni qazamata basdıraram!

– Niyə axı, nə barədə? Məgər adamı qazamata saldırmaq halvadır?

– Böhtan! – Məmmədxan əllərini açıb dizlərinə çırpdı. – Arvad şəri, vəssalam! Eşitməmisən, Allah yıxa bilməyən bir evi, arvad yıxar?.. Guya ki, mən bu anbarı söküb-dağıdıram, hamam suyu ilə özümə dost-aşna tuturam!..

Murtuzov şəhadət barmağını qaldırıb havada oynatdı, sonra əlini endirib qılıncına döndərdi və Məmmədxanın döşünə vuraraq:

– Üstüörtülü boşa, vəssalam! – dedi: – Yoxsa bu kooperativ üstündə böyük qənbərqulusu çıxar!

– Getmir, iki ayağını bir başmağa dirəyib tərpənmir!

– Onda dil tap, yola get!.. Atı daşlığa sürmə! Çünki at büdrəyər, başın daşa çırpılar! – Murtuzov saatına baxıb:

– Yaxşı, bunlar yola gedər, – dedi. – Bir az puluynan ayın-oyun düzəlt, qonağım olacaqdır!

Məmmədxan hirsini soyutmağa çalışdı, qonağın kim olması ilə çox maraqlandı:

– Biz bu qonağı bilsək pismi olar? – deyə soruşdu. – Bir az əvvəl, Yavər bacı da azuqə üçün gəlmişdi, azdan-çoxdan düzəltdim, apardı. Deyirdi qonağımız olacaq, sən də gəl!

Murtuzov əlini Məmmədxanın çiyninə vurdu:

– Heç Bayraməlisiz toy olar? Ancaq abırlı olsun!.. Puluynan!.. Başa düşdünmü?.. Dünyada ilanın zəhləsi yarpızdan gedən kimi, mənim də zəhləm müftədən gedər!..

– Əlbəttə, əlbəttə...

Məmmədxan da arada bir şey yoxmuş kimi özünü çəkdi.

– Yoxsa mən milyoner deyiləm ki, deyəm, nə küləyə düşdü, qoy getsin! Qəpiyinə qədər haqq-hesab çəkməsəm, mən kooperativin bir qramını da kənara vermərəm! Lap Allahın öz bacısı oğlu olsa belə!..

– Nə qəpik, nə qram, hamısı hesabdır! – Murtuzov öz bəlli sözlərini təsdiq etdi: – Mən öz ömrümdə əlacsızlıqdan bu borc zəhrimara getsəm də, başımı da kəssələr müftəyə getmərəm!

Murtuzov bir qədər dayanıb sonra yavaşca Məmmədxanın qulağına əyilib:

– Bir az işləri qaydaya sal, bəlkə qəfildən təftişə gəldik! – dedi.

Məmmədxan bir an içində yenə də bu "təftiş" xəbərindən özünü itirdi, onun gözlərinə qaranlıq çökdü.

– Buyurun! – deyə o mənasız bir əda ilə əlini oynatdı. – Gül kimiyəm. İstər gecə, istər gündüz gəlin, bir kibritə nə söz? Ya bir qəpiyə, ya bir qrama nə sorğu? Mən bayaq da, söhbətin bismillahında dedim ki, mən əsla o adamlardan deyiləm! Olub yüz ireviziya, qoy olsun bu da bir ireviziya. Qoy ta Allahın özü də ərşdən enib öz əshabələri ilə mənim təftişimə gəlsin! – Məmmədxan döşünə döyüb içəridən ürküyə düşdüyü üçün özünü danlamağa başladı. – Mən qönçədən çıxan sabah ertənin şehli bir güllüyəm!.. – Məmmədxan stolun gözlərini bir-bir çəkib üst-üstə toplanmış sənədləri araya tökdü, təkrarən, stolun gözlərini şaraq-şaraqla örtdü.

– Mən təftişə hazıram, qardaş!..

– Anbarı bilirəm, kənarda necə, ədə?

– Kənarda olsun, buyursunlar! Dokumentlərim yerində, gül kimi! Mən vicdanımın qabağında xar düşməz bir gül kimi olandan sonra, bütün dünya məndən ötrü bir cıdır meydanıdır, necə istəsəm atımı elə də

oynadaram! – O əlinin kəfəsi ilə stolun üstünə vuraraq: – Mən bunları tanıyıram, – dedi – sənəd, bir də qol!.. İstəyirsiniz lap dünyanın ən baş bilən, ilan yeyib əjdaha olan irevizorunu çağırın!

– Müəllimlərin və qeyrilərinin payına baxmaq lazımdır!..

– Dedim ki, mən pionerəm, Murtuz dadaş!

Murtuzov Məmmədxanı yamsıladı:

– "Mən pionerəm, Murtuz dadaş!"

Murtuzov gödək barmaqlı əlini yuxarı qaldıraraq: – Təftişin Allahı yoxdur, – dedi. – O, nə dadaş tanıyır, və nə qardaş! Yoxsa sənə nağara lazımdır?.. Özün də hələ təftişin burnu görünməmiş qızdırmalı adam kimi ərşdən-kürşdən danışıb sayıqlayırsan, "yoldaş" sözünü də bilmərrə öz yadından çıxarırsan?..

– Mən nə deyirəm ki? – Məmmədxan şübhə ilə dostunun üzünə baxdı. – Mən həmişə hazıram, yoldaş müstəntiq!..

Bu vaxt qapıdan içəriyə bir əyri-üyrü kölgə düşdü:

– Kim var burada?..

Murtuzov və Məmmədxan ayaq üstə ölü sifəti alıb avazıdılar, ikisi birdən qapıya tərəf boylandılar. Sanki hər ikisi bir ağızdan:

– Ə, Qaloş, sənsən? – deyə irişə-irişə toxdadılar.

Qaloşlu adam etina etmədən içəriyə girdi:

– Əlindəki o yamaqlı zənbil nədir? – deyə Məmmədxan tələsik soruşdu.

Qaloşlu adamın arıq sinəsi qalxıb endi, onun qırışıq üzü titrədi:

– Sizin başınız üçün, – deyə divara söykəndi, əlini cibinə atıb bükülmüş əzinik pulları çıxarıb göstərdi: – Əsə-əsə, anası qoynundan çıxarıb, titrəyə-titrəyə mənə uzadıb ki, qadan alım, bazarlıq elə! Əşi, bu pula nə bazarlıq? Evdə bişməyib, qonşudan gəlməyib, dul arvad oğlundan nə prokuror? Bu pula heç bir lax yumurta verməzlər ki, divara çırpasan!..

Murtuzov, udqunub-udqunub ilk gəlişi zamanı kölgəsindən qorxduğu adamın üstünə acıqlandı:

– Gəvəzək danışma, a kişi!

– Gəvəzək deyəndə, – Qaloşlu adam yenicə yetim qalmış gözüyaşlı bir ərköyün uşaq kimi boynunu çiyni üzərinə qoydu, – Qaloş, başına indi haranın yekə ələməsini salsın?

– Lap yerin-göyün!

– İçindən nə çıxsın?

– İçindən Qaloş! Guya dünənki bəbədir, əlli ildir cəhənnəmə kötük tullamır bu Qaloş?

– Kötük olmayan yerdə, nəinki bir odun yarmaçası, heç bir qamqalax da atmaq olmur, Murtuz dadaş! – Qaloşlu adamın qırışıq gözləri bir hakim kimi Murtuzovun üzərində gəzdi.

– Sən yenə əli istisən, – deyə Murtuzov bu baxışların müqabilində sözünü dəyişib yumşaldı, ağır-ağır məsləhətə başladı. – Təzə adamdır, sabahdan təzə pulu da olacaq, bağlama-bağlama başı açılmamış donluğu da! Buralardan indi kişinin öz halal pulu ilə bir şey düzəlt, qoy dolansın! – Murtuz Murtuzovun da torbalanmış gözləri hiyləgərcəsinə dolandı, – Qaloş, ağlın olmaz birdən hazırlıqdan-zaddan gedib prokurorun adına bir şey-mey alarsan ha?!. Sonra kişinin adına bir ləkə yaxarlar!..

– Mən ancaq bizim Məmmədxanı tanıyıram! – Qaloşlu adam anbardarı göstərdi. – Bu arada bir etibarlı mərd kişi varsa o da budur, mənim qardaşoğlum!..

Məmmədxanın kefi də, rəngi də açıldı:

– Buyursunlar! – deyib batıq səslə Murtuz tərəfə güldü. – Bu gün olmaz pul, sabah olar pul!.. Yoxsa prokuror da ayrı birisi deyil ki, haqqa cığal ola, alıb vermiyə, bəzi para adam kimi?!

## XIX

Getdikcə Mehman təcrübi işə daxil olur, rayonu tanımağa başlayırdı. Rayon partiya komitəsi katibi Vahidov incə, cavan prokuroru çox sevir, onunla söhbət etməkdən zövq alır, arabir onunla şəhər kənarına gəzməyə çıxırdı. Gənc prokurorun raykom katibi Vahidovla belə qoşa gəzməyi Kamilovu bərk darıxdırırdı: “Dünən yox, srağagün bura təşrif gətirən, ağzından süd qoxusu gələn bir para prokuror hara, bir rayonun siyasi ştab naçalniki, saçlarına dən düşmüş bir raykom katibi hara?” – deyə o, üz-gözünü turşudurdu. Baxdıqca, fikir verdikcə, Kamilov bu cəhəti öz sinəsinə sığışdıra bilmirdi. Buna görə o öz katibi Sərrafzadəyə, müstəntiq Murtuzova tapşırıq verirdi ki, bu qoşa gəzən adamları gözdən qoymaq olmaz. Yoxsa niyə bu söhbətdən doymasınlar?.. Ya niyə kənar bir adamı söhbətə daxil etməsinlər?!.

Əlbəttə, Sərrafzadə canla-başla bu vəzifəni yerinə yetirməyə başlamışdı. Qadınlar arasında gedən söhbətləri o öz bacısı Zərrintac vasitəsilə toplayır, Kamilovun ovcuna qoyurdu. Murtuzov isə prokurorluq idarəsində baş verən ən kiçik hadisələr haqqında Kamilova məlumat verdi.

– Bilirsinizmi, bala, sayıqlıq gərəkdir, – deyə Kamilov kabinetdə vurnuxa-vurnuxa gəzinirdi. – Axı nə barədə belə qoşa gəzmək ola bilər?.. Bircə bu "əsası" öyrənsəniz, heç də bəd olmaz!..

– Bu barədə qoy sizin ürəyiniz buz kimi olsun, – deyə Murtuzov sədrə qulluq göstərmək üçün varlığını əsirgəmirdi. – Biz də bizik! Bir də örkən nə qədər uzun olsa, gəlib doğanaqdan keçər!

– Örkən doğanaqdan keçəni gözləmək olmaz, – deyə Kamilov başını bulayırdı. – Belə bir vəziyyət içərisində örkən doğanaqdan keçməyə də bilər...

Murtuzov, Kamilova qatı açılmamış xəbərlərdən verdikcə Mehmana daha da yaxınlıq edirdi. – "Ondan buna, bundan ona". Murtuzov belə desə də, Mehmandan daha artıq ehtiyat edir, əlbəttə, Kamilovdan bərk yapışır, aradakı ixtilafa, Kamilovun verdiyi atı geri qaytarmasına baxmayaraq, o özü ürək dostu ilə köhnə münasibətini bərkidir, iki daşın arasında da olsa belə, "bir parça çörəyini" unutmurdu. Bəzən Murtuzov arada dayanıb "canları çıxsın" – deyə qırışıq dodaqlarını büzüşdürüb işləri vərəqləyir; astadan fıştırıq çalır, sonra kağızların şıqqıltısını dinləyirdi. – Dəmirim gedir, ya kömürüm?! – Murtuzov üst-üstə qalaqlanmış iş qovluqlarını bir kənara itələyib ayağa durur, həbsə düşmüş kimi həsrətlə pəncərədən bayıra baxırdı. – Bəli, ancaq siyasət, politika... Mən bu vəziyyətimdə politikasız kimə söykənə bilərəm?.. O tərəf itələsə, bu tərəfə söykənmək, bu tərəfə itələsə, o tərəfə söykənmək!.. Elə dünya özü də iki üzdə yaranıbdır, biri gecə, biri gündüz!..

Murtuz Murtuzov çoxdan qəbul etdiyi bu "həyat düsturu"na indi daha da ciddi əməl edirdi. – Yoxsa bir başı gərək öz əlinlə suaşağı axıdasan?.. – Murtuzov göy şüşəli pəncərədən öz əksinə baxır, onun qırışqırış sifəti bir qarmon kimi açılıb yığılırdı. – Bax, bu bir dolu baş!.. Dünya avamların dediyi kimi qızıl öküz üstə yox, indi dolu baş üstə dayanır!" Beləliklə o, hər tərəfə sədaqət göstərib tez-tez, bu cilddən o cildə girib uyğunlaşır, Mehmanı gördükcə bir kirpi kimi yığışılıb müti bir sifət alırdı:

– Mən yaşca böyük də olsam, balaca bir kiçiciyiniz olmaq istəyirəm, – deyə Murtuzov ətürpədici bir şəkildə yaranırdı. – Ağıl yaşda deyil, başdadır... Sizin danışığınıza mən heyran oluram... Görürəm, biz axırda çevrilib bir ailə olacağıq. Təvəqqe edirəm, buradan bir yana tərpənsəniz, öz qardaşınızı da unutmayasınız... O günləri anaya da demişəm ki, gərək bizim kasıb komamıza gələsiniz, görəsiniz ki, bu kasıb oğlun necə yaşayır?.. Murtuzov irişir, fəqir-fəqir sözünə davam edirdi. – Bu barədə mən bizim Xatun nənədən çox rica etmişəm, amma nənə

deyir ki, Mehman özü bilər!.. Baxıram, görürəm ki, lap öz anamdır. O günləri Züleyxa xanımdan da təvəqqe eləmişəm, o da mənə söz verib ki, özümüzü düzəldib bir sizə gələrik!

Mehmanın altdan-altdan acıqlı-acıqlı baxdığını görən Murtuzov özünü o yerə qoymur, doğrudan da yay gününün atmilçəyi kimi sıvaşırdı.

– Bilirsiniz, yoldaş prokuror, – deyə Murtuzov axırıncı söhbətdə başını Mehmana sarı uzatdı. – Bizim bir tərəfimiz kəndə söykənir... Kənd ki var, bu qara torpaq bərəkətdir!.. Rəhmətlik atam özü şəhərdən olub, dobbaçılıq etsə də, dayılarım kəndçi olublar... Ona görə lap əzəl gündən bizim bir ayağımız şəhərdə, o biri ayağımız kənddə olubdur!. Buna görə indi anamın toyuq-cücəsi, bir inəyi, iki keçisi var... Əgər anam olmasa, biz bu xırda şəhərdə çoxdan başımızı itirərdik. Anam yığışıb sizə görüşə gəlmək istəyir, deyir ki, gərək gedib bacımı görüm. Vallah düzü, ya burada, ya kənddə, söz-söhbət ancaq elə bu barədə olur!

Qara qıvrım saçları pərakəndə halda dağılan, ancaq işlə məşğul olan Mehman yaza-yaza:

– Dostluq ancaq yüksək bir amalla bağlanmalıdır, – deyib davam edirdi. – Yoxsa vəzifə adamlarının ayrı cürə dostluğu onları çox-çox uzaqlara apara bilər!..

– “Dostluq ancaq yüksək bir amalla bağlanmalıdır”. Murtuzov bu dəfə də cib dəftərini çıxarıb yazdı. – Ancaq bir iş də var ki, dünya durduqca şəxsi dostluq da duracaqdır, – deyə əlavə etdi. – Dünyada bir ürək tikəsi kəsməsən bu dünya daha nəyə lazımdır?.. Bu dünya sədaqət, vəfa, bir də məhəbbətdir! – Ələlxüsus bu sosializmin qələbə çaldığı, ellikcə kollektivləşmə əsasında qolçomağın bir sinif kimi ləğv edildiyi, onun külü göyə sovrulduğu zamanda, dövrümüzün bu çağında!.. Düzü adam dönüb ayna qabağında özünə diqqətlə baxanda utanır ki, bu sədaqət məndə niyə bəs belə kasaddır? Vaxta ki, deyirlər sədaqət, gərək sən də başdan-ayağa çevrilib olasan sədaqət!.. – Murtuzov özünü sadiq və birüzlü adam kimi qələmə verməyə çalışır, sədaqətdən dəm vururdu, ancaq çox vaxt Mehman bəlkə də eşitmir, başını qaldırıb Murtuzova cavab vermirdi. Axırıncı bir təşəbbüs edib, özünü gözə verib sədaqət və mərifətdən danışdıqdan sonra, Murtuz öz kabinetinə keçib xeyli fikirləşdi, bir azdan evinə tərəf yollandı. O, arvadı Yavəri barmağı ilə yanına çağırıb onu başa salmağa başladı ki, sabah idarələrdə iş başlananda prokurorgilə gedib bütün xuruşu ilə bir zəfəran-plov düzəltsin. Şişman vücudlu Yavər öz köşək gözlərini döyüb:

– Bu dünyada heç belə də bir şey olubmu? – deyə təəccüblə yerindən soruşdu: – Sən şələlənib onun evinə gedəsən, qolunu çirməyib, “zəfəran-plov” bişirəsən, öz evində onu qonaq eləyəsən?!

– Sən deyilənə qulaq as! – Murtuzov arvadının üstünə xoruzlandı... – Deyərsən ki, bizim yerin dəbi belədir, sədaqəti, etibarı, vəfası belədir!..

– Axı, nə təhər sədaqət, etibar, Murtuz!

– Nə təhər sədaqət, Murtuz! Ölü qızı, ölü! Bəyəm, indi burada bir parça çörək yemək asandır?

– Mən də bilirəm çətindir!

– Onda deyilənə bax. – Murtuzov arvadı Yavəri yaxalayıb dingildədə-dingildədə onu düz evin xəlvəti küncünə çəkdi. – Bu qədər kluba gedirsən, bu dildən də öyrənmirsən ki, bir başını da saxlayasan? Bəs bu danışıqlar ki, boşa gedəcəkmiş, bu “vicdan-məslək”dən bircəciyi də ilişib sənin yadında qalmayacaqmış, daha havayı yerə bu kluba əriş-arğac etmək, ayaq döymək nə üçün imiş? Başına dönüm, qurbanın olum, Yavər!

Murtuzov çox danışdıqdan sonra, arvadının qolundan tutub onu yırğaladı:

– Beyninə batdımı bu sözlər, heç?

– Ancaq Murtuz...

– Ancağı yoxdur, dərsdir, əzbərlə, yoxsa imtahandan kəsilərsən!

– Vallah, mən heç belə dərsdən baş çıxarmıram, Murtuz!..

– Gərək bədənini saxlamaq üçün bu dərslərdən baş çıxarasan, bala!

– Lap quruyub qalmışam bu zəfəranlı plov əhvalatına! Bəlkə elə bu plovun hər bir dəsgahını, lap baş soğanına qədər aparıb qoyub gələm: özləri gəlsin, hə?.. Yoxsa qazan as, plov bişir ki, mən gərək sizdə, sizi qonaq eləyəm?!

– Heyif o kluba ki, – deyə Murtuzov yanıxdı, – sən onun bəzək bölməsində iştirak edirsən!

– Hələ heç bir bəzək də öyrənməmişəm!

– Hamısına baş lazımdır! Murtuzov birdən tutub Yavəri bərk-bərk öpdü. – A qız, vallah, sən qızılsan!..

Nəhayət ki, ərinin tədimi üzrə Yavər müəyyən hazırlıq görüb üçüncü günü idarələrdə iş başlanan kimi şələlənib Mehmangilə yollandı. Yavər, hıqqana-hıqqana pilləkəni çıxdı. Xatun arvad diqqətlə Yavərə baxıb-baxıb təəccüblə soruşdu:

– Bu nədir, ay arvad?..

– Bir şey deyil, sədaqət haqqı, elə bir şey deyil, – deyə Yavər şələli vəziyyətdə ötüb mətbəxə keçdi. – Məslək haqqı, bir şey deyil!..

– Axı, balam, bu nə şələli gəlişdir?

– Gəlmişəm ki... – deyə Yavər şələsini yerə qoyub alnından axan tərini sildi. – Sizə bir plov bişirəm, o klubdakı məslək haqqı!..

– Ay bala, belə bir işin adına nə deyərlər! – Xatun xala qəti etiraza başladı. – Yox-yox, belə şey yaramaz! Bizlərdə belə şey üçün əl-ələ vurub şaqqa çəkib gülərlər!..

Nəfəsini dərən Yavər pörtmüş sifətini başındakı qırmızı haşiyəli kəlağayısının ucu ilə silə-silə:

– O vicdan haqqı, bizlərdə adətdir, – deyə kişisi öyrətdiyi sözlərdən danışa-danışa gözlərini döydü, – ev yiyəsini evində qonaq elərlər!.. Bir də zəhmət verib sizin kimi canışirin qonaqları tərpətməkdənsə, beləcə yaxşıdır, lap beləcə, sədaqət haqqı!

Danışığa o biri otaqdan qulaq verən Züleyxa maraqlanıb gəldi. O, meşokdan çıxarılıb bir yana düzülən düyü torbasına, ağzı açılmış yağ badyacasına, zoğal axtasına, iri baş soğanlara, kişmişə, ətə baxıb çiyinlərini çəkdi:

– Bu nədir, Yavər xanım?

– Vallah, Murtuz dedi ki, Mehman qardaşgildə bir bizlərin plovunu hazırla, yığılıb birlikdə bir süfrədə yeyək! Bu dünyada adama vəfa lazımdır, məslək haqqı!.. Hamısını bir-bir bizim kişi özü dedi... Nədən ki, bizim Murtuz bu dünyanın alt-üstünü ovcunun içi kimi biləndir!

– Heç belə yararmı?! – deyə Züleyxa yumşaq-yumşaq danışdı. – Biz sizi qonaq edərdik! Belənçik şeylərin heç adına nə deyərlər?!

– Təfavütü nədir ki, ay Züleyxa bacı, ya biz, ya siz!.. Vallah, Murtuz sizdən evdə lap çox-çox danışıb, hamısını da yerli-yataqlı mənə başa salıb ki, mən də sizə deyəm ki, biz elə birevliyik!.. Qardaş, qardaşın evində nə eləyə bilməz?.. Kimə nə düşüb ki, ətlə dırnağın arasına girə?.. Biz indi daha yad-yadırğa, ya bir-birimizə uzaq deyilik, bir can-ciyərik!..

– Nə qədər can-ciyər olsaq da, axı, bir cürə çıxır, – deyə Züleyxa əlavə etdi. – Lap bir cürə çıxır!

– Heç cürə çıxmaz, sədaqət haqqı, Züleyxa xanım! Mən bişirərəm, siz də baxarsınız. Görərsiniz ki, bacınız sizin üçün necə bir zəfəran-plov bişirər, nəinki ətri bu evi, lap bu şəhəri bürüsün!

– Bəlkə Yavər bişirsin, biz də bu yerin plovuna bir baxaq, hə, ana, – deyə Züleyxa işin dərininə getmədən Xatuna müraciət etdi.

– Yox, bala, belə şey bizimçün yaramaz!

– Axı bir plovla nə ola bilər ki?.. Özü də, maşallah bu boyda böyük arvad şələlənib, gəlib, bir də şələ belində geriyə qayıtsa, heç bilmirəm, axır nə cür çıxar, hə?

– Çox eyib olar, – deyə Yavər Züleyxanın belə yumşalmağı müqabilində sevinə-sevinə dilləndi, – onda bu şeyləri buraya töküb gedərəm!..

– Yox, tökmək nöş! Ancaq, ana, qoy Yavər xanım zəfəranlı plovunu bişirsin, baxım görüm mamam yaxşı bişirirdi, ya Yavər xanım, hə?

– Mənim zəfəran-plovumu bişirən hələ bu yer üzündə anasından olmayıb, – deyə Yavər kükrədi. – Heç olmaz da!.. Mən bişirərəm. Siz də yeyəndə beş barmağınızın beşini də yalayıb görərsiniz, dünyanın dadı-tamı nədir?

– Qoy bişirsin, baxaq, ana!

– Yox, qız, olmaz!.. Yaramaz!

– Bişir, bişir! – deyə Züleyxa dönüb Yavərə icazə verdi. – Vaxtaki gəlmisən, gətirmisən, bişir, baxaq sənin zəfəran-plovuna!

Bu vəziyyətdən girəvə tapan Yavər əl-qol açdı, Xatun kənar adamın yanında evin pərdəsini yırtmaq, təzə gəlin ilə ağızlaşmaq istəmədi. Qaloşlu adam da hərlənib gəldi, söhbətin üstünə çıxdı. O da Yavərə tərəfdar durub, ona kömək etdi. Yavər çox əlləşib, çox çalışdı. Tər tökə-tökə bir yekə qazan zəfəran-plov bişirdi. Sonra Murtuzun sözlərini yadına salmaq, həmin dildən yağdırıb tökmək istədi, ancaq, heç bir sözü də yadına sala bilmədi. “Əşi cəhənnəmə olsun, bir də gora!” deyə o, Xatunun tərs baxışlarına etina etmədən qab-qacağı da yuyub quruladı, süfrə üçün lazım olan nə varsa düzəltdi.

Mehman işdən çıxanda, Murtuz Murtuzov ondan qopub üzülmədi, hər ikisi birlikdə gəlib eyvana çıxdılar. Mehman otağa, Murtuzov mətbəxə girdi. O, zəfəran-plovu öz xuruş-muruşu ilə dəmdə görüb, burnunu çəkdi, arvadını ağızdolusu tərifləyib:

– Anam, bacımsan, – dedi, – vallah, Yavər!

– Ancaq sən öyrədən sözlərin hamısı yadımdan çıxdı, Murtuz!

– Əbəs yerə, çox əbəs yerə!

Yavər güldü:

– Yenə öyrədərsən, nə olar!

– Klub, klub, birbaş klub! Mən evdə xüsusi guşə aça bilmərəm! – Murtuzov çox razı bir sifətlə Yavərin yağlı kürəyinə vurdu. – Qoy bütün dünya üzündə kimin belə bir piy-palan maralı varsa, döşünə döyüb qabağa çıxsın!..

O, ev sahibi kimi əlini yudu, Züleyxa təmiz bir məhrəba gətirib ona uzatdı:

– Buyurun, Murtuz qardaş!

– Çox sağ olun, qız! – deyə Murtuz ərklə əl dəsmalını aldı, bütün barmaqlarını çəkə-çəkə möhkəmcə sildi.

– Züleyxa xanım qoymasaydı, nənə mənim bütün şələ-küləmi qoltuğuma verirdi – deyə Yavər sevinməyə başladı.

– Niyə, qız?..

– Çox acıqlı arvaddır! Ancaq Züleyxa xanımın ürəyi də mənim ürəyim təhər pilə kimi yumşaqdır!

– Sağ olsun onda Züleyxa xanım! – Murtuz əlini əlinə sürtdü. – Var olsun bizim gözəl Züleyxa xanım!

– Dedim şələli-küləli bir də geriyə aparmaq yaramaz!

Mehman arabir ağzı açılan zəfəran-plovdan şübhəyə düşüb:

– Bu nədir, ana? – deyə soruşdu. – Bu nə oyundur?

– Oğul, sənin pomoşnikingildir, – deyə Xatun cavab verdi. – Dilağıza saldılar, biz də qəriblikdə üzlərindən keçə bilmədik. – Xatun xala, Mehman görmədən, Züleyxanı süzüb ah çəkdi. – Daha keçib, adam evində qonağa qaşqabaq tökməz... Dur qabağa, de xoş gəlmisiniz!

– Ana!..

– Oğul, yaxşı!

– Ana, sən bilirsənmi nə qayırırsan?

– Ay bala...

Xatunun gözləri doldu.

– Bəs Züleyxa?!.

– Züleyxa da görünür, hələ çox körpədir!

Murtuzov üzünə salıb özünü qabağa verdi, yükünü təpəyə yığmış adam kimi arxayın-arxayın xeyli danışdı, Qaloşlu adam da ona qarışdı, evi səs-küy götürdü. Dazbaş Murtuzov sərbəst qaydada qol-qanadla eyvana çıxdı, özünü küçə ilə gəlib-keçənlərin gözünə verdi. Dolu zənbilli Məmmədxan da gəlib çıxdı.

Murtuzov o saat zənbili alıb:

– Ə, bu nəmənədir? – deyə burnunu qırışdırıb qoxuladı.

– Elə bir şey deyil, dadaş!

Murtuzov sarıqlı kağızları əlləşdirib:

– Varam bu abikövsər qanacağına! – dedi. Məmmədxan zənbili təkrar Murtuzovun əlindən alıb:

– Yavər, Yavər, – deyə mətbəxə girdi. – A qız, rumka varmı?

Qəribə, gözlənilməz, ağlagəlməz bir vəziyyətə düşən Mehman birdən-birə bilmədi nə etsin. Ancaq durub telefona getdi.

– Yoldaş Vahidovu! – deyə həyəcan içində xeyli gözlədi, cavab gəldi ki, bir az əvvəl Vahidov kəndə, yeni tikilən məktəb binasına baş çəkmək üçün gedibdir. Mehman dəstəyi asıb qayıtdı.

– Ana, sən bilirsənmi bu evin içində nə olub?!.

Mehmanın təbdən çıxdığını görən anası indi artıq ona yalvarmağa başladı:

– Oğul, evimizdə bir səs olmasın!.. Bu yad yerdə pərdə yırtılmasın!..

Mehman papağını götürüb iti addımlarla evdən çıxdı, elə bil ki, Murtuzov qarışıq bu dəstənin başına bir qaynar su töküldü...

Evindən pərt çıxan Mehman hövl etməyə, onun ürəyi çırpınmağa başladı. O, mübarizəyə girişmək istədiyi ilk addımlarından maneçiliyə, fitnəkar qurğulara rast gəlirdi. Onun atəşi hədəfə gücl ə dəyirdi. İndinin özündə belə haraya getsin, bu qəribə, ağlagəlməz işlər haqqında kimə öz ürəyini açsın, dərdini töksün?.. Axı belə də üzsüzlük, həyasızlıq olarmı?.. Sən dur sırtıqlığına sal, gəl başqasının evinin içində zəfəran-plov bişir, qonaqlıq düzəlt?! Bu harada görünmüş, hansı kitabda yazılmışdır?! Görən, eşidən adama nə deyər?.. Deməzmi bu nə oyun, nə pəstəhadır?! Mehman iztirab içində düşündü, həyəcanlanıb qıpqırmızı qızardı, burun pərələri körük kimi şişməyə başladı. O, nə etsin? Onillik məktəbdə oxuduğu günləri, burada Altayla olan ilk yoldaşlıq çağlarını xatırladı. Doğrudur, Mehman elə də Altayla dərindən dostluq etməmişdi... Çünki Mehman həmişə fikrini dərsə vermiş, "Qoy məktəbi əla qiymətlə qurtarım, qoy anama yaxşı-yaxşı kömək eləyim", – deyə kitablardan üzülməmişdi. Altay isə məktəbin ictimai işlərində qaynamaqla, həmişə qabaqda, gözdə olmuşdu. Mehman yuxarı siniflərə qalxdıqca, daha artıq kitabxanalara meyl göstərmiş, bu, ya digər qiraət salonundan çıxmamış, istirahət günlərini belə kitabxana künclərindəki lampaların işığında keçirmişdi. Ancaq bütün bu xüsusiyyətlərinə baxmayaraq, o, bir neçə yoldaşı ilə dostluq telini qırmamış, arabir Altayla Xəzər sahilinə gəzintiyə çıxmış, onda da sözü kitabdan, qədim tarixlərdən, ümdə olaraq yunan fəlsəfəsindən olmuşdu. Əgər Altay başını qaldırıb gözucu belə olsa cavan qızları süzərdisə, onda da Mehman ciddi sifət alır, sinəsini arıtlayır, öz hənirtisi ilə "eyibdir!" – deyə işarə edirdi. "Yaxşı deyil başqasına baxmaq, görən-zad olar". Altay pedaqoji institutun tarix fakültəsində təhsilinə davam etdiyi zamanlarda da onların əlaqəsi üzülməmişdi. İndi onların burada, bu ucqarda müxtəlif vəzifələrdə işləmələri

Mehmanın prokurorluqda, Altayınsa rayon komsomol komitəsinin birinci katibi vəzifəsində çalışması gözəl təsadüflərdən sayılmalı idi. Doğrudur, onlar bu rayonda da hələlik çox sadəcə olaraq üzdən əhvallaşmışdılar... Ancaq hələ ki, ağıllı-başlı vaxt-vədə tapıb bir-birilə üz-üzə söhbət edə bilməmiş, bir-birinin buradakı həyatıyla tanış ola bilməmişdilər. Nədən ki onlardan birisi rayon mərkəzində olduğu zaman o birisi kənddə olmuşdu. İndi Mehman hirsli, hikkəli də olsa Altayı anır, düşünə-düşünə addımlayırdı... Bir qədər sonra o, ötüb keçən adamdan xəbər aldı. Altayın işdən döndüyünü, öz mənzilində olduğunu müəyyən etdi. O, ikinci döngəni də dönüb taxta məhəccərin əhatəsinə alınan həyətə girdi, bir-birinə qarışıb oynaşan uşaqlara üz tutub Altayı soruşunca:

– Raykom komsomolunu buyurursunuz? – deyə torpaq şöbə müdiri Cabbarzadənin beşinci sinifdə oxuyan pioner oğlu sinəsini qabağa verdi:

– Bəli, Altayı, komsomolun birinci katibini, – deyə Mehman təkrar etdi – onu görmək istəyirəm!

– Gərək ki, öz mənzilində olsun! – deyə həmin uşaq qalstukunu tumarlayıb çevikliklə ağac pilləkəni üzüyuxarı qalxıb eyvana çıxdı, açıq qapının yanovundan başını içəriyə salıb özünə isti xörək hazırlamaq üçün maşınka ilə əlləşən komsomol katibinə salam verdi, yenə də qırmızı qalstukunu düzəldib əmrə müntəzir dayandı. Altay üz-gözünü qaralamışdı. O, əlindəki kibrit qutusunu qoymaq üçün dövrə vurmaqla məktəbli pioneri başdan-ayağa süzüb: – hmm... Əleykəssalam, – deyə səsini qaldırdı – Aza-dd!

– Sizi xəbər alan vardır, yoldaş rəhbər!

– Kimdir bizi xəbər alan, yoldaş pioner?

– Ucaboylu, hündür əmi!

Altay pəncərəyə atılan stəkan-nəlbəki dəsmalı ilə əlini sildi, pioner barmağını burnuna gətirib rəhbərinə işarə etdi. Altay pəncərədəki xırda güzgünü götürüb sifətinə baxdı, nə qədər çalışdısa, təmizləməkdən artıq burnunu qaraladı. O, üz-gözünü təmizləmək üçün əlüzyuyana yaxınlaşdı, ağ dəmir əlüzyuyanda bir qətrə də su olmadığını görüncə başını buladı. Qalstukunu tumarlamağı unutmayan pioner çevikliklə vedrəni qapıb taraq-turuqla ağac pilləkəni endi, o, yan küçədəki şirrandan su gətirmək üçün qoparaqlandı. Altay eyvana çıxdı, öz sabiq məktəb yoldaşı Mehmanı görüncə üz-gözünün qaralanmağını unudub:

– Nə əcəb?.. Xoş gəlmişsiniz, bizə, yoldaş prokuror, – deyə həyətə endi. Altay qaralanan əlini Mehmana uzadınca gülümsünüb:

– Subaylıq sultanlıqdır, – dedi. – Səni bizim yeni həyatda, evimizin qənşərində xoş gördük, əlaçı yoldaş! Bayaqdan bəri bir maşınkanı da alışdıra bilmədim!.. Barı qayğanaq da olsa bişirim, kəndə yollanım... Axı bu axşam saat səkkiz üçün komsomol özəklərinin kolxozarası müşavirəsini keçirməliyik!

İlk görüşdən, ağına-bozuna baxmadan şuxluq edən Altay, dostu Mehmanın pörtüb tutulduğunu görüb:

– Bəlkə ikimiz köməkləşib bir maşınkanı yandıra bildik? – deyə hisə bulanmış əllərini göstərdi. – Barı bir yerdə, bir tikə də olsa çörək kəsəydik?.. Bir qədəh də olsa sizin sağlığınıza badə qaldıraydıq?..

– Belə isə bəs siz niyə bizə gəlmirsiniz, – deyə Mehman Altayı süzüb, istehzanı andıran bir əda ilə dodaqaltı gülümsündü. – Biz ki burada evli-eşikliyik?!

– Çağırılan yerə gedərlər. – Altay deyintili Mehmanı gözdən keçirdi. – Siz ki, gərək biləsiniz: "Çağırılmayan qonaq tatardan da pisdir".

– Bu köhnə məsəldir!

– Həm köhnə, həm də mürtəce məsəldir!.. Prokurorun məntiqi daha tutarlı olmalıdır, – deyə Altay dirsəyilə Mehmanı dümsüklədi. – O gün küçədən keçəndə Xatun nənəyə təzim edib salam yetirmişəm!

– Bəs Xatun nənə necə?

– O məni evinə dəvət etdi!

– Bəs siz nə üçün buyurmaq istəmədiniz?

– Bu məsul tapşırıqlardan göz açanda, yoldaş Mehmanın özünün evdə olacağı bir zamanda gələcəyimi bildirib nənəyə təşəkkür etdim. – Altay gülümsünə-gülümsünə danışır, Mehmanın gəlişilə doğan sevincini gizləmirdi. – Ancaq Züleyxanı görüb təbrik edə bilməmişəm.

– Nə üçün?

– Çünki siz bizi öz toyunuza dəvət etmədiyinizdən, quru, tələsik toy etdiyinizdən, bizləri unutduğunuzdan Züleyxa xanımı təbrik etmək üçün istər-istəməz borclu qalmışıq!

– Siz onda Bakıda deyildiniz!

– Bəs onda biz harada olmuşuq?

– Görünür burada vəzifə başında!

– Bəli, institutda komsomol katibi işləməyim məni aktivlər siyahısına saldı, nəhayət, pedaqoji müəssisədə qoparıb ucqarlara atdı. – Altay nəfəsini dərdi, sonra da sağ əlini başıqarlı dağlara doğru uzatdı. – Bax oralara qədər bizi tulladı!..

– Mən bilirəm su balığın, komsomol da sizin canınızdır! – deyə Mehman evindəki Murtuz həngaməsini unuda bilmədən başıqarlı dağlar səmtinə göz gəzdirdi. – Lap onillikdə neçə il bizə rəhbər oldunuz?

– Düz üç il o qaynar məktəbdə komsomol katibi işlədim, – deyə Altayın sinəsi qabardı, – səni isə divar qəzetinin redkollegiya üzvlüyündən yuxarı darta bilmədik!

– Bəlkə dartıb qaldırmaq istəmədiniz?

Mehmanın gözləri dolanır, özlüyündə götür-qoy edir, evdə baş verən hadisəni açıb-ağardımmı, deyə daxilində çırpınır, söhbəti kənar-kəsmə aparır, necə deyər, işi özlüyündə bilmək istəyirdi. Altay isə Mehmanı süzür, səyli rəsmi şagirdi göz qabağına gətirirdi.

– Bəli, siz “5” i hər şeydən üstün tutur, qızların müqabilində saman altından su yeridib Züleyxanı Leyliyə çevirirdiniz, daha bizim günümüzə düşüb “3”lə iməkləmirdiniz?!

– Komsomolun gücü ilə siz də heç onilliyi pis qurtarmadınız, – deyə nə qədər öz daxili aləmi ilə məşğul olsa belə, Mehman da Altaya atmaca atır, üzüntülü fikirlərindən qopub azca da olsun zarafata keçmək istəyirdi. Altay isə indiyə qədər danışdığı ictimai işlərin ağırlığından şikayətlənir:

– Ali məktəbdə, pedaqoji fakültəsində, tarix-ictimaiyyət şöbəsində xeyli çalışmalı oldum, – deyə dərindən nəfəsini dərirdi. – Xeyli kitab vərəqlədim, mən də uzun dilim konspektlər çıxartdım.

– Nə əcəb bəs orada tezcənə rəhbər olmadınız? – deyə Mehman gülümsəyib daxili çırpıntılarını gizlədir, necə, nə təhər olsun, – deyə Murtuzun hərəkətlərinin müqabilində, kənarda yox, özündə qüvvət-cəsarət aramaq istəyir, xudpəsəndlik duyğularından yaxa qurtara bilmirdi. “Öz müavinindən şikayətlənmək acizlik əlaməti olmazmı?..”

Bu arada nazik sısqa şirrandan vedrəni dolduran qulluqbaz oğlan böyürdən ötüb, boyun damarları qızara-qızara pilləkən yuxarı dartındı, onlar da danışa-danışa eyvana qalxdılar. Onlar nə qədər söhbət etsələr, Mehman nə qədər özündə daxili cəsarət arayıb, evdə əmələ gələn vəziyyətin həllini başqa vaxta qoymaq istəsə də, yenə də Murtuz Murtuzovun qurğusu nəticəsində əmələ gələn ağrı-acını unuda bilmir, deyinti, göynərti, gizilti Mehmanın ürəyindən çıxmırdı. Bəlkə o, Altaya bir söz desin, düyünü açsın?.. Özünəməxsus yolla dərindən-dərinə düşünmək istəyən Mehman əllərini belində birləşdirib eyvan boyu asta-asta gəzindi.

Altay pionerdən vedrəni alıb dəmir əlüzyuyanı siləbəsilə doldurdu. Sonra suyun üstünə çilənə biləcəyini görüb əlüzyuyanın altındakı ləyəndən yapışdı, pilləkəni enib, bir kənara boşaldıb qayıtdı. O, gəzinən Mehmana mane olmadan əl-üzünü sabunlayıb möhkəm-möhkəm yuyundu, qurunub təmizləndi, Mehmanın saçlarına bənzəyən sıx qara saçlarını üzüyuxarı daradı, dəmir çarpayısının üstünə sərilən yorğan-döşəyini sahmana salmadan, boz nazik adyalla örtdü.

– Buyurun, deyə Altay dolaşıq addımlarla eyvanda gəzinən Mehmanı içəriyə səslədi. – Buyurun, mənim gün-güzəranımı qanuna müvafiq bir nəzərlə gözdən keçirin!..

Mehman var-gəldən qayıdıb içəriyə girdi. Otaqçaya göz gəzdirdi. Burada olan heç bir şey öz yerində deyildi. Duzqabı mürəkkəbə bulaşmış, qarğı mərtəbəcikdəki kitablar baş-ayaq halda bir-birinə qarışmışdı. Divara vurulan mismarlardan yana bir çox yer dəlik-deşik olmuşdu. Mehmanın evə göz gəzdirdiyini görən Altay bir daha dostunu tərpətmək üçün:

– Subaylıq sultanlıq deyilmi? – deyə eyni misalı çəkdi. – Bax belə, mənim kimi!

Mehman dinib cavab vermədi. O, subaylığınmı, ya özü kimi evli olmağınmı gərəkli olduğunu müəyyən etmək istəyirdi. Ancaq nə isə Mehmanın nəfəsi daraldı, bir kitab götürüb vərəqlədi. Hər halda bütün çətinliklərinə baxmayaraq cavan adam üçün subaylığın çətin keçdiyini kəsdirib: “Subaylıq çətin, evlilik də çətindir! – deyə söyləndi: – Ancaq elə bir ailə həyatı olsun ki, müqabil tərəflər bir-birini anlasın, həqiqi əməkdaşlıq, həqiqi yoldaşlıq olsun”, – kitabın vərəqləri arasında Mehmanın gözlərinə gülümsəyən Züleyxa, onun yanında qabarıq yalmanlı Şəhla xanım göründü. Mehman götürdüyü kitabı cəld qapayıb yerinə qoydu. Altayı maşınka ilə əlləşən, onu yandıra bilməyən, yenə də üz-gözünü hisə-pasa bulayıb, qaralayan gördü.

– Yenə də həmin-həmin! – deyə Mehman mürəkkəb vəziyyətlə çırpışsa belə, Altaya söz atdı, – əbəs yerə siz rəhbər, o pionerə zəhmət verdiniz.

– Sən mənim canımmı? – deyə Altay balaca aynanı götürdü, bu dəfə üz-gözünün daha artıq qaralandığını gördü, təkrar əlüzyuyana yaxınlaşdı, bir daha yuyunub darandı, Mehmanın qolundan tutub:

– Gedək! – dedi. – Sən mənim canım gedək!

– Evdən haraya?

– Yeməkxanaya, – deyə Altay qol saatına baxdı. – İndi pitinin dəm vaxtıdır!..

– Yoxsa evinə gələn qonağını başından eləyirsən? – deyə dalğalarda döyüşən Mehman qolunu çəkdi.

– Mən, qonağımıza hörmət etmək istəyirəm! – Altay qonağının qolundan yapışıb dartdı. – Mütləq sizi pitiyə qonaq edəcəyəm!

– Belə harada, hansı bir yerdə?

– İctimai yeməkxanada!

– İctimai yeməkxana subaylar üçündür!

– Mən ki evli deyiləm, – deyə Bakıda eşq sevdasıyla bağlandığı qızı yadına salan Altay istər-istəməz ah çəkdi. – Bir də əgər... indi... bu an... evli öz evinə subayı dəvət etmirsə? Onda əlac ictimai yeməkxana deyildisə, bəs nədədir?

– Sonra, sonra! – deyə Mehmanın qara qaşları düyünləndi, sifəti dəyişib turşudu. – Sonra, münasib bir vaxtda! – Mehman əlini yellətdi, sanki Murtuzovu, Məmmədxanı zəfəran-plov bişirən Yavəri bir-birinə qarışdırıb nifrətlə rədd etdi. – Ayrı bir zamanda!

– Münasib bir maddəyə salandan sonramı? – deyə Altay pərt olmağa başlayan Mehmanın daxili dərdini bilmədən ücəşdi. – Biz Xatun nənənin əlindən pendir-əppəyi də ləzzətlə alıb yeyə bilərik!

– Mən elə-belə səninlə bir görüşməyə, bir gəzib dolanmağa gəlmişdim!

– Yəqin ki, böyük müsahib Vahidov burada yoxdur, ona görə də kiçik müsahib axtarmaq istəmişsiniz, – deyə Altay başını qaldırdı. – Yoxsa ayrı cürə siz böyük mənsəb sahibi biz komsomolu çətin arardınız?!.

– Heyif ki, indi bu gün Vahidov burada yoxdur, – deyə ürək sirrini açmaq istəməyən Mehman udqunub dərindən nəfəsini dərdi, – çox heyf!

– Komsomol partiyanın sadiq köməkçisidir, – deyə Altay döşünə döydü. – Lap biriminci müavini, sözündə-ilqarında möhkəm dayanan müavini!

– Elə mən də partiyanın müavini, namizədiyəm!

– Deməк hələ partiya üzvlüyünə burada, bizim büroda keçəcəksiniz?

– Əgər özümü doğrulda bilsəm? – Mehmanın qara qaşları mənalı və əsrarlı açıldı və düyümləndi. – Əgər bu yüksək ada layiq ola bilsəm?!.

– Bizim komsomol bürosu əlaçı Atamoğlanova zəmanət verə bilər!

– Gənclər təşkilatı hələ yuxarıda Atamoğlanova namizədlik zəmanəti vermişdir!..

– Komsomol indi də öz zamınkarlığını təntənəli surətdə elan edər, – deyə Altay əlini sinəsinə gətirib cibindəki kitabçanı çıxartdı. – Düz üç ildir ki, Altay Əhmədov kommunist partiyasının şərəfli vəsiqəsini ürəyinin başında daşıyır!..

– Ona görə də siz büro üzvüsünüz!
– Bəli, mən rayon komitəsinin büro üzvü, yeddi nəfərin birisiyəm!
– Bəs Kamilov necə?
– Təəssüf ki, o əyan da bizim rayon partiya komitəsinin büro üzvüdür!..
– Niyə bəs bu qədər də təəssüflə?!
– Çünki o qoca palıd içəridən çürükləmişdir, – deyə Altay hiddətləndi, çünki Kamilov ürəkdən zədələnmişdir. Onun ürəyi əyilmişdir. Bir də ürəyi əyri olanın işi, hərəkəti düz ola bilməz!
– Siz də çürüyü, zədəni, əyrini kəsin, safı, düzü saxlayın!
– Kamilovun məni görməyə gözü yoxdur!
– Niyə bəs səni?
– Çünki o bizim odlu komsomol tənqidini görəndə elə bil qutuda şahmar görür!..
– Demək Kamilov komsomolun tənqidində dəvə nalbənddən ürkən kimi ürkür?
– Dəvədən də artıq, cin dəmirdən ürkən kimi!
– Axır Kamilov niyə tənqiddən bu qədər hərasan olsun? – deyə Mehman başını döşünə salladı, – nə üçün, bu qədər də komsomoldan qorxub çəkinsin?!.
– Çünki Kamilovu üfürüb dağa döndərən yalnız və yalnız, ardı-arası kəsilməyən mədhlər, quru, boş təriflər olubdur!
– Bəlkə köhnələn Kamilovun bütün təzəliyi görməyə gözü yoxdur?
– Kamilov komsomola ağzı süd qoxusu verən çağalar kimi baxır, – deyə Altay əlini yumruqladı. – Elə ki onun şöbə müdirlərinin birisinin adını-familini tutub, tək bircə kəlmə nöqsanını deyirsən, kişinin tüstüsü ərşə dirənir. Elə bil ki, bəs bizim bayaqkı pionerin böyük bir tonqalını çatmısan, alovu, aləmə yayılır... Hey fısıldayır, hey deyinir Kamilov! “Biz balam, bu boyda kişi balaca komsomolun işinə qarışmırıq, demirik, siz balacalar, neçə saat, neçə dəqiqə iclas eləyin, demirik, nə boyda, nə uzunluqda, nə endə divar qəzetini çıxarın, ya siyasi meşqin məramnaməsini hər dəfə bizə göstərin! Bəs necə olur ki, bu dağ boyda mən, işimin öhdəsindən gələ bilmirəm, siz, yumurtadan yeni çıxanlar mənə Karl Marksdan dərs deməyə başlayırsınız?.. Hər bir halda ki, mən özüm Karl Marksın “Kapital”ını neçə kərə o üz-bu üzünə vərəqləmişəm, özünü də inqilabi fırtınalarda bayraq kimi başımın üstə qaldırmışam, polisdən-milisdən qorxub bir ləhzə aşağı endirməmişəm?..”

– Kamilov mənimlə də çox yamanca toqquşmağa başlayıbdır, – deyə Murtuzovun əsl istinadgahını görən Mehman da Altay kimi əsəbiləşdi, özü bilmədən o da əlini yumruqladı. – Qılıncı əlinə götürüb çarpışmağa girişibdir!

– Yəqin ki lap gələn gündən? – Altay komsomolçuluğa xas ciddi sifət aldı. Sənin gözünün odunu almaq istəmişdir... Yəqin Kamilov sənə öz əlinin suyunu göstərmək istəmişdir!

– Bəli, Kamilov gözümün odunu almaq istəyir!

– Demək sənə dəmirdən də artıq polad nizam-intizamı göstərib təlim verib, "cavanları tərbiyə etmək, onlara öz inqilabi təcrübəmdən də dərs demək, mənim müqəddəs borcumdur!" – deyir, yəqin ki, döşünə döyür ki, burada nə prokuror, nə qanun?.. Qanun mənəm! Qanunu mən yaratmışam, komsomol proqramını mən təsdiq etmişəm, nizamnaməsini də mən düzəltmişəm, pionerə qədər nə iş-güc varsa, hamısını öz əlimlə özüm etmişəm!

– Bəli, təəssüf ki, Kamilovun başı belə-belə sözlərlə dolubdur, – Mehman komsomol katibinin də belə bir əqidədə olduğunu görüb sevindi, Altay əlavə etdi:

– Bəs prokurorun bütün bu işlərə apaydın münasibəti necədir?

– Prokuror sovet dövlətinin qanunu ilə düz-düzünə hərəkət edəcəkdir! – deyə Mehman qətiyyətini bildirdi. – Bir tük qədər əyilməyəcək, qanun deyəndən sarpmayacaqdır!

– Bəli, Kamilov da iri-iri daşlardan, qayalardan Murtuz kimisinin əlilə səni qanun təkərinin altına yumalayacaq, sənin qanun qatarını Murtuz kimisinin qurğusuyla öz yolundan çıxarmağa, istədiyi yola salmağa cəhd edəcəkdir!

– Mən güman edirəm ki, Kamilov öz yoğun boynunu tezmi-gecmi bizim sovet qanunu qabağında sındıracaqdır!

– Bəli, o "mənim oğlum yerində", "mənim qızım yerində", "mənim balam, körpəm, nəvəm yerində" – deyə aradabir "siyasət" də işlədəcəkdir, – Altay yana-yana söyləndi. – Bu zorbalıqda adamı tutmaq çətin olacaqdır! Haqqa cavanları bir-bir udacaq, özü də heç bir tora düşməyəcəkdir! – Altay bir an dayanıb əlavə etdi: – Mənim işim bir kənardadır. – Səni dirigözlü udmağa çalışacaqdır! Murtuz kimi bir dazbaşı, hıqqana-hıqqana sənin yerinə itələyəcəkdir, gül kimi Murtuzdan dastan açacaq, vicdana, məsləkinə and içib, ağzı köpüklənə-köpüklənə boğaz gücünə bütün hərəkətlərini doğruldacaqdır!

– Bəs Vahidov?.. Bəs yoldaş katib? – deyə vücudu qızışan Mehman mərtəbəcikdən başqa bir kitab da çəkdi. – Bəs Vahidov yoldaş həlledici ayaqda bu döyüşlərə necə yanaşacaqdır?

– Vahidov düz-düzünə yanaşacaqdır, – deyə Altay tərəddüdsüz cavab verdi.

– Onda məsələlər tam qanunla, tam düzlüklə, tam ədalətlə həll olunacaqdır!

– Ancaq Kamilovun nüfuzu, onun məddahları da heç az deyildir! – Altay cavan prokuroru bütün ciddiyyətlə xəbərdar etmək istəyirdi. – Belə ki, özünü "mən firqəsinin köhnə soldatıyam", – deyə hər yerdə qələmə verməklə Kamilov özünə xeyli məddah toplamışdır!

– Bəli! – deyə Mehman birdən istədi ki, bu gün onların evində baş verən hadisəni və bunun kökünü açıb Altaya nağıl etsin, ancaq yenə də dayanıb çəkindi, qorxdu ki, Altay, "Gördün yemək, daha nə demək?" – söyləyib Mehmanı yaxalayıb zəfəran-plova çəksin, "həm plovunu yeyərik, həm də Murtuz Murtuzovun atasını bizim klubda beş yüz komsomolun gücüylə dalına şələlərik", – desin?!

Mehman əsəbiləşən barmaqlarıyla Altayın mərtəbəciyindəki kitabları düzəldə-düzəldə bu işlərin dərinini dərk edib düşünməyə, hər bir cəhəti aydın nəticə çıxarıncaya qədər öz ürəyində saxlamağı kəsdirdi. Altay isə adəti üzrə Mehmanın kitablara uğraşdığını görüb özünü tərsliyə qoyan maşınkanı yandırmaq istədi, ancaq his basmış piltələr kiçik alovu udub, Altayın qanını qaraltdı...

Uca dağların ətəyində salınan yeni şəhərin özünəməxsus klubu var idi. Bu klub şəhərin ayaq tərəfində sal-sıldırım qayaların üstündə dayanmaqla qanadlarını yanlara gərmişdi. Klubun bir neçə otağı, klub müdiri və kütləvi işçinin şəxsi mənzillərinə çevrilsə belə, yenə də klub çox da böyük olmayan yeni şəhərin əhalisinə özünəməxsus yolla mədəni xidmət göstərirdi. Burada yerləşən kitabxana və qiraət salonu balaca şəhərin bir dəstə oxucusuna xidmət edir, səhnə tərəfdə olan bir neçə xırda otaqcıqda şəxsi fəaliyyət dərnəyinin məşğələləri aparılırdı. Klub müdiri ortaboylu, nisbətən doluvücudlu Əbdülsalam burada cərəyan edən yaradıcılıq işinin mərkəzində dayanırdı. Əbdülsalam rahatlıq bilmir, hey əlləşib vuruşur, ad-san çıxarmaq istəyirdi... O, burada həm müdirlik, həm rejissorluq, həm aktyorluq edirdi. O, səhnədə mövqeyi-tamaşaya qoyulan bu və digər əsərdən asılı olaraq, gah baş rolda, gah orta, gah da kiçik rolda çıxış edir, öz işi, amalı uğrunda özünü oda, közə atır, sivrilib dərisindən çıxırdı. Əgər birdən burada göstəriləcək bir pyesdə bir neçə qadın

rolu olurdusa, onda da biçarə Əbdülsalam yetim quzu kimi boynunu burur, əl-ayağını döşünə yığırdı. Bu halda şəhadət barmağını gicgahına dayayan rejissor bir azdan gülümsəyir, məsələni həll edirdi... O, cavan, kök oğlanlardan, bəzən də lap cod qar saqqalı qaşına-qaşına qırxılanlardan belə arvad yaylığında, kofta-tumanında səhnəyə çıxarır, rəqs zamanı yellənən tumanının altından çıxan ala-bəzək şalvarlar hər şeydən də artıq tamaşaçıların hırıltısına səbəb olurdu... Belə müsamirə zamanı əgər qadın rolunda çıxış edib rəqs edəni bir dəfə səhnəyə çağırırdılarsa, "şalvarlı gözəlləri" bis-bislə bir neçə kərə səhnəyə çağırır, salonu hırıltı doldurur, hay-küy klub pəncərələrindən çıxıb, ətrafın daş qayasında əks-səda verir, qanadlanan Əbdülsalam az qala klub tavanını yarıb ərşə qalxırdı. Rayonun görkəmli məsul işçiləri qabaq cərgələrdə oturduqları zaman, yaxud Mərdan Vahidov burada əyləşdiyi vaxtda salonda intizam yaranır, böyük-kiçik sayılır, haqq-hesab alınırdı. Əgər qabaq cərgələrdə rayon idarələrinin adi məmurları, süpürgəçi və kuryerləri yer tuturdusa, onda bu salonda bir vur-çatlasın qopurdu ki, daha "şalvarlı gözəllərin" parlaq nailiyyətləri göz qamaşdırırdı.

Demək olardı, əgər kişi rolları əsasən Əbdülsalamın üstündə dayanırdısa, bir qayda olaraq mühüm qadın rolları da Məmmədxan arvadı Balışın üstündə dayanırdı. Gözəl, göyçək, qaraqaşlı, qaragözlü, ətli-əndamlı Balış səhnə libasında daha qəşəng, daha yaraşıqlı görünürdü. Gecə kurslarında savadlanan, komsomolda fəallaşan Balış yeri düşəndə öz əri Məmmədxanla səhnəyə çıxmaq barəsində xoruz kimi döyüşür, sevdiyi klub səhnəsindən əl çəkmək istəmir, baş rollarda çıxmaqdan hədsiz zövq alır, xüsusən səhnədə qadın rollarını ifa edənlər olmadığından özünü klub səhnəsinin misilsiz kraliçası sayırdı. Baxanda Balış səhnədə nazlanır, o, mahir bir nəğməkar kimi canlara yayılan xoş səslə oxuyur, tovuz kimi sallana-sallana süzür, salonda əyləşən kişilərin ağızlarının suyunu axıdır, qadınlarda qısqanclıq doğurur, tamaşaya gəlib lap geri cərgələrdə oturan, qaranlıqda qısılan Məmmədxanın dişi bağırsağını kəsir, Balış alqışlandığı zaman əgər bir kəs dönüb anbardara baxırdısa, o, kömür kimi qaralır, başını gizlətməyə yer tapmırdı. Əlbəttə, Məmmədxan əliisti adamdır, o Balışın öhdəsindən gələ bilərdi... Ancaq indiki, kəskin sinfi mübarizə zamanı Balışın qarşısına çıxmaq, komsomolun dil-dişinə düşmək, komsomol katibi Altayın siyahısında "yaramaz ünsür" olmaq, hələlik onu dayanıb susmağa, hesabı içəriyə verməyə məcbur edirdi. Bir də kənar bir guşəni, isti, yağlı yeri itirmək, üçillik savada malik olan, indi süd gölü içində üzən Məmmədxanı öz ürəyini yeməyə

məcbur edirdi. Məmmədxan bomboz bozarıb arvadına bir söz deyəndə, Balış çımxırıb ikisini deyir, barmağını silkələyib ərinin anbarda törətdiklərini yerbəyer sadalayırdı. Əliəyri Məmmədxan bu zaman qeyzini udub dil-dodağını gəmirir, onun gözləri dəhşətli surətdə qızarır, sanki qanlı bir pərdə onun gözlərini tuturdu. "İndi neyləyəsən bu sırtılan həyasızla, necə çalıb-çağırasan?" – deyə Məmmədxan birdən də qeyrətə dolur, gecə-gündüzlü vurnuxur, çalmağa hazırlaşan aran yerin ilanı kimi başını dikcə tuturdu. "Lənət sənə kor şeytan ha!" – deyə bəzən də o, bütün anbardan, misilsiz gəlirdən keçir. Balış səhnədə süzən zaman salondan səhnəyə atılan "oxqay"lar Məmmədxanın ürəyinə ox kimi saplanırdı, O, neçə kərə Əbdülsalama yaxınlaşıb:

– Ədə, bu qədər üzünə ənlik-kirşan çəkdin bəs deyil, heç yorulmadın? – deyə ona söz atmış, şəxsi fəaliyyət dərnəyinin işinə pərşaxlıq satmağa çalışmışdı... Ancaq klub həvəskarlarının öz işlərindən möhkəm yapışmaqları, Əbdülsalamın ölçü-biçiyə gəlməz fədakarlığı Məmmədxan əlinin buraya girməsinə imkan verməmişdi... Xüsusən rayon komsomol komitəsi katibi Altayın şəxsi fəaliyyət dərnəyinin işinə verdiyi qiymət, ayda bir dəfə klubun kütləvi işlərini komsomol komitəsinin bürosunda müzakirə etmək, Məmmədxanın əlini sanki biləyindən kəsir, "şəhər teatrosunu" dağıtmağa imkan vermir. "Biz gərək bu klubda elə sənətkarlar yetişdirək ki, bir zaman bizim şəxsi fəaliyyət dərnəyi rayonumuzun dövlət dram teatrına çevrilsin", – deyə Altay əllərini qalifesinin ciblərində yerləşdirib kürsüsündən qalxıb büroda gəzinincə Əbdülsalama ruh, həm də zövq verirdi. "A başına dönüm, komsomol, ha!" – deyə Əbdülsalam ürəyində sevinir, top-yumru vücudu ilə şişib qürrələnir, sonra məqamı çatınca şəhərin gözəl qız, gəlinlərindən səhnəyə cəlb etmək üçün öz təklifini də irəli sürürdü. "Olmaz ki, yoldaş Altay, bizim komsomolun bugünkü bürosu qərar çıxarıb, komsomolçu qız və gəlinlərdən səfərbərliyə alıb bizim səhnənin ixtiyarına verə?" – deyə israr edincə, Altay çevrilib "komsomol belə bir inzibatçılığa qurşana bilməz, – deyə klub müdirinin sözünü qaytarırdı. – Yox, heç zaman könüllü işi məcburiyyətə döndərmək olmaz!" Son zamanlar Əbdülsalamın diqqətini təzə prokurorun boylu-buxunlu, gözəl-göyçək xanımı cəlb edirdi. Ancaq nə edəsən ki, Əbdülsalam öz arzusunu açıb-ağarda bilmir, "girməli kol deyil!" – deyib dodaqlarını mumlayırdı... Xüsusən Mehmanın qaradinməzliyi və sərt baxışları Əbdülsalamın sözünü boğazında boğur, az qala fikirləşəndə belə xatalı bir iş gördüyünü güman edib özözünü danlayırdı. Ancaq Züleyxa kimi şəhərli qızının səhnəyə çıxmağı

səhnəni dirildər, Əbdülsalamın fəaliyyətini daha artıq gözə yetirib, onu uca-uca dağların başına qaldırar, klubun işləri əcəbcə yaxşılaşırdı. Bir dəfə o, yan-yörəsinə baxandan sonra asta addımla Balaşa yanaşıb:

– Qız, bir prokurorun xanımıyla bacılıq olsana! – deyə canını dişinə tutmuşdu. – Bir o gəlinə tərəf yol açsana!

– Nə barədə Əbdülsalam? – deyə mətləbi tez alan Balış pörtə-qızara çımxırmışdı. – Xeyirdimi, barı?!

– Lənət şərə, qız!

– Yenə də olsun, möhtərəm rejissor?

– Deyirəm, bəlkə, qız, bu ala-bula "şalvarlı gözəllərin" sayını səhnədə azaldaq, buraya cavanəzən qız-gəlin gətirək!..

– Yəni çox lazımmış? – Balış qalın, qırmızı dodaqlarını büzüncə, Əbdülsalam gülümsəyərək demişdi: – Bir güllə yaz olmaz, Balışcan!

– Yəni sən güman eləyirsən ki, prokuror xanımı sənin klubuna gəlsə, səhnən gülüstana çevrilər?

– Əlbəttə, gözəl-göyçək qızların, gəlinlərin, bir sözlə qadın həvəskarlarının sayı nə qədər burada artsa, o qədər də bizim səhnəmiz tamaşaçılarımızın nəzərində yüksələr!

– Prokuror xanımına ancaq Zərrintac xanım vasitəsilə əl uzatmaq olar, Əbdülsalam, – deyə Balış iri, qara gözlərini oynatmışdı! – Yoxsa heç kəs o tilsim xanıma yaxın düşə bilməz!

– Yox, yox, Zərrintac Kamilovun məxsus aşnası olduğundan əlçatmaz ulduzdur! – deyə Əbdülsalam cavab vermişdi. – Yox, əsla o ulduza əl uzada bilmərik.

– Onda ki, elənçik xanımlar ulduzdur, sən də gəl yer üzünün tək çiçəyinin qədrini bil, əzizimiz Əbdülsalam!

Bu söz-söhbət son günlərdə nə qədər klub müdiri ilə rollarda çıxış edən Balışın arasında getsə də, yenə də iş həmin-həminliyində qalır, Əbdülsalam yenə də köhnə vəziyyətdə, həmin heyətdə çıxış etməli olurdu...

Bu gün axşamüstü yenə də qayalar üstündə klubda məşq gedirdi. Gah rejissorluq, gah aktyorluq edən Əbdülsalamın bağırtısı klubu götürürdü. Əbdülsalam məşhur bəstəkar Üzeyir bəyin "O olmasın bu olsun" musiqili komediyasının quruluşunu verirdi. O, burada rejissorluqdan savayı Məşədi İbad rolunda məharət göstərirdi. Altayın evində dayanmayıb gəzintiyə çıxan Mehman öz sabiq məktəb yoldaşı ilə dolanır, öz mürəkkəb vəziyyəti barəsində düşünürdü. Altay isə qəsdən Mehmanı kluba tərəf çəkir, "O olmasın bu olsun" musiqili komediyasının məşqlərinə nəzər yetirmək, komsomolun yardım əlini uzatmaq istəyirdi.

– Görək bizim şəhər teatrının işləri necədir?! – deyə Altay, Mehmanın qolundan yapışıb klubun qapısına tərəf çəkdi. Mehman qulaq verincə tar-kaman səsini eşitdi, tutulub kədərləndi. Altay tutqunlaşan Mehmanı kluba çəkməklə ürəyini açmaq, sonra da çox uzaqda olmayan komsomol mü-şavirəsinə yollanmaq istəyirdi. Nəhayət, Altay Mehmanı klubun qapısına yaxınlaşdırdı, əlini dəstəyə atıb açdı, Mehmanı içəriyə saldı. Məşq edən Əbdülsalam əlini qaldırıb məşqini davam etdirməyi bildirdi: Məşq davam edir, Balışın nəğməsi ucalırdı. Mehman diqqətlə baxırdı. Əgər Züleyxa şəhər gözəli idisə Balış da kənd, bir sözlə dağ gözəli idi...

– Necədir teatrımız, yoldaş prokuror?

– Yaxşıdır, dama-dama göl olar!

– Onda siz də kömək edin, yoldaş Atamoğlanov!

– Yəni deyirsən hamılıqla səhnəyə çıxaq?

Altay Əbdülsalamın ürəyindən keçəni duymuş kimi:

– Qızların, qadınların və... gəlinlərin cəlbində siz bizə kömək edin – deyə gülümsədi. Mehman işarəni alınca sifətini turşudub:

– Səhnə həm məharət, həm də könüllü olmağı sevir, – deyə cavab verdi, – yoxsa sənətlə oyun oynamaq yaramaz!

– Ümumən düzdür, mən özüm də bu fikirdə və mülahizədəyəm. An-caq biz səhnəni qadın rolunda, çıxış edən bığlı kişilərdən xilas etməliyik!

– Elədir, inqilaba qədər qadın rollarında kişilərin çıxış etməyi bizim opera teatrının özündə az olmamışdır.

– İnqilabdan əvvəl, eləmi?

– Bəli, inqilabdan əvvəl!

– İndi isə Azərbaycanda inqilabdan on-on iki ildir ki, keçir!

– Onda subay-sultan oğlan bir aktrisa xanımla evlənib öz fəaliyyəti ilə səhnəni zənginləşdirsin, – deyə Mehman birdən-birə sərt cavab qaytardı. Mehmanın bu söhbətdən alındığını görən Altay daha ona bir söz demədi.

Mehmangildə düzəltdikləri zəfəran-plov qonaqlığının baş tutma-dığından sonra Məmmədxan geriyə dönüb Balışı evində görməyincə cini kəlləsinə çıxmış, necə deyər, kəfəni boynuna dolayıb mır-mır mı-rıldanmış, quduz it kimi yan-yörəsini tutmağa başlamışdı.

– Bu kafər qızı Balış bir səhnədən yığışsaydı, bunun uzun dili bir də gödəlsəydi? – deyə Məmmədxan qıvrılıb açılmış, sonra bugünkü baş tutmayan işləri barədə yanıxmış, ipə-sapa yatmayan cavan prokuror ba-rəsində deyinmişdi. – Bircə allahsız oğluna yol tapsaydıq, bircə bunu, körpə quzunu duza öyrədən kimi rüşvətə öyrədə bilsəydik... Yoxsa indi o, xam dayça kimi atılıb-düşür, kəməndə gəlmir, fınxırır. Əgərləri bir yol

tapıb bu zalım balasının dilinə bir qıfıl keçirsəydik, onda qiyamət qoparar, bu lotuxanada qol götürüb qaş-göz süzdürən Balışın əl-ayağını bu evə yığar, alt-üst basanda bu Balışın özünü qara tuluğa döndərib yorğan-döşəyə salardım! Belə ki, bu avara qızı, Əbdülsalam itoğlunun lotuxanasından, hər axşam ona-buna ərə getməyindən birdəfəlik gözünü çəkərdi.

Evindən qəzəbnak çıxıb gicəllənə-gicəllənə kluba gələn Məmmədxan qapının yanovunu açınca Altayla Mehmanın içəridə yanaşı oturduğunu görüb tez geriyə çəkildi. Məmmədxan bir an ayaq saxlayıb, istədi Balışı burada, səhnədə süzən qoyub evinə getsin, ancaq hövsələsini yemədi, qəzəbindən tir-tir titrədi, sanki onun beyninə sıçradı.

– Bu telli Altay bəs niyə buradan əl çəkmir? – deyə Məmmədxan olmazın bir qısqanclıq alovu içində qovruldu. – Hələ bu prokuror da şam kimi şölə çəkən arvadını orada qoyub buraya, səhnəyə, bizim bu yastı-yumşaq xanımın tamaşasına gəlibdir?! Bu Mehmanoğlan orda qanundan dərs deyir, burada komsomolla yanaşı oturub Murtuzovun bunun evinə daşıqçı olduğunu malalamaq, "qanun-qanun" deyib gözümüzə kül üfürmək istəyir.

Yox, yox, Məmmədxan günün batar çağında klubu dörd dövrə dolandı, pəncərədən boylanıb Balışın Sərvərlə qol-boyun olduğunu gördü. "İt küçüyü" deyincə dişləri xırçıldadı. O, hərlənib arxa qapıdan birbaş səhnəyə girmək istədi. Lakin dekorasiya dalında dayanıb: – Balış, Balış! – deyə barmaq elədi.

Altaydan bu tərəfə oturan Mehman Məmmədxanın kömür kimi qaralan sifətini görüb xısıltılı səsini eşitdi.

– Qız!.. Qız!.. Ay qız!.. Ay qız!..

Mehman başını əyib Məmmədxanın tutulan sifətinə, oynaya-oynaya tərpənən şəhadət barmağına baxdı. Balış isə anbardarı saya-hesaba almadan öz rolunu ifa edib başa vurdu, sonra səhnədən salona düşüb Mehmana və Altaya salam verdi. Axırda o, Altayın onu nə vaxt komsomol komitəsində qəbul edəcəyini müəyyən edib uzun zərli tumanının qabağını əlində dəstələyib geriyə döndü. Mehman yenə də Məmmədxanın o yandan bəriyə silkələnən barmağını, kömür kimi qaralan, vəhşiləşən sifətini gördü...

## XX

Altay atlanıb kəndə, komsomol özək katiblərinin kəndarası müşavirəsinə getdikdən sonra, Mehman evinə dəymədən prokurorluğa getdi. O, rayon həbsxanasında istintaq altında yatan məhbusların işlərini bir

daha diqqətlə nəzərdən keçirməyə başladı. Demək olar ki, o çox gec, bütün şəhər yatdığı zaman evinə döndü...

Mehman arvadı Züleyxanı öz yerində qurcalanan, anası Xatunu maşınka yanında çay qızdıran gördü. Gündüzkü əhvalatdan onların heç birisi söz açmadı. Çox gec yerinə girən, nisbətən çox az yatan Mehman yenə də erkən yerindən qalxdı. Züleyxa da cəld yatağından durdu. Dan sökülənə yaxın gözünə çimir gələn Xatun nənəni oyatmadan əri üçün çay-çörək hazırladı, onu yola saldı. Mehman bu gün də dünən axşamdan başladığı işlərlə məşğul oldu. İşin axırına yaxın kabinetindən çıxdı, Murtuzovun otaqcığına baş saldı, Qaloşlu adam müstəntiqin qoltuğunu doldurub icraiyyə komitəsinə yollandığını söylədi. Mehman onu yaxalamaq istəyən Qaloşlu adamı geridə buraxıb islah evinə doğru addımladı. Qaloşlu adam geridən mırıldandı.

İslah evi şəhərin bir kənarında, rayon milis idarəsinin yaxınlığında idi. Mehman dustaqların vəziyyətini yoxlamaq, Kamilovun ağlasığmaz müqavimətlərinə, qarşıya kötük yumalamağına baxmayaraq o, bu gün yazıb bir az əvvəl göndərdiyi qərar mocibincə kolxoz briqadiri Salamatovu buraxmaq istədi. Mehman mərtəbəyarım evin qabağında ayaq saxlayıb milis rəisini çağırdı. İşdən qayıdan milis rəisi eyvana çıxdı. O, Mehmanı görüncə:

– Bah, yoldaş prokuror! – deyə onu süzüb içəriyə, öz evinə dəvət etdi. – Hazır xörəyimiz var!

– Sağ olun, mən toxam, – deyə öz evindən deyintili çıxan Mehman, rəisə razılıq etdi. – Ancaq dedim, istintaq altında olanlarla bir balaca söhbət edək.

Prokurorun islah evinə baş çəkməyindən, istintaq işinin hər kiçik nöqtəsinə qədər nüfuz etməyə başlamağından yana özünü toplaşdıran milis rəisi:

– Yoldaş prokuror, axı işdən sonra yorğun-yorğun bu nə zəhmətdir çəkirsiniz? – deyə təkrar evini göstərdi. – Bir tikə çörək kəsərdiniz, sabah, ya birisi gün də, bu işlə məşğul olmaq olardı... Onlar daha möhkəm ağzıbirdədirlər, tələsiyəsi yerləri də yoxdur!

– Mən mütləq bu gün, özü də indicə onlara baş çəkmək istəyirəm!

– Olar, lap indi bu anda ola bilər, – deyə milis rəisi daha sözü uzatmaq istəmədi. – Sizin dövləti nəzarətinizə nə etiraz ola bilər? – o cəld evinə döndü, papağını başına qoyub enli qayışını çəkə-çəkə çıxdı: – Dustaq üçün axı bu nə zəhmətdir? – deyə milis rəisi gənc prokuroru qarşıladı. – Axı işdən sonra, yorğun-yorğun bu nə artıq əziyyətdir?

– Dustaq da bir vətəndaşdır! Onların taleyini ayırd etmək bizə tapşırılıbdır!

– Amma içində elə mamırlı qəddar düşməni də var ki, özünüz də görəcəksiniz, yoldaş prokuror, o başınız üçün, heç sabaha da saxlamalı deyil!

– Sabaha saxlamamalını da, qanun üzrə səbirdə öz cəzasına çatdırmaq gərəkdir. Ancaq təqsirsiz bir vətəndaşı həbsə almaq düşmən dəyirmanına su tökmək olardı!

– Bura ancaq ilk istintaq üçündür, bizim bu üç gözlü evcik!

– Qanuni əsas, möhkəm qənaət olmadan, sorğu istintaq zamanı, təqsirsiz vətəndaşı həbsə məhkum etmək yaramaz!

– İstintaqın xeyri üçün vətəndaşın bir balaca yaxasından yapışmaq da olar! – deyə milis rəisi gözünü dolandırdı.

– Həbsxana çayxana deyildir, onun adı ağırdır! Hər bir vətəndaşın özündən savayı onunla bağlı ailəsi, gənc bir sovet nəsli vardır. “Gir-çıx” deyə biz vətəndaşın taleyi ilə oyun-oyuncaq kimi əylənə bilmərik!

– Əlbəttə, əlbəttə!.. – deyə Cabirov gözlərini tez-tez döydü. – Elədir!..

– Yoxsa əsl günahkarı bir kənarda sərbəst buraxıb, cüzi bir təqsir olanı, yaxud heç bir təqsiri olmayan o briqadir Salamatov kimisini dərhal gözyummadan həbsə almaq düzgün olmazdı! O Salamatovun ailəsi var, uşaqları Bakıda ali təhsildədir, oğlu mühəndis, qızı həkim qurtaracaqdır. Bəs bunların taleyilə zarafatlaşmaq olar? Kimə belə şey xoş gələr?..

– Bəli, elədir, ancaq bu işin əsasında Kamilovun iki səhifəlik bir möhürlü qərarı var... Gedər kolxoza, sözləri bu Salamatla çəpləşər, Kamilov da tutub, bu Salamatovu ifşa edər! Beləliklə, yoldaş prokuror, – deyə milis rəisi davam etdi. – Yerli rəhbərdir, adam da yekə möhürlü qərara ələm edir...

– Yox, yaramaz, əsla yaramaz! Qanunsuz həbs hökmünü çıxaran özü məsuliyyətə alınmalıdır. – Gənc prokuror gedə-gedə başını qaldırıb milis rəisinin üzünə baxdı və qəti iradə ilə addımladı. – Qanun hamıya aiddir! Hər kəs bizim sovet qanununun qabağında bir vətəndaş olaraq eyni dərəcədə cavabdehdir! Qanunda “böyük-kiçik” sözü yazılmayıbdır, hər bir sadiq vətəndaşın həyat və əmniyyəti bizim böyük qanuna görə müqəddəs və toxunulmazdır!

– Bəli, düz buyurursunuz, yoldaş prokuror, – deyə ortayaşlı Cabirov təzə görürmüş kimi Mehmana ciddiyyətlə baxdı. – Düzdür. Ancaq bu Salamatovun üstündə Kamilov yoldaş dağı-daşı başına alacaqdır.

– Cabirov ayağını saxlayıb bir balaca səsini endirdi. – O, əlini döşünə qoyub bir balaca başını əydi.

– Qanunsuzluğa qarşı qanunun kəsərli qılıncını bütün parıltısı ilə qaldırmaq gərəkdir!

– Düşmənə qarşı olsa da, hansı bir vəzifədə olsa da, sovet vətəndaşının ali hüququ hər şeydən yüksəkdə dayanmalı, onun adı iftixarla səslənməlidir!

– Ancaq Kamilov bu işdən yana lap boğulacaqdır!

– Lap ortasından partlasa da, qanuni addımlarımızdan dönməyəcəyik!

– Bəli, – deyə Cabirov boğazını arıtladı. – Doğrudan da, qanun qanundur!

– Bizim qanun kitablarında böyük Oktyabrın fütuhatı həkk edilmişdir!

– Orası düzdür, – deyə Cabirov bu kəsərli sözlər qarşısında Mehmana yaxınlaşdı. Onun qarşısında özünün də bu fikirlərə şərik olmaq istədiyini göstərdi. Beləliklə, ikisi istintaq evinin qapısına endilər. Milis rəisi Cabirov öz işindən, qapıları möhkəmlətməyindən məlumat verib:

– Bax, görürsünüzmü, yoldaş prokuror! – deyə o, divarın yamaqlı yerini göstərdi. – Beləsi də var. Bax belə dələduzu da! Görürəm, sizin rəhminiz böyükdür. Ancaq qulağı tüklü, gözü işıldayan, bu divar dağıdan vəhşi mamırlısı da var!.. Belə ki, görəcəksiniz o, necə kolxoz tayasına od vurubdur, bu vəhşi qolçomaq oğlu qolçomaq hə, sonra, – deyə milis rəisi divarın yamaqlı yerini göstərdi. – Bəli, bu əhvalatdan sonra üzümə salıb Kamilovdan sement alıb bu divarın dibini, bax görürsünüzmü, elə bərkitmişəm ki, neçə kulaq olsa belə buranın bir daşını belə tərpədə bilməz!.. Atam bənna olduğundan mən də ta iyirminci ilədək, yəni milis olana qədər, onun əlinin altında şəyird işləmişəm. Odur ki, bu gün naçalnik olsam da, yenə bənna işindən az-maz başım çıxır!

– Ellik kollektivləşmə əsasında, qolçomaq nə qədər bir sinif kimi ləğv olsa da, əlbəttə, onların qalıqları hələ də yox deyildir, – Mehman sıravi milislikdən, öz rəşidliyinə görə milis rəisliyinə qalxan möhkəm, tökmə vücudlu Cabirovu rəğbətlə süzüb əlavə etdi:

– Gizli düşmən daha hiyləgər, daha xətakar, daha qorxuludur, yoldaş rəis!

– Heyif ki, onların bir parası elə bizim Kamilov kimisinin qanadı altında özünü yetim cücəliyə qoyub cükküldəyə-cükküldəyə kef çəkir! – Milis rəisi oyan-buyana baxdı. – Bəlkə də Kamilov özü bilmir, ancaq onlar cildə girib, hələ ki, dövran sürürlər! Nədən ki, Kamilov yağlı-qaymaqlı yerdən savayı bir kənar evə düşməz!

– Bəs yavan yer?.. Bəs yağsız-qaymaqsız yer necə?

– Elə yerə heç o gözünün quyruğu ilə də baxmaz, – deyə Cabirov prokurorla həmahəng olmaq üçün cəhd etdi. – Kamilov sözdə hay-küy eləyib, baxırsan ki, opportunisti söyər, amma iş işə gələndə bir cücə çığırtması üçün yağlı adamla yağ-bal olar!..

– Baxarıq, – deyə Mehman cavab verib istintaq otağının qapısını açdırdı, tez səs yayıldı.

– Prokuror, prokuror!

– Təzə prokuror gəlib!

Kimsə içəridən boylanıb:

– Lap uşaqdır ki, – dedi, – bu prokuror...

– Bəlkə prokurorun katibidir, mirzəsi, hə?

– Yox, lap doğmaca prokurordur, mən görmüşəm, milislər deyir, yaman başlayıb!

– Hansı tərəfə?

– Düzlüyə!

– Qaloş ona birtəhər çəkməsə?..

– Cücəni payızda sanarlar!

– Elədir, kəsərli başlayıb, korşalmış qurtarmasa yaxşıdır.

Mehman bu yavaş-yavaş gedən danışıqlara qulaq verməklə içəriyə, onların yanına girdi. Adamlar təkrarən bir-birinə dəyib dayandı. Mehman papağının qılları üzünü örtmüşdən soruşdu:

– Nə üçün tutulubsan, kişi?

– Başına dönüm, – deyə o papağını boynunun ardına tərəf itələdi. – Üstümə keçi şəri atıblar!

– Nə keçisi, kişi?

– Olub da, olub bu şər... Qonşuluqda bir dul var, Sünbül qarı... Hay salıb, səs çıxarıb ki, guya mən onun keçisini meşədə süpürləyib kəsmişəm!

– Sübutları nədir?

Milis rəisi bayaqkı vəziyyətindən fərqli olaraq indi tündləşdi, istədi cavab versin, ancaq Mehmanın burada olduğunu hiss edincə dayandı.

– Yaxşı, bu işdə sübutları nədir? – deyə Mehman təkrar soruşdu:

– Sübutu yoxdur, nə sübut? Mənim o rəngdə bir keçim meşədə bir az şıltağa qalxmışdı, mən də keçini hayladım ki, koldan çıxıb, yolun ağzına düşsün, keçi allahsız tərslik elədi, mən də hirslənib, salba atdım, keçi bəyirib yıxıldı, mən özümü çatdırdım, keçi ölmüş bıçağa güclə gəldi, bu dəmdə naxırçı oğul-uşaq da üstümə çıxdı, haray saldılar ki, Xudayar əmi Sünbülün keçisini kəsibdir!

– Demək belə çıxır ki, nahaqdır?

– Bıy, əşi, o bir Allah haqqı, təzədən bu saqqalnan elə də şeymi olar?.. Sünbül kimisinin keçisinə bıçaq çəkməkmi olar?.. Ölən keçi mənim, qalan dulundur!

– Yaxşı, ayırd edərik, – deyə Mehman ötdü.

– Kişi, sən nə üstdə? – deyə o, başqa birisinə tərəf çevrildi.

– Eyib olmasın, qonşunun bir uzunqulağının üstündə! Canavar, necə deyər, qurd dayısı qabağına qatıb hansı dərənin dibində yeyib, izini-tozunu itiribsə, indi o evi yıxılmış da qurdu o yana buraxıb, bu yanda mənim yaxamdan ikiəlli tutub!

Milis rəisi istədi yenə də kükrəyib qalxsın. Mehman onun əlindən yapışıb sakit olmağını xahiş etdi və:

– Sən, oğlan? – deyə üçüncü adama yanaşdı.

– Mənmi? – Çəpiş papaqlı yan-yörəsinə baxdı, kimdən soruşur, əyə?

– Sən, sən, – deyə prokuror barmağı ilə göstərdi. – Səndən soruşuram, sənin təqsirin?

– Mən müqəssirəm!

– Niyə?

– Oynaş öldürmüşəm!

– Kimin?

– Arvadımın oynaşını! Kopratelin bir teli burma dükandarını... özü də kulaq balası idi!.. Qızı çitlə tovlayırmış! Atası bandit köpəkoğlu!

– Nə ilə öldürmüsən?

– Kor-kəsməz xəncərlə!

– Bəs xəncər?

– Bu naçalniyə vermişəm!

– Düzdür, birbaş mənim üstümə gəlmişdi, – deyə Cabirov təsdiq etdi. – Amma lap zalımoğlu o qolçomaq oğlunun sağ tikəsini qulağına döndərmişdi!

– Namus üstə, yoxsa mən dinc adamam!

– Sakit! – deyə milis rəisi gözünü ağartdı. – Daha artıq-əskik yox!..

Bu vaxt birisi o yandan bəriyə partlayıb:

– Onun təqsiri var, – deyib özünü irəliyə verdi, – özü də boynuna alıb, mənim təqsirim yoxdur, vallah, yoxdur, gecə bir ölmüş qarının toyuğunu tülkü hindən aparır, səhər durub üzünə daş yamanmış məni yaxalayır ki, sənsən!

– Zamına verib yoxlamaq gərəkdir, – deyə Mehman bu adamdan da ötdü və barmağını bir qalife şalvarlıya uzatdı:

– Bəs siz? – deyə soruşdu.

– Biz də. – Onun boğazı qurtuldadı, – guya deyirlər ki, biz də müəllimlərin payokunu bölüşmüşük!

– Hə, bilirəm, sizi tanıyıram!

– Mən də elə dabbağda bunun gönünə bələdəm!.. – deyə Bənnaoğlu hirsləndi – gözünün içinə, bəbəyinin ortasına qədər tanıyıram!..

Mehman milis rəisinə baxıb sakit olmaq işarəsi verdi. O, bir yanda dayanan, qaşqabağından zəhər damcılayan, saqqalı, bığı qıvrılıb bir-birinə qarışan, üz-gözünü pırtlaşıq tüklər bürüyən mamırlı adama tərəf dönüb:

– Bəs sizin təqsiriniz? – deyə soruşdu.

– Mənim heç bir şikayətim yoxdur, – deyə mamırlı adam qeyzlə cavab qaytardı. – Mən sizə ərizə-zad yazmamışam!

– Görünür, müqəssirsiniz, eləmi?

– Keçən ilin bir payız gecəsinin zülmətində, – deyə mamırlı adam özü də zülmət kimi qaraldı, – bax, bir kənara, qara qayanın dibində dayanıb on min dərzin qırmızı-yaşıl dilli alovuna doyunca tamaşa eləmişəm!

– Axı nə üçün, nədən ötrü belə? – deyə Mehmanın hiddəti səsi üç gözlü istintaq evinin səqfində dolaşdı. – Nə üçün siz yüzlərcə adamın, qocanın, körpənin çörəyinə bais olmuşsunuz?

– Biz, Əsgərxan uşağının, ta ata-babadan qalma yeri, sərvəti, var-yoxu müsadirə elənəndən sonra, mən də gözlərimi ölüvay qoyun kimi döyə bilməzdim. – mamırlı adam sağ əlini yumruqlayıb döşünə çırpdı, sonra irəliyə uzatdı. – Bax, ona görə də bu əlimə silah götürüb zülmət meşəyə çəkildim... Gözlədim, biçin qurtardı, dərzlər daşındı, xırmanlar birinci dəfə ağardı. Xırmanlar boyu cərgələnən tayaları alova verdim!..

– Bəs qarovulçu, bəs keşikçi? – deyə Mehman dönüb Cabirovdan soruşdu. – Bəs o harada ölmüşmüş?

Mamırlı adam, milis rəisi cavab vermədən, öz cinayətlərindən indi də belə zövq alırmış kimi:

– Mən özüm mürgüləyən qarovulçunun boynunun kökünə tutarlı bir tüfəng küpü ilişdirib onun ağzını həmişəlik torpağa qapadım, – dedi. – Mən işimi görüb, əvvəlcə Qaraqaya dibinə, sonra dağlara çəkildim! Bax, sonra Bənnaoğlu Cabir mənim iki adamımı vurdurdu. Mən də borclu qalmayıb öz əlimlə bunlardan üçünü tələf elədim!

– Düz altı ay ayağımda çarıq, əlimdə tüfəng bir dəstə uşaqla dağa-daşa düşüb, bu canavaroğlunu axtardım, – deyə milis rəisi mamırlı adama tərəf dişlərini qıcadı. – Bu vəhşioğlu vəhşini! Bu quduz köpəyi!

– Bənnaoğlu, ağzını təmiz saxla! – deyə mamırlı adam qudurmuş köpək kimi zəncir gəmirdi. – Mən kolxoza da, bütün siz qırmızıpapaq tayfasına düşmənəm!

– Biz də düşmənlə düşmən kimi rəftar edəcəyik! – deyə Mehman mamırlı adamı kinli bir nəzərlə kənara buraxdı.

– Mən heç birinizdən rəhm gözləmirəm! Daha ikinci dəfə əlimi ağrıdıb bu divarı da sökəsi deyiləm!

– Çünki sizin kimi sinfi düşmənə cüzi bir rəhm etmək, çörəkləri yandırılan yüzlərcə namuslu adama xəyanət etmək olardı, – deyə Mehman mamırlı adamdan üzünü döndərdi, qoşa dayanan iki nəfərlə dəxi söhbət edib qeydlər götürdü.

– Aydın edib baxarıq, – deyə onlara söz verdi. – Mən sizin işləri bir qədər nəzərdən keçirmişəm!

Mehman dəftərçəsini cibinə qoyub:

– Bəs Salamat Salamatov kimdir? – deyə soruşdu. – Bəs o niyə səsini çıxarmır?

O tərəfdə, küncdə dayanan, başını aşağı salan, arğazvücudlu, ucaboylu, əlli-əlli beş yaşlı, ancaq saqqalı qar kimi ağaran adam dilləndi:

– Salamatov mənəm, yoldaş!

– Siz irəliyə gəlin, yoldaş!

Salamat Salamatov pəncərə qabağına çıxdı.

– Sizin bəs bu ağsaqqal çağınızda təqsiriniz?

– Təqsirim varsa, Şura hökuməti özü aydın elər, – deyə Salamatov xatircəm cavab verdi.

– Əgər yoxsa?..

– Yoxsa da yenə özü bilər!

– Biz sizi azad etməyi qərara aldıq!

Ağ saqqallı Salamatov bir addım irəliyə atıb:

– Mən inanırdım ki, kolxozda gizlənən belənçik mamırlı qolçomaq quyruqlarına cəza veriləcəkdir! – deyə o şikayətləndi, çünki mən kolxozun bir dəninə də haram gözlə baxmaram. Toxum səpənlər içində bir imansızoğlu Allahqulu olub, – keçmişdə muzdur saxlayan zalımoğlu! Toxumu seyrək səpir, qalan toxumu şumda gizləyib gecələri evinə daşıyır, taxıl yerdən seyrək çıxır, oduna mən düşürəm!.. İndi Allahqulu yalyamacda asudə gəzir, xatanı əbəs yerdən mən briqadirin üstünə tökürlər! Niyə? Çünki Allahqulunun yalandan adamın üzünə duran şahidi az deyil!

– Elə toxumyeyən düşmənlərə aman olmadığı kimi, dosta da zaval olmayacaq, – deyə gənc prokuror əlini Salamatova uzatdı.

– Bəli, biz, sizin qərarı bir az qabaq almışıq, – deyə milis rəisi izahat vermək istədi, – sabah işıq gözünə buraxacaqdıq Salamatovu!

– Təqsirsiz vətəndaşı bir dəqiqə də burada saxlamaq olmaz! – deyə Mehman Salamat Salamatova qapını göstərdi.

– Bizim rayonda otuzuncu ildən bu vaxta kimi bu Salamatov həmişə belənçik mamırlı qolçomaqla döş-döşə vuruşanlardan birisi olmuşdur, – deyə milis rəisi dilləndi.

– Siz azadsınız! – Mehmanın səsi ucaldı. Salamatov gənc prokurora baş əyib qapıdan çıxdı.

– Oğurluq xüsusi mülkiyyət hisslərindən doğan kapitalizmdən, dərəbəylik qalıqlarından əmələ gələn cinayətdir! Oğurluq adamın gözünə kölgə, vicdanına silinməz bir ləkə salır!..

Birisi arxadan soruşdu:

– Bəs böhtançı?

– Böhtançı oğrudan da pisdir!

– Böhtançı nədir, ə? – deyə biri, o birisindən soruşdu.

– Şərçi, dayna!

– Oğru özünü alçaldırsa, böhtançı təmiz bir adamı ləkələyir, – deyə Mehman izahat verdi, – böhtançı vicdanını ləkələmiş bir satqındır!

– Ay ağzına qurban olum, cavan prokuror, lap ürəyimdən tikan çıxartdın!

– Bəs, prokuror, rüşvətxor necə?

– Rüşvətxor itdən də pisdir! – deyə Mehman cavab verdi, – rüşvətxor ən rəzil bir həşəratdır!..

Mehman əlini qara qıvrım saçlarında gəzdirə-gəzdirə adamlarla bir qədər də danışıb axırda:

– Kimin təqsiri yoxsa, mütləq buraxacağıq, – dedi. – Kim müqəssirsə, öz cəzasını çəkəcəkdir!.. Kooperativ əmlakını talan edənlərə, vətəndaşların şəxsi əmlakına xain gözlə baxanlara, kolxoz tayalarını alova tutan düşmənlərə heç bir rəhm, güzəşt olmayacaqdır!.. Biz inqilabi qanunun bütün kəskinliyilə inqilabın bəhrəsini hər hansı sinfi düşmən qalığından – oğrudan, rüşvətxordan, böhtançıdan qoruyub, maneələri aradan götürə-götürə, yolumuzu arıtlaya-arıtlaya, qurub yarada-yarada irəliyə gedəcəyik!..

Mehman danışdıqca burada olan müqəssirlər başlarını aşağı salır, rüşvətə cuman Murtuzovun daha kəsərdən düşdüyünü hiss edir, öz cinayətlərini göz qabağına gətirib vahiməyə düşürdülər. Mehmanın axırıncı nəzəri mamırlı adamla toqquşdu, o qayıdıb geriyə döndü, qapı

bağlandı. Bayaqdan dilini uzadan mamırlı adamın, əvvəlkindən fərqli olaraq, canında bir üşütmə gəzirdi... O, iki əlini qoynuna gətirdi, sanki qara torpaq qabardı, yer onu öz dərin qatlarına çəkdi.

Mehman getdikcə daha artıq həyat təcrübəsi kəsb edir, işə ciddiyyətlə girişirdi. O, sübh tezdən prokurorluğa gedir, evə gec qayıdırdı. Züleyxa darıxır, deyinir, ayrıldığı gəzinti, əyləncə günlərini, şənlik çağlarını xüsusi bir həsrətlə xatırlayırdı. O, gündüzləri pəncərə qabağında dayanıb, sanki azad uçuşdan tutulub qəfəsə salınmış bir quş kimi yal-yamaca, dağ-daşa boylanırdı:

– Bu Mehman niyə belə buza dönüb, öz yuvasından soyuyur? – deyə bəzən Züleyxa qısqanmağa başlayırdı. – Bəlkə bir iş var, mən bilmirəm?.. Bəlkə bu sakit oğlan bir fasonlu qıza, ya kənd yerinin bir işvəkar gəlininə uyub xəlvəti-xəlvəti saman altdan su yeridir!..

Züleyxanın səbri tükənir, daha o, axşamları prokurorluğa zəng etməyə başlayırdı. Bu zənglərin bir çoxuna ya telefon dəstəyini götürən olmur, ya da cavab gəlirdi ki, prokuror idarədə yoxdur... Belə bir vəziyyətdən darıxan Züleyxa tablaşa bilmədən öz dərdini qonşuluqda olan bağça müdirəsi Zərrintac Sərrafzadəyə açmağa başlayırdı:

– Ay qız, xanım bacı, buralarda lap adamın ürəyi ağzına gəlir ki, – deyə o ah-zar eləyirdi. – Adamın ürəyi elə qısılır ki, deyəsən bəs bir daş qəfəsə düşübdür?..

Zərrintac bu sözlərə göydəndüşmə bir qızıl alma kimi baxırdı. O, öz növbəsində dönüb Züleyxanın qızlığına girir, onu öz evinə dartmağa başlayırdı. Zərrintac Sərrafzadə prokurorun arvadı Züleyxanı mürəbbəli çaya qonaq edir, gülüb danışır, ona xoş sifət göstərirdi.

– Ay Züleyxa xanım! Burada bir gediş-gəliş yerin olmasa, lap qulaqdan qut olarsan, – deyə o, Züleyxaya həmdəm olduğunu bildirdi. – Özüm də neçə vaxtdır kənardan da olsa göz qoyub baxmışam, sənin o qayınanan çox yamanca arvaddır... Adam dalınca boylanandır... Mənim də bir elə boylananım var idi, çox çək-çövürdən, dava-dalaşdan sonra bir gün oğluna dedim ki, bu evdə ya o, ya mən!.. Olmadı, qarı öz boylanmaq xasiyyətindən əl çəkmədi, axırda oğlu ona yol göstərdi, o da qoyub getdi öz doğma qızının yanına! Vallah, bu qayınanalar gəlinlərini o qədər qısqanırlar, az qala istəyirlər ki, özləri, ayıb olmasın, öz oğullarına ərə getsinlər! Bunlar günüdən min qat pis olurlar... Təlx, acı, turş!.. Özü də gəlininə göz verib işıq verməyən bir gözüdar, donqabel, heyvərə ha!.. Baxır arvad ayna qabağında torbalanmış üzünün qırışına, baxır gəlininin alma yanağına, qarının cini vurub çıxır kəlləsinə, bu çöllülər demiş, keçiləri toplanır

başına bu heyvərənin! Daha qarı qalır şıllağa, huygir qatır kimi qoşa təpikdən çırpır adamın sinəsinə!.. Dayanmaq olmur, durmaq olmur, o sapsarı sifəti görmək, biri bir batman gələn sözü udmaq olmur, olmur!..

Züleyxa Zərrintacın bu yanıqlı sözlərini kədərli-kədərli dinləyir, onun da gözündə qayınanası Xatun arvad yamanlaşmağa başlayırdı. Züleyxa hər bir söhbətdən evə dönüncə Xatuna qarşı çəpəki baxır, daha dodaqaltı deyinir, öz kəm taleyindən şikayətlənirdi.

Mehman bu vəziyyəti sezsə də, hələ ki, üzdə açılışmır, öz işi-gücü ilə məşğul olur, ucqar kolxozlara gedir, işləri yoxlayır, dərindən-dərinə istintaq aparır, haqqı nahaqdan ayırd edir, günlərlə oralarda qalırdı.

Bu vaxt Xatun sabaha kimi yatmayıb ürək döyüntüsü ilə oğlunun yolunu gözləyirdi. Külək qapını taqqıldadanda belə o cəld ayağa durur, əsə-əsə qapıya yaxınlaşırdı:

– Kimsən?..

Bir səs gəlmir, Xatun qapı ağzında dayanıb dinləyir, sonra titrəmiş yerinə dönürdü. Bu vaxt səsə oyanan Züleyxa, öz çarpayısında ağır-ağır o tərəf-bu tərəfə çevrilir, özlüyündə dodaqaltı mırıldanırdı.

– Bir çimir eləməyi də bu arvad bizə çox görür, ha, "Mehman gəlmədi, Mehmana yolda nə oldu?". Daha demir, bəlkə oğlan rayonun dərin yerinə girib, görəsən nə kef çəkir, bu saman altdan su yeridən?..

Bir an keçmədən Züleyxanın şirin mışıltısı başlayır, Xatunun yuxusu göyə çəkilir, o gözlərini pəncərəyə zilləyir, sabahın açılmasını gözləyirdi. Getdikcə Züleyxa Zərrintacgilə getməyi daha artıq vərdiş edir, bu aranı su yoluna döndərirdi. Zərrintac isə brilyant sırğalarını, qiymətli üzüklərini, qızıl saatlarını Züleyxaya göstərirdi. Züleyxa baxır, onun ağzı sulanır, tamahı qılınc kimi itilənirdi:

– Ay qız, nə əcəb bunları toplamısan?

– Neçə ildir ki, bəs bu bağçalarda niyə can çürüdürəm? Deyirsən yəni bu bir-iki dənə də şey-şüyümüz olmasın? – Zərrintac pörtə-qızara cavab verdi. – Sabahdan əlimiz bir dara düşəndə yetim quzu kimi hansı düşmən qapısında öz boynumuzu burub, məliyək, hə?

– Hamısını özün düzəltmisən, bu parıltılı şeylərin hamısını?.. Bu ki, Şah Abbas xəzinəsidir, bacı!

– Düzü bir az qabaqkı kişidən qalıb. O da sənin ərin kimi prokuror idi. Bir az da oyan-buyandan!.. Belə də!..

– Bəs o prokuror oğlanla aranız niyə dəydi?

– Gördüm ki, gecələr arvad danışdırır...

– Nə olar ki?.. Bəlkə müqəssirdir? Ya da şahiddir? – Züleyxa qısqansa da üstünü vurmur, hələ ki, öz vüqarını yuxarı tuturdu.

– Əgər fikri düz idisə, arvadları gündüz danışdıraydı, kişiləri də gecə, – deyə Zərrintac yırğalanırdı. – İndi bəs o prokuror oğlan haradadır?

– Deyir haradasa şorgözlük üstündə dolaşıbdır! Şorgözlükdə o, dünyaya tək gəlmişdi. Qız, məndən sənə əmanət, – deyə Zərrintac danışdıqca pörtürdü. – Kişinin yaxasını heç zaman öz əlindən buraxma!.. Beynini ye, qoy gözü açılmasın! Özü də öz üst-başını daş-qaşını düzəlt!.. Həmişə özünü bax bir qarış yuxarı, kişini isə bir qarış aşağı tut! Qoy sənə baxanda ağzı sulansın! Yoxsa sən ona hörmət eləsən, deyəcək bəs sən ondan qorxursan?!. Vur özünə tumarı, alış gün kimi yan, qoy gözləri qamaşsın! Dünyada adama heç bir şey verməzlər, hamısını almaq lazımdır, qız! Qamarlamaq, almaq gərəkdir, balası!..

– Haradan qamarlamaq, almaq, ay bacı? – deyə Züleyxa köks ötürdü. – Bizim anamız quru çörəkdən də bizi qoruyur, həmişə: “Oğul, artıq tamah baş yarar”, – deyə toyuq kimi bir ayaq üstə durur. Qoymur heç o Mehmanı öz donluğuna da bir düz-əməlli qol çəkə, barı!

– Qadam onun kaftar ağzına, – deyə Zərrintac iki əlini qoşalaşdırıb buradan oraya Xatunun başına “ala ee” deyir, Züleyxaya öyüd-nəsihət verirdi. – Bu dünya yeyənə quyruqdur, qız, ağlayana yasxana! Sən işində ol, qız, özünə bir gün ağla, balası! Sabah bu dünyadan sənin gözəlliyin gedəndən sonra, bu gündən o qırışan qocalığa hansı yadigar qalacaqdır?.. Bəlkə daş-qaşın olsun ki, birtəhər özünə bəzək-düzək verib o zaman qarılığın üstünü örtəsən!..

## XXII

Bütün gecəni dağ-daş arası, at belində yol gələn Mehman gündüz gün yağlananda rayon mərkəzinə çatdı. Prokurorun gəldiyini görən Qaloşlu adam özünü qapıya cəld yetirib Mehmanın atının cilovundan bərk-bərk yapışdı, başını qaldırıb altdan yuxarı onun üzünə irişdi:

– Xoş gəlmisən, qadan alım, səfa gəlmisən!.. Bu neçə gündə gözləməkdən də gözümüzün kökü saraldı!..

Xatun eyvana çıxıb oğlunu qarşıladı. Züleyxa qaşqabağını sallayıb dinmədi.

– Nə olubdur, ana?! – deyə Mehman anasının əlindən tutub onun intizardan yorulan, mehriban gözlərinə baxdı.

– Elə bir şey olmayıb, bala, – deyə Xatun gülümsədi. – On gündür getmisən, görünür ki, Züleyxa bir az küsübdür... Çox da doğru eləyir...

Adam da yad yerdə bir-iki günlüyə gedib bu qədər də uzun-uzadı qalarmı? Gecələr də yuxumuz göyə çəkilir. Yolların da dağ-daş, əyri-üyrü, at qoparılsa, heç bilməzsən, dilim-ağzım da qurusun, hansı uçurumun dibində bənd alar?.. Axı nöş belə?.. Məgər yaxşı işdi?.. Özün də cavan bir uşaq, belə dağ-daşa nabələd?!

– Yaxşı su varmı, bir əlimizi yuyaq?, – deyə Mehman Züleyxanı süzüb anasına cavab verdi, – iş çoxdur, ana!..

– İş olsa da, biz də axı belənçik nigaran qalırıq, – deyə Xatun dönüb getdi, o cəld sabun, məhrəba, su hazır etdi. Qaloşlu adam özünü qabağa verib Xatunun əlindən su dolçasını aldı, prokurorun əlinə qırışa-qırışa su tökdü. Mehman əl-üzünü yudu. Xatun çay gətirib stolun üstünə qoydu, eyvana çıxdı. Mehman Züleyxanın qolundan yapışıb:

– Küsəyən xanım, nə olub belə? – deyə onu mehribanlıqla dindirdi. – Axır bu nə küsməklikdir, qız!..

Züleyxa birdən ağlamağa başlayıb:

– Neçə aydır, – dedi, – buradayıq?

– Nə olsun, nə böyük qürbətdir, Züleyxa?

– Bir gəzməyi yox, əylənməyi yox, ürəksıxan iki hündür dağın arası, göy də görünmür!.. Kim bilir, hələ özün də haralarda gəzirsən?

– İşləmək, iş görmək gərəkdir, Züleyxa! – deyə Mehman Züleyxanın pırtlaşıq saçlarını tumarladı. – İşləmək, iş görmək, tapşırılan çox-çox məsul vəzifəni yerinə yetirmək gərəkdir, yoldaş!..

– İş görmək!.. İş görmək!.. – deyə Züleyxa hikkələndi. – İş görmək... Quru süfrə... quru süfrə... quru çay... Quru gün...

– Demək, aclıq davası eləyirsən?.. – Mehman Züleyxanın qollarından tutub, onu sıxçalayıb ovundurmaq, əsəbiləşən gəlinin könlünü almaq istədi. Züleyxa Mehmanın qolları arasından çıxmağa çalışaraq:

– Heç aclıq olmasın, – deyə başını əydi. – Bir ürəyimiz açılsa, necə?..

Atı aparıb şəhərkənarı tövlədə bağlayıb tez birdabana qayıdan Qaloşlu adam eyvana çıxdı. O, Xatuna yaxınlaşdı, içəridən gələn səsə qulaq asmağa başladı. Bir az keçincə başını yırğaladı.

– Doğrudur, hamısı doğrudur, – deyə Qaloşlu adam guya yanıxdı. – Mən neçə-neçə prokuror yola salmışam, indi dönüb bu oğlana mat qalmışam... Bu camaat ki, var, hamısı Kufə məxluqudur... Onlar yeyənə də, yeməyənə də “yeyən” deyirlər... İstəsən dünyanı ye, istəyirsən heç bir tikə dadma, hamısı birdir, hamısının adı yedidir... Haqq-halal normasını da qoymur kooperativin anbarından da götürəsən evinə ki, gəlin də dilə gəlmiyə. Belə adam olar? Görünür şura əsrinin peyğəmbəri olmaq

istəyir?.. Duzsuz arpa çörəyi yeyib, bir cam da soyuq su içmək istəyir... belə də prokuror, belə də çinovnik olar?.. Evində bişirilən zəfəran-plova da qapı çırpır, bilmirəm bu nə təhər bir ev saxlayacaq, sabah bunun uşağı nə güzəran görəcəkdir!..

Xatun Qaloşlu adamı tərs bir nəzər ilə süzüb:

– Bu söhbət, belə kimə gərəkdir? – dedi.

– Düz demirəm, Xatun bacı? – Qaloşlu adam təəccüb edər kimi soruşdu.

– Yox, düz demirsən, kişi! Adama təmiz ad lazımdır, zibilli qarın yox!

Qaloşlu adam Xatunun qəti qərarını görüb susdu...

Züleyxa içəridə gözlərində yaş gilələri dolana-dolana danışırdı:

– Xalqınkı qoşa-qoşadır... Gəlin gəlmişik, bir cüt sırğanı, bir qol saatını da görməmişik!..

– Demək bəzək-düzək davası eləyirsən, Züleyxa, eləmi?

– Yazıq anam həmişə deyərdi: "Qarnım üçün yox, qədrim üçün". Bir cavanlıq yadigarı olsa, göydən yerə qan yağmaz ki!

– Adam ayağını yorğanına görə uzadar, Züleyxa! – deyə Mehmanın əsəbiləri çalınmağa başlayırdı. – Mən sənə rayon dövlət kitabxanasından "El məsəlləri" gətirərəm, oxuyarsan. "Ayağını yorğanına görə!.."

– Mən yüzdən yuxarı roman oxumuşam, sənin bu kitabxanan mənə lazım deyil! – Züleyxa gözlərini silə-silə üzə durmağa, Mehmanın dönüşü zamanı göstərdiyi mehribançılığı qiymətləndirmədən, bir tərəfdən də qısqanclıq içində qabarmağa başlayırdı. – Heç bir romanda, bircə kəlmə də deməyiblər ki, ay Mehman, qıza gözəllik, bəzək lazım deyil!.. Heç birisində də heyvərəyə, bir cın-cındırıyla eşq yetirildiyi göstərilməyibdir, mamamın canı üçün.

– Sən çox zərərli romanlar oxumusan, Züleyxa! – Mehman arvadının bu sözləri qarşısında heyrət etməyə başlayırdı.

– İndi də bəlkə bu romanlara maddə verib qazamata salasan, yoldaş Atamoğlanov?

– Sənə bu dili öyrədən var, Züleyxa!

– Necə, bəyəm mən lal idim?

– Bu qədər də yox, Züleyxa!.. Sən əsla belə deyildin, Züleyxa!

Qaloşlu adam özünü saxlaya bilməyib içəri işarə edib Xatuna:

– Görürsənmi, – dedi, – gəlin necə haqqına üzə durub?

Xatun Qaloşlu adamı yenə eyni nəzərlə süzüb:

– O sənin işin deyil! – dedi, – kişi! Əsla ətlə dırnaq arasına girmə!..

Qaloşlu adam büzüşüb:

– Mən qələt eləyirəm, – dedi, – min qələt! – O, çiyinlərini çatdı. – Mən süpürgəçi babayam, mən atamnan qələt eləyərəm!

– Onda bu dili bir kənara burax, kişi!

– Dil deyəndə, mən süpürgəçiyəm, bacı, ancaq gəlini də elə üzə qaldırmaq olmaz! Mən, hər ikisini də öz balam kimi, bax bu döyünən ürəyim kimi istəyirəm!

Qaloşlu adam həyətə enib kağız qırıntılarını yığmağa başladı. Xatun isə bu söhbətlərin dəhşətli gələcəyini görür kimi dayanmadan içəriyə girib:

– Oğul! – deyə üzünü Mehmana tutdu, – ləkəli sultan olmaqdansa, ləkəsiz çoban olmaq yaxşıdır! Mən hələ başımı aşağı salmamışam, bu özü də dünyaya dəyər. – Xatun gəlininin üzünə baxdı. – Qızım, alnı damğalı adam, qulağı damğalı heyvandan pisdir!

Gözlərində hiss və hikkə yaşı quruyan Züleyxa, bir də ağlamağa başlayıb:

– Uy, mama! – dedi, – hamısı da o yandan bəriyə mənim üstümə düşüb, uy, mama!..

## XXIII

Qaloşlu adam arzuladığı ilk açarı əldə etmiş oldu. O, bu ailədə olan azmı-çoxmu ixtilafa bələd oldu. Qaloşlu adam "daş-qaş mərəz"ini bildi. "Bax buradan, buradan açarı salmaq!" – deyə o içəridə sevindi. Qaloşlu adam fikir içində bir qədər hərlənib-fırlandı, girəvə tapıb özünü anbarın qapısından içəri saldı. Məmmədxan yenə də çotka çəkir, sənədləri aşırıb yoxlayır, qara saplı bir iynə ilə tikib düzəldirdi. Qaloşlu adamın kölgəsi içəriyə uzanıb stol üzərinə səpələnmiş kağızların üstündə gəzdi. Məmmədxan əyri-üyrü kölgəni görüncə başını qaldırıb:

– Yenə xeyir ola, – dedi. – Qaloş?

– İş var, – deyə Qaloşlu adam ayaq barmaqlarının ucunda içəri girdi. – Sənə işim düşübdür!

– Nə vaxt olacaq ki, sən özün də bir iş düzəldəsən, ay Qaloş?!

Qaloşlu adamın qırış üzü titrədi:

– Köpək qaya kölgəsində yatar, elə bilər öz kölgəsidir!

Məmmədxan çotkanı kənara itələyib:

– Mən həmişə sənin bəndeyi-fərmanın, Qaloş! – deyib ayağa durdu. – Mən həmişə əli-qolu bağlı qulun!

Qaloşlu adam əyilə-əyilə:

– Sən bilirsən ki, – deyə barmağı ilə sənədləri göstərdi, – mən sənin boğazını neçə kərə kəndirdən qurtarmışam!

– Yaxşı bilirəm!

– İndi kim bilir, bu qoşa gözlərin hansı zülmət qaranlıqdan işıldayırdı? Camaat deyər: “Koxanı gör, kəndi çap”.

– Bu misalı açıq dilə çevirəndə nə deməkdir, Qaloş?

– Bir saat!

– Mən saatsazammı, Qaloş?

– Qanmadın!

– Necə, necə?

– Dedim ki, qanmadın! Bir qızıl saat gərəkdir!

– Bu xarabada qızılı haradan tapmaq olar?.. Gümüş olsa, bəlkə birtəhər düzələrdi, Qaloşcan!

– İtər yerə getməz, ədə!

Məmmədxan əlini alnına, dirsəyini də sənədlərin üstünə qoyub xeyli fikirləşdi. Qaloşlu adam anbarın içini bir müfəttiş kimi gəzib dolandı və sonra gəlib, anbardarın başının üstə dayandı:

– İtər yerə getməz! – dedi. – Atalar deyib, – “Yüz gün yaraq, bir gün gərək”.

Qaloşdan yaxa qurtara bilməyən Məmmədxan stolun balaca gözünü açıb qızıl qolbaqlı saatı çıxarıb:

– İşinə düşərmi? – dedi. – Bu sən yığan sarıdan! Ancaq sən yığan dilsizdir, bu qədər də çıq-çıqlıdır!..

Qaloşlu adam saatı alıb baxdı, açıb içini yoxladı, yazı-pozusunu gözdən keçirtdi:

– İnsafən söz yoxdur, qiyməti neçədir?

Məmmədxan güldü:

– Sən neçə qiymət qoyursan?

– “Örtülü bazar – dostluğu pozar!”...

– Kim üçündür, əmican?

– Bilmirsən, ay lotu, kim üçün olar, ilin-günün bu çağında?..

– Vallah, o Əbülfəzli Abbas haqqı, mən haradan bilim? Sən deməsən, mən bu anbarda hardan başa düşüm ki, sənin o dərya könlündən nələr keçir?..

Qaloşlu adam saatı yuxarıya qaldırıb:

– Qiymətsiz şey olmaz, qiyməti?

– Peşkəşdir, Qaloş!

– Doğru söz? Lap qızıl kimi düz söz?

– Bir əmimin tək ölmüşünə!

– Qiymətsiz şey olmaz, qiyməti!

– Dedim ki, peşkəşdir! Mən bilirəm ki, sən hədər yerə bir kibrit dənəsi də verməzsən!

– Haqq başı ağır olar, ancaq çatmağının geci-tezi var! – deyə Qaloşlu adam sümüklü əlini qaldırıb Məmmədxanın kürəyinə vurdu: – İtər yerə getməz! – O saatı pambığa büküb yavaşca qoynuna qoydu, öz əyri-üyrü kölgəsi ilə birlikdə anbardan çıxdı.

Mehman işə getmişdi. Xatun mətbəxdə çalışırdı. Züleyxa məlul-müşkül eyvanda dayanıb ətraf dağlara baxırdı. Qaloşlu adam böyük bir qənimət əldə etmiş kimi şəst ilə yuxarı eyvana çıxıb:

– Xoş gördük, – deyə o, qapağı qırışıq gözləri ilə Züleyxanı süzdü. – Başına dönüm, mənim gözəl-göyçək qızım!..

Tutqun Züleyxa cavab vermədi. Qaloşlu adam Züleyxanın gözləri içinə zənn ilə baxıb:

– Bu əmin dünya görübdür, – deyə ona yaxınlaşdı. – Sən mənim özcə balamsan... Sonra sən mənim necə xeyirxah bir adam olduğumu tanıyıb biləcəksən!.. Mən əcəb bilirəm ki, gen günü dar günə sığışdırmaq çətindir. – Qaloşlu adam içəriyə girib Züleyxanı da otağa çağırdı:

– Bir zəhmət olmasa, qızım, bəri gəl!

Bu səsə Xatun başını qaldırıb mətbəx dəsmalı ilə əlini sildi. Züleyxa hərlənib otağa girdi.

– Sizə saat lazımdırmı? – deyə Qaloşlu adam soruşdu.

Züleyxa bu qəfil sual qarşısında səksəndi.

– Nə saatı?

– Qızıl saat!

– Yox, bizə nə qızıl, nə də gümüş saat lazım deyil!

– Niyə?

– Çünki gərəyimiz deyil!

– Saat ola, gərək olmaya?.. Mən bilirəm ki, sizin saatınız yoxdur. – O, saatı çıxarıb əlində hərləyib Züleyxaya tərəf tutdu: – Əntiqəsidir, lap əntiqəsi!..

Züleyxa sarı qızıla baxdı:

– Bizə lazım deyil, çox sağ olun!

– Yox, siz bu saatı götürün!

– Pulumuz yoxdur, axı?..

– Yavaş-yavaş düzəldib verərsiniz! – Qaloşlu adam təsiredici bir səslə güldü. – Əminlə köməkləşərsiniz... Yavaş-yavaş mənim donluğumu da sizin düyünçələrdəkinin üstünə qoyarıq, qiymətini düzəldərik!

Züleyxa baxıb-baxıb:

– Mehman dünyanı dağıdar, əmican! – dedi. – Lap bizi baş-başa verən dağların arasından sürgün edər!..

– Heç-zad deməz, qızım!

– Vallah, Mehman mənim aşımı kəsər, lap!

– Al, qoy dursun, deyərsən, Zərrintacındır. Mən bilirəm siz ikiniz onunla canbir qəlbdə bacılıqsınız!

– Bacılığın buraya nə dəxli?..

– Qadına sirdaş gərəkdir, onda da o Zərrintac kimi dünyagörmüş bir sirdaş ola...

– Axı heç bilmirəm Mehman üçün, onun qulluğuna görə nə cürə çıxar?

– Heç cürə, yüyürən yıxılmağına baxmaz. Könlü daş-qaş istəyən gərək ustalığı da bacarsın! Lap qədimlərdə də, bu “sarılar” axıb-axıb ağlı başında top adamlarda toplanardı, hərdə-hürdədə yox!.. Bu çərəz deyil, yeyəsən, ağzın şirin ola, ötüb sovuşa. Bu həm bəzək, həm də çəkidə yüngül, qiymətdə ağırdır!..

Qaloşlu adam saatı stolun üstünə qoyub yavaş və yastı addımlarla qapıdan çıxdı...

## XXIV

Züleyxa xeyli vaxt, həyəcan içində qapı-bacada dolandı, sonra yenə Zərrintac Sərrafzadəgilə getdi.

– Salaməleyküm, gəlin! – deyə genişlənən gözlərini dolandırdı!

– Əleykəssalam, ay qız! Niyə bəs elə də tövşüyürsən? Elə bil ki, lap qaç-qovdan gəlirsən?.. – Zərrintac Züleyxanı diqqətlə süzüb əyləşmək üçün ona yer göstərdi. – Otur, bir nəfəsini dər. – O qaş-gözlə bir daha Züleyxanı nəzərdən keçirtdi. – Ay qız, bəyəm adam böyük arvadı olanda, xırda adama bu qədər də sallaq satmaz?!. Bu neçə gündə bəs haradasan, balam?.. Bilmədim ayağının altına da bir dəmir parçası atım, barı!..

– Ay qız, vallah, adamın ürəyi yamanca darıxır, – deyə Züleyxa nəfəsini dərə-dərə birtəhər stulda əyləşdi. – Ancaq adam da tez-tez gəlib getməyə utanır, üz ki var, ətdəndir!

– Elə niyə? Yad-yadırğa deyilsən ki?! – Zərrintac qayğıkeş adam kimi canıyananlıq göstərdi. – Mən qardaşıma da demişəm, bizim katib Kamala! O da icraiyyə komitəsinin katibidir! Hə, demişəm ki, biz ikimiz Züleyxa xanımla həmişəlik bacılıq olmuşuq... Bacı olandan sonra, daha burada artıq-əskik nə söz ola bilər?..

Züleyxa bir təhərlə özünü sakitləşdirdi. Onlar bir qədər oyan-buyandan söhbət edəndən sonra Züleyxa yenə də qızarıb-bozardı, əl çantasını götürüb çəkinə-çəkinə və yavaş-yavaş onu açdı:

– Ay qız! – deyə o birdən yumşaq telli pambığa bükülü saatı titrəyən barmağı ilə asta-asta çıxartdı. – Dedim sənin saatınla quraq bunu... Dedim baxaq, sınayaq görək necə işləyir?.. Yoxsa adam burada lap vaxt-vədəni də dolaşdırıb, az qala, sən demiş qulağı belə batır!

Züleyxa qızıl saatı göstərdi, Zərrintac əli ətə çatmaz, dadanmış, hərif pişik kimi baxıb-baxıb udqundu:

– Qəşəngdir, mübarəkdir, qız! Alırsanmı, barı?

– Yox, özümünküdür!.. Nə almaq?.. Özümünküdür!..

– Nə əcəb bəs indiyəcən heç bir kərə də bağlamadın?

– Bağlamış bu ucqar yerdə hara gedəsiyəm?

Züleyxa bu sorğuların içindən özü də gözləmədən çıxdığı üçün az-çox arxayınlaşdı, sinədən yanıqlı bir nəfəs aldı. Zərrintac Sərrəfzadə saatı alıb çox diqqətlə, özü də xeyli bir zaman oyan-buyanına süzə-süzə baxdı:

– Hə, bir adamın... – deyə sözünü tezcə yarımçıq kəsdi, "oxşayır..." sözünü ağzında saxladı, "ş-ş-ş..."lar, onun qırmızı, ətli, qalın dodaqları arasında fışıltıyla çıxdı...

– Nə? Necə? – Züleyxanın rəngi bu əcaib və əsrarlı səsin müqabilində bir an içində sapsarı saraldı. – Nə dedin, qız?

– Heç! – Zərrintac sürməli qaşlarını yuxarıya dartdı. – Heç bir şey! Bacı canı!.. Yəni deyirəm ki, adamın qoluna saat gələrmi? – O saatı daha yaxşı tanımaq üçün bəhanə ilə onu qoluna gətirib diqqətlə baxdı. Sonra Zərrintac saatı nə qədər qoluna bağlamağa çalışdısa da, saatın qızıl zənciri onun ağ, yastı biləyinə gəlmədi. – Yox, mənim qoluma çətin gələr, – deyə Zərrintac güclü əli ilə Züleyxanın çiynindən yapışıb onu bərk-bərk yırğaladı. – Maşallah, sən də heç məndən geriyə qalmaz bir qurğuşunsan! Ancaq istəsən bu saatı mənimki ilə dəyişdirə də bilərik!

Zərrintac, Züleyxanı arxayın salmaq, onu ürkütməmək, özünü tox göstərmək üçün ayağa durub sandığını açdı. Bir cüt saat çıxarıb gətirdi. Züleyxa bir qədər toxtadı, ancaq böyük bir həsrətlə qoşa saata baxdı:

– Qəşəngdir sənin bütün-bütünə daş-qaşın, qız!

– Hamısı da qoşa-qoşa gərəkdir, – deyə Zərrintac yenə də öyünməyə başladı. – Birdən biri sındı, biri itdi, sonra?.. Bu dünyada bir dənədən bir şey çıxmaz!.. Elə bu kənd qulluqçularının arvadları da baxırsan ki, cüt-cütdür!.. Hərçənd olsa bu da mədəniyyətdən deyil, – Zərrintac əlini-əlinə vurub süni bir səslə güldü. – Ehtiyat gərəkdir, ehtiyat! – Zərrintac əlini qaldırıb yağlı pampızlı dizinə vurdu. – Ayrı cürə heç olmaz bu dünyanın işi!.. Çünki üstə gəlməyən azalır!

Züleyxa kövrəlib sadəlövhlüklə açıldı.

– Bizim ana dünyanı qurudan, hər şeyə bir qulp qoyan, bir ılıq yumurta ilə gün keçirəndir!

– Hə, – deyə Zərrintac gözlərini dolandırdı. – Hələ o Qaloş da, bu gün onun barəsində mənə elə deyirdi.

Zərrintac cavan rəfiqəsinin öz qayınanasına qarşı başlayan narazılıq qığılcımını üfürüb alovlandırmaq, hər hansı ehtiyata qarşı, bu ailənin içərisinə əl salmaq, gənc prokurorun düyününü öz əlində saxlamaq istəyirdi. Bunun üçün də Zərrintac ananı öz oğlunun keşiyindən qovub uzaqlaşdırmağa, onunla gəlin arasında ixtilaf salmağa çalışırdı. Buna görə də Zərrintac mətləbi hərləyə-hərləyə ananın üstünə gətirməyi vacib bilirdi.

– Hə, – deyə o, yenə sözə başladı. – Doğrudan da, mən də bu barədə göz qoymuşam. O arvad elədir ki, var!.. O Qaloş, asta-asta bizə gələr, düşəndə bizdə isti bişmişdən-zaddan bir qaşıq yeyər. Yazıq yamanca kişidir. Qaloş da sənin o mısmırıqlı qayınanandan əl aparıb qan gətirir!.. Baxırsan ki, o arvad sənin dalınca hey göz qoyur... İstəmişəm bir kərə tutub deyəm ki, ay xala, axı belə də yaramaz?! Sonra sözümü udmuşam, demişəm, eh mənim nə borcuma?!. Bu dünyada bu qayınana deyilən ki, var, qoymaz bu yazıq gəlin kirpik qaldırıb, göz aça!.. Mən sənə qabaqlar öz qayınanam haqqında demişəm. Bu qayınanaların hamısı bir bezin qırağıdır! “Ora getmə, bura get, elə durma, belə dur”, onlar az qala evi bir qazamata döndərib özləri də əllərində nizəli tüfəng qapıda dayanırlar. – Bəxtəvər o gəlinlərin başına ki, onlar bütün ömürlərində qayınana üzü görməyiblər!..

– Yox, bizimki daha o dərəcəyə qədər pəncə-pəncədən də keçməyib a!

– Mən göz qoymuşam, hələ bir qədər ötübdür, – deyə Zərrintac Sərrafzadə Kamilovun bu ailəyə qarşı itilənmiş dişlərini göz qabağına gətirərək belə bir narazılıq toxumu səpmək yolu ilə öz işinə davam edirdi. – O kişi də deyirdi, o fəqir Qaloş, mən özüm də sərraf gözü ilə baxanda o lapçınlı arvadın yeddi qatını görmüşəm... Nədən ki, mənim gözümdə nə bir canlı yayınar, nə də bir cinli... Demişəm, yazıq bacımın gününə!.. Qayınanalı gəlinin bu dünyada yediyi qan, içdiyi irindir! – Sərrafzadə o yana göz gəzdirib astadan söyləndi: – Sən çalış, qoy kişinin əlində girəvə varkən sənə belənçik-belənçik şeylərdən bir daş-baş eləsin!.. Yoxsa qız, gərək bəzənəsən ki, kişinin də ağzının suyu şırıl-şırıl axsın! – Zərrintac yırğalandı: – Ancaq bu imansızlar da az qalırlar ki, bəzək görəndə ortalarından çatlasınlar! Onların gözü götürməz ki, gəlin yazıq bir yaxşı-yaxşı geyinsin-kecinsin, altdan vurub, üstdən qıfıllansın, tay-tuş içində tovuz kimi bəzənib, sallana-sallana gəzinsin. Hə, qayınana qoymaz ki, ər deyilən adam, boya-başacan gəlini sevsin. Mənim başım bu barədə, bir dünyaca ağrı çəkibdir. Sən hələ təzəsən. Özün də baxıb görəcəksən... Ancaq haray bu başdan!.. Bu başdan başına bir çarə!.. Lap elə bu başdan o qayınananın gözünün odunu al! – Zərrintac cavan rəfiqəsini diqqətlə süzüb öz sözlərinin təsirini yoxlamaq istədi. – Ancaq bu qızıl saat heç də bir bünövrə daşı kimi, bəd deyildir, qız, balası! – Zərrintac saatı qurub qulağına tutdu. – Bəd deyil, dalı bol olsun, qoşa-qoşa olsun!.. Qoy dincələ-dincələ işləsinlər... Elə mən də bu saatları növbə-növbə işlədirəm. Heç biri də ömründə bir saatsaz üzü görməyib... Necə yerindən çıxıb, eləcə təptəzədir!

Züleyxa gətirdiyi sarı saatı yenə də həmin yumşaq pambığa büküb əl çantasına qoydu.

– Qoluna bağlasana, qız! – deyə Zərrintac onun üstünə çəmkirdi. – Bağlasana özcə qoluna!

– Evdə bağlaram!.. Bağı qolumu kəssə də bağlaram!

– Görünür ki, qayınanandan yamanca qorxursan, lap cin dəmirdən qorxan kimi! Bildim, başa düşdüm. – Zərrintac əlini əlinə vurub, şaqqa çəkib güldü. – Adam bu dünyada beş gün yaşayacaq, gərək ürəyini yemiyəsən, qız!

Zərrintac uzun qara kirpiklərini silib öz allı-güllü geyiminə, dolu əndamına nəzər saldı. Onun qardaşı Kamal qapını taqqıldadıb içəriyə girdi. Zərrintac ayağa durub:

– Tanış olun, – dedi, mənim qardaşımdır, Kamal! Yoldaş Kamilovun katibidir! Bizim ispalkomun, böyüyün!

Kamal Sərrafzadə Züleyxanın qabağına gəlib ayaqlarını qoşaladı və əyilib əlini uzatdı:

– Kamal Sərrafzadə!

– Züleyxa!..

– Mənim bacılığımdır, – deyə Zərrintac əlini Züleyxaya sarı uzatdı. – Bizim Züleyxa xanım, bizim prokurorun həyat yoldaşıdır! Özü də "Yusif-Züleyxa"da olan Züleyxadan min pay gözəl.

Kamal Sərrafzadə Züleyxaya tərəf baxdı, onun qız üzünə bənzər üzü pörtdü, dişləri də bir şux qız dişi kimi ağ-ağına cərgələndi.

– Çox pakizə! Biz çox xoşbəxtik. – Kamal o tərəf-bu tərəfə sındı. – Hörmətli adamlar bizə gəlib-gedirlər. Yoldaş Kamilovun özü də, bizə öz evi kimi gəlib gedər...

Zərrintac Züleyxanın diləgəlməz gözəlliyi müqabilində tezcə özünü unudub əriyən və yumşalıb sıvılan qardaşına tərəf gözlərini ağardıb:

– Yoldaş Kamilov hərdənbir ətirli çaya gələr, – deyib qabarıq döşləri ata-ata allandı. – Nə olsun ki?.. Adam-adamın evinə gələndə qanxata olmaz ki?! Bu xırdaca şəhər də elə bir cürdür ki, baxırsan ki, o qədər gözü götürməyən, ürəyi qurdlu var ki, necə deyər, bu ara adamı az qala öküzü qaldırıb altından buzov çıxarır?..

Züleyxa, Kamalın açıq sözlərindən, xüsusən Kamilovun buraya gəlib-getmək məsələsindən yana, birdən dəyişib pərt oldu, belə bir söz-söhbətdən sonra o cəld yığışılıb pərişan bir halda evlərinə döndü. Xatun, gəlini bir cürə bozarmış sifətlə qarşılayıb:

– Qızım, nə tez-tez o gəlingilə gedib gəlirsən? – deyə soruşdu.

– Nə olar gedəndə, ana?.. Gedəndə, nə olar?..

– Nahaq gedirsən, – deyə əsəbiləşən Xatunun səsi titrədi. – Çox göz qoymuşam, torançağı bir zorba kişi asta-asta o evə girir!.. Yad yerdə adam gərək qədəm basdığı yerə fikir versin ki, altı quyudur, xəndəkdir, uçurumdur, ya nədir?

Züleyxanı söz tutdu, çaşıb dolaşdı. Xatun qayıdıb içəriyə girdi, xörəyə baxıb bir balaca sıxma duz atdı, vedrəni götürüb dağdağan ağacının dibindəki şırrana tərəf yollandı. Züleyxa daha da bərk hikkələndi. Zərrintac beynində köpəşməyə və cücərməyə başladı, Xatun arvad bir müqəssir kimi onun gözləri qabağında dayandı. O, Xatunun ardınca deyinib içəriyə girdi, balaca kasanı iki dəfə duzla doldurub bozbaş qazanına hirslə endirdi.

– Bizim gözətçimiz bizi göz açmağa da qoymaz!.. Cərə olsun, bir də cəhənnəmə! Bu da lap çustunu sürütləyə-sürütləyə mənim başımda vər-vəkillik eləyəcəkdir?!

Xatun sudan qayıtdı. Bir azdan Mehman da işdən döndü. O, əlini yuyub stolun yanına gəldi.

– Ana, bu gün çox yaman acmışam, özüm də işə çox tələsirəm!

Xatun soğan doğrayıb nəlbəkiyə qoydu. Bozbaşı üç qaba çəkdi, iki qabı stolun üstünə gətirdi. Öz payını mətbəxdə saxladı. Mehman qaşığı doldurdu, ağzına gətirərkən dil-dodağının yandığını hiss etdi.

– Ana, ana!..

– Nədir, oğul?..

– Duz varmı?

Xatun bir nəlbəkini duzla doldurub gətirdi.

Mehman qaşığı qaba atıb güldü, anasının boynunu qucaqlayıb ağaran pırtlaşıq saçları arasından öpdü.

– Görünür yadından çıxıb üç-dörd dəfə duz atmısan, hə?

Xatun Mehmanın qaşığını götürüb xörəkdən daddı.

– Olar, oğlum, – deyə başı ilə təsdiq etdi. – Olar!.. Yəqin qocalıq huşumu başımdan aparıbdır, olar!..

Mehman asta-asta güldü:

– Yəqin hər dəfə qazana baxanda bir ovuc, hə? – O, pərt olan anasını bir də qucaqladı, – lap duz gölü! Nə olar, üç gün duzsuz bişirərsən, əvəzi çıxar!

Xatun Züleyxaya altdan-altdan baxdı, elə bu andan Bakıya qayıtmaq üçün münasib bir adam axtarmağa başladı. Bir gün sonra o buraya təftiş üçün gələn qonşuları Balaqardaşı bazarda gördü. Xatun iri portfelli Balaqardaşla danışıb şəhərə qayıtmaq vaxtını müəyyən etdi. Xatun öz fikrini oğluna bildirdi. Mehman etiraz etdi. Anası təkidlə:

– Yox, bala, – dedi, – mən gedim bir evimizə də baş çəkim!

– Evimizdə nə var ki, ana?

– Heç bir şey! Bircə sənin körpəlik ətrin, – Xatun dayandı. Əvvəlcə o, Züleyxanın boynunu qucaqlayıb öpdü, sonra da Mehmanın boynunu qucaqladı, gözləri doldu, əl atıb bağlamasını götürdü, əyilmiş halda pilləkəni enib birbaş avtobusa tərəf yollandı. Mehman bu işə məəttəl qaldı, Züleyxa o biri otağa çəkilib:

– Qoyma getsin ananı, Mehman! – bir uşaq kimi ağladı.

– Mehman pilləkəni düşdü, astaca yeriyib küçədə anasına çatdı, əlini bağlamaya atdı.

– Qayıt, sonra özüm gedəndə səni apararam, ana!

– Burax, küçədir, eyibdir, – deyə Xatun oğlunu tərs bir nəzərlə süzdü. – Burax, burax məni, Mehman!..

## XXV

Bir axşamüstü Züleyxa bir neçə fincan moruq mürəbbəli çay içib bərk tərlədi, hərlənib eyvana çıxdı, soyuq onu o ki var, tutdu, gecə isə özünü pis hiss etdi, səhər titrədib, doğrudan da ağır yatdı. Mehman işdən qayıdanda Züleyxanın halını pərişan gördü; zəng edib həkim çağırdı. Yarım saatdan sonra həkim gəldi. O, Züleyxanın qızdırmasını ölçdü, hərarətin otuz doqquz dərəcədən yuxarı olduğunu müəyyən etdi. Bir neçə resept yazdı, Mehman Qaloşlu adamı çağırdı, reseptləri ona verdi. Qaloşlu adam dərmanxanaya yollandı. O yüyürüb aptek müdirini tapdı, reseptləri birbaş ona verib dərmanları hazırladıb gətirdi. Züleyxa gözünü açıb yanına düzülən dərman şüşələrinə baxdı, "mamamı istəyirəm, mamamı!" – deyib iztirab içində gözlərini yumdu. "Qoy anam gəlsin mənə bir yol göstərsin". Züleyxa yüksək hərarətin içində belə qərar çıxardı: "Qoy Xatun bir də bu evə qayıtmasın..."

Qaloşlu adam Züleyxanın xəstələndiyini, bəzən sayır-bayır danışdığını ətrafa yaydı. Yavər Murtuzova, Zərrintac Sərrafzadə cəld yığışıb Züleyxanı yoluxmağa gəldilər. Onlar bütün gecəni xəstənin yastığından ayrılmadılar. Mehman isə Züleyxanın qəflətən belə xəstələnməyini həqiqi bir kədər kimi qarşıladı. Getdikcə onun ürəyi daha həyəcanla döyünməyə başladı. Ancaq Züleyxa gözlərini açıb hərdənbir dil-dodağını yalayır, hey anasını arzulayırdı: "Anamı!.. Mamamı!.." – deyib israr edirdi.

Sabah açıldı, Qaloşlu adam çolpa üçün bazara göndərildi. Qaloşlu adam bazara baş vurmadan, təngnəfəs özünü Məmmədxanın yanına saldı, o, bazarı dörd dövrə dolandığından, burada heç bir çolpanın olmadığından yanıqlı-yanıqlı şikayətləndi: Məmmədxan isə bu haldan çox şad olub, "mən taparam", – deyib onu geriyə qaytardı. Çox çəkmədi, Məmmədxan bir cüt çolpa gətirdi. O, qapıda Qaloşlu adamı görüb öskürdü, işarə ilə içərini soruşdu. Qaloşlu adam baş işarəsi ilə Mehmanın evdə olduğunu bildirdi. Məmmədxan əli dolu gəldiyini bildirmək bəhanəsilə çolpaları tərpədib cığıldatdı və cəld qapının ağzına tulladı. Yavər Murtuzova bayıra çıxdı.

– Xəstə xanım üçün bəlkə çolpalı sup bişirəsiniz, – deyə Məmmədxan başını içəri salıb Mehmana təzim etdi. Onu qaşqabaqlı görüncə geriyə çəkildi. Qayıdanda pilləkəndə Murtuzovla üz-üzə gəldi.

– Haradan belə, aşna?..

– Heç bura çolpa gətirmişdim!

– Yaxşı da eləmisən... O günü kişi utandığına görə evdən çıxıb getmişdi, – deyə Murtuzov özünün baş tutmayan qonaqlığına işarə etdi.

– Sonra Züleyxa xanım mənə dedi, Mehmanın əvəzinə bizdən üzr istədi... Çox da yaxşı, əcəb eləmisən! Bu dünyada adama adamlıq qalar... Daha bax, gör nə var, yenə ələ düşən çol-çolpadan, zaddan gətir!.. İtər yerə getməz, başa düşdünmü? "Yüz gün yaraq, bir gün gərək", qandınmı?

Murtuzov bu sözləri deməklə Məmmədxanın gözləri içinə baxdı.

– Hamısı aydındır, – deyə Məmmədxan əlini sağ gözünün üstünə qoydu.

– Bu aranlarda deyərlər ki, arxı bərədən bağlarlar! Bizim bu arx elədir ki, buraya hər bir vətəndaşın işi düşə bilər!

– İşimiz düşməsə də, qərib qonağa hörmət bəsləmək bizim şərəfli borcumuzdur!

– Görünür, daha əlifbey qanırsan!..

– Müəllimi Murtuz dadaş olan necə qanmaz?

Qaloşlu adam bu danışığa qarşı eyvanın o biri küncündən dilləndi:

– Adamlığa nə söz? Bunların hamısı bu dünya üzündə adamlıq üçündür!

Murtuzovun iri qırışıq dodaqları qaçdı.

– Onu da bilmək ki, hər şeyi öz vaxtında əkib öz vaxtında biçərlər, yoxsa taxılı göy-göy biçməzlər!

Murtuzov sağ əlini sol biləyinə qoyub:

– Çıqqıldayan, necə? – deyə gözünü Məmmədxanın gözündə gəzdirdi. – Balaca dəyirmi?..

Məmmədxan Qaloşa tərəf göz vurub güldü:

– Biz elə şeyləri bilmərik, – deyib üstünü vurmadan ötüb sovuşdu.

Murtuzov arvadı Yavəri barmağıyla eyvana çağırıb tapşırıq verdi. Yavər əl-ayağa düşüb çolpa şorbasını hazır elədi. Zərrintac isə buğlanan şorbadan çini qaba töküb xəstəyə apardı. Xəstə təkrar: "mamamı gətirin", – deyə gözünü açmadan əli ilə şorbanı rədd etdi. Bir az sonra Kamal Sərrafzadə həkimlə birlikdə gəldilər. Kamal bacısından Züleyxanın halını soruşdu, Zərrintac başını ağır-ağır buladı, həkim xəstəni təkrar-təkrar müayinə etdi, sonra həkim Mehmana üz tutub dedi ki, xəstənin arzusunu yerinə yetirmək onun səhhəti üçün xeyirli olardı və azarlının əsəbiliyi kəsilərdi. Yoxsa xəstənin halı daha da ağırlaşacaq, nə qədər müalicə olsa belə təəssüf ki, istənilən nəticəni verməyəcəkdir.

– Əlac ancaq əsəbi gərginliyi aradan götürməkdən ibarət ola bilər, – deyə həkim öz dediyində israr etdi. – Əsəbi sarsıntını aradan qaldırmaq gərəkdir!

Yavər Murtuzova, Zərrintac Sərrafzadə, onun qardaşı Kamal Sərrafzadə, onun qardaşı Murtuz Murtuzov və Qaloşlu adam həkimin sözünə

qüvvət verib Züleyxanın belə qəfil xəstələnməsi ilə bərk həyəcan keçirən Mehmana üz tutub xahiş etdilər ki, təcili olaraq xanımın anasına teleqram göndərilsin... Həkim öz dövrəsinə baxınca, onun sözünə bu qədər qüvvət verən adamın tapıldığı üçün baş əyib hamıya razılıq etdi. Axırda o, evdən çıxa-çıxa təkidlə:

– Çox fəna təsiri ola bilər, – dedi, – son peşmançılıq çox ağır nəticə verə bilər. Hər halda əsəbi gərginlik çox güclüdür. Maması gəlməli, xəstənin sakitliyi bərpa edilməlidir!..

Həmin bu adamlar yenə də bir ağızdan həkimin sözünə şərik olub onun dediklərini təsdiq etdilər. Murtuzov isə bir neçə addım qabağa yeriyib:

– Yoldaş prokuror, – deyə əmrə hazır bir vəziyyətdə boynunu uzatdı, – mən şəxsən özüm gedim, onsuz da mərkəzə gedəcəyəm. O işləri də aparım, xalanı da özüm götürüb gətirim!

Zərrintac da Murtuzovdan geriyə qalmaq istəməyib:

– Bağçanın işləri üçün mən özüm də maarif komissarlığına getməliyəm, – deyə qulluq göstərmək istədi. – Gedim, ananı da gətirim! Görünür, Züleyxanın dərdinə hər kəsdən artıq anası şərik ola bilər...

Yavər Murtuzova isə həyəcana gəldi, dönüb Züleyxanın alnından öpdü:

– Bacısı qurban! – dedi. – Lap hamımız gedib bacımın mamasını, gecə vaxtı gətirərik!..

– Bir görürsünüzmü, maral kimi qız! – deyə Zərrintac əli ilə Züleyxanın saçlarını sığallaya-sığallaya sözünə davam etdi: – Görəsən hansı oxlanmışın gözünə, hansı bıçaq batmışın nəzərinə, hansı dili qurumuşun dilinə gəldi?!.

Mehman xəstənin belə qeyri-müəyyən vəziyyəti qarşısında tərəddüd etdi, Zərrintac Mehmandan əl çəkmədən təvəqqe etdi. Nəhayət, o üzünə salıb Mehmana teleqram yazdırıb Qaloşlu adama verdirdi. Murtuzov Qaloşlu adamın qolundan yapışıb:

– Ə, nəçəlniyi tapıb deyərsən ki, Murtuz deyir, molnıyadır!

Züleyxanın qızğın arzusu nəticəsində, Şəhla xanımın bu evə gəlməyi, Mehmanın keşiyində dayanan Xatunun buradan əbədi uzaqlaşması demək olduğunu dərk edən bu adamlar bu barədə danışmasalar belə bir-birini anlamağa başladılar. Yavər Murtuzovanın mat-mat baxan gözlərindən savayı, bütün gözlər bir-birinin ürəyindən xəbər verir, bu gözlər, işə qılınc kimi prokurorun tez bir zamanda korşalacağını söyləyirdi. Qaloşlu adam hiyləgər baxışlara yekun vurur kimi başını dolandırıb

əydi, "hə!" – deyə getdi. O, tələsik addımlarla yeriyib poçt rəisinin otağına girdi:

– Molnıyadır, qadası!

– Hara belə, Qaloş?..

– Oxumursanmı, prokurorun qayınanasına...

– Bəs deyir, anası buradan acıqlı gedibdir?

– Çünki o düşük bir arvad idi!

– Niyə, Qaloş?

– Acgözün birisi idi, naçalnik!

– Ona görə yəqin ki, prokuror yoldaş özü onu yola salıbdır, hə?

– Nə isə, bizə nə düşüb ki, ətlə dırnaq arasına girək? Sən molnıyanı qanadlandır, getsin, naçalnik!

Poçt rəisi teleqramı gözdən keçirib "Şəhla" sözünü diqqətlə oxudu: "Şəhla Mamayevaya!.."

– Görəsən, bəs bu necə arvaddır?

– Adının, bir də qızının yaraşığına baxanda, görünür, xanımdır, – deyə Qaloşlu adam hiyləgərcəsinə gülümsəyib başını tərpətdi və sonra o, teleqramı öz gözü qabağında verdirib arxayınlaşdı. – "Anası çıxan ağacı, balası budaq-budaq gəzər". Əgər o Şəhla xanım, mən bilənsə, onun tamahı Mürtəza Əli qılıncından itidir". – Nə isə işin bu cür gedişi Qaloşlu adamı açır, prokurorun evinə qızıl saatın yeridilməsi ona zövq verirdi. – Qoy bu qaratel oğlan, açsam ovcumda, yumsam yumruğumda olsun, – deyə ürəyində sevinən Qaloşlu adam buradan çıxıb astadan fit çala-çala geriyə döndü və:

– Molnıya getdi, – deyə evdə xəbər verdi.

– Çox gözəl, – deyə Zərrintac Sərrafzadə evin bir müvəkkili kimi cavab verdi. – Sonra astadan göz basdı, onun ovurdları çalalandı. "Bu Qaloş, yüz cüt boğazlı çəkməyə dəyər".

– Bu molnıya çox yaxşı oldu, – deyə Murtuzov da adəti üzrə əllərini ovuşdurdu: – çox gözəl oldu!

Gözlərini Züleyxanın üzündən çəkməyən Mehman dönüb çox asta, ancaq şübhəli bir nəzərlə bu canfəşanlıq edən adamları süzdü, onun ürəyinə şübhəli bir xal düşdü:

## XXVI

Gecənin yarısı idi. Şəhla xanım qollarını qu tükündən olan nazbalışa sərdiyi halda fısafısla yatmışdı. Bu əsnada zəng arası kəsilmədən

çalındı. O, qollarını çəkib əsnədi, qulaq verdi. Zəng aram eləmirdi. O, ayağa qalxıb zərli xələtini geydi, qulluqçu qadını oyatmadan qapıya özü ehtiyatla yanaşıb:

– Kimdir? – deyə soruşdu.

– Molnıya, açın!

– Haradandır? – deyə Şəhla xanımın zəfəran kimi saralan ətli sifəti, qapı başında yanan göy zəif işıq altında gömgöy göyərdi.

– Açın qapını, Şəhla xanım Mamayeva!..

Şəhla xanım Mamayevanı bərk bir titrətmə tutdu: o bərk-bərk xələtinə büründü, qapını açdı, teleqramı aldı, balaca qəbzə qol çəkib qaytardı. Teleqramı oxudu. Narahatlıqdan sabaha kimi yata bilməyib yerində eşələndi. Tezdən qulluqçusunu ayağa qaldırdı, yol üçün bəzi tədarük görməyi ona tapşırdı. Özü isə bacısı Katibə xala vasitəsilə bilet əldə edib həmin gün birinci qatarla yola düşdü. İkinci günü, sübh tezdən Murtuz Murtuzov Şəhla xanımı vağzalda qarşılayıb:

– Siz yoldaş prokurorun qayınanası olmayasınız? – deyə ehtiyatla soruşdu. – Bizim Mehmanın?

– Bəli, necə bəyəm?

Murtuzov tanışlıq verib, Şəhla xanımın çamadanından yapışdı:

– Arxayın olun, – deyə Murtuzov irişdi.

Şəhla xanım gedə-gedə soruşdu:

– Züleyxa necədir?

– Lap yaxşı... Bir qədər darıxırdı... Biz prokurordan xahiş etdik ki, sizə teleqram vursun!..

– Bəs niyə molnıya? Gecə yarısı?.. Məndə ürək qalmadı!..

– Ancaq tez olmaqdan ötrü! Mən özüm şəxsən bizim kuryerə tapşırdım ki, naçalnik özü molnıyanı versin. Çünki mən özüm yoldaş Mehmanın birinci müaviniyəm. Özümüz də birevli olmuşuq. Mən, bizim yoldaş Yavər ilə birlikdə Züleyxa xanımın yastığının dibindən getməmişik, bu neçə gündə elə-belə düzü sizi də könlümüz istədi.

– Molnıya mənim ürəyimi qırdı... Gecəyarısı birdən Mamayevaya?!.

– Çünki Züleyxa xanım, hey “mama” deyirdi, biz də qərar çıxardıq ki, tez olsun!

– Bizim qız ərköyün böyüyübdür, çox ərköyün!

– Bəli, çox nazlı baladır!

– Qədirbilən yanında! – deyə Şəhla xanım ah çəkdi.

Mətləbi tez alan Murtuzov:

– Bəli, – dedi, – bir az qayınanası deyingəndir!..

– Mən də elə onu demək istəyirəm, o çustlu-pustlu arvadı!

– Bir həftədən çoxdur geriyə qayıdıbdır!

– Mən də elə onu demək istəyirəm! Biz onu da körpələrə qoşub rayona göndərmişik ki, onlara göz olsun, o da qaş qayırdığı yerdə vurub göz çıxarıbdır!

– O arvad bir az ürkəkdi, dünya görməmiş!

– Ürkək olmasaydı, dünya görsəydi, elə gəlini bir şam kimi araya qoyub, pərvanə kimi onun başına fırlanardı!

– Vallah, bizim hamımız elə Züleyxa xanımın başına gecə də, gündüz də pərvanə kimi fır-fır fırlanırıq, – Murtuzov irişdi. – Od tutub yansaq da kənara qaçmırıq. Yavər bacı Züleyxa xanımın hər bir hıqqıltısına beş dəfə can deyir, qurbanın olum deyir.

– Mən çox razıyam sizdən!

Bu ilk söhbətdən xoşhal olan Murtuzov, Şəhla xanımın çamadanını çox asanlıqla avtomobilə qaldırdı. Dolamalı yollar dolanıb onlar axşama rayon mərkəzinə çatdılar. Mehmandan xəbərsiz vağzala gedən Murtuzov Şəhla xanımın çamadanını maşından ehmallı götürdü. Onlar pilləkən yuxarı Mehmangilə çıxdılar. Şəhla xanım qızını yataqda gördü. Züleyxa yerindən qalxıb anasının boynunu qucaqladı. Bir azdan sonra həkim gəldi. Xəstənin qızdırmasını ölçdü:

– Düz otuz yeddi, – deyə həkim şad xəbər verdi. – Əsəb istirahətinin böyük möcüzəsi gör nəyi göstərir?

– Çox sağ olun, doktor, – deyə Şəhla xanım həkimə təşəkkür etdi.

– Bəli, əsəb! Bütün müalicələr əsəblərin müalicəsindən başlanmalıdır!

– Bəli, bizim qız çox ərköyündür, doktor!

– Mən orasını bilmişəm, ona görə də xəstə xanımın əsəbləri sakit olsun deyə mamasının gəlməsini, onun yanında olmasını lazım bilmişəm.

– Təşəkkür! – deyə Züleyxa topbığ həkimə öz minnətdarlığını bildirdi.

– Bəli, bir əsgər kimi, bizim borcumuz insan əsəbinin keşiyində dayanmaqdır!

Bu qayda ilə ümumi şadlıq buranı bürüdü. Yavər Murtuzova bu gündən etibarən Şəhla xanımın qulluğunda dayandı. Zərrintac təzə qonaqla mehriban söhbətə girişdi. Bir neçə gün də öz yataq yerində istirahət edəndən sonra, Züleyxa ayağa qalxdı. Şəhla xanım əldə etdikləri ikinci otağı, tör-töküntülü mətbəxi Yavərə təmizlədib düzəltdirdi. Şəhla xanım Qaloşlu adama uzun siyahı verib onu bazara göndərdi. Yavər zəfəranplovdan başlamış müxtəlif xörəklərdən bişirdi. Arabir Murtuzov da nahar

üçün bura yol aldı. Məmmədxan da hərdənbir bura baş vurub Şəhla xanımın qulluğunda hazır dayandı.

Kamilov qapıda dolanan ucaboy, ətli-əndamlı, qara krepdeşin libaslı xanımı görüb udqundu. O, Murtuz Murtuzovu şəhadət barmağı ilə tez yanına çağırıb:

– Ə, noxudu keçəl, bu nə əhvalatdır? – deyə qonşuluqda yaşadığı evin həyətindəki Şəhla xanımgil tərəfə işarə etdi. – Bu nə xəlbir gətir, ayran apardır, balam, sizdə?.. Olmuya təzə naçalniklə malı mala qatmısınız, hə?

– Əşi, bir-iki aydan sonra nə təzə, nə köhnə?

– Onu bilmirəm, bəs o kimdir?

Murtuzov özünü bilməməzliyə qoyub:

– Nəyi buyurursunuz, yoldaş Kamilov? – dedi.

– Ədə, məgər ərəbcə deyirəm ki, başa düşmürsən, ay şüursuz! Bax, onu deyirəm, o həyətdə fır-fır fırlanan xanımı!.. Pah, atonnan, ədə Murtuz, o bir dağdır ki!.. Həyət-bacaya da yerləşmir ki!.. Ədə, bu qonaqlığa-zada bizi də çağırsana!..

– Demək, bizlə barışırsınız? Demək daşı ətəyinizdən tökürsünüz?

– Sən öl, hə, Murtuz, lap get indidən o atı da geriyə götür, yəhəryüyəni də, ipi-noxtanı da!..

– Bəs "Salamatov əhvalatı?" Bəs "əsas?" Bəs aramızdakı barışmaz alovlu ədavət?..

– Ay dəli, qohum olan yerdə ədavət də sönər, hələ dünyanın alovu da!..

– Lap qan da bağlanar, bunu bilirəm, – deyə Murtuz Murtuzov özünü Kamilov tərəfə verib qonşu qapıda dolanan Zərrintac tərəfə işarə etdi:

– Hansı qəşəngdir bu xanımların?..

– Ay kal, hər meyvənin bir dadı var!

Onlar bir an bərabər ixtiyara malik adamlar kimi çiyin-çiyinə dayanıb gülüşdülər. Murtuzov əlini xoşhallıqla gözünün üstünə qoyub:

– Ancaq bir az səbir elə, – dedi. – Səbir, səbir!.. Bir iş var, iki əməl! Mən sizin bu sağalmaz mərəzinizi müalicə etməyə çalışıram, Kamilov!..

– Elə bu qayda ilə də hərifi içəridən çürüdüb o dəli atının belindən üzü üstə torpağa gətirərik!

– Elə bizim də bütün zəhmətimiz, Kamilov, başın haqqı bunun üçündür! İçəri, bağırsağına əl atıb içərini sökmək!..

– Lap ciyərini çəkib sinəsindən çıxarmaq! – deyə bir an içində Kamilov dəyişdi, o, titrəyən əlini yumruqladı. – Bütün zarafatlar bu "əsas"

üstündədir. Onda Muradoğlu Atamoğlanov, Mehman cənabları prokuror, öz gözlərilə görər ki, dəvəni xizəklə qorxutmaq nəyə deyərlər?..

Klub müdiri, rejissor və aktyor Əbdülsalam qarşıdakı ilk tamaşa üçün həyəcan keçirirdi. Əgər onun bu axşamkı tamaşası istədiyi kimi tutsaydı, kefi heç şübhəsiz kökələcək, damağı çağlanacaq, tamaşa bir neçə gün də gur-gurultu ilə gedəcək, həm həvəskar aktyor kollektivinin hörməti artacaq, həm də klubun boşalan kassası siləbəsilə dolacaq, iki ayda bir dəfə də olsa Əbdülsalam öz aktyorları üçün xüsusi maaş cədvəli tərtib edib, klubun fədakar aktyorlarını mükafatlandıracaqdı. Buna görə də Əbdülsalam qapaqlı gümüş saatına müraciət etmədən müqabil tərəfdəki başıqarlı dağların təpəsinə sancılan payız günəşinə baxır, həvəskarların idarə işlərindən tez çıxıb gəlmələrinə diqqət edir, qarşıdakı qələbənin məstedici əhval-ruhiyyəsi ilə yaşayır, həvəskarları daha öz adları ilə deyil, rollarına görə çağırırdı:

– Demək qoçu Əsgər də buradadır? – Əbdülsalam əynindəki pal-paltarını sivirib-tökür, əzilib-əzilmədiyinə etina etmədən küncə atır, rol paltarına girmək üçün işə girişir, onun qırğı gözləri gəzirdi:

– Qoçu Əsgər, keç qrimə!.. Tez-tez!..

Ara verir, ayna qabağında geyinən Əbdülsalam Məşədi İbadın şəvə saqqalını çənəsinə keçirib başına daz parik qoyur, hərlənə-hərlənə uzun sarığını belinə bağlayıb özü üçün tirmə şaldan mötəbər qurşaq düzəldir, nallı başmaqlarının üstündə fır-fır fırlanır: "Ay maralım Gülnaz, ay ceyranım Gülnaz!" – deyə dodaqaltı zümzümə edirdi. Aradabir o, zümzüməsini dayandırıb müdriklik vəzifəsini də başlı-başdaşına buraxmırdı:

– Demək bu da intiligent Həsən!

– Bəli mən də gəldim, Əbdülsalam!

– Hımm!.. O da qəzetçi Rzabəy!

– Mən lap tez geyinəcəyəm, möhtərəm rejissor!

Əbdülsalam divara bərkidilən uzun ayna qabağında Məşədi İbada xas şəvə saqqalını tumarlayır, həyəcanlı sevinc hisslərilə yaşayırdı. Zarafat deyildi ki... Məşədi İbad toy edəcək, gül kimi cavanəzən Gülnazı alacaq idi... Onun xəsis əlləri əssə də, cavan yolunda pul tökəcəkdi... Ancaq nəticədə kişinin başına it oyunu açılacaqdı... Toy dəsgahından sonra çadradan Gülnaz əvəzində əli tapançalı Sərvər çıxacaq, Məşədi İbadın dədəsini yandırıb, cəvanəzən Gülnazın əvəzində ona kaftar qulluqçunu verəcəkdi... Al-al dürt gözünə bu kaftar, heyvərə, hoqqar arvadı, arığı-pazağı!.. "Son facieni" xatırlayınca onun gözləri doldu, istər-istəməz dönüb rəqibini sordu.

– O hanı bəs?
– Sərvərmi? – deyə qoçu Əsgər dilləndi.
– Bəəli!.. – Məşədi İbad Quranı qiraət edir kimi, “bəəəli” sözünü boğazında qaynada-qaynada uzatdı, bir an ara verincə kölgə basmış dəhlizdən yenə də ayaq səsləri eşidildi.
– Hambal gəldi! – deyə hamı bir ağızdan dilləndi, hər kəsi şux bir sevinc bürüdü.
– Bəs Sərvər, ağa?! – deyə qoca Məşədi İbadın böyüyüb ağaran gözləri döş-döşə gəlmək üçün öz cavan rəqibini axtardı. – Bəs o cavan bozbala gədə hanı, balam?..
Hər kəsin gözü qapıya tərəf çevrilsə belə, yenə də klubun çox da zəngin olmayan pal-paltarından geyinir, hər bir aktyor özünü səliqə-sahmana salıb düzəldir, öz rolunu dodaqaltı təkrar edir, səhnəyə hazırlaşırdı.
Daha, geyinib-kecinən, Məşədi İbad rolunda səhnəyə çıxmaq üçün hazır olan Əbdülsalam, sakitlik bilmir, bir vəzifədaş kimi onun səbri tükənirdi. Bu dəfə o, cib saatını dartıb çıxardı və papağını açdı.
– Balam, Sərvərsiz ki, iş aşmaz!
– Sən Sərvəri ikiəlli tutmusan, heç Gülnazı demirsən. Məmmədxan arvadı Balışı!.. – Hambal rolunu ifa edən poçt məmuru təlaşla xəbər verdi. Onsuz ki, dünya dağıla səhnənin işi aşmaz!
– Mənim ürəyim Balışdan yana arxayındır! – deyə Əbdülsalam gödək çuxasını yellədə-yellədə kölgəli dəhlizi ötüb qapı ağzına gəldi. – Budur Sərvər ağa da gəlir! – deyə dönüb dabanlarının üstündə dükçə kimi fırlandı, bir az keçincə rayon komsomol komitəsində kargüzarlıq vəzifəsində çalışan, ucaboylu uzun sümüklü, bığ yeri yenicə tərləyən oğlan da gəlib çıxdı, rəqiblər bir-birini süzdü. Sərvər qalib zövqlə gülümsədi. Məşədi İbad əlini tapan saqqalına atıb məğlub ah-zarla inlədi:
– Bəs bu Gülnaz hanı, bizim Balış xanım? – deyə Əbdülsalam daha da artıq bir narahatlıqla dilləndi: – Məmmədxan arvadı Balış, axı niyə, doğrudan da, bu qədər ləngisin?..
– Balışsız ki, əsla işimiz aşmaz! – deyə uzundilim papağını başına keçirən hambal əlini atıb birçəklərini düzəltməyə girişdi, nazik, uzun bığları altında oxumağa başladı. Bəli, hər kəs ciddi hazırlaşır, səhnəyə çıxacağını dərin intizarla gözləyirdi. Vaxt daralır, aktyor heyəti getdikcə daha ciddən narahat olur, dalğalanıb bir-birinə dəyirdi... Artıq əli biletli tamaşaçılar klubun qapısını tutur, salondakı skamyalar nömrələnmədiyindən hər kəs içəriyə can atır, adam olan bir-birinin dabanını qırırdı. Nədən ki, tez gələn, cəld tərpənənlər qabaq cərgələrdə, gec gələnlər

arxada otururdular. Hələ bir halda ki, “O olmasın, bu olsun” tamaşası üçün bir həftə qabaq bilet yayılmışdı. Əbdülsalam isə bir neçə gün əvvəl biletlərin satılıb qurtardığından öyünə-öyünə danışmış, bazar başından belə car çəkdirmiş, xoşbəxt saatlarını izhar etmişdi.

– Bəs bu Balış? – deyə Əbdülsalamın gözləri halqalandı. – Bəs axı, ay uşaq, bu qız axı, hamıdan qabaq gələrdi?!.

– Yəqin ki, indi camaat qabağında Balışın səhnəyə çıxmağına Məmmədxan ağa razı deyildir!

– Axı belə bir dəmdə Məmmədxan ağanın ağzı nədir? – deyə Əbdülsalam başmaqlarının üstündə dikəlib gödək büzməli çuxasını qabartdı, savaşa hazır olduğunu bildirdi: – Onun ağzı nədir?

– Ağzı bir ət, bir də sümük! – deyə Qoçu Əsgər dilləndi! – Daha nə olacaqdır? Deyir arvad mənimdir, vəssalam, şüt tamam!

– Siz özünüz bəs niyə öz arvadlarınızı səhnəyə çıxarmırsınız? – deyə un hazırlığında işləyən subay oğlan da Qoçu Əsgər rolunu ifa edən həvəskarın sözünə qüvvət verdi.

– Gərək arvad zalım qızının bir səhnəyə çıxmalısı olsun?! – deyə hambal öz palanını qaldırıb silkələdi. – Səhnə gözəl-göyçək məxluq istəyir, yoxsa donqabel, bozbaş arvadını istəmir, ay həzərat!

Sanki Əbdülsalamın ovqatına acı Hovsan soğanı çırtıldı. O, pərt və təlx oldu. Yer-göy biçarənin başına iynə ulduzu qədər daraldı. Hər kəs Məşədi İbad libasına girən şəvəsaqqal rejissoru dövrəyə aldı, o, ağlamsınan gözlərini həvəskarların üzərində gəzdirib:

– İndi, ay uşaq, bəs necə olsun? – deyə imdad istər kimi matı-qutu qurumuş dayandı. – Bəlkə deyirəm bu zalım anbardar elə Balışı evdə qoyub Məşədi İbad sayağı qapını zorba bir kilidlə qıfıllayıb?.. Özü də haradasa araq vurur...

– Birdən oldu-oldu?

– “O olmasın, bu olsun” Sərvər Balışın əvəzinə Gülnaz rolunda çıxar, mən də Sərvər rolunda! – deyə Qoçu Əsgər taxta mauzerindən yapışdı. – Qoçu Əsgərin rolunu da klubun kuryerinə verərik!

– “O olmasın, bu olsun” – deyə hambal dilimpapaqlı başını yırğaladı. – Canım işi, zarafata düzməyin, bura sizin üçün oyunxana deyil! Artıq bura böyük sənət ocağıdır! Vallahı tamaşaçılar adamın tükünü didərlər!

– Tamam-kamal rüsvay olarıq! – deyə Əbdülsalam gözlərində gəzən gilələri sildi: – mən lap doğrudan da, boğazımı birdəfəlik kəndirə keçirəcəyəm siz öləsiniz bu klubun əlindən!

Qızğın nəşə əvəzində soyuq bir kədər həvəskar kollektivini bürüdü. İndi tamaşanın baş tutmamağı nəinki axşamı, hətta sabahına, bütün günü böyük danışığa səbəb olacaqdı! Siyasi-maarif şöbəsindən tutmuş, rayon komsomol komitəsinə qədər hər yerdən – Əbdülsalamdan izahat tələb olunacaq, hər yandan o, məngənəyə alınacaqdı. Rayon qəzeti də göydən düşən bir sovqat boğçası kimi bu işi qapıb götürəcək, əlində dəstəvuz etməklə bir bağıracaq, hələ bəlkə öz səhifəsində xüsusi karikatura yerləşdirmək üçün qəzetinin məsul katibini tez təcili Bakıya göndərəcək, bəlkə bu əhvalat respublika qəzetlərinin səhifələrinə belə düşəcəkdi... – İndi bəs necə olsun? – Ürəyi titrəyən Əbdülsalam naçar halda soruşdu.

Səslər bir-birinə qarışdı:

– Gərək hamılıqca Məmmədxanı yaxalayaq!

– Məmmədxanı, niyə?

– Qoy Balışı versin, anbardar!

– Bəlkə zalımoğlu anbardar Balışı faytona basıb dağüstü şəhərə qaçırıbdır?

– Əşi, belə də şey olar?

– Oldu-oldu, nə olsun?

– Yox, uşaqlar, heç də dayanıb-durmaq yeri deyildir! – Məşədi İbad geyimli Əbdülsalam özünü bayıra atmaq istərkən Qoçu Əsgər onu yaxalayıb:

– Belə haraya? – deyə səsini qaldırdı. – Pulları buraya saymamış haraya gedirsən, Məşədi!

– Mənim bir abbasımı ver, Məşədi! – deyə hambal atmaca atdı. Başını itirən heyət bilmirdi, işi zarafata salıb gülsünmü, ya hər kəs başını bulayıb ağlasınmı?!

– Qoyun bir Məmmədxan ağaya dəyim! – deyə Əbdülsalam dartındı. – Qoyun bir bu kafəroğlu anbardarın lap ayaqlarına düşüm!.. Tərsinə dönsə yaxasından yapışıb düz Altayın yanına çəkim!

– Lap prokurorun öz yanına da çəkmək olar! – deyə hamıdan artıq tələsən, Balışla səhnədə dövran sürmək istəyən Sərvər qətiyyətlə qabağa durdu. – Qoy anbardar bizim qanun qabağında cavab versin!

Yerdən bir ağızdan səslər gəldi:

– Əlbəttə, qoy anbardar cavab versin!.. Qoy qadın azadlığının qabağına çıxmasın, kooperativ siçovulu!..

İşin çox ciddi yerdə olduğunu axırıncı olaraq dərk edən heyət yenə də ciddi sifət aldı, daha bu ayaqda heç kəs atmaca atmadı, onlar Əbdülsalamı

əhatə etdi, onu uzun-nazik paltoya bürüyüb, yaxasını qaldırıb saqqalını örtüb yola saldılar.

Əbdülsalam küçə yuxarı çaparaqladı. O özünü Məmmədxanın həyətinə saldı, qapıdan iri, yekə bir qıfıl asıldığını gördü, hər ehtimala qarşı qapını yumruqladı. "Balış! Balış!" – deyə bağırdı, səs-səmir gəlmədi. Əbdülsalam paltosunun ətəklərini əllərində dəstəkləyib küçə aşağı yortavladı, yan tərəfdəki kooperativ anbarına yönəldi, qapıda ayaq saxladı, boğazını uzadıb döşü atlana-atlana baxdı. O, içəridə neft lampasının işığında Məmmədxanı qapqara qaralan kağızlarla boğuşub-əlləşən, onlardan bir dəstəsini əlində toplayıb cırmaq istəyən gördü.

– Kimsən, ay adam? – deyə Məmmədxan hənirtiyə səksənib qalxdı. – Nəçisən? Kimi pusursan belə qara oğru kimi?!

– Mənəm! – deyə paltosunun boynunu endirən Əbdülsalam içəriyə girdi. Məmmədxanın qan çanağına çevrilən gözləri Əbdülsalamın top qara saqqalına zilləndi:

– Nə var, Məşədi İbadoğlu Məşədi İbad?

– Məmmədxan qardaş, bəs Balaş hanı?

Anbardar qudurmuş it kimi Əbdülsalamın üstünə qabarıb, qeyri-müəyyən səslə hürüb əlavə etdi.

– Balış, sən arsız oğlu arsızın qulluğunda dayanır, ya mənim, özcə qanuni ərinin? – deyə kişini boğazladı. – Özündə itirib məndə niyə axtarırsan, bu it balasını?!

– Axır, Məmmədxan qardaş, tamaşaya cəmi bircə saat da qalmayıb, – deyə Əbdülsalam paltosunun yaxasını açıb cib saatını çıxardı, qapağını qaldırıb onu Məmmədxanın qızaran gözlərinə tutdu. – Bir görürsənmi? Düz qırxca dəqiqə. Bunun geyinməyi, səhnəyə çıxmağı, heç bilirsənmi nə qədər çəkəcəkdir? Özü də bu gün axır premyeramızdır. Bayramımızdır! Biz heç zaman ləngiyə bilmərik! Onsuz da qəzetə bizi gözüqıpıq sərçəyə döndəribdir!

– Mənə nə, mənə! – deyə heybətli sifət alan anbardar xatırladı. – Axır, mənə nə, Məşədi İbadoğlu?

– Necə mənə nə? – Əbdülsalam dayanıb israr etdi. – Məgər sən, Məmmədxan qardaş, bizim vətəndaş deyilsən?

– Mən səndən də min qat artıq vətəndaşam, sonra?

– Sonrası Balış bacıdır!.. Bəlkə sən hirslənib onu içəridə qoyub, doğrudan da, Məşədi İbad kimi arvadı qıfıllamısan?

– Mən sənin kimi təlxək, oyunbaz, kələkbaz deyiləm, Əbdülsalamoğlu Əbdülsalam!

– Bəs indi necə olsun, necə olsun, Məmmədxan qardaş?

– Get, o yorğan-döşəkdə zıqqıldayan arvadını yeltələyib lüt-üryan səhnəyə çıxart, qoy düz dünya o mələk mənzərə tamaşa qılsın.

– O, illər zarıncısıdır, vallah, Məmmədxan qardaş!

– Cəhənnəmə-gora ki, illər zarıncısıdır, it qızı!

– Bəs, Balış axır nə olsun, Məmmədxan qardaş!

– Mən səndən soruşmalıyam, əbləh! – deyə Məmmədxan müqabilində dayanan, onun hər sözünü yeyən, tutduğundan qopmaq istəməyən Əbdülsalamı xırxaladı. – Balışı sən məndən yox, mən səndən soruşmalıyam, arsız!

– Mən dünən gecə özüm Balışı sağ-salamat sizin evə müşayiət elədim, – deyə Əbdülsalam udquna-udquna izahat verməyə başladı. – Bu gün gündüz də Balış bacı bizə görünmədi. Güman etdim ki, o rolunu əzbərdən də əzbərə bilir. Yəqin ki, Məmmədxan qardaş üçün evdə məşğuldur. – Əbdülsalam paltosunun yaxasını düymələyib qollarını yanına saldı.

– Lap sən mənim boynumu vurursan, Məmmədxan qardaş!

– Mən niyə, oğraş!

– Çünki Məmmədxan qardaş, Gülnazsız “O olmasın, bu olsun” olmaz!

– O, Sərvər itoğlunu, Altayın mirzəsini Balışın yerinə basın! Özünün də bütün vücudu, bütün yör-yöndəmi, yerişi, gülüşü zənənədir!

– Olmaz, Məmmədxan qardaş, əsla ondan Gülnaz olmaz. O, uzun, arıq, hoqqarın biridir!

– Demək sizə yumşaq lazımdır! – deyə Məmmədxan təkrar Əbdülsalamı yaxalayıb bayıra itələdi. – Gedin özünüzə fahişə tapın, ituşağı! Gedin özünüzə lotu tapın, donuzuşağı! – Məmmədxan stol üstündə parıldayan iri qəməltiyə baxınca Əbdülsalam qapıdan püfürək çıxıb cəld əkildi. O, küçəaşağı, kluba doğru qanadlandı, içəriyə girib arakəsmələrə göz gəzdirdi. Balışı heç yanda görmədi, başını sallayan aktyorlar da dinmədi. Artıq salonun səsi, səhnə arxası otaqları titrədirdi.

– Açın pərdəni!

– Çəkin pərdəni!

– Məşədi İbad!

– Məşədi İbad!

## XXVIII

Ani sükutdan sonra Əbdülsalam təkrar güllə kimi qapıdan çıxdı. O, küçənin qatı qaranlıq və işıq düşməyən yerlərilə yanlarını basa-basa

yeridi. Aktyor paltarını geyinən həvəskarlar qapıdan bayıra çıxmadan rejissorun qaraltısını gözdən itirincəyə qədər süzdülər.

– Yox, tamaşa pozuldu! – deyə əllərini dizlərinə vurdular. – Dərimiz didildi!

– Dədəmiz yandı!

– Hələ sən rayon qəzetəsini demirsən, necə də pusqudan qalxıb bar-bar bağıracaqdır!

– Hələ sən mərkəzi qəzetlərdən qorx!

– Hələ sən qorx ki, bizi öz iş yerimizdə də dilə-dişə salsınlar!

– Qoy bizim kimi arsızları lap didim-didim didsinlər!

– Sənətkarda Ərəblinski iradəsi gərəkdir! – deyə hambal geyimli həvəskar sinəsini qabağa verdi. – İndidən darınızı kola tökməyin, canım-gözüm, Allah kərimdir!

– Kərimin quyusu min arşınlıq quyudan da dərindir!

Əbdülsalamın qaraltısı həvəskarlarının gözündən itincə geriyə çəkildilər, darıxdıqlarından özlərini təkrar lampa yanan gözlərə verib üst-başlarını düzəltməyə, əzbərlədikləri rollarını dodaqaltı ifa etməyə başladılar...

Nəfəsi çiyinlərindən çıxan Əbdülsalam indi də özünü Altayın həyətinə saldı. İçəridə oturan Altay maşınkasını təmir etdikdən sonra artıq çox sevdiyi isti qayğanağı hazırlayıb qabağına qoymuş, təzəcə tikələməyə başlamışdı.

– Yoldaş Altay, yoldaş Altay! – deyə Əbdülsalam dəli kimi tarap-turupla qapı ağzından içərini səslədi. – Siz, sizsə barı, evdəsinizmi barı?

Bu hövlnak bağırtıdan Altay səksəndi, tikəsini güclə udub qapını açdı:

– Nə var, nə olub, kişi?

Uzunpaltolu, dəripapaqlı, qarasaqqallı, indiki zamanda gözə az dəyən, komsomolun iş dairəsində çətin nəzərə çarpan qoca təngnəfəs halda:

– Yoldaş Altay, – deyə bir neçə dəfə təkrar etdi. – Barı siz buradasınızmı?

– Nə var, əmican, belə qaranəfəs? – deyə Altay heyrətlə qəribə qocanı süzdü, – nə olub sizə? Mənə görə nə qulluq?

– Yoldaş Altay, yoldaş Altay, tamaşa pozulur!

– Nə tamaşası pozulur, əmican?

– “O olmasın, bu olsun” – “Məşədi İbad!”

Altay zənn etdikdən sonra Məşədi İbad roluna girən Əbdülsalamı tanıdı.

– Necə yəni tamaşa pozulur, Əbdülsalam?

– Pozulur, pozulur, məsləkim haqqı pozulur!

– Axı nə üçün pozulur? Niyə, nədən ötəri pozulur?

– Çünki, çünki baş, baş qəhrəman yoxdur!.. Baş qəhrəman yoxdur!

– Bəs sən, bəs sən? – deyə Altay rejissorun beyninin xarab olduğunu güman edib geriyə çəkildi və istədi səhiyyə şöbəsinə zəng edib təcili yardım istəsin.

– Siz hara belə zəng etmək istəyirsiniz? – deyə Əbdülsalam təəccüblə soruşdu. – Haraya axır zəng edirsiniz?

– Bir mühüm yerə, Əbdülsalam!

– Dairəittifaq sədrinəmi?

– Yox, səhiyyə şöbəsinə!

– Yəqin belə güman edirsiniz mənim kəlləm xarab olub, eləmi? – deyə Əbdülsalam acı-acı güldü. – Doğrudan da, kim mənim yerimdə olsa, nəinki dəli, lap zırrama olar!

Altay soyuyan qayğanağa həsrətlə baxıb telefonun dəstəyindən gözlərini çəkdi, daha aramla nəfəs almağa başlayan Əbdülsalam irəliyə gəlib izahat verdi, tamaşaya çox az qaldığını, Məmmədxanın hədərəcavablığını, onu yaxaladığını, qəməltiyə baxdığını söyləyib, üyüdüb tökdü.

– Bəs indi, doğrudan da necə olsun? – deyə Altay bu işin uzun sürəcəyini duyub, soyuyan qayğanağını tez-tez tikələyib ötürdü. Komsomol katibinin belə nisbi soyuqqanlığı müqabilində Əbdülsalamın əl-ayağı yerdən-göydən üzüldü:

– Mən sizə pənah gətirmişəm, yoldaş Altay, – deyə Əbdülsalam başını əydi. – Mən o səhnədə ancaq sizə söykənmişəm, bizim şanlı komsomola!

– Deyirsən yəni mən özüm gəlib hazırlıqsız-zadsız sizin səhnəyə çıxım? – Altay qayğanaq boşqabının dibini də sil-süpür edib, aclığını dəf etdi. – Buyurursan, Əbdülsalam, mən soyunmamış, geyinməmiş, əzbərləməmiş səhnəyə atılım?

– Bizə Balış gərəkdir, yoldaş Altay, ancaq Balış!

– Mən ki, indi dönüb sizdən ötrü Balış ola bilmərəm. – Əbdülsalamı əlhayda görən Altay gülümsədi. – İstəsəm də mən Gülnaz rolunu ifa edə bilmərəm.

– Siz yəqin ki, zarafat eləyirsiniz, yoldaş Altay! Biz isə qan ağlayırıq. – Əbdülsalam qaynayan gözlərini sildi. – Vallah, məsləkim, vicdanım haqqı, lap batan, ölən yerimizdir, Altay yoldaş!

– Düzü çox yaman acmışdım! – deyə Altay əlüzyuyana yaxınlaşıb dönüb əlini boğazına atdı. – Siz özünüz əcəb bilirsiniz ki, bu hal necə

böyük biabırçılıqdır!.. Bütün şəhər ayaqlanıb üstümüzə qalxacaqdır!.. Bütün adamlar der-der deyinəcək, bütün biletlər bizim başımıza çırpılacaqdır! Olan-qalan abrımız, hörmətimiz, ismətimiz töküləcəkdir!.. Sonra heç bizim bədbəxt klub yağ da içsə, özünə gəlməyəcəkdir!

– Tamaşanı əsla pozmaq olmaz! – deyə artıq mətləbin bərninə enən Altay Əbdülsalamın gözlərinin içinə baxdı. – Heç bilirsənmi, doğrudan da, nə boyda bir rüsvaylıq olar?!

– Əlac ancaq Balışı tapmaqdadır! – deyə Əbdülsalam az qala ki, Altay qarşısında dəvə kimi dizləri üstündə düşmüşdü. – Əlac yerinə tərkindən, göyün yeddi qatından, indinin bu anında Balışı tapmaq, klubun səhnəsinə çıxarmaqdır!..

– Onda, onda, – deyə Altay telefona yanaşdı, dəstəyi götürüb Mehmanın mənzilini aldı, – Züleyxa xanımdır? – Altay hörmətlə xəbər aldı. – Mehmanı olarmı?.. Yoldaş Atamoğlanovu?

Mehmanın səsi gəldi. Altay klubdakı tamaşanın pozulmaq təhlükəsi qarşısında dayandığını söyləyib, anbardar Məmmədxanın yaramaz hərəkətlərindən şikayətləndi. Mehmanı dinləyən Altay bütün ciddiyyəti ilə: – Bu hərəkət qadın azadlığının əleyhinə çıxmaqdır, – deyə neçə il qabaq Bakıda baş verən "Səriyyə məhkəməsini"* xatırlatdı, sonra dəstəyi yerindən asıb Əbdülsalamla birlikdə qapıdan çıxıb kluba tərəf yönəldi. Onlar yeriməkdən artıq yüyürürdülər, vaxt artıq səkkizdən ötmüş, salon qabağa qədər dolmuş, klubun həyətini də səs-küy götürmüşdü. Arada əl vurulur, dolu salon partlayırdı.

– "O olmasın, bu olsun"

– Məşədi İbad! Məşədi İbad!

– Muzıka! Muzıka!..

– Heç olmazsa, muzıka!..

Aktyor kollektivi kükrəyib dalğalanan izdihamın qarşısında başını itirmişdi... Hər kəs gözünü buyankı qapıya dikmişdi. Ətəkləri yellənən Əbdülsalamın Balışsız dönməyi, onların olan-qalan ümidlərini də puça çıxardı.

– Bəs necə olsun, yoldaş? – deyə həvəskar kollektivi rayon komsomol komitəsi katibi Altayı əhatə etdi. – Həmişə deyərdiniz, siz cürətlə

---

* Səriyyə məhkəməsi 1930-cu illərdə Bakıda olmuşdur. Yenilik, azadlıq tərəfdarı Səriyyə Əli Bayramov adına "Şərq qadını" klubunda fəal iştirak etdiyinə görə öz əri, atası və qardaşı tərəfindən vəhşicəsinə öldürülmüşdü. Bu hadisə ictimai hiddət və qəzəb doğurmuşdu. Respublika mətbuatı bu qətlə qarşı kütləvi etiraz səsini ucaltmışdı. Sovet məhkəməsi uzun sürən mühakimədən sonra qatilləri ağır cəzaya cəlb etmişdi.

səhnəyə çıxın, dar ayağında komsomol sizə dayaqdır!.. İndi bundan da artıq nə dar ayağı?!

– Barı siz bizə kömək edin, Balışı tapın! – deyə ürəyi atlanan Sərvər geyimli komsomolçu ayrıca olaraq xahiş etdi. – Yoxsa lap başımızı itirmişik?!

– İndi elə iş də Balışı tapmaqdadır, – deyə Altayın fikri dolanınca prokuror Mehman Atamoğlanovla milis rəisi Bənnaoğlu Cabir içəriyə girdilər.

– Kimdir o qadın azadlığının əleyhinə çıxan, köpəkoğlu? – deyə milis rəisi döşü atlana-atlana soruşdu, prokuror əlini qaldırıb milis rəisinə işarə etdi.

Aktyor heyəti bir-birinə macal vermədən çətin və çıxılmaz vəziyyətə düşdüklərini söylədi. Mehmanın fikri dolandı. İki həftə bundan qabaq həmin bu səhnənin arxasından Balışa tərəf uzanan hədələyici barmağı xatırladı. Prokuror, Məmmədxanın o yandan bəriyə kömür kimi qaralan sifətini də təsəvvürünə gətirdi, o, bu barədə indilikdə heç bir söz demədi, işarəli bir hərəkət belə etmədi. Sonra Mehman bugünkü tamaşanı sakitliklə dayandırmağı, klub müdirinin səhnəyə çıxıb camaatdan üzr istəməyini məsləhət bildi.

– Bəs soruşsalar nə üçün, onda nə cavab verim, yoldaş prokuror? – deyə Əbdülsalam burulğanda boğulan bir uşaq kimi kəkələyib soruşdu. – Bilirsinizmi, camaata cavab vermək necə çətindir, məsləkim haqqı!

– Deyin ki, aktyorlarımızdan xəstələnən vardır!

– Bəs desələr kim xəstələnibdir, onda necə? – Əbdülsalamın saqqalı titrəyirdi. – Onda bəs nə cavab verim?

– Bəli, doğrudan da, soruşsalar kim xəstələnib? – Mehman bir an dayanınca hövsələsini yeyə bilməyən milis rəisi əlavə etdi:

– Deyərsiniz, nə isə bu kələk qolçomaq balası anbardarındır!

– Hələ bu barədə heç nə, – deyə Mehman əlini qaldırıb ürəyində dolanan şübhəni büruzə vermədən sözü aldatmağı lazım bildi. – Əgər təkid edərlərsə, onda deyə bilərsiniz, Gülnaz rolunu ifa edən aktrisamız xəstələnibdir!

– Birdən Balışgilin evinə gedib tapmasalar necə?

– Siz indilik tamaşaçıların qarşısında nəzakətlə üzr istəyib tamaşanı dayandırın! – deyə Mehman qərarını bildirdi. – Sonrasını biz qanuna müvafiq yolla özümüz aydın edərik!

Altay Məşədi İbad geyimini geyinən, əzizi ölmüş kimi qara yasa batan Əbdülsalamı tərpətdi, nəhayət, Əbdülsalam Məşədi İbad geyi-

mində səhnəyə çıxdı, o, titrəyən barmaqlarıyla pərdəni araladı, hamı ona əl vurdu, Əbdülsalam uçunan əlini qaldırıb:

– Möhtərəm tamaşaçılar, – deyə səsini çıxarınca tutulub qəhərləndi. Səs-küy yavaşıncaya qədər o boğazını arıtlayıb təkrar: – Möhtərəm yoldaşlar, – deyə başını aşağı salınca hənalı saqqalı sinəsinə sərildi.

– Nə möhtərəm, tamaşanı verin?!

– Özü də yarım saatdan artıq ləngimisiniz!

– Əziz qardaşlar, – deyə Əbdülsalam kədər içində titrəyib-əsən, qurğuşun kimi ağırlaşan əlini qaldırdı, salon bir anlığa sakitləşdi. – Biz sizdən, bizim hörmətli, əziz tamaşaçılarımızdan çox-çox üzr istəyirik... Biz sizdən...

Salon yenə də dalğalandı.

– Yaxşı da, ləngimisiniz-ləngimisiniz. Məşədi İbadın saqqalına qurbandır!

Əbdülsalam əlini gətirib saqqalını çıxartdı, onun turşuyan sarı, acı sifəti göründü. Əbdülsalamın gözlərində gilə-gilə yaş gəzdi.

– Üzr istəyirəm, bugünkü tamaşa qalır, qardaşlar, bacılar!

– Sabahamı?

– Birisi günəmi?

– Haçana bəs balam?

– Xüsusi elana: baxarsınız – deyə salonun qarşısında çaşan Əbdülsalam tezcə pərdə arxasında itdi. İndilikdə işin belə qurtarmağından yana Mehman razı qaldı. Altay isə hiddətləndi:

– Gərək deyəydin, anbardar Məmmədxanın arvadı Balış gəlmədiyindən tamaşamız pozuldu!

Fikrə gedən, nəyi isə araşdıran Mehmanın başı yelləndi, milis rəisi Cabirin fikri dolandı, onu da dərin şübhə götürdü. Həvəskar kollektivi öz yerində çəkilib məyus-mükəddər halda soyundu, salon deyinə-deyinə söküldü, Mehman təmkinli addımlarla Altaydan ötüb prokurorluğa girdi.

– Görünür, bu xəmir hələ çox su götürəcəkdir! – deyə stolun arxasında dayandı, sonra buradan dönüb ağır-ağır gəzinməyə, var-gəl etməyə başladı.

## XXIX

Şəxsi fəaliyyət dərnəyi tərəfindən böyük həvəslə hazırlanan tamaşanın təxirə salınmağı balaca şəhərdə böyük danışığa səbəb oldu. Klubdan çıxan, küçələr boyu səpələnib evinə dönən hər kəs güclü bir səs-küylə

söylənməyə, bu hadisənin səbəbini arayıb özünəməxsus yollarla yozmağa başladı. Kimisi Balışın öz əri anbardardan üz döndərib atası evinə – "Ballıqaya" kəndinə getməyindən, kimisi anbardarın öz halal arvadını qısqanıb səhnəyə buraxmadığından, kimisi də Balışın özünün şıltaqlıq edib qəsdən bu axşamkı tamaşanı pozmağından danışdı. Bu növ söz-söhbətə qulaq verən Məmmədxan hər kəsin gözünə dəymədən, ara-bərədə hərlənib fırlandı. İstər-istəməz büzüşüb, yığışıldı. Hələlik öz evinə dönməyə cürət etmədi, təkrar anbara girdi, kağızları, anbarda səpələnən sənədləri qurdaladı, sonra da qapını arxadan bərkidib işığı keçirdi. "İşdir, soruşan olsa, deyərəm işləyib-işləyib yorulub, burada mürgüləmişəm" – deyə dolaşıq vəziyyətə düşüb qədəmləri dolaşan anbardar qeyri-müəyyən halda çalıxıb-vurnuxmağa başladı. Bir azdan, yox-yox öz əyri yolunu sanki əlinə götürdüyü yarım sönük fənərlə işıqlandırdı, hətta: "tapdım, tapdım" – deyə bir qədər də sevindi. Bəli, daha onun qəsdi bütün şəhər əhli yatana qədər başını burada gizləmək, əl-ayaq yığışılandan sonra bir oğru kimi buradan sivişib çıxmaq, qapını yavaşca açmaq, öz qurbanının izini-tozunu silib süpürüb itirmək idi. Buna görə də anbardar çox sevdiyi parça taylarının arasına girib uzandı, cinayətinin izini necə ört-basdır etmək üçün öz beynində nəqşələr cızmağa başladı...

Hər kəsdən də artıq onu xofa salan iki həftə bundan əvvəl axşamüstü səhnəyə hücum çəkdiyi zaman barmağı ilə Balışı hədələdiyi vaxt, prokurorun ona zillənən gözləri idi! İndi də bax, bu zülmət qaranlıqda həmin gözlər sanki təqibedici nəzərlə ona zillənirdi... Açılmasın, örtülməsin, qapansın, bir daş bir quyuya düşən kimi düşsün, iz itsin, çıxsın getsin!.. Bəs belə etmək üçün, bu gözlər, Məmmədxandan üzülməyən gözlər necə olsun? Necə olsun ki, bu gözlər qatili görməsin, bu işin üstü basdırılsın?!. Onda bu prokurorun qabağını bəs nə ilə almaq olar? Bax, Qaloşun bu anbardan alıb apardığı qızıl saatı öz qızıl bağı ilə bir sarı ilana çevirib bu inadkar prokurorun boğazına dolamaq, onu boğmaq, məngənə arasına alıb onu sıxıb, sıxcalamaq gərəkdir, deyən Məmmədxanın qara fikri dolaşmağa başladı. Bax bu işi Qaloş necə hərləyər, Murtuz Murtuzov istintaqda necə döndərə bilər?.. Dəhnədən möhkəm bağlanan arx sürətlə axar, istənilən səmtə döndərilib, istənilən yer suvarıla bilər... Demək bütün mətləb arxı dəhnədən necə bağlamağın üstündədir. Ancaq Mehman qurulan tələyə ilişəcəkdi, ya buradan sağ-salamat çıxacaqdı?.. Axır Məmmədxan qızıl saatı Qaloşa verərkən "yüz gün yaraq, bir gün gərək" deyə prokurora yaxınlaşmaq istəmişdi. "Koxanı gör, kəndi çap" misalını nəzərdə tutmuşdu. Doğrudur, onda hələ də Məmmədxanın belə

aydın fikri yox idi!.. Ancaq necə olsa da, həmin qızıl saatı müəyyən mənzur ilə vermiş, üstəlik qızıl saatın prokurorun evində ilişib qalmağına da sevinmişdi. Bu hal Məmmədxanı, prokurorun evinə əl uzatmağın mümkün olduğu qənaətinə gətirmişdi.

Balışa qəsd edərkən qatil öz anbar talanından bir qədərini verməklə yaxasını qurtara biləcəyini də hiss etməmiş deyildi!.. İndi bu an tayların arasında başını gizləyən Məmmədxan prokurorun arvadı Züleyxa xanımı gözdən keçirir, onun nəzəri ümdə olaraq ətli-əndamlı və dadancıl xanımlardan olan Şəhlanın üstündə dayanırdı... Son günlər anbardar cavan prokurorun başçılığıyla başlanan təftiş nəticəsində oğurladığı kooperativ əmlakının üstünün açılmağından yana çox bərk vahiməyə düşmüşdü. Həm də o, çox bərk qısqandığı Balışa bel bağlaya bilmədiyindən, xüsusi bir vəhşiliklə ötən gecəyarısı onu öz yolunun üstündən götürmüşdü... Qatilin dumanlanan beyni elə açılıb ayazıya bilmirdi. O, doğrumu, hərəkət etmişdi, hələ də müəyyən etməkdə ciddi çətinlik çəkir, onun cinayətkar ürəyi yenə də bax çırpınaraq ağzına gəlməyə başlayırdı. O özünün bu ağır dəqiqələrində onu bilirdi ki, necə olsa da Balışı ortadan götürməklə fövqəladə bir iş görmüşdür. Güman ki, qatil üzə-üzə bu bulanıq gölməçədən çıxar, bu işdə ona Murtuz kimi müstəntiq qardaşı, illərdən bəri cəhənnəmə kötük atan Qaloş kimi sirdaşı kömək əlini uzadar, "tut buradan, üz-üzə çıx" deyər. Bu dünyada bütün ölüm hadisələrinin üstü açılırmı? Bütün qanlar üzüb, üzə çıxırmı? Heç itən-batan qan da olurmu?.. Əlbəttə, üstü açılmayan qətl, batan qan da olur... Belə halda niyə də gərək mən Məmmədxan yaxamı ələ verim, çalışıb-çapalayıb hərəkət etməyim! Əgər adi yollarla bu qətli gizləmək mümkün deyilsə, daha o niyə boğazını ələ versin, cəld yayınmasın, aradan çıxıb qaçmasın?.. Qatilin beyni qurcalanır, burulğana düşmüş kimi əl-qol çalır, yaşamaq, bu anbarda müdir qalıb, soyub-soymalamaq üçün yol deyil, cığır, hətta qaçacaq üçün bir cız belə arayırdı... Nə üçün də o bəd ayaqda qazamatlarda çürüməkdənsə bu və ya digər bandit dəstəsinə qoşulmasın?.. "Arvadı öldürüb, sizi deyib gəlmişəm!" Beləliklə o özünü namuslu bir adam, ötən adətlərin mərd bir igidi kimi təqdim edər, banditlər isə Məmmədxanı bir qədər göz altında saxlayıb, doğru-əyriliyini yoxlayıb sınaqdan çıxarandan sonra inanar, əlinə odlu silah verib özlərinə qatar, Əsgərxan kimi mamırlı adamın xilası üçün cəhd edərdilər. Belə olduqda hər bir yerə bələd olan Məmmədxan rüşvət almaq və tələyə düşmək istəməyən Mehmanın yolunu kəsər, onu vurub yerə sərər, lap canlı Xatunu ağlar, gözəl-göyçək Züleyxanı dul qoyardı. Əl-

bəttə, onlar, Mehman kəndlərə, kolxozlara çıxarkən onun yolunu doğrudan da bəndərgahların birində kəsər, öz qara niyyətlərini yerinə yetirə bilərdilər. Bu qayda ilə parça taylarının arasında gizlənən Məmmədxanın fikri qarabaqara dolanır, o götür-qoy edincə bu işə bütün ciddiyyətilə girişə biləcək Mehmanı yenə də öz böyüyən gözlərinin qabağında görürdü... Məmmədxan ağırlaşan kirpiklərini qaldırıb baxır-baxır, ancaq qaragözlü qıvrımsaçlı Mehmanda heç bir aman-iman görmürdü. Demək bu ipə-sapa yatmayan Mehmanın qabağını kəssə ancaq və ancaq həmin qızıl saat kəsər, o qızıl qolbaqlı saat, bir şahmara çevrilib Mehmanın boğazına sarınar, dolanardı. Məmmədxan öz ağır cinayətini düşünərkən Mehmanı görən kimi bu an öz kabinetində düşünə-düşünə gəzinən Mehman da sanki gecə kimi qaralan, indi harda isə, adam çalan zəhərli bir ilan kimi, başını gizləyən, tir-tir titrəyən Məmmədxanı görürdü... Demək Balış səhnəyə gəlməmişsə, ciddi bir hadisə baş vermişdir, bəlkə də güman edildiyindən daha dəhşətli, faciəli bir hadisə baş vermişdir!..

Prokuror gəzinə-gəzinə telefona yaxınlaşdı, qulpundan yapışıb qətiyyətlə zəng etdi, əvvəlcə milis rəisinin idarəsini, sonra isə onun evini alıb Bənnaoğlu Cabiri yanına çağırdı, çünki artıq dayanmaq, uduzmaq deməkdi!.. Mehman qəddar düşmənin girəvəsini kəsmək, əlinə verilən kəsərli qılıncla hərəkət etmək, düşməni diz çökdürmək istəyirdi. Mehman öz vəzifəsinin dövlət və ictimaiyyət qarşısındakı məsuliyyətini duyduqca onun iradəsi mətinləşir, o, amansız ölçülər götürmək, düşmənin başında oyanan hər hansı qara niyyətini həyata keçirməyə qoymadan pozub dağıtmaq istəyirdi. Mehman hələ gənc də olsa belə öz itiləşən hisslərilə qatilin hansı bir niyyətə düşə biləcəyini duyur, sanki o, Məmmədxanın beynində dolanan qara niyyətləri belə müəyyən edə bilirdi. Mehman gəzinə-gəzinə gözlədi. Bir qədərdən döşü atlanan milis rəisi içəriyə girdi.

– Buyurun, yoldaş prokuror, deyə o öz gəlişini elan etdi. Mən pioner kimi həmişə hazır!

– Əyləşin, yoldaş naçalnik!

Cabir kürsünü çəkib əyləşdi. Mehman dönüb gəldi.

– Balışdan nə xəbər, – deyə uzun qara kirpiklərini qaldırdı. – Gülnaz rolunda səhnəyə çıxası Balışdan nə xəbər-ətər?

– Kim bilir, Balış başıbatmış indi harada mürgüləyir?!

– Bəlkə də Balış əbədi sükut içindədir?

– Yox, canım, – deyə Cabirov gülümsəyib başını buladı. – Mənim fikrim də, orada, klubda bir az qaraldı. Ancaq sonra düşündüm ki, yəqin kişisi ilə sözü bəd gətirib, bir ağlagəlməz qonşuya yayınıbdır?!

– Əgər belə deyildirsə, onda necə? – Mehman yenə də eyni ciddiyyətlə uzun qara kirpiklərini qaldırdı. – Əgər tamam başqa cürədirsə?!

– Onda yəqin Balış başıbatmış "Balıqqayaya" gedibdir! – deyə Cabirov boynunun ardını qaşıdı, – yəqin də gərək belə olsun!

– Əgər belə də deyilsə? – deyə Mehman sorğu-sual aparır kimi davam etdi. – Birdən ciddi bir hadisə olmuşsa? – Mehman israrla dayandı. Mətləbin dərində olduğunu milis rəisinə çatdırmaq istədi.

– Ciddi hadisəmi? – deyə milis rəisi dik ayağa qalxdı. – Yəni anbardardan da elə ciddi bir hadisə baş verə bilər, yoldaş prokuror?

– Artıq ciddi hadisə baş vermişsə, necə?

– Güman etmirəm! – deyə milis rəisi bədən tərbiyəsilə məşğul olan kimi hər iki əlini dik qaldırıb endirdi, – əqlə çətin batır!

– Hər bir ehtimala qarşı, – deyə Mehman kürsünün söykənəcəyindən bərk yapışdı. – O Məmmədxan ciddi bir nəzarət altına alınmalıdır! Belə ki, qanadlı quş da olsa bir yana uça bilməsin.

– Bəlkə elə onu bu şübhəyə görə bəri başdan həbs edək? – deyə milis rəisinin alnı qırış-qırış oldu. O, gözlərini qıyıb prokurorun üzünə baxdı: – Ağzıbir hamıdan yaxşıdır. Balış pırtdayıb, bir yerdən çıxarsa, mən də qapını açıb Məmmədxana deyərəm, rədd ol buradan cəhənnəminə, goruna it küçüyü!

– Həbs və ağzıbir yox, nəzarət altına almaq! – deyə Mehman şəhadət barmağını qaldırdı, bununla da milis rəisinə qəti qərarını bildirdi, – o Məmmədxanı danışıqsız nəzarət altına alın! Quş da olsa qanadlanıb uça bilməsin. Od olsa bir kəsi yandıra bilməsin. Cinayətin heç bir iztozunu itirə bilməsin.

– Baş üstə, – deyə milis rəisi daha çək-çevir etmədən hökmü icra etməyə hazır olduğunu bildirdi. – Oldu, yoldaş prokuror! Siz Bənnaoğluna tamamən bel bağlaya bilərsiniz!

– Ancaq işə olduqca, olduqca ciddi, çox ciddi yanaşmaq gərəkdir! – deyə Mehmanın gözləri sanki sifəti kömür kimi qaralan Məmmədxanın silkələnən barmağı göründü.

Mehmanın hissləri artıq milis rəisinə keçir, onu izafi tərəddüddən çıxarır, səfərbər vəziyyətinə salırdı. Artıq Bənnaoğlu qarşısında anbardar Məmmədxan yox, əli qana bulanan amansız bir qatil görməyə başlayırdı. Bir an fikrə gedən, işin ciddiyyətini dərk edən Cabirov yerində hərəkət edib, qapıdan çıxıb həyətə düşüncə Mehmanın işdə-idarədə olduğunu bilən Murtuz Murtuzov onu prokurorluğun yolağzında qarşıladı.

– Xeyir ola, yoldaş naçalnik?

– Biz ancaq bizim hökumətin xeyri üçün işləyirik, – milis rəisi uzun şinelinin yaxasını düymələməyə başladı. – Şər üçün şeytanlar əlləşir!

– Düzü bu vaxtda nə var? – deyə Murtuzov özünü faqqılığa qoydu. Söz çəkmək istəyirdi. – Bəlkə, kənddə-filanda, xudanəkərdə, bir hadisə baş verib, mən heç bilmirəm?

– Elə heç bir şey yoxdur! – Cabirov daha Murtuzovun yanında dayanmadan aralandı, Murtuzov prokurorluğa girib öz otağının qapısını açdı, şüşəsi his tutan lampasını yandırıb işlərdən çəkib qabağına tökdü, bir an burda qərar tuta bilmədən yerindən qalxdı ayaq barmaqlarının ucunda yeriyib prokurorun yanına girmək istədi, lakin Mehmanı qəzəbli gəzinən görüncə burnunu geriyə çəkib yerinə qaxıldı. "Bu Atamoğlanov necə də həm yaşından, həm də öz başından böyük bir əda ilə adamlar kimi var-gəl eləyir, ha?!" – deyə işləri araşdırmağa başladı.

## XXX

Balaca şəhərin evlərinə çəkilən əhalisi axşamkı tamaşanın pozulması haqqında öz evində belə xeyli deyindi, birisi bu işə ciddi əhəmiyyət verdi, digəri əlini qaldırıb "eh, Əbdülsalamın oyunxanası ancaq belə olar", – deyib əlini yellədi... İstər-istəməz Balış barədə olan danışıq ayaqlandı, getdikcə yayıldı. Pəncərələrdən düşən işıqlar bir-bir söndü, müqabil tərəflər qaraldı. Lakin küçələr boyu qoyulan ara-ara işıqlar bir qədər nəfəs alıb öz işıqlarını artırdı. Payızın soyuq küləyi dağlardan üzüaşağı əsməyə, dirəklərdən sallanan lampaları yellədib cırıldatmağa başladı. Anbarın ağzındakı dirəkdən sallanan lampanın səsi qapıdan içəri dolur, parça taylarının arasında marığa yatan Məmmədxanın narahatlığını birə-min artırır, hər yer Məmmədxana qorxulu, hər şaqqıltı ona təqibedici görünürdü. Xeyli ara verdi, Məmmədxan tayların arasından çıxıb qulağını anbarın qapısına söykədi: dizləri uçundu. Öz-özünü söyüb danladı, işığı tez yandırıb anbarı dördgöz halda seyr etməyə başladı... "İşdir meşə adamlarına qoşularamsa, buranı yarmaq lazım gələrsə, nə qədər qənimət əldə edə bilərik? " – deyə Məmmədxan yenə də anbarın içini tezcə dolduran işığı söndürdü. Özü də anbarla birlikdə qaranlığa qovuşdu. İndi Məmmədxana işıq yox, qaranlıq gərək idi. Sanki qaranlıq Məmmədxanın qolundan yapışır, işıq onun cinayət və xəyanətlərini faş edib anbarda olan kələklərinin və ötən gecənin zülmətində, təqribən, elə gecənin bu vaxtında törətdiyi ağır cinayətin üstünü açırdı... Yox, qaranlıqdan da artıq kömür kimi bir zülmət lazım idi ki, Məmmədxan bu

gecə sabaha kimi, ya öz cinayətinin üstünü örtüb yalquzaq kimi ağız-burnunu yalayıb sabahdan sakit görkəmdə işə çıxsın, yaxud elə bu gecə, vurub bu şəhərcikdən uzaqlaşsın, əlinə nə oldu silah keçirib qaranlıq meşələrdə gizlənən qolçomaq qalıqları ilə birləşsin, ipə-sapa yatmayan Mehmandan heyfini alsın... Axır bu cavan Mehman Atamoğlanovun yerində o dazbaş Murtuz Murtuzov olsaydı, necə də bu Balışın qətlini istənilən kimi yozar, ortaboylu, tökməbədənli, əldən-ayaqdan çevik Məmmmədxan nə söyləsə üzü qarmon kimi qırışıq Murtuz onun bir cüt əfil-əfil yanan çiçək naxışlı xalçasının müqabilində lap sandıqtulasına dönərdi. Ancaq nə edəsən ki, burada başqa bir adam, dönməz, çəkinməz, qayıtmaz bir adam vardı ki, o öz araşdırıcı, nüfuzedici, qaynar, odlu gözlərini bu vurnuxan Məmmədxanın gözlərindən çəkmir, bir an belə onu bu anbarda öz halına-əhvalına buraxmır. Bax, bax oradan o yandakı bir cüt amir gözə görünür, Həmin gözlər Məmmədxanın nəinki zahirini, onun batinini, içini-içalatını yarıb, aləmə göstərir, – yığılın, gəlin, görün, – deyə aləmə haray salır, külli-aləm yığılıb gəlib görür ki, bu Məmmədxan olmazın xəyanətlər törətmiş, xalq əmlakını talan etmiş, hər iki qara əlini qırmızı qana batırmışdır. Gözlər çoxalır, gözlər cinayətkar qatili dəyirman daşlarından da bədtər əzirdi. Təftişdən başlayan ağır, əzici zəhm onu hey basır, əzirdi. Daha Məmmədxan burada, bu vəziyyətdə boğucu rütubətdə dayana bilmədən qapının arxasını boşaldıb bayıra çıxdı, qapını qıfıllayıb əlinin içində kibrit yandırıb surğuc tutdu, buranı möhürlədi, sarı bürünc möhrü cibinə qoydu, nə isə, haradansa balaca bir şıqqıltı onu səksəndirdi. Məmmədxan qurd kimi döyükdü, – "bu belə kim ola?" – deyə əlləri üstə çöngəyib yan-yörəyə boylandı. O diqqətlə süzə-süzə qaranlığa baxdı, heç bir iz-əlamət görmədi. Dirəkdən sallanan elektrik lampası yenə də birdən cırıldayıb səsləndi, anbarın qabağına tökülən həsir parçaları əsən küləyin qabağında yumurlanıb, aşa-aşa aşağıdakı uçuruma yuvarlandı. İndi hər bir şey yalquzaqsayağı çöng oturan Məmmədxanın gözlərində qabarıb dikəlib canlanır, onun qulaqlarında qəribə, müdhiş uğultulu səslər gəzir, törətdiyi cinayətin yerindən əkilib uzaqlaşmaq istəyirdi. Bəli, doğrudan da, indi hər şey Məmmədxana dəhşətli bir təhlükə görünürdü. "Yox, izi-tozu tamam-kamal itirmək, sübhün gözü açılana qədər aradan çıxmaq, meşəyə girmək, vuruşan dəstəni tapmaq gərəkdir!" – deyə Məmmədxan ayağa qalxdı, anbarın həyətindən əyri-üyrü dolaşıq addımlarla çıxdı, gecə növbəsini aparan milis nəfərinin gözünə dəymədən qaranlığın içiylə özünü üzüyuxarı verdi, gedib-gedib evinin qapısında dayandı, sinəsi qopub,

ürəyi parçalanmaq istəyincə buraya sığındı. İri qıfıl öz yerindən asılmışdı. Demək burada heç bir dəyişiklik olmamışdı. Məmmədxan açarı çıxarıb qapını astaca açdı. İçəriyə girdi. O, lampanı yandırmadan, otağın içində büzüşdü. "– İndi bəs necə olsun? – Məmmədxan sinəsində mırıldandı. – İndi bu it balasının izini itirmək necə olsun? Buradakı, yandakı, bəlkə anbarın içindəki quyuda o it balasını gizlətmək mümkün olsun? Birdən aradılar, birdən bəlkə bu it balasını tapdılar". – Məmmədxan daş kimi dayansa da öz murdar taleyini düşünürdü. "– Bəs onda, bəs onda?.. Bəs necə etmək? Bəlkə onu bənd-bənd doğrayıb buradan torbalarda hissə-hissə çıxarmaq! – Axır bir zaman onun əmisi də qısqanclıqdan öz qadını ilə eynən beləcə rəftar etmişdi? O, çar vaxtı qətlə çatdırdığı qadının qan izlərini məharətlə silib-süpürüb itirmişdi. Bu qan izləri, Şura hökuməti zamanında açılınca Araz çayının o biri tayını adlamışdı. Bəlkə elə indi Məmmədxanın əmisi də bu qaranlıq meşədəki bir dəstənin içindədir?.. – Yox, yox, daha belə bir gündə daş kimi dayanmaq, durmaq olmaz!"

Məmmədxan ağırlaşan qurğuşun addımlarıyla qaranlıq küncdə gedib gödəksaplı, enliağızlı baltanı sağ əlinə götürüb, ağır-ağır samballadı. Otaqdan anbara açılan qapını tərpədib dayandı, bayıra qulaq verdi. Demək, bu ağır, ovxarlı balta işləyəndə necə olsa da bir səs çıxacaqdır! Bəlkə pusquda dayanan, bu evin dövrəsində dolanan da vardır? O, qaranlıqda qızaran gözlərini gəzdirdi. Mehmanın ona zillənən gözlərini görürmüş kimi vahiməyə düşdü, addım-addım geriyə çəkildi, əlində balta qapıya yanaşdı, nə isə onun qulağına bayırda xısıltı, həm də şübhəli ayaq səsləri gəldi. – "Adamdırmı, küləkdirmi?" – Məmmədxan qapı açıb gözünün ucuyla bayıra baxdı, bir qaraltı onun gözünə dəyib ötdü... – "Bu adamdır, ya mənim gözlərim böyüyübdür?" – Məmmədxan qapını açıq qoyub qəsdən öskürə-öskürə həyətə çıxdı, bir neçə addım da gəzib dolandı, heç bir qaraltı onun gözlərinə dəymədi. Məmmədxan içəriyə dönüb iri-iri boçkalar dayanan anbara girmək istərkən asta bir fit səsi onun qulaqlarına gəldi. – "Belədir, ya mənə belə gəlir?" – Məmmədxan bir qədər gözlədi, pəncərənin pərdəsini çəkdi, bayıra baxdı, yenə də gözlərinə qaraltı sataşdı, arada az-çox toxtayan Məmmədxanı yenə də dəhşət götürüb istər-istəməz uçundu, ancaq bir ümidlə içində baltanı daha bərk tutdu. Lakin bu baltanı burada işlədib azca da olsa səs çıxarmaq cinayət yerində tutulmaq deməkdi... Məmmədxan döndü, gizlətdiyi tapançanı aradı, xeyli eşələndi, tapmadı. O, tapançanın yerinimi azdırmışdı, yaxud onu Balış gizlətmişdir? Ya bəlkə Balış əlaltınca Məmmədxanın silahını milis rəisi Cabirə vermişdi? Bəlkə həmin tapança indi evin döv-

rəsinə dolanan bir milisin – gözətçinin əlindədir?.. Onda elə qaçarağa düşüncə, öz yanınca bu baltanı götürsün? Bu balta görən, duyan kəsdə bir şübhə oyatmazmı?.. Nə qədər şübhə oyatsa da əlac baltaya idi... Məmmədxan baltanın dəstəsini buraxmadı, onun qulpundan bərk-bərk yapışıb, qapıdan birbaşa çıxdı, həyətə düşüb addımlayınca bir öskürtü eşitdi. O, özünü gözə dəyməyən, ancaq bənd-bərəni kəsən silahlı adamların əhatəsində hiss etdi. İndi bu halda o, qaçmaq, aradan çıxmaq istədi. Ayaq saxladı, bəlkə bəndərgahlarda pusquya duranlar vardır. Birdən onlar gördülər, qışqırıb, əli baltalıya "dayan-dayan!" dedilər. Əli baltalı adam ayaq saxlamayınca odlu güllədən onun qaraltısına dolu kimi yağdırdılar, dəlik-deşik meyit ortada qaldı?! Nəfəsi təngişən, geniş dünya iynə ulduzu kimi başına daralan Məmmədxan qayıdıb qapısına söykəndi. Ona elə gəldi ki, buradan qaçmaq üçün etdiyi cidd-cəhd heç bir vəchlə baş tutmayacaq, o yaxalanacaq, yaxud dolu kimi yağan odlu güllələrin nəticəsində dəlik-deşik olacaqdır. Qalsa necə? – "Buradaca qalsam?.. Bəs necə?.. – deyə Məmmədxan çiyinlərini çatdı, başını qınına saldı. – Qalsam, bəlkə, birtəhər qaldım, anbardan çalıb-çapıb illər boyu yığdığım varın bir qismini, bərkə düşsə lap hamısını Murtuz kimisinin üstünə töküb özümü xilas etdim!.. Verim nəyin yolunu bağlamaz, verim kimin səsini desən boğazında boğmaz. Hələ bax o çıq-çıq, sarı saatın ardınca xeyli qiymətli, dəyərli şeylərdən tökməklə tamahkar Şəhla xanımın yumşaq, ətli əlilə inadcıl kürəkəninin ağzını qapamaq da olmazmı? Məmmədxan qapını bağlayıb nəfəsini dərdi, demək, işin izini ayrı yolla da itirmək olar. O, dolandı, evin içində gəzib bir neçə qulacdan ibarət kəndir tapdı. İçəriyə girib yan-yörəsinə baxdı, öz qurbanını dikəldib asmağa cəhd etdi... Xeyli vaxt keçdi, qaranlıq yavaş-yavaş əridi tər içində çapalayan Məmmədxan dönüb baltasıyla birlikdə yorğan-döşəyə girdi. "Bu zalım qızı həm oynağan, həm də gəzəyən çıxdı", – deyə Məmmədxanın beyni sıxılıb daralmağa, ürəyi döyünməyə başladı. – İndi, sabahdan məndən soruşacaqlar, "Məmmədxan bəs Balış hanı? Niyə Məşədi İbad pozuldu?" Deyərəm: "Mən nə bilim hanı! Avaranın qızı avara, nə bilim itilib hansı cəhənnəmə gedib?"

Qatı qaranlıq əridi. Dan yeri söküldü, payız günəşi üfüqdən çırtdayıb çıxdı, Məmmədxan pəncərəyə zillənən gözlərini tez-tez döydü, o, işıqdan qaçır kimi yorğanına bürünüb gizləndi. – "Bəlkə bu gün də üstünü vurmamaq?" – o, gözlərini bərk-bərk yumunca Murtuzovla Qaloşlu adam qulluğunda dayandı. – "Bax bu daz Murtuz sehrli bir açar kimi Şəhla xanımın dəmir qapı dərbəndinə düşməzmi?.." – Məmmədxan

vurnuxdu, yenə də selə dönən tər onu boğdu, başını çıxarınca, işığın gücləndiyini, pərdələri saya-hesaba almadan bütün işığın içəriyə dolduğunu gördü. O, istər-istəməz yerindən qalxıb əzik-üzük paltarlarını pis-pis geyindi, baltanı əlinə alıb küncdə gizlədi, qapıdan çıxıb eşikdə girələndi, göz qoydu, qulaq verdi, hər kəs öz işində-peşəsində idi. Gecəki külək də kəsmişdi. Gözdəyən qaraltılar, qulağagələn hənirtilərdən iz-əlamət yox idi. Bəlkə ötən gecə qatili qara basırmış, heç bir şey yoxmuş?! Ya bəlkə o qaraltı, hənirtilər Bənnaoğlunun təyin etdiyi pusquçularmış?.. – "Ax bu dünyada, bu daşçıoğluna necə də bir odlu güllə yapışdıran olmadı, bu kafir balası torpaqda çürüyə, dağa-daşa çəkilənlərin cancığazları dincələ?! Elə bil ki, bəs güllə batmayan tilsimdir, bənna balası. Dolu kimi yağan güllənin altından da dirigözlü çıxır... Neçə-neçəsi ölüb, neçə-neçəsi yaralanır, ancaq bu Bənnaoğlu naçalnik od içindən dipdiri çıxıb, sağ-salamat qalır, özü də bu dünyada heç bir atışmanı saya-hesaba almır".

Mehmandan sonra Məmmədxanın xoşuna gəlməyən, bir oxa çevrilib onun gözlərinə batan bir adam vardısa, o da Bənnaoğlu milis rəisi Cabir idi. Daha bəs kim?.. Komsomol Altay, altıaylıq Altay! "– Heç kəs qadın azadlığının əleyhinə çıxa bilməz!" – deyə cingiltili cır səsilə klubu doldurur. – "Niyə çıxmır, cənab Altay! Çıxanda nə edəcəksən? Çıxan da olub, hələ ötən də!" – Məmmədxan özünə çay dəmləyib iri bir çaynik çayı qaynar-qaynar, üfürə-üfürə içdi. – "Bəs daha kim?" – deyə Məmmədxan çay məhrəbasıyla sel-suya çevrilən tərini sildi, yenə də isti tər qaynaya-qaynaya çıxıb onun murdar vücudunu guya yuyacaqmış kimi süzdü. – "Bax Vahidovun özü də! – Məmmədxan göz dolandırıb baxdıqca Balışın intiqamını almaq üçün onun necə də çox-çox tərəfdarları olduğunu görürdü, halbuki Məmmədxan öz qara niyyətini yerinə yetirəndə bu sahibsiz qızın heç zaman bu qədər havadarları olduğunu düşünməmişdi. Sanki peşəkar sərxoş əsnəyib ayılır, tutduğu əməllərin içi ona əliçi kimi aydın görünürdü. Demək tək bir əlac, bu alaşıq-dolaşıqdan çıxmaq, o qızıl saatın zəncirini uzadıb hərləyə-hərləyə Mehmanın boğazına dolamaq, gözləri kəlləsinə çıxana qədər çəkmək, – bəsdir, siz buyuran olsun! – deyincə dartmaq, bizim əlbuyruqçumuz oluncaya qədər onu hövkələməkdir, – özü-özüylə vuruşan Məmmədxan qara sifətini bürüyən tərini sildi, qapını çəkib bərk-bərk örtdü, qıfılladı, sonra yan-yörəsinə baxdı. Qıfılı dartışdırdı, sinəsini dönüb arıtladı, göyə baxdı. Göy ayaz idi, silinmiş dəyirmi güzgü kimi parıldayırdı.– Bəlkə elə bu gündüzün, gündüzçağı qaçmaq? – Məmmədxan çiyinlərini dartıb bü-

züşdü, girdələnib dəyirmiləndi. – Axşamdan qoyulan gözətçilər indi keçidlərdə, adlamacalarda, bəndərgahlarda dayanıblarsa necə? – deyib udqundu. – Lap qoydular şəhərdən çıxdım. Kənarda bu girəvələrin birisində məni yaxalamazdılarmı, durmasam, dayanmasam atmazlarmı?.. Yox, əlac ancaq-ancaq xorum-xorum rüşvət alan, Allahını-imanını danıb, isti-isti qan basdıran bu daz oğlu Murtuzun, özcüyəzinin üstünə getmək; var-yoxu boğazına tıxayıb, əl-ayağını yalayan köpəyə çevirməkdən ibarətdir. Qoy bu köpək haphapla sən tərəfdən o tərəfə hürsün, səni qorusun, sənin köpəyin olsun!"

Məmmədxan bu ümidlə də öz ayaq barmaqlarının ucunda yeriyib küçəni qət etdi, özünü tox tutmuş halda ötüb həyətdə qır-qırıntını təmizləyən Qaloşlu adamdan keçib özünü Murtuz Murtuzova yetirdi.

– Hə, nə var Məmmədxan dadaş? – deyə Murtuzov yağlanmış kimi parıldayan daz başını qaldırıb dostunun zəhər damcılayan sifətinə diqqət etdi: – Hə nə olubdu belə, aşna ovqatına soğan doğranıbdır?

– Nə olacaqdır?! – deyə Məmmədxan əllərini ovuşdurdu. – Bədbəxtlikdən savayı nə ola bilər?

– Nə bədbəxtliyi, ədə! – Yemək yerindən yeni kabab qoxusu almış kimi burnu gicişən Murtuzov dik dikəlib Məmmədxanın qaralıb-qırışan, acıtmalı xəmir kimi bir az da şişib köpən sifətini seyr etdi. – Nə olubdur, ədə?

– Bu Balış da, – Məmmədxan boğazında tilişkəli sümük qalmış kimi udqununca fürsəti fövtə vermək istəməyən Murtuzov soruşdu:

– Axşamkı tamaşanın pozulmağınımı deyirsən, ədə?

– Bəli də, Murtuz qardaş!

– Demək, sən komsomol Altayın dilinə düşdün.

Murtuzov işin dərində olduğunu almış kimi Məmmədxanın qırışıq içində gizlənən gözlərinə zənn etdi.

– İndiki zamanda komsomolun dil-dişinə düşməkdən də böyük bir bədbəxtlik hanı? Hər yerdə Altay oturub-durub danışacaq, asıb-sovuracaq, o boyda yağlı anbarı da vurub sənin ağzından çıxaracaqdır.

– Anbar cəhənnəmə, – deyə Məmmədxan yaxın adamının üstünə zıqqıldadı, – anbar gora.

– Necə anbar gora, ədə! – Murtuzov ildırım vurmuş kimi sarsıldı. – Yoxsa daş gəmirəcəyik biz burada, yoxsa qaya?!

– Lap daş da gəmirərik, lap qaya da gəmirərik. Təki başımıza bu boyda bir daş düşməyəydi.

– Bəs daha bundan da böyük bədbəxtlikdir, nə daşdır?

– Ondan daha böyük bir bədbəxtlik mənə üz veriblər, başımıza dağ uçubdur.

– Olmaya arvadın baş-gözünü bu klub-filan üstündə ötən axşamkı tamaşa bərədə əzmisən, o da həkimə-zada qaçıbdır?

– Belə olsaydı, dərd yarı idi!..

– Ya bəlkə vurub qolunu sındırıbsan bu kafər qızının, – deyə Murtuz qolunu qaldırıb biləyini göstərdi. – Lap lülə sümüyü qırılıbdır?

– Qolu yox, boynu sınıbdır, – deyə sifəti acıtmalı xəmir kimi şişib birdən-birə göbələk kimi köpəşən Məmmədxan başını çiyni üstünə döndərdi, – boynu, boynu, Murtuz qardaş!

– Necə?.. Nə boynu, ədə, axmaq, – deyə Murtuzovun iri burnu qırışdı. O, çox cızıltılı yağlı tikə qoxusu alan mövru pişik kimi sanki ətrafını qoxuladı. Məmmədxanın var-yoxunu gözlərinin qabağına gətirincə onun içi güldü. – Belə bir hadisə onu xeyli varlanmaq, bundan da artıq xeyli şişmək, peysərini yoğunlatmaq vədini verdi. Adətən bir xəyanət, ya cinayət baş verincə Murtuzovun qırışıq üzü açılar, onun çiçəyi çırtlayırdı. Mollalar ölümdən, aşıqlar toydan zövq alan kimi Murtuzov da cinayət-xəyanətlərdən zövq alır, yeni gəlir mənbəyini görüncə onun aşığı alçı dururdu. Murtuzov özünü dəyirmançı, istintaqa düşən cinayət və xəyanəti dən hesab edirdi. Əgər rayonda cinayət və xəyanət tez-tez baş verirdisə, demək, Murtuzovun dəyirmanında yekə-yekə dən tayları üst-üstə növbəyə dururdu. Elə bu zamanda o özünü “mübariz ər kimi gözə verir, işini işlədib külli qazancını edirdi. Necə deyər o, girəvəsinin əlinə keçirdiyi adamı soymalayır, barmaq kimi lütləyirdi. Əgər cinayət və xəyanət hadisələri təsadüfdən-təsadüfə olursa, yəni bu işlər azalmağa başlayırdısa, sanki Murtuzovun başına göydən ağır bir əlləmə düşür, o, əzizi ölən kimi qara yasa batır, sudan çıxarılan, quru qum üstünə atılan balıq kimi çapalayırdı. İndi o, zahirən Məmmədxanın gətirdiyi bu xəbərdən həyəcan keçirmək istəsə də, az qala çırtıq vurub ötən axşamkı Məşədi İbadın əvəzində oynamaq istəyirdi. Ayrı cürə onun xörəyi azalacaq, kabab şişləri pas tutacaq, zəfəran-plov əvəzində onun ocağının üstündə his bağlamış əriştə-umac qazanı bağlanacaqdı. Murtuzov isə öz iti dişləri ilə yeməyə, sökməyə, bəzən də acgöz zəli kimi yapışıb sorub şişməyə adət etmişdi. Daha onun ayrı bir gözətləməsi, arzusu yox idi. Bunun üçün Murtuz Murtuzov çox dərindən, diqqətlə, iştahlı bir maraqla, peysərini qaşıya-qaşıya Məmmədxanın gecənin içində xeyli şişib torbalanan gözlərinə, hücumçu nəzərlə baxıb daz başını əsdirdi.

– Hə, Murtuz qardaş, başıdaşlı özü özünü asıbdır. – Məmmədxan əlini atıb dostunun ətəyindən tutdu.

Murtuzov ətli dodağını marçıldatdı.

– Harda belə, ədə?

– Anbarda, – deyə Məmmədxan dolambacı hərlənirdi, – mən yazıq da, bu sabah ertə bizim anbarçanın qapısını açanda onu üzüaşağı kəndirdən sallanan görmüşəm!

– Demək?.. Demək? – Murtuzovun daz başı da güldü. – Görəsən, axı niyə! Görəsən, axı nə üstə balam?

Məmmədxanın çiyinləri çatıldı, onun şişkin sifəti yayılıb daha da enləndi:

– Hirsindən!.. Hikkəsindən!.. Qısqanmağından!.. Məni min hoqqaya salmağından!.. Min bir bəd əməlindən-felindən, klubdakı min bir oyunundan, ərini burada qoyub gündə bir lotu-potuya ərə getməyindən!..

– İndi deyirsən, elə Balış kəndirdən asıla qalıbdır? – Murtuzov özünə güc verib içəridən üfürülüb ciddiləşdi, süni də olsa kədərləndi. Məmmədxan müqabilindəki Murtuzun mərəzini yaxşı bildiyindən, rəsmi cəhətdən heç bir dəstəvuz vermək istəmədi. Necə deyər, oyun pərdə altında getməyə başlayırdı.

– Bəyəm, mən özünü asan adama heç əl vura bilərəmmi? – deyə qatil əllərini döşündə çarpazladı. – Qoy cümlə-cahan görsün ki, bu namussuz mənim başıma necə pəstah açıbdır?!.

– Demək, istintaq başlanacaqdır!.. – Murtuzov durdu, daz başı gülə-gülə gəzindi: – Demək istintaq hər şeyi aydın edəcək, bulanığı duruldacaq, xıltı-mıltı, yalan-doğrunu üzə çıxaracaqdır!..

– Əlbəttə, əlbəttə, yoldaş Murtuzov, – deyə Məmmədxan müstəntiqin qabağında xeyli əyildi, özünün iynə ulduzundan keçməyə hazır olduğunu bildirdi. – Gərək, sən özün, Murtuz qardaş, var-yoxuma göz olasan, haqqı da nahaqdan ayırd eləyəsən!..

– Onda birbaş məhkəmə hakiminə xəbər vermək, haqqı-nahaqqı ona demək, başını yaxşı-yaxşı piyləmək gərəkdir! – deyə Murtuzov məsləhət verdi, onlar bir-birinin nə demək istədiklərini işıldayan məkrli gözlərindən oxudular.

– Belə ki, hakim, sən deyənsayağı, haqqına xülasə versin, – Murtuz əlini qılıncına qaldırdı. – Dam dirək üstündə dayanan kimi istintaq da hakimin xülasəsi üstündə dayanacaqdır!

– Ötən axşamüstü gördüm, – deyə Məmmədxan özü də hiss etmədən səsini yavaşıtdı, yan-yörəsinə baxıb xısıldadı. – Salam verdim, gülümsədi, halbilən kişidir...

– Demək, həkim sənə xoş sifət göstərdi? – deyə Murtuzovun gödək, sarımtıl, bığının seyrək tükləri qabarıb dikəldi. Sonra o özünü geriyə çəkdi, sanki ilan udmaq istəyən kirpi qınına çəkildi.

## XXXI

Züleyxa “qızıl saat” əhavalatını açıb anasına söylədi. Bir neçə gün sonra o, anasının məsləhət və təkidilə saatı çıxarıb qoluna bağladı və işdən qayıdan Mehmana göstərib:

– Neçəyə dəyər? – dedi.

Mehman pörtdü:

– Məgər mən saatsazam?

– Saatsaz olmayanda nə olar ki, Mehman?

– Haradandır, belə? – deyə Mehman ciddi bir nəzər və şübhəli bir gözlə Züleyxaya diqqətlə baxıb soruşdu.

– Bağışlayıblar!

– Kim bağışlayıb?..

– Mən müqəssir deyiləm, istintaq edəsən?! Soruşuram ki, bu saat neçəyə dəyər?

Mehman bozarıb daha ciddi bir sifət aldı:

– Kim bağışlayıb o saatı?

– Almaq istəyirəm, Mehman!

Mehman barmağı ilə qapını göstərdi:

– O saat gəldiyi yolla da bu evdən geriyə qayıtmalıdır!

– Məgər saatın ayağı var, Mehman?

– Dedim qurtardı, qaytar!

Züleyxa anasını səslədi:

– Görürsən, mama, sən bu Mehmanı?

– Nədir, qızım? – deyə Şəhla xanım o biri otaqdan gəldi.

– Mama, görürsənmi bunu, məni çox yamanca incidir!

– Nə üstə, oğul?

– Mən deyirəm bu saatı qaytarsın!

– Nəyi?

– Qolundakı o saatı!

– Nə olar, oğlum, qız özünə bəzək-düzək vuranda?

– Onsuz da keçinmək olar!

– Yox, olmaz, yaramaz! Qadın başdan-ayağa zinətdir. Zinətsiz qadın nədir ki? Bir parça ət!..

– Mənim sözüm bu şübhəli saat üstündədir, ana!

– Saat da o cümlədən! Zinətsiz-bəzəksiz qadın, gülsüz bir koldur! Nə vaxt gül kolu gözəldir? Güllər qönçələnib açılanda! Bəzək də qadının açıl qızılgülləridir!

– Bunlar hamısı zahiridir, içəri lazımdır, ürək! Ürək ləkəli olsa, çölün bəzəyi bir parıltılı ilan qabığıdır!

– Oğlum, bu dünyada zahirin daxildən də çox qiyməti var! Bir padşaha dilənçi paltarı geydirsən o nəyə bənzər? Ancaq bir cındırlı pirə! Kim onun qabağında əyilər, kim ona pərəstiş elər?

– Biz padşaha pərəstişdən yox, təmiz, ləkəsiz ürəkdən danışırıq, ana!

– Ürəyə kim girir, oğlum?

– Hər kəsdən qabaq insanın özü öz ürəyinə girir! – deyə Mehman Züleyxanı süzdü, onun sifətində xəstə qızıl sarıltısı gördü.

– Göz də adamı aldadır, – deyə Şəhla xanım indi də sözü bu tərəfə döndərmək, qızını zərbə altından xilas etmək, özü kürəkəni ilə üzbəüz dayanmaq istədi. Əks halda bu yad yerdə, aradakı hörmət pərdəsi yırtılar, rüsvayçılıq görünərdi. – İnanmaq da gərəkdir, oğul, – deyə Şəhla xanım yenə sözə başladı.

– Kimə, ana?

– Ailəyə, külfətə!

– Başçı ailəsinin keşiyində durmalıdır, mənim əziz anam!

– Əgər satqınlıq olarsa oğlum, – deyə sözünü yastıladı.

– Aldadılmaq da ola bilər?!

– Heç bulaq öz gözünü kor istəməz, oğlum!

– Birdən bir xəyanət əli bu bulağa uzanarsa?..

– Biz də dünya görmüşük, bala, – deyə Şəhla xanım boynunu əydi. – Doğrudur, zəmanə füqərayı-kasibə zəmanəsidir, ancaq biz tox olmuşuq, acgöz olmamışıq!

– Mən saatı deyirəm, bu sarı zəhəri.

– Onu özüm gətirmişəm!

– Mamamla sözü bir yerə qoyub səni sınamaq istəyirdik... – deyə Züleyxa anasının “lal oyunu” işarəsilə çıxış yolu tapıldığı üçün özünə gəlməyə başladı.

– Bəs bu nə rəngdən-rəngə düşmək idi, Züleyxa?

– Dəli eşqimin daşa çırpılmasını görəndə az qalır ürəyim ağzıma gəlsin, Mehman!

– Belə isə, heç də pis deyildir, – Mehman stulda oturdu, – Əgər belə isə, Züleyxa?!.

– Bəs nə cür ola bilər, Mehman?

– Bir xain əl uzanmasın!.. Çünki bizim işimiz mübarizədir, burda təmizlik hər bir şeydir! Yoxsa kürəyinə bir xəncər saplansa, üzü üstə yıxılmaq bir göz qırpımındadır!

– Mənim bir oğlum, bir qızım vardır! – deyə Şəhla xanım özünü qabağa verdi.

– Artıq tamah baş yarmasın! Mən buraya təmizlik və qanun üçün gəlmişəm! Mənim arzularım vardır, ana! Mən söz vermişəm, mən hər zaman alnıaçıq, ürəyitəmiz olmalıyam! Mən təcrübi işdən sonra şəhərə dönəcək, ömrümü hüquq elminə sərf edəcəyəm!.. Mənim fikrim, arzum böyükdür, ucadır!..

– Biz də heç bu böyük, uca arzuların borana düşməyinə razı ola bilmərik, oğul!

– Əsla! – deyə Züleyxa daxili bir əzab içində hikkələndi, Mehmanın məhəbbət və sevgilə dolan, romantik bir xəyal içində süzülən gözləri Züleyxanın varlığını sarsıtdı. O, çiynini ata-ata hönkürdü.

– Nə oldu, qız? Zarafat da bilmirsiniz, barı?!

– Mən bədbəxtəm, ana!..

– Görünür, bu şübhə toxumunu kimsə bu evə səpib gedib, – deyə Şəhla xanım vicdan əzabı çəkmədən, uzun ömrünün ikiüzlü təcrübəsilə bir iblis kimi araya girdi...

## XXXII

Öz vaxtında prokurorluğa gələn Mehman, cari kağızlarla məşğul olub onların icrası üçün qanuni istiqamət verdi, sonra onu, çox narahat edən Balış məsələsi düşündürdü. Bakıda hüquq fakültəsində oxuyarkən istehsalat təcrübəsi zamanı "Səriyyə məhkəməsi"nin materialları ilə necə tanış olduğunu təsəvvürünə gətirib xatırladı. Səriyyənin qətlinə dair respublika qəzetlərində çap edilən ictimai etirazları necə tədqiq etdiyini, özü üçün konspektlər tərtib etdiyini, necə qəzəbləndiyini yaşadı, sanki onun qəzəb və nifrəti, qatillərə qarşı qətiyyəti qat-qat gücləndi. Mehman birdən stolun arxasından dik ayağa durdu, kitab mərtəbəciyinə yanaşdı, buradan bir kitabça çəkdi, vərəqlədi, buradakı, "Səriyyənin ölümü" şerini diqqətlə, kərratla oxudu.

"Mən görmədim, söyləyirlər bir gecənin sonunda
Sənə qıyan mərhəmətsiz, soyuq bir əl qudurdu,
Bu gün qurmaq istədiyin yeni həyat yolunda,
Ağ sinənə sağalmayan isti yaralar vurdu.

Dalğalandı bu xəbərdən xəyalımın dənizi,
Uzaq-uzaq keçmişləri xatırladım nifrətlə...”

Vurğun şeri başdan-başa Mehmanı tutdu, onda oyanan kin və qəzəb dalğalarını coşdurub köpükləndirdi. Mehman bədəninə od dolmuş kimi qurcalandı, kitabçanı qanun kimi tutub “Tabut keçirkən” sərlövhəsi altındakı sətirləri də aramla, asta, ancaq həyəcanla oxudu.

“Sarılıqlar çökmüş kimi buludların rənginə,
Günəşdən yox bir nişan;
Bütün aləm pərişan...
Ağır karvan yürüşilə dalğalanır insanlar,
Həm də qızlar, oğlanlar,
Komsomollar, pionerlər, məktəblilər, qadınlar
Öndə gedən bir tabutun arxasınca addımlar.
Dalğalanırdı Bakı,
Onun qarşısındakı
Salamlanan bu tabut ki, azadlığa verdi can,
Hər gözdə bir həyəcan.
Hər baxışdan kin püskürür o qatil qəlbə qarşı,
Çalınır matəm marşı...
Həzin-həzin bu nəğmədən döyünürdü ürəklər,
Çaldıran bir quduz kimi səslənirdi küləklər...”

Mehman kitabçanı qatlayıb, bir kənara qoymadan əlində saxladı, onun fikri “Səriyyənin ölümü” günlərini, həm də onun tabutu böyük izdihamın müşayiətilə son yoluna salınan günləri gəzib dolandı. Axır Mehman özü də bu faciəni eşitmiş, çiyinlərdə gedən tabutu müşayiət edən izdihamın içində olmuşdu. Axır o zaman Səriyyənin ölümü əfkarictimaiyyəni cəlb etmiş, hər evdə, məclisdə, yığıncaqda söz-söhbət bu barədə getmişdi. Köhnə dünyanın adamları bu qətli “namus işi” adlandırıb qatillərə bəraət vermiş, ancaq qanun hökmüylə bu azğınlığa qarşı qılınc çəkmişdi...

İndi də burada, bu ucqarda Balışın qətli, eyni faciəni xatırlatmırdımı!?. Mehman alovlanmış kimi otağın içində yeyin-yeyin dolandı, şeri təkrar başdan-ayağa qədər oxudu, şeir kitabçasını astaca örtüb mərtəbəciyə qoydu. Mehman nə qədər səbir etməyə çalışsa da həyəcanlanır, onun şübhələri anbaan güclənir, artırdı. O, kişdəkçiləri ov ardınca göndərib özü barədə dayanan ovçu kimi döşü atlana-atlana real və hüquqi nəticə gözləyirdi. Mehman milis rəisinin verdiyi məlumata əsasən Məmmədxanın nəzarət altına alındığını bilirdi. O bilirdi ki, biryolluq qaçıb öz yaxa-

sını qurtara bilməyən cani bu cilddən o cildə girəcək, öz cinayətini minbir yolla ört-basdır etməyə çalışacaqdır... Bəli, bir tərəfdən "Səriyyənin ölümü" şerinin bütün bir faciəli aləmi onun təsəvvüründə canlandırmasından, digər tərəfdən Balışın başında oynayan şimşəklərdən yana Mehmanın ürəyi aramsız döyünür, anbaan səhih bir səs, bir xəbər gözləyirdi. Mehman gözləyirdi ki, görək nə olacaq, bu hadisə nə edəcəkdir?.. Elə bu an ayaq səsləri Mehmanı öz təlatümlü fikrindən qopardı. Başıalovlu Murtuzov dostu Məmmədxanı bir addım özündən geridə buraxıb özünü içəriyə verdi, prokurorun hüzuruna ədəb-ərkanla salam yetirdi. Mehman nazik, uzun barmaqlarıyla qara qıvrım saçlarını alnından geriyə darayıb, müstəntiqin salamını aldı. İşin xoşluqla başlandığını görən, hələ daxildə nə olduğunu dərk etməyən Murtuz Murtuzov cəld çiyni üstündən geriyə qanrılıb:

– Yoldaş, prokuror, – deyə Məmmədxanın yaxasından yapışıb onu içəriyə dartdı. – Bu yazığın, bu başıdaşlının başına oyun açılıbdır!

– Nə oyunu? – Mehman zahiri soyuqqanlılıqla soruşdu, – məgər nə olubdur, müstəntiq?

– Elə bir oyun ki, yoldaş prokuror, – deyə Murtuzov anbardarın yaxasını buraxıb irəliyə gəldi, stola söykəndi, qırmızı mahud örtüyü əlinin kəfəsi ilə sığallamağa başladı. – Deməyə adamın dili də gəlmir, vicdan haqqı...

– Niyə, nə üçün adamın dili də gəlmir, Murtuz, müstəntiq?

– Belə ki, yoldaş prokuror, – deyə Murtuz Murtuzov çiyinlərini çatdı, – nə bu oyunu düşünmək, nə də bu oyundan baş çıxarmaq olur?!

– Necə bəyəm, nə təhər bəyəmləri? – Murtuzovla onun yanında büzüşən Məmmədxanı gözdən keçirən Mehman sözünü qəsdən döndərib yantarırdı. – Yoxsa bu adam da xalq müəllimlərinə göndərilən sənaye malında dolaşığa düşübdür?

– Yoldaş Atamoğlanov, – deyə Murtuzov çevrilib qaşqabağından zəhər damcılayan Məmmədxanın turş-acı sir-sifətinə, onun dərin yasa batdığını andıran qara, sallaq dodağına baxdı, Murtuz "yumurtadan yenicə çıxan" uşaq prokurorun belə mürəkkəb bir işdə hədəfi sərrast nişan ala bilməyəcəyini, onun əl-qolunun titrəyəcəyini yəqin edib için-için güldü. Müstəntiq bu hadisənin tükənməz sevincini gizlədə bilmədən özünü büruzə verən qəribə bir ahənglə əlavə etdi. – Baxanda, bu başıdaşlı yazıq, neçə-neçə ilin təftişindən gül kimi çıxıbdır!

– Bəs onda bu gədənin başına gələn qəziyyə nədir? – Mehman ötən axşamkı tamaşanın pozulmasından bixəbər kimi soruşdu. – Bəs onda nə qəziyyədir?

– Başına gələn qəziyyə budur ki, demiyəsən bəs arvad tutub özünü asıbdır! – Murtuzov duruxub əlavə etdi. – Başıbatmış, durduğu yerdə tutub özü-özünü tələf eləyibdir!

– Adı nədir özü-özünü tələf eləyənin, Murtuz müstəntiq?

– Adı, Balış! – deyə Murtuz danışığını sürətləndirdi. – Ötən axşam "Məşədi İbad" tamaşasında oynamağa getməyən Balış başıbatmış, avaranın balası avara! Çölü bəzək, içi təzək zalım qızı zalım!.. Baxanda nə deyiləsidir, nə də danışılası!..

Mehman ilk əzəldən yanılmadığını, ilk müşahidə duyğularının belə düz çıxdığını görürdü. İstər-istəməz başını tərpədib təsdiq etdi, barmağını büzüşüb qaralan, qara qan tuluğuna çevrilən adama tərəf uzatdı:

– Bəs bu özü şəxsən belə bir faciəni haçan, nə zaman bilibdir?

– Elə ancaq bu sabah, yoldaş prokuror... Sübhdən, tezdənnən!.. Özü də görüb-bilən kimi yüyürüb gəlib ki, birbaş şəxsən sizin özünüzə, yoldaş Atamoğlanova bildirsin!.. Daha düzü, ədalət naminə sizin qədəmlərinizə yıxılsın. Daha şərə-şürə düşməsin!

– Demək, qadın özü-özünü asıbdır! – Mehman diqqət və nüfuzedici gözlərilə qatili süzdü.

Qatil onu qorxuya salan, ötən gecə onu izləyən, bir an belə ona rahatlıq verməyən gözləri görüncə şaşırıb duruxdu, mövru pişik kimi anbardarın var-yoxunun marığında yatan Murtuz Murtuzov çox cəld sorğu-suala müdaxilə edib:

– Bir az o arvadın ayağı sürüşkən, gözü dağınıq idi, – deyə qatilin dilinin altına dil qoymaq üçün tələsdi. – Boynu sınmış paxırı aləm qabağında açıldığından yana daha el töhmətinə tab gətirə bilməyibdir. Özü-özünü kəndirə aparıbdır.

Murtuzov prokurorun sifətində sezdiyi şübhəli təbəssümü duyunca, əlini iri daz başında hərləməsinə gəzdirib hər hansı bir ehtimala qarşı sözünü dəyişdirdi.

– Əlbəttə, hamısını şəxsi rəhbərliyiniz altında bizim ədalətli sovet istintaqı aydın edəcəkdir! Hələ ki, ilk söz-söhbətdir?!.

Artıq Mehman, qarşısında boyun əyən, arada bir qırmızı örtüyü sığallayan Murtuzovun hərəkətlərində anbardara aid bir qayğının ifadəsini kəsdirib:

– Elə bu saat hadisəni öz yerində yoxlamaq gərəkdir, – deyə sakit kimi oturduğu kürsüdən dik qalxdı. – Həkimi çağırmaq gərəkdir, bir də milis rəisini!.. Bənnaoğlu, Cabiri!

Mehman telefon dəstəyini əlinə götürüb, rayon milis rəisinə zəng edincə, Murtuz Murtuzov fiürsəti fövtə vermədən astaca bayıra sivişib

prokurorluğun həyətində qırım-qırıntı toplayan, əlini kötük süpürgədən çəkməyən Qaloşlu adama yanaşdı. Balış əhvalatını onun ovcuna qoydu.

– Sən nə danışırsan, ədə? – deyə Qaloşlu adamın qırışıq sifəti acıtmalı xəmir kimi turşudu. – Deyirsən yəni bu gədə havayıdan Balış lotunun xatasına düşübdür!.. "Məşədi İbad"da qol götürüb oynayan bu ləçərin qızı ləçər! – Murtuz Qaloşlu adamı dürtmələyə-dürtmələyə, alacalanan gözlərini prokurorun qapısına hərləyə-hərləyə əlavə etdi.

– Sən bir tez eynəkli həkimi çağır, iş eynəklinin nəticəsindən asılı olacaqdır! Əgər ürəyin bu qədər yanırsa, tez özün yüyür, ucun-dan-qulağından eynəklini əməlli-başlı başa sal! Dam dirək üstündə duran kimi, bu iş də məhkəmə həkiminin verdiyi nəticə üstündə duracaqdır!

– Belə, yəni Murtuz?

– Bəli, belə, dam dirək üstə, Qaloşşş!..

Qaloşlu adam bir an yubanmadan yanlarını basa-basa, qaloşlarını sürüyə-sürüyə yortavladı.

– Qocanı məhkəmə həkimi üçün göndərdim, – deyə içəriyə dönən Murtuz öz rəisinə raport verdi. Mehman əl-ayağa düşən Murtuzovun ləkələnən sarımtıl sifətinə baxdı, onun qırışan sifətinin tala-tala qara ləkələr ilə örtüldüyünü gördü.

– Bilirsinizmi, doktor, biz sizi niyə çağırmışıq? – deyə Mehman içəriyə daxil olan eynəkli həkimə müraciət etdi.

– Xeyr, əsla, buyurun! – Narahatlıq keçirən məhkəmə həkimi kürsüdə rahatlanmağa çalışdı. – Buyurun, bəlkə kənddə bir hadisə üz vermişdir? – O, dayanmadan əlavə etdi. – Mən də, üstünüzə sağlıq, yamanca kefsizləmişəm!

Qapı ağzında dayanan, qulağı səsdə durub intizar içində gözləyən Qaloşlu adam qırışıq burnunu içəriyə uzadıb tez də çəkdi: "Barakallah, həkim!.. Səd afərin, eynəkli!"

– Bəli, bir iş vardır, – deyə, Qaloşun dimdik burnunu uzadıb çəkdiyini nəzərindən qaçırmayan Mehman həkimin üstünə döndü. Məhkəmə həkimi tam nəzakətlə:

– Bəli, buyurun, – deyə ağ ətli əllərini ovuşdurdu, – yoldaş prokuror, mən əmrinizə müntəzirəm!..

– Bu saat biz bir vacib yerə gedəcəyik, doktor!

– Mən sizə əmr etdim ki, naçağam, – həkim sözünü döndərib kürsüdə qərar tutub yoğun kötüyə çevrilən gövdəsilə yığılıb açıldı, soyuqladığına, ağrıdığına, bəlkə də lap ikitərəfli sətəlcəm olduğuna işarə etdi: – İndi

mən siz görən vəziyyətdə deyiləm, əsla Züleyxa xanımı müalicə edən halda deyiləm!.. İndi mən doğrudan da, vicdanən çox yamanca xəstələnmişəm... Görünür lap, bəlkə də ikitərəfli sətəlcəm də olmuşam.

Əlini həkimin ətəyinə toxundurub çəkən Murtuz Murtuzov alışıb-yanan gözlərilə, kərələrlə olduğu otağı təsəvvürünə gətirib qurtaqurtla udqundu, – "lap göydəki tək Allah da o xalı-gəbədən adlamaz, – deyə fısıldadı – nə ki yerdəki biz təki biçarə bəndələr?!" Murtuz yanıb-qaralan dil-dodağını yaladı.

– Biz çox yaxına gedəcəyik, doktor! – deyə həkimin izafi cəfasının müqabilində şübhələri artan Mehman bir-birinə bənzəyən müstəntiqlə məhkəmə həkimini istehzalı təbəssümlə gözdən keçirdi.

– Bu tamam başqa məsələ! – deyə həkim şişkin əllərini yumru, yağlı dizlərində gəzdirdi. – Qırx dərəcə hərarətim olsa belə, yaxına getməyə etiraz etmirəm, prokuror!

– Mehman milis rəisinə baxınca onlar ayağa qalxdılar, Məmmədxanı qabaqlarına qatıb qapıdan sallanan qıfılı açdılar. Mehman irəliyə ötüb otağa girdi. Bu otağın divarları qiymətli xalı-gəbələrlə örtülmüş, döşəməsinə isə bir cüt ala-bəzək xalı sərilmişdi. Baxanda elə bil ki, otaq çılçıraqdı, yanırdı. Deməli, Balış bu evdə, bu qızıl qəfəsdə zəhər içmişdir, daha doğrusu, onun boğazı burada kəndirə keçmiş, o gözəl xilqət boğulmuşdur. Necə, nə təhər, onu istintaq bildirəcək, Mehmana düzü-əyrini göstərəcəkdi?!.. Mehman, öz dostu Altayla kluba getdiyi, burada hazırlanan tamaşaya baxdığı dəqiqələri andı... Bəli, Balış, bu şəhərcikdə həmin vahid qadın idi ki, klub səhnəsinə gəlmiş, özüylə səhnəyə həyat və nəğmə gətirmişdi. Bu həmin Balış idi ki, bunsuz klub müdiri Əbdülsalam özünü heç-puç hesab edirdi... Bu həmin Gülnaz idi ki, səhnədə öz rolunu ifa etdikdə, bu Məmmədxanın barmaq hədəsindən çəkinmədən öz vəzifəsini yerinə yetirmişdi. Heç şübhəsiz Balış öz ictimai fəaliyyətində Altay və Mehman kimilərinə güvənmişdi. İndi həmin Balış gərəksiz bir cəsədə çevrilmişdi... Bütün bu cəhətləri düşünən, ilk istintaqa başlayan Mehman özü də dərk edir, onun qatilə qarşı kini içəridə yanıb közərirdi.

– Sizin evinizdirmi bura, vətəndaş Məmmədxan? – deyə bir an içində xəyalı gəzib-cövlan edən, öz addımlarını necə atmağı müəyyənləşdirmək istəyən Mehman ilkin sadə sual verdi: – Bu bərbəzəkli otaq sizindirmi, vətəndaş?

– Bəli, bizimkidir, bu xaraba!.. Bizimkidir bu dağılmış viranə!

– Bəs qadın harada, – deyə Mehman müqabilindəki qatilin gizlənməyə cəhd edən gözlərini tuturdu, – asılmışdır?

– Bu yanda bir balaca anbarçamız var, – deyə anbardar gözlərini yerə zilləyib danışır kimi davam etdi: – Öz-özünü asıb – məni də bədbəxt eləyib, başına dönüm, – Məmmədxan ayaqlarını sürüyə-sürüyə gəlib aradakı balaca qapını açıb qaranlıq küncü göstərdi. – Mən evdə olmayanda, boynusınmış bu kələyi mənim başıma gətiribdir!

Mehman qapıya yanaşdı, Məmmədxanı əlilə geriyə itələyib, başını içəriyə saldı, kiçicik pəncərəcikdən düşən alaqaranlıqda qadının boyaboy kəndirdən sallandığını gördü.

– Bəs bu çöl qapı? – Kin-küdurəti artan Mehman başını döndərib Məmmədxandan soruşdu. Məmmədxan yasa batmış kimi çənəsini sinəsinə bitişdirib:

– Bu qapı açıq idi, başına dönüm, prokuror! – dedi.

Mehman anbarçaya girmədən geriyə çəkildi, stulu sürüyüb əyləşdi.

Milis rəisi Cabirov prokurorun belə səbirlə tərpənməyinin müqabilində darıxdığından, durub içəriyə girmək istərkən prokuror əlini qaldırıb onu saxladı.

– Neçə vaxtdır, öz əllərinlə boğub öldürdüyün bu qadını dikəldib oradan asmısan? – deyə Mehman gözətlənmədən səsini qaldırdı: – düzünü de, lap düzünü, doğrusunu söylə?!

Mehmanın hədəfə açılan atəşi Məmmədxanı gicəlləndirdi, onun gözlərinə zülmət çökdü:

– Necə, necə? – Anbardar sərsərisayağı dilləndi: – Nə təhər?

– Karsanmı? – Prokurorun amir səsi qatili sarsıtdı. Anbardar yaman gündə Murtuzun yaxasından yapışmağa, qıjıltılı çaya düşən adam saman çöpünə əl atan kimi o da öz dostuna əl atdı:

– Murtuz qardaşa hamısın demişəm, – Məmmədxan titrəyə-titrəyə danışırdı. – Ötən tamaşa axşamı mən onu atası evinə gedən bilmişəm... Məndən soruşan Əbdülsalama da beləcə bildirmişəm... Ancaq bu səhər anbarçaya girəndə onu kəndirdən sallanan görmüşəm.

– Sən tikanlı kirpi kimi qınına çəkilməklə özünü xilas edə bilməzsən! – deyə Mehman qatili məngənəyə aldı. – Bu əl qadın azadlığına qarşı qaldırılan xain əldir! Sən, köhnə dünyanın yeni dünyaya buraxdığı murdar bir cəmdəksən!

Prokurorun belə açıq ittihamı qarşısında qatilin şişkin qara sifəti böyüdü, o bütöv bir qara ləkəyə döndü.

– Elə isə onda siz də məni asın!

– Mən sənə, sənin kömür üzünə, qadın azadlığına qaldırılan düşmən əlinə ən ağır, ən şiddətli cəza tədbiri tələb edəcəyimi elan edirəm!

– Haqq olan yerdə mən heç bir cəzadan çəkinmirəm, – deyə qatilin daz qapaqları titrəyincə o, ayaqlarını yerə dirədi. – Mən qaçmamışam, böhtandan çəkinib tezməmişəm, mən özüm, öz ayağımla Şura hökumətinin ədalətinə pənah gətirmişəm... Özüm öz ayağımla, onun idarəsinə gəlmişəm... Başqa yandan başımı gizlətmək istəməmişəm.

Bütün gecəni qaçmaq-gizlənmək üçün vurnuxan qatili nifrətlə süzən Bənnaoğlu:

– Biz onu bilirik! – deyə Mehmanın gözünü yayındırıb, Məmmədxana bir dürtmə ilişdirdi: – Biz sənin öz ayaqlarınla necə prokurorun hüzuruna gəldiyini əcəbcə bilirik!

– Sən bənna balası! – deyə Məmmədxan mırıldandı.

– Sən anbardar! – deyə milis rəisi hayqırdı.

Acıqlanan Mehman ayağa durdu, milis rəisinə əliuzunluq etməmək işarəsini verdi, pəncərəyə yaxınlaşıb buraya qoyulan yeddilik lampanı kibritlə yandırıb əlinə götürdü, içəriyə girdi. Dişi bağırsağını kəsən milis rəisi "necə də sən Məmmədxanı tüfəng küpü ilə gupardım" – deyə Məmmədxanın boynunun kökündən itələyib onu içəriyə saldı, hesabı içəriyə verən eynəkli həkim istər-istəməz buraya daxil oldu. Mehman şölələnən lampanı künc-bucaqda gəzdirdi, nəhayət, kəndirdən sallanan Balışın üzərində dayandırıb, onu diqqətlə ayaqdan başa süzdü. Balışın səhnədə açılan gül sifəti artıq kömür kimi qaralmış, onun "kraliça" lığından iz-əlamət qalmamışdı. Rayon klubunun "Dezdemonası" həlak edilmişdi.

– Qadın bəs sizcə nəyin üstünə çıxıb özünü asıbdır? – Mehmanın lampadan əli əyilib-bükülən qatilin başı üstündə dayandı. Məmmədxan böyrü üstə yıxılan taburetə işarə edib:

– Bax bunun üstünə! – yalançı göz yaşlarını sildi. Mehman lampanı milis rəisinə verdi, ayaqları laxlayan tabureti götürüb asılanın ayaqları altına qoydu, burada müəyyən bir boşluğun olduğunu müəyyən etdi.

– Tam dörd barmaq! – deyə məsafəni ölçən Mehman məhkəmə həkiminə sarı döndü. Boynu piydən qat bağlayan şişman həkim güclə cöng oturub eyni məsafəni cibindən çıxardığı əsgisayağı ruletlə ölçdü. Asılanın ayaqlarıyla laxlayan taburetin arasında müəyyən boşluq əmələ gəldiyini görüncə təəssüf hissilə altdan yuxarı Murtuz Murtuzova nəzər saldı, istər-istəməz onun başı bir balaca titrədi. Əyilib santimetrləri gözdən keçirən Murtuzovun daz başına xışıltılı qan doldu, o, uzundimdik şapkasını əlində hərlədi, istədi bu dimdikli şapkanı zor düşən başına qoymaqla lərzəyə düşən sifətini prokurordan gizləsin. Axı sınıq-salxaq

taburetlə asılanın ayaqları arasında uçurum – boşluq əmələ gəlirdi? Axır bu özü də hər iştahası tük aparan hər iki adamın belindən basır, andardarın xalı-gəbələrini onların sulanan ağızlarından çıxarırdı?!

“Bu əbləhin mənimsəmələri vurub üzə çıxmasınmı, bu əmlakı bu prokuror müsadirə etdirib, – dövlət mənafeyi, – deyə xəzinəyə verdirməsinmi?” Hər iki dazbaş adam birdən udqundu. Sanki hər ikisinin ürəyindən eynən qara qan axdı. Hər ikisi naşı iş görən anbardarın atasının goruna bir an içində, bəlkə də minbir kərə söydü. “Cəhənnəm kötükçüsü” Qaloşdan məsləhət almamaqda onu sarsaqdan da sarsaq saydılar. Belə də kor-kobud iş görmək, axmaq bir iz qoymaq olardımı? Hər iki dazbaş birdən öskürdü. Mehman kirpiklərin çalındığını, gözlərin gəzdiyini, anbardar tərəfindən hər iki dazbaşa bütün evin, xalı-gəbənin vəd edildiyini hiss etdi.

– Çox yəqin ki, bu qadın öz ayaq barmaqlarının ucunda dikəlib, özünü bir qədər də yuxarıya dartıb özü-özünü asıbdır, – deyə dazbaş həkim əllərini dizlərinə dayayıb ayağa qalxdı.

– Onda bəs bu tabureti kim böyrü üstə yıxıbdır?.. Əgər belədirsə, tabureti kim yıxmış olar? – Mehman çəkməsinin ucu ilə tabureti vurub, istehzalı ahənglə soruşdu: – Bəlkə onu da qadın özü, özünü asdıqdan sonra edibdir?.. Ola bilməzmi belə bir möcüzə?! – Mehman gözlərini qatilin gözlərinə saplayınca, həqiqət qarşısında sarsıyan, məhkəmə həkimi boğazını bir neçə dəfə arıtladı.

– Mən bu yazığı, bu bədbəxti görəndə – deyən Məmmədxanın klubdakı hədələyici barmağı titrəməyə başlayırdı. – Düzü özümü lap əməlli-başlı itirdim... Vəziyyət heç cürə yadımda deyil... Düzü istəmədim tez qaraqışqırıq salam, ancaq qorxdum, qonşular axıb buraya tökülə, iz tamam-kamal itə? Əqlimə gəldi ki, birbaş yüyür prokurorun üstünə!

Qatilin belə məntiq izahatı müqabilində hər iki dazbaş bir-birindən bixəbər, hər ikisi birdən döşünü arıtladı, sanki hər ikisinin xırıltılı nəfəsindən: “Ha, qoçaq, ha! – Xalılar ha, xalçalar ha!” – sözləri çıxıb otaqda dolaşdı. Üstüörtülü işdən baş çıxaran milis rəisi hirsindən gödək bığlarını çəkişdirdi. Mehmanın hiddətli gözləri sarı eynəkli adama tərəf çevrildi.

– Asılan adam uzanır, yaxud gödəlir, möhtərəm həkim?

– Bişübhə uzanır! Bu hamı üçün bəlli bir məsələdir!

– Bəs asılan uzandığı halda onun ayaq barmaqlarının ucu belə niyə sınıq-salxaq taburetə çatmasın?

– Ola bilər ki, bir az əvvəl, mən ərz edən kimi barmaqlarına dayaq verib iki əlli kəndirdən yapışıb özü-özünü asıbdır!

– Demək bu aşkar dəlil bizim möhtərəm məhkəmə hakiminin nöqteyi-nəzərincə isbat edilməmiş qalır?..

– Bəli, sizin dəlilinizdə böyük şübhə vardır, – deyə xalı-gəbəyə baxdıqca iştahası itilənən Murtuz birlikdə az nahaq qan basdırmayıb, sallaqxana köpəyi kimi boynunu yoğunladan, hakimliyini itirib aşağıdan da aşağı düşən Əbülfətzadə döyünən ürəyinə güc verməyə başlayır, daha dürüstü, həmişə olduğu kimi indi də öz ürəyini əzməyə-əzişdirməyə çalışırdı:

– Burada insan taleyi, insan müqəddəratı həll olunduğu zaman mən öz ləkəsiz vicdanımın səsinə qulaq asmağı düstur kimi tuturam, – deyən dazbaş nə qədər özünü tox tutmaq istəsə də, sanki onun ürəyi üsyankarlıqla səslənirdi, onun qulaqlarında cingildəyirdi. – Bəli, mən hər halda ölənin faciəsini düşünən kimi, dirinin də taleyini unuda bilmərəm!

– Demək ölən ölübdür, eləmi?

– Xeyr, əsla prokuror!

– Lakin?..

– Lakin kifayət qədər dəlil, sübut olmadan hökm çıxartmaq bizdən vicdani məsuliyyət tələb edir, – deyə Əbülfətzadə kənara çəkilib çəlləyə söykəndi, Mehmanın amansız baxışları müqabilində özünə dayanacaq tapmaq istədi. – Mənim işimin mahiyyəti məndən ədalətli, vicdanlı, namuslu, məsləkli olmağı tələb edir, cavan prokuror!

– Bəli, belə! – deyə qəzəblənən Mehman nəfəsini dərindən dərdi, asılan qapının kəndirdən azad edilib o biri otağa keçirilməsini, çarpayı üstünə qoyulmasını tələb etdi. Bayaqdan buyruq gözləyib əmrə müntəzir dayanan milis rəisi lampanı küncə qoydu, intizam saxlamaq üçün bayırda dayanan milislərdən iki nəfərini içəriyə çağırdı, prokurorun əmrini yerinə yetirdi.

Mehman asılı qadının sarı bənizinə səpələnən şəvə saçlarına baxdıqca “kraliça”nı xatırladı, yavaş-yavaş kövrəldi, başını döndərincə divardan onun diqqətini qaraqaşlı, qaragözlü, süzgünbaxışlı əks cəlb etdi.

– Bu kimin şəklidir? – deyə Mehman başını yana döndərib barmaqlarıyla yaşaran gözlərini gizlicə olaraq silib qəzəblə əlavə etdi: – Siz mənə, doğru-dürüst cavab verin, müttəhim!

– Bizim, bədbəxtin! – deyə başıaşağı dayanan anbardar şəklə baxmağa cürət etmədən cavab verdi. – Yazığın şəklidir, bizim biçarə Balışın!

– Bəs indi Balış kimə baxır? – deyə prokuror tələbkarlıqla soruşdu. – İndi bəs Balış kimə baxır? Düz cavab verin!

Məmmədxan kal-kal hönkürdü:
– Balış, Balış... Evimi yıxan, qapımı qıfıllı qoyan Balış!..
Bayıra toplanan izdihamı yarıb keçən, milis nəfərlərinin arasına dürtülüb. – Prokuroru görməliyəm, – deyə özünü içəriyə verən Qaloşlu adam, özünü "əldən salan", Məmmədxanın qolundan yapışıb onu silkələdi.
– Toxtaq ol, ədə, toxtaq! Sən başını yolma, prokurora ağıllı-başlı cavab ver! – deyə özünü araya atdı. – Kişi ol, ədə, arvad kimi zarıyan, ağlayan olma.
– Kişi, sən bayıra! – deyə Mehman gözlərini dolandırınca, Qaloşlu adam süpürülüb bayıra çıxdı, dodaqlarını büzüb "görək, kim kimi bayıra basacaq?" – deyə "qızıl saat əhvalatını" xatırladı, vurduğu düyününü gözlərinin qabağına gətirib "Qızıl ki var – deyə inamla söyləndi – ta qədimlərdən bəriyə sönməyən oddur... Haranı desən yandıran alovdur. Kimi desən boğandır... Kimin desən səsini kəsəndir. Baxanda həmişə möcüzədir, sehrlər sehridir".
Bir az ara verincə boynupiyli, gözləri sarımtıl məhkəmə həkimi Əbülfətzadə Balışın meyitini ədəb-ərkanla müayinəyə girişdi.
– Kəndir izi, bir baxın! – deyə iri daz başını yuxarı qaldırınca Mehmanın heyrətlə dayandığını, onun bütün davranış və hərəkətlərini şübhə ilə izlədiyini gördü. Nəhayət, milis rəisi və müstəntiq Murtuzov da başlarını Balışın üstünə sallayıb diqqət etdilər.
– İşıq verin, işıq! – Mehmanın səsi mis kimi cingildədi, sallanan başlar səksənib çəkildi. Cavan prokuror həqiqət axtarır kimi Balışın boyun-boğazını nəzərdən keçirməyə başlayıb:
– İşıq-işıq! – deyə təkrar etdi: – işıq verin, işıq!
Milis rəisi pəncərənin pərdəsini bir-bir sivirib yanlara çəkdi, nizam-intizamın necə saxlandığını bilmək üçün həyətə də bir göz gəzdirdi. O, bayırda toplanan adamları, adamların qabağında dayanan Əbdülsalamı, onu dövrəyə alan aktyor kollektivini gördü.
– Biz qatilə ölüm tələb edirik! – deyə ürəyiyanıqlı, gözüyaşlı Əbdülsalam hər iki əlini qaldırıb yumruqladı. – Səhnəmizin əlvan lələkli tavusuna, bizim "kraliça"ya əl qaldıran hər kimsə, ölüm tələb edirik!
– Ölüm! Ölüm tələb edirik, ölüm! – deyə aktyor kollektivi rejissorun səsinə səs verdi, bu səslər otaqçanı titrədib, Məmmədxanın canına giziltili bir üşütmə saldı. Prokuror müayinəsini dayanmadan davam etdirib:
– Buraya, buraya baxın, həkim! – deyə barmaqlarını üstdən gəzdirdi, məhkəmə həkimi ipiri, sarı saplı çeşməyini ütülü ağ dəsmalı ilə silib-silib gözlərinə gətirdi.

– Diqqətlə buraya baxın, həkim!

Əbülfətzadə başını sallayıb, iki ayağını bir başmağa qoymuş kimi israr etdi:

– Boyun-boğazına hərləməsinə kəndir kəsibdir. Bayırdan gələn artist səsləri də mənim vicdan səsimi susdura bilməz!

– Yox, qatilin barmaq izləridir. – Mehman başını qaldırıb əzici nəzərlə xaldar qalstuklu, dazbaşlı məhkəmə həkiminin sir-sifətini süzdü. – Məgər, sizin eynəkli gözlərinizin işığı bu qədər azalıbdır, möhtərəm cənab?

Dünyanı yorub-yortan Əbülfətzadə başını qaldırıb anbardara baxınca, büzüşən anbardarın hər iki əli birdən qalxıb, barmaqları aralanıb başına çırpıldı.

– Müqəssir! – deyə anbardarın aralanan barmaqlarını görən, hər barmağı ilə bir min manat vəd etdiyini işarə ilə duyan Mehmanın qəzəbnak hayqırtısı səqfi titrətdi, şüşəli pəncərələri cingildədib bayırdakı izdihamı tərpətdi, Əbdülsalam öndə olmaqla həvəskar kollektivi şəhər camaatıyla irəliyə cummaq istədi. Lakin Bənnaoğlunun nizam-intizam üçün təyin etdiyi milis nəfərləri adam olanın qabağını kəsdi.

– İşə mane olmayın!

– Buraxın bizi!

– Yol verin bizə!

– “Dezdemona”nı görmək istəyirik.

– “Kraliça”nın qarşısında əyilmək, təzim etmək istəyirik!

– Bənnaoğlu bizi qulluqdan qovar! – deyə milislər adamlara sakit olmağı, nəticəni gözləməyi məsləhət bildilər:

– Həkim, siz tamam diqqətlə nəzər salın, – deyə məhkəmə həkiminin ürəyini əzişdirməkdən əl çəkməyən Mehman onun olub-qalan vicdan zərrələrinə müraciət etdi.

– Mən, cavan prokuror, öz həkimliyimdən əlavə bu işlərin ixtisas kursunu da belə nailiyyətlə keçmişəm! – deyə Əbülfətzadə dikəldi. – Mən iyirmi ildən artıqdır, bu sahədə çalışmışam, saç-saqqal ağartmışam!.. Daha mən dünən yumurtadan çıxan cük-cük edən cücələrdən deyiləm!

– Müqəssiri bayıra! – deyə Əbülfətzadənin necə çərənlədiyini görən Mehman uca səsi ilə əmr etdi.

Milis rəisi əmrə itaət edib, Məmmədxanı bayıra itələdi, intizam saxlayan milislərə təhvil verdi, Mehmanın nəzərləri Əbülfətzadənin sarı keçi buynuzunu andıran eynəyində gəzdi:

– Siz qatilin barmaq izlərini necə də görmək istəmirsiniz?!. Mən təəccübdən artıq sizin dördləşən gözlərinizə təəccüb edirəm! – Prokuror şəhadət barmağını yenə də qatilin barmaq izlərində gəzdirdi – Məgər, siz məhkəmə həkimi dördgözlə də bu qədər görmürsünüz?!

– Hələ ki, mən bu qadının boğazında aydın bir şey, yəni boğan barmaqların iz-tozunu görmürəm! – "On min manat işarəsi" aldığından vicdanını ayaqları altına alıb piyli donuz kimi xortaxortla tapdayan Əbülfətzadənin sir-sifəti kobud yonulan daş parçasına döndü. – Mən başqa bir xülasə yaza bilmərəm! Mənim vicdanım var!.. Burada canlı insan taleyi həll olunur... Mənim məsləkim vardır! Hamısından da əfzəl bax budur!

– Bəli, hamısından da əfzəl bax budur! – deyə Mehmanın kinayəli sözləri, nə qədər müqavimət göstərmiş olsa belə Əbülfətzadəni qızdırmaya qovdu: – Bu al günəşin dupduru işığında sizin üçün dördgözlə belə görmək nə qədər də çətindən çətin olubdur, məhkəmə həkimi?!

Mehmanın istehzalı, iynəli, kinayəli sözlərindən titrətmə tutan Əbülfətzadə ətli barmaqlarını ovuşdura-ovuşdura səyriyən çənəsilə giley-güzara başlayıb:

– Evinizə də az-çox gəlmişəm, sizin xəstənizin üstünə, xanımınızı müalicə etmişəm. – O, tamahkarlıq burulğanında boğulur, az qala titrədə-titrədə hıçqırır, ancaq "on barmaq"dan üzülmür, üzülə də bilmirdi. – Əgər siz mənə etibar etmirsinizsə, mən əsla bunun üçün təqsirkar deyiləm! Mən də müəyyən... məsuliyyət hiss edirəm!.. Mən bu səhnə qadınının boğazında ancaq-ancaq hərləməsinə kəsən kəndir izlərini görürəm!.. Daha mən, səhnə xanımını boğan barmaq izlərini görmürəm!

– Baxarıq, baxarıq! – deyə odlu əlilə eynəyi kimi saralan Əbülfətzadəni rədd edən Mehman milis rəisinə müraciət edib: – Qatili elə bu an həbsə almaq gərəkdir! – dedi.

Bu evdə çilçıraq kimi yanan xalı-gəbənin ağzından çıxacağını keçirən Murtuz Murtuzov:

– Gərək də belə olsun! – deyə boranı başını prokurorun qabağında salladı. – Gərək də siz buyuransayağı olsun!..

## XXXIII

Murtuzovun arvadı Yavər mətbəxdə xörək hazırlayır, Şəhla xanım bir amir kimi ona göstəriş verirdi. İztirabları az-çox ötüb keçmiş Züleyxa isə ayna qabağında dayanıb saçlarını xüsusi bir aludəçiliklə qaydaya salır, özünə sığal verirdi.

Bayaqdan bəri qapıda girlənən Qaloşlu adam özünü içəriyə saldı. Züleyxa səksənib çevrildi:

– Bıy sizsiniz?.. Dedim bəs kimdir?..

– Mənəm, bala, – deyə Qaloşlu adam udqundu, sözünün ardını gətirmədən xeyli bayıra baxdı.

– Görünür ki, sözünüz var, hə, əmi?

– Bəli, bir balacası var idi, qızım!

– Onda bəs niyə çəkinirsiniz? Biz ki, sizə yad adam kimi baxmırıq!

– Məsələ də buradadır ki, adam yaxınına söz deməyə həmişə utanar... Nədən ki, deyərlər, üz verdik, astar istədi. Xətir qoyduq, başa çıxdı. Belədir, başına dönüm, dünya qəribədir, ürək dərdini adam öz balasına da aça bilmir...

Züleyxa çiyinlərini çəkdi:

– Necə deyərlər, oxunu atıb yayını gizlətmək nöşün?

Qaloşlu adam bir qədər yaxına gəldi, əlini Züleyxanın qolundakı qızıl saata uzatdı:

– Bədbəxtlikdən bu mənim qardaşımoğludur!..

Züleyxa təəccüblə:

– Kim? – dedi.

– Bu Məmmədxan!

– Necə Məmmədxan?

– O arvad ki, özünə qəsd eləyib ha, eşitmiş də olarsınız!.. Onun əri, Balışın!.. Onun atası ilə mən qardaşdan da artıq idim. Çox kara gələn adamdı. O irəli dedim ki, ədə, Məmmədxan, bu şey lazımdır (Qaloşlu adam yenə saata işarə etdi), müzayiqəsi olmadı, dost yolunda başını verən oğlandır, bədbəxt!

Bir anda Züleyxanın rəngi qar kimi ağardı, o tez sağ əlini sol qoluna atıb:

– Onda bu saatı özünə qaytarmaq lazımdır, – deyə qolundakı saatı açmağa çalışdı.

– Özü qazamatdadır!

– Hər nədir qaytarmaq gərəkdir, özünə, vəssalam!

Qaloşlu adam əlini tüklü, qırışıq çənəsinə atıb:

– Biz də bir adamıq, – deyə qaloşuna baxdı, – beləliyimizə baxmayın siz bizim!..

– Hər necə olsa, Mehman başımı kəsər!

– O bu işləri bilməmiş olmaz!

– Mehmanmı?..

– Bəli! – deyə Qaloşlu adam girəvəni əlinə keçirən namərd ovçu cürətilə öz ayaqlarının altını bərkitdi.

– Bəs, nə əcəb özü mənə bu barədə heç hələ bir söz deməyib?.. Çünki hələ də o elə bilir ki, bəs bu saatı mamam gələndə gətiribdir!

– Demək nəyinə gərəkdi, – o, qaloşu ilə fərşi qurdaladı. – Bir şey ki, açıq ola, daha açıq qapının nəyini döymək?..

– Onda mən özüm Mehmana deyərəm, – sanki Züleyxa çıxış üçün qapı axtarırdı, – pulumuz da olmadı ki, barı vaxtında bu saatın dəyərini verək?! İndi də bu işin içindən də bir iş çıxmaya?! Onda mən mamama!.. – deyə Züleyxa anasını səslədi: Mama!..

– Nə üçün, qızım? Nə üçün axı belə bir təlaş? – Qaloşlu adam dərisi yanıq əlini qaldırdı. – Burada axı, indi nə var ki?

– Qoy mamam bu işi bilsin, sonra yaxşı çıxmaz! Uy Allah, – deyə Züleyxanın vücudu sarsılmağa başladı. – Mən Mehmandan nə qədər də qorxuram! Siz bilmirsiniz, – deyə Züleyxa az qala Qaloşlu adamın ayaqlarına qapanmaq istəyirdi. – Mən onu əcəb tanımağa başlamışam!.. Heç kəsdən çəkinməz! Birdən bizi tutub məhkəməyə verər... Uy mama! Yox, yox! Alın bu bir tikə zəhrimarı! Alın! Biz o qədər də görməmiş deyilik, alın bu sarını, özünüz öz əlinizlə atın çölə, rədd olsun bizdən!

Qaloşlu adam əl atıb Züleyxanın qolundan möhkəmcə yapışdı:

– Qızım, biz görməmiş deyilik! Bir eləsi olmasın, min eləsi olsun, bu qoca əmin ölməyib ki! – Onun kinli gözləri otağı dolanıb gəzdi. – Mən də mənəm! Mənə qulaq asın! Heç kəsə bir söz demək lazım deyil. Maman nə üçündür? Eyibdir, səs olar, kənara səs çıxar, səs-küy dünyanı bürüyər, fil də olsan altından çıxa bilməzsən!

– Mənim bu dünyada mamamdan heç bir gizli sirrim ola bilməz! Özü də bilir ki, mən başqa fikir üçün bu saatı götürməmişəm! Siz gətirdiniz, mən də qoluma bağladım, bilmədim sonrası gedib elə qazamata çıxacaqdır!..

– Onu sonra, qızım! – Qaloşlu adam dönüb özünü itirən Züleyxanı sakit etmək istəyirdi. – Burada nə qazamat?!

– Allahı sevirsən, bu sarı zəhrimarı alın! – deyə Züleyxa daha saatı öz biləyindən açıb Qaloşlu adama uzatdı. Qaloşlu adam saatı alıb üzərində ayna olmuş stolun üstünə qoydu. Züleyxa çevrilib baxdı. Aynada onun sifəti çox ölgün, saatdan da çox sarı görünürdü.

Qaloşlu adam:

– Özgələri dəvələri sarvanıyla yeyir, bir parça şey az qala, od olub sizi yandıracaqdır, – dedi, – on il də qala, aparmaram!

– Onda mən, Mehmanın özünə qaytararam. Dizüstə düşərəm, hər şeyi açaram, yalvararam, deyərəm qələtimdən keç!

– Yaxşı çıxmaz, Mehman çox tünddür! Hay-küy elərsən çox uzun gedər! Qazamat o yana, dünyanı rüsvayçılıq bürüyər, son peşmançılığın altından çıxa bilməzsiniz, hamınız xar olarsınız!.. Bu barədə ara örtülü qalsa, pərdə tərpənməsə daha yaxşıdır. Sən açmasan, Mehman bilib də üstünü vurmaz! Külfətdə gərək qalın pərdə olsun, o tərpənsə hamı çılpaq qalar düzdə, utanar, abır tökülər, hər şey alt-üst olub gedər, pərdə, pərdə!..

– Bəs onda bu pərdələrin arxasında nə olsun, əmi can? – Züleyxanın göz yaşları yanaqları aşağı axmağa başladı. – Bəs belə düyünə düşərkən əlac nədir, yüz pərdə olsa da?!

– Əlac, pərdələyib udmaqdır, vəssalam!

– Həzm etmək olmaz, əmi can!

– Görünür ki, sənin bu Mehman oğlanın hələ bu qoca dünyadan bir duz dadmayıbdır!

– O yazıq çox təmiz adamdır!

– Bəli, görünür o, kitabdan uç-dörd "qanun" deyə söz əzbərləyib, elə bilir ki, dünya elə beləcədir!..

– Bəs nə təhərdir?.

– Kitab başqa, dünya başqadır! O kitab yazanların heç birisi ömründə öz yazdıqları kimi etməyiblər... Elə keçmişdə molla özü Allahın evində camaata məsləhət gördüyünü, özü öz evində edirdimi? Siz uşaqsınız, qızım! – Qaloşlu adam ovcunun içində olan bir şeyi bərk-bərk sıxır kimi davam etdi. – bəli, bu dünya özü sizə möhkəmcə bir dərs deyib sizi əcəbcə öyrədəcəkdir! Sənin dostun olduğun Zərrintac, heç bilirsənmi hansı pərdələrin arxasında necə bir xəzinənin üstündə oturubdur? Hər gündüzün bir gecəsi olduğu kimi hər ağ günün də bir qara günü vardır!.. Mehman nə qədər bilir, o qədər də bəsdir!

– Axı, o, əsla işin belə olduğunu bilmir!

– Ayrı söz daha deməyin! – Qaloşlu adam əlini dodaqlarının üstünə gətirdi. – İndi mənim son təvəqqəm budur ki, Mehman haqq-ədalətlə hərəkət etsin. Məmmədxanın evini dağıtmasın... Onun atası da vaxtına görə bir kişi idi... Amma özü bu arvad barədə yelbeyin çıxdı. İlk toy elədiyimiz qızla yola getmədi, kənddən bir sarsağını aldı. Şəhərli ilə kəndlinin sözü də haradan tutar?.. Sarsaq gəzib bu klubun səhnəsinin daldasında sarsaq dolandı, camaatın gözünün qabağında guya ərə getdi, sonra biri ilə pıçı-pıçı, ikisi ilə pıçı-pıçı... Axırda da özünə qəsd elədi.

Züleyxa çəkinə-çəkinə:

– Mənə nə? – dedi. – Axı mənim təqsirim nədir?

– Mən ancaq Mehmandan haqq-ədalət istəyirəm!
– Mən Mehmanın işinə heç istəsəm də qarışa bilmərəm!
– Bəs siz də axır çoxlu-çoxlu kitablar oxuyursunuz...
– Mən qanun yox, roman oxuyuram!
– Hansı kitab bu dünyada haqdan, ədalətdən dəm vurmur?
– Siz də oxumusunuzmu?
– Bir az savadım var idi!
– İndi oxumursunuzmu?
– İndi bu dünyadan nə yadımda qalıb ki, o da yadımda qalsın? Bu zamanda mən daha yerli-dibli bisavadam!.. Savadım olsa, daha niyə sizin qapınızda süpürgəçilik eləyirəm? Siz ömrünüzdə yıxılana əl çalmazsınızmı? Yoxsa indiki kitablarda belə qanun yazılmayıbdır?
– Niyə yazılmayıb? Qəşəng-qəşəng romanlarda çox-çox, doğru-doğru sözlər var! – deyə Züleyxa yavaş-yavaş özünə gəlir, onun yanaqları ilə üzüaşağı axan göz yaşları yerində, duz ağartıları görünürdü.
– Bəs onda ədalətə niyə dil bulamırsınız?
– Ədalətə dil bularam, ancaq cəncələ yox!
– Cəncəlsiz ədalət ola bilməz! Ona görə də mən təvəqqe eləyirəm ki, – deyə Qaloşlu adam təkidlə tapşırıq verər kimi barmağını qaldırıb tərpətdi. – Mehman gələndə Şəhla xanımla birlikdə ona deyəsiniz ki, bu məsələdə haqqa tərəfdar çıxsın!.. Mən görürəm ki, sizin də nəsliniz-nəcabətiniz olubdur! Bəlkə, fikirləşirəm ki, lap atangillə duz-çörək də kəsmiş olarıq!.. Siz gərək bu donqabel dünyanı, olduğu kimi Mehmana öyrədəsiniz. O gərək hələ bu dünyadan çox-çox dərs götürsün. O yazıq anası nə idi, küçəyə çıxanda adam olan lapçınına gülərdi. O yazıq nə bilirdi, bu oğluna da nə məşq verə?.. Bu barədə lap əlifbeydən deyəsiniz!.. Şəhla xanım özü gərək Mehmana bu dünyada necə yaşamaq barəsində məşq versin! Yaxşı eləyib o lapçınlı arvadı buradan əkdiniz! Təzədən o lapçınlı qarıdan bu dünya üçün nə müdərris ola bilərdi?..
Qaloşlu adamın dili Züleyxanı getdikcə heyrətə salır, o mat-mat baxırdı.
– Siz, əmi can, çox pərdəli bir sehrkarsınız!
– Elə Mehman da mənim pərdələrdən düzəlmiş sehrimə gələcəkdir. Ancaq bir geci var, bir də tezi!..

## XXXIV

Yavər Murtuzova qazanları qaydaya salandan sonra əlini döşlüyünə silə-silə mətbəxdən eyvana çıxdı. Bu son söhbət zamanı Züleyxa ilə

açılışan Qaloşlu adam Yavəri görmüş, Məmmədxanın işi barəsində onu qızışdırıb Züleyxa ilə Şəhla xanımın üstünə yönəltmişdi.

– Qız, qırsaqqız olub yapışarsan yaxalarından – deyə Qaloşlu adam sözünün axırında təkidlə ona tapşırmışdı. – Lap qırsaqqız!.. quyruğu qapı arasında qalmış kimi hey çapalayıb vurnuxacaqlar!..

– Necə quyruğu qapı arasında, qardaş? – deyə Yavər bu sirri öyrənmək istəmişdi. Qaloşlu adam yenə üstüörtülü cavab vermişdi:

– Yəni əlləri daşımızın altındadır, alt-üst olsa əzim-əzim edərik! Ancaq sən mən deyən kimi danış, qalanı borcuna deyil!

– Yaxşı-yaxşı! – deyə Yavər razılıq vermişdi. Buna görə, Yavər bayaqdan bəriyə, mətbəxdə işləyə-işləyə bu söhbəti öz beynində dolandırıb sözləri sapa düzmüş kimi hazırladı. Necə deyər onun söz kasası dolub daşırdı:

– Vallah, Şəhla xanım, – deyə Yavər, yayxana-yayxana yaxınlaşdı, əzbərlədiyi sözləri itirib batırmamaq üçün mətləbə girişdi. – O yazıq Məmmədxanın, düzünə baxsan, heç bir günahı yoxdur... – Bu halda pusquya dayanan, vaxt gözləyən Qaloşlu adam ayaq pəncələri üstündə dərhal gəlib çıxdı. Yavər isə Qaloşlu adamdan gözlərini çəkmədən öz dəlil, sübutlarına keçdi. – Axı yerli bizimdir, biz də əcəbini bilirik!..

Qaloşlu adam başı ilə təsdiq edib, elə bu qayda ilə başlamaq işarəsini verdi.

– Hə, o Balış ki vardı, – deyə Yavər gözlərini dolandırdı, – yüz cürə pinti işlərdən çıxmışın biri idi!

– Hə, elə! – Qaloş işarə ilə danışır, onun sifətində tərpənən minbir qırış mətləbi çatdırırdı.

– Hə, klubda qol götürüb süzən, ağzında min cürə diringi çalan!..

– Bəli, belə, Yavər!

– Hə, indi düşmən tərsinə söz yayır ki, guya yazıq Məmmədxanın o Balışın yanında pis-pis işləri, əməlləri varmış – deyə Yavər yenə də kirpiklərini qaldırıb Qaloşlu adama baxdı. Qaloşlu adamın təsdiqedici him-cimini görüb sözlərini tez-tez üyüdüb tökməyə başladı.

– Hə, bəli!.. Düşmən belə şayiə yayır ki, guya ki, Məmmədxan qorxub ki, arvadı Balış, guya onun hansı pisliklərininsə üstünü açacaqdır!

– Bax belə!

– Hə, belə olan zaman, guya Məmmədxan Balışı boğubdur... Sonra da asıbdır... Heç belə də şey olarmı? Kişi də heç öz arvadını boğarmı?.. Dünya dağıla, o Murtuzov heç mənim boğazıma əl atarmı?

– Bax belə!.. Döşə getsin! – İndi Qaloşlu adamın qırışıq içində itən gözləri gülür, qaranlıqda xırdaca qanadları parıldayan böcək kimi işıldayırdı.

– Hə, düşmən adama qara yaxar da!.. – deyə Qaloşdan qüvvət alan Yavər uzada-uzada davam edirdi. – Hə, bir siz allah, bu dünyada hansı ağzıgöyçəyin ağzına pambıq tıxayıb, bağlamaq olar? Onda gərək ağ bez karxanaları dayana, hamısı pambıq tıxanca gedə!.. Bir də deyirlər ki, guya kişi arvadını qısqanıb güdüb, pusa-pusa gedib klubun dalısı o qalın-qalın ardıclıqda pis-pis işlərdə tutub!.. Hə, guya arvad da öz eyiblərinə kor olmaqdansa, dönüb Məmmədxanı barmağıynan hədələyib ki, sənin kooperativ kələklərini, fırıldaqlarının üstünü birbəbir açacağam!.. Heç belə də şey olarmı, siz allah, hə? Kooperativ verir malın, alır pulun, daha burada nə çək-çövür ola bilər, hə?.. Yanı bir sübut-filan olar, yoxsa adam yıxılana bu qədər də balta vurar?.. Bu qədər də cürbəcür nağıl yayarmı? Yoxsa mən başıbatmış sabahdan durub özümü asım, daha bunda yazıq Murtuz niyə müqəssir olsun! Birdən beynimin qurdu tərpəndi, elədim elədim, hə? Olmazmı?.. Vallah lap belə də ola bilər! Deyərlər, adamın haqqında söz deyərlər, lap pambıq çatmasa kimin ağzını tutub bu əsgi-üsgü ilə bağlamaq olar?.. Lap bəzi para təzə gələn aydan arı, gündən duru adamlar barəsində də... – Burada Qaloşlu adam Yavərin daha cızıqdan çıxdığını görüb böcək gözlərini ağartdı. Yavərin döşü qalxıb endi, ancaq o istəsə də mətləbi qırıb sözünü kəsə bilmədi.

Bu dəfə Qaloşlu adam Yavərin ayağını bərkdən basdı. Yavər ufuldayıb:

– Uyyy! – deyə çəmkirdi, – sən niyə ayağımı, Qaloş?..

– Ay qız, axı!

– Əşi, sən niyə ayağımı əzirsən, – deyə Yavər canının ağrısından Qaloşlu adamın üzünə qabardı. – Sən də, görünür, hökumət qulluğundasan? Özünü çəkib belə tutursan, hə? Düşmən istəyir gədəni selə-suya versin, – deyə Yavər Qaloşlu adamın işıltılı baxışları altında yenə də dəyişməyə cəhd etdi. – Hə, bəli, sən də durub baxırsan?.. Sən Allah, heç quru ağaca qan sürtmək olarmı? Qadam o Balışın ləçər ürəyinə, bizim Murtuzov deyir: – "Həkimin sözündən Məmmədxana heç bir ləkə yapışmır". Şəhla xanım, sən bizim özümüzünkü olmusan... – Yavər dinməyib susan Şəhla xanımın yaxasından yalvarıcı tərzdə yapışdı. – Bax daha bir evli olmuşuq, Mehman da öz qardaşımız!.. Sən allah, o niyə belə iki ayağını bir başmağa qoyub ki, gərək mən qatığa qara deyəm?.. Yazıq Məmmədxan nə qədər bu evin qulluğunda durardı, hə? Züleyxanın xətri üçün lap dünyadan keçərdi, vallah o yazıq, evi yıxılmış... Özü də bir dirək kimi kara gələn oğlandı.

Qaloşlu adam Şəhla xanımın dilini açıb, onu dindirmək üçün işarəli hərəkətlərindən vaz keçib yenə də Yavərin üstünə acıqlandı:

– Ay qız, bir kiri!.. Dilotu-zad yeməmisən, ha?!

– Əşi, adam alışıb yananda nəinki dilotu yeyər, lap daşı da gəmirər!

– Ay Yavər, sən allah bir Şəhla bacıya əngəl olma! Hey quru dən kimi üyüdüb tökürsən, qoymursan, bir başqası da öz dənini başlıya!.. – Bu sözləri ilə Qaloşlu adam Şəhla xanıma açıqca müraciət etdi.

– Doğru deyir, ay Yavər, bəlkə qazanlar daşdı, ya da maşınkalar his verməyə başladı. Sən bir mətbəxə get, – deyə dünyagörmüş Şəhla xanım, ağzının gözəyi olmayan Yavəri başından əkmək istədi.

Yavər bu dəfə iki adamın amir baxışları qarşısında aciz qalıb nəfəsini dərə-dərə tələsik mətbəxə getdi. Qaloşlu adam başını yırğalayıb:

– Bir belə ağıllı, ağzı göyçək olsa, daha iş qurtarar, – dedi. – Səfeh dostun olan yerdə daha düşmənə nə ehtiyac?

Beləliklə, Qaloşlu adam əlini yelləyib, Yavəri əbəs yerə öyrətməyinə heyifsiləndi: "Yoğun, ətli-canlı arvaddır, ancaq kəlləsi balqabaqdır", – deyə özlüyündə içəridə söyləndi və bu dəfə özü Şəhla xanıma üz tutub onun bu işə qarışmasını xahiş etdi.

Şəhla xanım Qaloşlu adamı sakit elədi. Mehman evə gələndə bu barədə ondan təvəqqe edəcəyinə söz verdi. Qaloşlu adam Şəhla xanımın qabağında boynunu büküb:

– Əlbət, biz də bir adamıq, – deyib eyvandan aşağı düşdü. Şəhla xanım çox dərin bir fikrə getdi.

– Mən bu kişini harada görmüş olaram?..

Şəhla xanım mətbəxə baş vurub Yavərə qab-qacağı təmizləyib yumağı tapşırdı. Yavər Məmmədxanın işi üçün qayıdıb yenə də qapının ağzını kəsdi:

– Vallah, Şəhla xanım, heç bilmirəm, bu Mehman qağa axı niyə belə cin atına minibdir?.. O yazığın xalısı, gəbəsi, ev-eşiyi, bir parça çörəyi var ki, iki göz gərək tamaşa eliyə... Qazamatdan sifariş göndərib ki, var-yoxun hamısını bu yolda odlayın, təki məni bu ağzıbirdən çıxarın! Deyir, yazıq igid yaman darıxır, lap divarları gəmirir. Bilirsən, Şəhla bacı, belə anbardar hələ dünyaya gəlməyibdir! Bakıdan mal gələndə böyüklərin arvadları deyərdi, ondan ver, bundan ver... Daha nə başını ağrıdım, bir-bir daşlanıb dolardılar anbara!.. Pay-püşk olardı. Adamın insafı var, amma Məmmədxan, necə olsa, bizim kimi ikiminci-üçümüncü dərəcəli fəqir-füqəranı unutmazdı. Məmmədxan olmasaydı, sizi inandırıram ki, bizim kimi üçümüncü dərəcəyə göz-giləsi qədər bir şey də düşməzdi! Düzü,

Şəhla xanım, canadəyən, yeyən-içən, dost yolunda dağıdıb-tökən bir oğlan idi! Hə, siz allah, elə sən də, Züleyxa bacı da Mehman qağa evə gələndə, bu işə dil bulayın, o yazıq qurtarsın getsin! Öz aramızda qalsın, vallah, Murtuzov deyir ki, işdə heç sübut deyilən bir-zad yoxdur... Siz allah, bir klub lotusunun birisi özünə qəsd eləyəndən sonra, o birisini də təzədən tutub əbəs yerə heç ağzıbirə salmaq olarmı?

– Sən bu Qaloşlu kişini yaxşı tanıyırsanmı? – deyə fikrə gedən Şəhla xanım Yavər Murtuzovadan soruşdu.

– Vallah, on ildir ki... – deyə Yavər qaşlarını dartdı. – Tamam on ildir ki, o kişi, bizdən o tərəfə böyük şəhərdən bu xırda şəhərə gəlib!.. Əvvəlləri o, bazara baxır, bu xırda şəhərin küçələrini süpürərdi. Sonra altı-yeddi il olar ki, prokuror idarəsinin süpürgəçisi olub!..

– Yaxşı, onda sən bir tez qabları yu, uşaqlar indi gələcək!

– Bizim Murtuz da gələcəkmi? Mən demişəm ki, onlara gedəcəyəm, yəni sizə, o da deyib ki, get, nə olar, öz evimizdir!

– Belə olanda, sən qabları tez yu!

– Vallah lap ilin on iki ayı mən qablarınızı da yuyaram, qaşıqlarınızı da! Ancaq o Məmmədxan yazığın işinə bir əncam çəkin! Şəhla xanım, vallah, can qurban eləməli oğlandı. Elə Mehman qağa işi bizim Murtuza adlatsa, iş düzələr. İndi Mehman qağa bir az təzə adamdır! Hərə bir cürə ağzı bozuna danışır, bir cürə şahid olur, işi lap kələf kimi dolaşdırır. Birisi uydurur, birisi bilmirsən yalandan necə sivrilib dərisindən çıxır?.. Yazıq deyirmiş ki, Məmmədxanı deyirəm e, məni buradan qurtarana o bəzəkli gəlin kimi ev-eşiyimi qurban edəcəm!.. Vallah, onun bir cüt divar xalısı var ki, deyirsən bəs göydəki ulduzlar əfil-əfil yanır, deyirsən bəs göydən yerə düşüb par-par parıldayır... Açanda o xalılar bir lay divar olub, bağlayanda bircə dəsmala yerləşir. Yazıq, doğrudan da, lap mərdana oğlandı. O Balış qızın görüm ki, yanları dəlinsin! Anbarın qapısı bağlı qalıb, camaat da boynu burulu, hələ ağzına da surğuc vururlar ki, gərək buranı da silist eliyək!.. Mal-zad da, çit-mit də hamısı qalıb orada, camaat da tökülüb qalıb burada... Sən allah, bir əncam çəkin!.. Heç olmazsa Mehman qağa zamına verib o yazığı buraxsın! – Yavər Murtuzova bu barədə aydın bir dildə kağız açıb dinməyən Şəhla xanıma sığınmaq deyil, ona yapışmaq istədi. – Siz özgəsi deyilsiniz, özüm də əlaltı, o yazığa xörək göndərmişdim, – deyə yenə sözə başladı. Deyir, dilini də vurmayıb! Vallah, Murtuzdan da onu çox istəyirdim... Siz özgəsi deyilsiniz, sizə lap ürəyimi deyirəm, biləsiniz ki, Məmmədxan nə oğlan idi!.. Allahın altında o səxavətdə oğlan qazamatdan çıxıb, bircə il anbarda ola,

görəsiniz ki, adam qədri bilmək nəyə deyərlər?.. Bu kooperativ müdiridir, bu zaddı, bunlar hamısı içi puç fındıq kimi boş şeydi!.. Bu dünyada bircə adamlıq, qanacaq ondadır! Məmmədxan buranın açarı idi, açarı!..

Fikri dolana-dolana gəlib bir cüt xalı üstündə dayanan Şəhla xanım Yavər Murtuzovanı qapı ağzından kənar edib içəri otağa girdi. Züleyxanın gözü qıpqırmızı qızarmışdı.

– Qız nə olub?

– Heç nə!

– Bəlkə Mişanı qısqanırsan, hə?

Züleyxa yenə də bütün əhvalatı açıb anasına dedi. Qaloşlu adamın tələblərini anasına bildirdi.

– Belə bir açılmaz bir düyün, ana!. – deyə Züleyxa anasının yazıq-yazıq üzünə baxdı. – Özü də bu zəhrimar saatı aparmadı, oraya atıb getdi. Dedi ki, sənin atanla da duz-çörək kəsmişik!

Şəhla xanım barmaqlarını dodaqlarına gətirib:

– Olar, – dedi, – mənə də işarə etdi. Deyəsən, bu tacirbaşını gözlərindən tanıyıram?.. Sən çox sonralar oldun!.. Yanılmıramsa, həmin bu kişinin özü idi, həmin tacirbaşı... Qarabağdan bizə gəlmişdi, atanla birlikdə Varşavaya getdilər. – Şəhla xanım sükuta getdi. – Sən dünyanı görürsənmi, o dağ böyüklüyündə kişini necə bir cırıq qaloşa yerləşdiribdir?!. Nə isə, tanışlıq verib, üstünü vurub utandırmaq olmaz!.. Qoy örtülü qalsın, odunları yarsın!

Züleyxa durub-durub ağlamağa başladı. Anası acıqlanıb onu sakit eləməyə çalışdı.

Züleyxa isə düşündükcə sakit ola bilmir, ağır əzablar çəkirdi.

– Mən Mehmana deməliyəm, mama, mən dizi üstə düşüb əhvalatı ona açmalıyam!

– Niyə, qız? Bir də təzədən nə həngamə açırsan? Mən gətirən saatdır, vəssalam!

– Hamısını düzünə açmaq gərəkdir, ana!.. Lap bu sarı zəhrimarın qıvrım yatan sarı ilanı, bax bir sən onun qolbağına, gör necə ilan kimi qıvrılıb?..

– Qız, örtülmüş işi açıb içindən işmi çıxarmaq istəyirsən?

– Nə vaxta kimi ürəkdə bu ağır daş sallanacaq, ana?

– Nə daşbazlıqdı, qız!

– Yox, mən Mehmanın üzünə baxa bilmərəm, ana!

– Qız uşağı ki, qız uşağı!.. Demişik mən gətirmişəm, daha qurtarıb, gedibdir öz işinə!.. Qoy lap bütün dünya dağılıb gəlsin!.. Şahidi yox, sübutu

yox, bir də təzədən oyun açmaq istəyirsən?.. Sənin kimilərinin özünün, gərək beş dənə belənçik qızıl saatı olsun! Görürsənmi o Zərrintac xanımı?

– Mən ona tay olmaq istəmirəm, ana! – deyə Züleyxa ziddiyyətlər içində hikkələndi. – Xatun xala düz deyirmiş: bilsəydim ki, o Zərrintacın adına bu qədər söz gəzir, heç mən onun qapısını da açmazdım! O mənim beynimi oğurlayan Sərrafzadənin qapısını, ana can!

– Sən kiri, qız! Saat bir şey deyil, kiri, vəssalam!.. Sirr, sirr qalar, – Şəhla xanım əlini kəmər yerinə qoyub yırğalandı, – vallah, mən bir nəfəsimdə on elə saat udaram, heç uf da deməरəm! Xatunun gəlinindən də elə Xatun çıxar!..

– Yox, iş çox dolaşıq düşüb, ana! Qorxuram təmiz adımız kömür kimi qaralsın, qorxuram biz ömür uzunu qara bir qarğaya dönək! Heç bilirsənmi Mehman nə qədər də paklıq, təmizlik istəyir! Mehman, müəllimimiz Məlikə xanımın ona etdiyi vəsiyyətindən söz açıb mənə danışıb!.. Mən də ona eləcə söz vermişdim, axır?..

– Söz vermişdim, – deyə Şəhla xanım qızını yamsıladı. – Qız söz verib ölüb-getmiş Məlikə xanıma?..

– Mehman bu sözləri bilsə dünyanı dağıdar!

– Heç şey eləməz! – deyə Şəhla xanım indi Məmmədxanın göydəki ulduz kimi əfil-əfil yanan xalılarının eşqilə çırpınırdı. – Sən at mənim boynuma!.. Bir azdan da o saatı bağla qoluna, qurtarsın getsin, vəssalam! O beş şahı donluq ilə siz dönüb Şah Abbas olmayacaqsınız!.. Sabahı da var, uşaq-muşağı da?!.

Şəhla xanım birdən şaqqa çəkib dolusu güldü:

– Gələndə üç min gətirmişdim, dedim, yağ-bal alıb şəhərə apararam. O da qurtardı! Bu divarların arasında siz daş-zad gəmirəcəksiniz, qız!..

Züleyxa gözlərini silə-silə söyləndi:

– Qana bulanmış saatı qola bağlamaqdan nə çıxar? Görünür ki, canavar oğlu bənd-bərəni qabaqcadan kəsirmiş ki, yazıq arvadı boğsun, qanını da batırsın!

– Yoxsa arvadın boğulmağında da özünü təqsirkar görmək istəyirsən, ay başıboş!

– Dərindən fikirləşəndə, belə çıxır, – deyə Züleyxa saçları dağılmış başını yersiz-yersiz yırğaladı. – Bəlkə o bu saata bel bağlayıb öz arvadına qəsd edibdir?.. Beləliklə biz, ana-bala, hələ açılmamış bu qana şərik olmuruqmu, hə?..

– Kiri, bircə kiri!.. Sən də mənə o sarsaq, qarğabəyin Yavər olmadın, kiri! Ağzıboşun biri, kiri!.. Sən burada ancaq belə Yavər kimilərindən ağıl

götürəcəksən, kiri!.. Dilini dibindən çıxararam, guya nə yeyib ki, onu da həzm eləyə bilmir, kiri, Xatuna oxşar, kiri!

– Vallah, mən hamısını Mehmana deyəcəyəm, yoxsa ürəyim partlayır, ana!

– Bəlkə gedib bir ali məhkəməyə də deyəsən? Heç qanırsanmı ömrünüzü necə qaraya calamaq istəyirsən? Dünyada sirr saxlamağı bacarmaq gərəkdir. Onsuz da indi bu dünya qurğuşuna dönüb, qız!

– Mənim ürəyim qurğuşundan da ağırdır, ana!

– Ağırdır?.. Öyrənmək gərəkdir!.. Adam var ki, dünyanı dirigözlü udur. Sən dönüb bir parça çaqqıldayan sarının əlində aciz qalmısan, kiri!

– Onda götür, özün o sarını saxla, ana! Yoxsa o, atəşə çevrilib alovu məni bürüyəcəkdir!

– Beynin xarab olmasın, qız!

– Başım qızışır, ana!

– Bəlkə dəlixanaya düşmək istəyirsən?

– Görünür, mənim axırım dəlixanadır, ana! Sən məni oraya çağırırsan!

Şəhla xanım əhəmiyyət vermədən ayna qabağında olan saatı götürüb qoluna bağlamaq istədi.

– Bağı çatsaydı, özüm bağlardım qoluma! – deyə dişlərini qıcadı. – Ancaq heç yarısına da çatışmır. – O saatı yenə də etinasız bir halda stolun üstünə atdı:

– Qoy qalsın burada!.. Özün də ud, vəssalam!

Yavər Murtuzova birdən qapını açıb adəti üzrə əlini döşlüyünə silə-silə başını içəriyə saldı:

– Qabları da yudum, Şəhla xanım!

Ana ilə qızın danışığı yarımçıq qaldı. Yavər oturub yenə də uzun-uzadı danışdı. Söhbət xeyli çəkdi. Mehman işdən qaşqabaqlı qayıtdı. Yavər ərinin gəlmədiyini, əziyyət çəkib bişirdiyi xörəklərdən onun yeyə bilməyəcəyini görüb özlüyündə acıq elədi, bir kəslə xudahafizləşmədən çıxıb evlərinə getdi. İşdən evinə dönmüş Murtuzov da arvadını pərt bir halda qarşılayıb:

– Harada idin, xanım? – dedi.

– Səhər-səhər özün demədin, bəyəm? – Yavər iri gövdəsilə qabardı: – sənin böyüyüngilə getmişdim!

– Nə olub sən də belə mısmırıqlı gəlmisən? Az qala alt dodağın yer, üst dodağın göy süpürür, arvad!

– Çünki sən məni öz əlinlə qulluqçu qayırmısan! Özün də deyirsən get, nə desələr et! Məni qramafon kimi qurursan, belə oxu, sonra dön elə oxu! Mən də lap tutuquşuya dönmüşəm!

– Yaxşı-yaxşı, belə oxu, elə oxu! “Tutuquşu”, xəncərinin daşı düşməz!..

– Niyə düşmür? Mən kimin qızından kəməm?

– Yaxşı, dərdim sənin kəmliyində deyil, beş-on günlüyə ölməzsən! Yəqin ağzını boş-boş qoyub ulduza danışmısan... Sonra bilmisən ki, ağzının gözəyi açılıb, söz yerə tökülüb, daha yığıb-yığışdırmaq mümkün olmayıb?

Yavər acıq eləyib fırlana-fırlana kənara çəkildi:

– Görünür mən on üç yaşında bir qızam?!. Sənsən məni bişüur yerinə qoyan!.. Yoxsa bütün arvad olan mənim başıma and içir!

– Elə bilirlər, bəs balqabağın içində bir dənədən-zaddan var? Daha demirlər ki, qupqurudur?!..

– Beynimi yemə, Murtuz, – deyə Yavər gözlərindən gilə-gilə yaş tökdü. – Sən məni qulluqçu yerinə qoyma, Murtuz!..

## XXXV

Bəli, Mehman işdən dönüncə Şəhla xanım özünü qabağa verib kürəkəninə xüsusi mehribançılıq göstərdi, bir azdan araya söz salıb Mehmana üz tutub təvəqqe elədi ki, prokuror, Məmmədxan gədənin bu şər işində ədaləti əldən buraxmasın, artıq danışığa, şər-şəbətəyə yol verməsin. Mehman da öz növbəsində Şəhla xanımdan təvəqqe elədi ki, onlar ana-bala heç bir zaman prokurorluğun daxili işlərinə qarışmasınlar. Şəhla xanım kürəkəninin bu sözündən rəncidə olub:

– Məgər, ana öz oğluna bir söz də söyləyə bilməzmi? – deyə umu-küsü elədi. – Mənim də bu dünyada gözümün ağı-qarası bircə qızım var!

– Elə o bir qız da, siz özünüz də ancaq burda, sizə aid olan ev işi ilə məşğul olun! – deyə Mehman qəti bir səslə cavab qaytardı. – Yoxsa ayrı cürə mümkün olmayacaqdır, ana!

Mehmanın bu sözləri müqabilində Züleyxanın nəzərləri yenə də stol üstündəki güzgüyə sarı parıltı salan saata sataşdı, o özü də dönüb sap-sarı saraldı, anası isə gözlərini qızına tərəf ağardıb:

– Mehmanın bir sözü, gör necə də sivri bir xəncər olub bu qızdan keçir, – deyə, Züleyxanın daxili həyəcanlarının əsl səbəbini gizlətməyə çalışdı.

Züleyxa danışmağa cürət etmədən dönüb pərişan bir nəzərlə anasına baxdı. Mehman isə bu müəmmalı və üstüörtülü nəzərləri tutub sezdi. Bu halda Qaloşlu adam əlində teleqram tövşüyə-tövşüyə içəri girdi. Mehman teleqramı alıb oxudu. Bakıdan vurulan teleqram təxirlə gəlib çatmışdı.

Mehman bu hala qarşı təhəmmül etmədən telefon dəstəyini götürüb poçt naçalnikini çağırdı. Teleqramın nə üçün ləngidiyini soruşdu, bu barədə izahat yazıb prokurorluğa təqdim etməyi ondan tələb etdi.

– İnciməyin, hirslənməyin, – deyə Mehman poçt rəisinin izahatına cavab qaytardı. – Mən sizdən dövləti vəzifəni layiqilə yerinə yetirməyi tələb edirəm!.. Rayona hər bir yeni məsul işçi gələndə köhnə telefon dəstəklərini dəyişdirməklə bütün bir rayonda poçt işini düzəltmək olmaz!.. Bu, gözə kül üfürməkdir, naçalnik!

Mehman dəstəyi asıb teleqramı təkrar oxudu. Respublika prokuroru Mehmanı yarımillik fəaliyyəti haqqında hesabat verməsi üçün, onu mərkəzə çağırırdı. Mehman teleqramı qatlayıb cibinə qoydu, yol üçün hazırlıq görməyi Züleyxaya tapşırdı.

Qaloşlu adam udqundu, çuxura düşmüş gözlərinin parıltısı aynaya düşən saata zilləndi. Züleyxa da saata tərəf baxdı, rəng verib, rəng aldı.

Mehman yır-yığış üçün idarəyə getdi. Murtuzov onu irişən bir sifətlə qarşılayıb çoxdan görməyən, bərk qəribsəyən bir adam kimi salam verdi. Mehman bəzi cari işləri, o cümlədən hansı bir məqsədlə isə Məmmədxanın işinin istintaqını davam etdirməyi də Murtuzova tapşırdı. Murtuzov bu etibar üçün sevindi, hətta bu təklifdən onun içi də güldü. Mehman şübhə etməsin deyə, o dərhal qırışıq qaşqabağını sallayıb:

– İş ağır olsa da isti-isti izinə düşmək gərəkdir! – deyə Murtuzov qulluq göstərməyə çalışdı. – Qan işidir, bu işi soyutmaq batırmaq deməkdir?

– Mütləq bütün düyünləri vicdanla açmaq, azadlıq yolunda məhv edilən qadının qanuni intiqamını qatildən almaq lazımdır!

– Mən sizin etibarınızı doğrultmağa çalışaram, yoldaş prokuror!

– Mən özüm dönərkən dərindən-dərinə məşğul olacağam!..

– Mənsə siz gəlincə bütün düyünləri açmağı, sizin qarşınızda alnıaçıq hesabat verməyi özümə şərəfli vəzifə hesab edirəm!

– İş və nəticə hamısını apaydın göstərəcəkdir! Hər kəsə öz səhvlərini islah etmək üçün imkan verilə bilər!

– Mən təmiz vicdanı bütün dünya nemətlərindən üstün tuturam! – deyə Murtuzov dik dayandı. – Mənim adilanə iş apardığımı bu ətrafda, uşaqdan-böyüyə hər bir kəs bilir! Təmiz vicdan, açıqalın, sizin qarşınızda heç bir şübhəyə yol vermədən əbədi bir etibar, mənim üçün ən qiymətli bir ləl-cavahiratdır! Dünyanın malı dünyada qalacaq, insan bu dünyadan ad-san aparacaqdır!

Murtuzovun bu bəzək-düzəkli sözləri Mehmanı inandırmasa da, o bir sınaq üçün də olsa bu işlə məşğul olmağı müstəntiqə tapşırmağı, sonra

nəticəsini yoxlamağı mümkün hesab etdi. Beləliklə danışıb tapşırıq verəndən və müəyyən dərəcədə yır-yığış edəndən sonra Mehman idarədən çıxıb rayon partiya komitəsinə getdi. Bakıya çağırılmağı barədə Vahidova məlumat verdi. Raykom katibi Vahidov Balışın ölümü üzərinə gəlib bu cinayətin dərindən öyrənilməsini, bu ölümün əsl səbəbinin açılmasını prokurordan tələb etdi.

– Mən sizə söylədiyim kimi yenə də həmin əqidədə qalıram ki, bu hadisədə əsas səbəb, o qatil ərin qadın azadlığına, qadının ictimai işlərdə iştirakı əleyhinə çıxmağı olmuşdur!

– Mənim də heç şübhəm yoxdur, – deyə Vahidov öz növbəsində Mehmanın fikrinə bir daha şərik olduğunu bildirdi. – Ancaq bu işin əsl mahiyyətini güzgü kimi açmaq, bütün kök və liflərinə qədər hər bir şeyi dartıb üzə çıxarmaq gərəkdir!

– Görək, Murtuzov mən gəlincə nə edəcəkdir?

– Siz işi onamı tapşırmısınız?

– Mən yoldaş Vahidov, onu da sınamaq, yoxlamaq, burada bəzi münasibətləri dəxi öyrənmək istəyirəm!

– Murtuzovu bir an belə gözdən qoymaq olmaz! – deyə Vahidov əlini uzadıb Mehmanla görüşdü. – Sizə yaxşı yol!..

Mehman raykomdan çıxıb mənzilinə gəldi, axşamı yatıb, sabahına, Vahidovun göndərdiyi avtomobilə oturub yola düşdü. Mehmanın dəmiryola qədər Vahidovun maşını ilə gəlməyindən, onun belə təcili Bakıya yola düşməyindən xəbər tutan Kamilov narahat olmağa başladı.

– Bu Mehman “qanun-qanun” deyib qurdalayıb bir iş çıxarmasa yaxşıdır?.. Özü də raykomun “QAZ”ında səkə-səkə gedib, ha?!. Bu olmadı, bu, Vahidovla birgə işləmək, işləri birgə görmək oldu. – Kamilov Murtuzovu telefonla axtarıb tapmadı. O əlini zəng düyməsinə dayayıb Sərrafzadəni yanına çağırdı. Murtuzovu tez-tələsik tapıb gətirmək üçün ona möhkəm tapşırıq verdi:

– Görünür ki, bu Murtuz özünü harasa verib ki, telefona da cavab vermir?..

Sərrafzadə icraiyyə komitəsi sədrinin kabinetindən çox cəld çıxdı, ora-bura dəydi, Murtuzovu tapıb gətirdi, Kamilov əlini başına aparıb:

– Ə, Murtuzov, – deyə əsnədi, – bu Bakıya gedəndə niyə bir xəbər eləmirsiniz ki, ay yerli hökumət, biz filan yerə təşrif aparırıq, hə?

Murtuzov boynunu əyib çiyinlərini çatdı.

– Niyə bəs belə, balam? – Kamilov təkrar otaqdolusu əsnədi.

– Mən özüm də mat qalmışam, yoldaş Kamilov!..

– Niyə mat qalmısan?
– Bütün bu işlərə!
– Bəs sən özün?..
– Mən qoz qabığındayam, Kamilov!..
– Dünənki bir uşağın qabağında sən bir cücəyə dönürsən!
– Əlacımı Allah kəsibdir!
– Niyə belə yetim quzu olmusan?
– Vahidovun "QAZ"ında gedən bir adama əl çatdırmaq olmaz, – deyə Murtuzov Kamilovun fikrini duymuş kimi cavab verib stulda əyləşdi. – Siz mənə bir heyvərə yabı verib gündə bir başıma çırpırdınız!
– Bəli, bəli, "QAZ" qanadlanıb zümrüdquşu kimi Muradoğlunu aparandan sonra sən də gərək kirpi kimi qınına çəkiləsən!
– Əlacımız nədir?..
– Bəli, başını qınına çəkmək, tamam yığışıb bir tikanlı yumağa çevrilmək! Bəli, bəli, kirpidən də heyvərə, tikansız bir ip yumağına! Dul bir qarının qırım-qırtı yundan düzəltdiyi boş bir yumağa!
Kamilov əsəbiləşən əlini çallaşmış saçlarından çəkib tündləşdi. Sonra Sərrafzadəni oturdub bir vərəq kağız verdi, teleqram tərtib etməyi ona təklif etdi. Kamilov Mehmanın özbaşına hərəkətlərindən, işləri pozduğundan, işlərin öhdəsindən gələ bilmədiyindən, sosializm əmlakının keşiyində dayana bilmədiyindən danışdı və qızışıb özündən çıxdı. Axırda bu işlərin hamısını yoxlamaq üçün yuxarıdan hörmətli bir komissiyanın göndərilməsini təkidlə tələb etdi:
– Belədir, yox? – deyə o, üzünü Murtuzova tərəf turşutdu. – Qoy gəlib yerində çözələsinlər, sizin nə kimi tikanlı, ya tikansız bir yumaq olduğunuzu görsünlər!.. Yoxsa siz, bizi gopa basmış tamam-kamal tozanağa tutmaq istəyirsiniz!..
Murtuzov sallanmış daz başını yırğalayıb:
– Düz sözə nə ola bilər? – dedi.
– O sənin də işləməyinə imkan vermir! – deyə Kamilov ayağa qalxdı. – Özün bu boyda köhnə bir silistçisən, baxıram ki, səni, doğrudan da, özün demiş, dürtüb bir çürük qoz qabığına, qalmısan orada bir fərsiz cücə kimi baxa-baxa! Ya da sarıyıb-sarıyıb, bir yun yumağına çevirib, uşaqlar oynadan bir kosa çeviribdir!..
– Lap düz sözdür, – deyə Murtuzov təsdiq etdi. – Doğrudan da, lap bir əyləncə olmuşam, mənim vicdanım var, düz söz gələn yerdə boynum qıldır, qıldan da nazik!
– Baxıram ki, o sənin də canını xirtdəyinə yığıbdır!

Murtuzov əlini hülqumuna atdı:

– Vallah az qalmışam ki, mən də elə o Balış qız kimi bu boğazımı o kəndirə keçirim!

– Bəs o Məmmədxanın işi necə oldu, bu barədə, hə?

Murtuzov yerə baxdı.

– Gedəndə onu mənə tapşırıb! Daha doğrusu o işi mənim boğazıma keçirib!

– Nə əcəb yağlı tikəni əlindən sənə verdi?

Murtuzov başını ağır-ağır qaldırıb qırışan burnunda güldü:

– Qan işində onların ağızlarından bir çiy süd qoxusu gəlir!.. Baxırsan ki, lap bələkdən çıxan bir çağadılar! Əvvəl-əvvəl özü istədi basıb-bağlasın, Amerika açsın, sonra baş aça bilmədi, gedəndə işi mənə adlatdı!..

Burada Kamilov, Zərrintacın söylədiyi saat əhvalatını xatırladı, dönüb katib Sərrafzadəni çağırdı.

– Qıza deyərsən ki, o məsələni bir də dərindən yaxşı-yaxşı öyrənsin, – dedi. – Başa düşdünmü?.. Dilə tutub dərindən öyrənsin, hər haça-puçasını öyrənsin, qandınmı?..

– Bəli, çatdıraram!

– Onda dəmiri isti-isti! – deyə Kamilov əlilə qapını göstərdi.

Sərrafzadə qapıdan birbaşa çıxdı, bacısı Zərrintacın yanına getdi, saat məsələsini bir daha ona anlatdı. Zərrintac barmağını dişləyib:

– Hə, bildim, iş haradan-haraya gedir, – dedi. – Axı deyirəm, bu milis naçalniki niyə boğça barəsində ora-buranı basmalayır?.. Görünür ki, o hərif kölgəsindən ürküb, bu hərifə tapşırıb ki, o qızı gözükölgəli elə!.. Hərçənd Züleyxa xanım indi daha yaxa ələ vermir, buraları dolaşmır, yanına getməyə də sifət göstərmir, ancaq görək onu necə tələyə gətirərik?.. Ancaq milis naçalniki neçə gündür mənə göz verir, işıq vermir!

Kamal Sərrafzadə özü də milis rəisinin işi basmarlamağı barəsində təşvişə düşdü, hətta bacısının sözlərini də yadında saxlaya bilmədi:

– Nə barədə, axı?.. Nə deyir axı o Cabirov?

– Bağçanın işləri barəsində deyir!.. Tutub ondan-bundan xəlvəti-xəlvəti soruşur ki, bəs bilməzsən bu norma haradan gəlir, haraya gedir?.. Bu nə bazardan ayrı-ayrı əllərdən alma şeylərdir?.. Bu möhür niyə belə buruq, ya pozuq düşübdür?.. Niyə bu peçat belə ləkəli düşübdür?..

– Neçə gündür belə təftiş başlayıb?

– Üç gün olar!

– Bəs niyə bizə bir söz demirsən? Bəlkə yoldaş Kamilova?..

– Mən dedim, sənin huşun başında deyildi, lülqənbər gəlmişdin, özün də qız kimi qızarmışdın!

– Kamilov yoldaşa bildirməyəkmi?

– Yox!

– Nə üçün?

– Çünki çünkisi var?..

Kamal bacısının bu qəribə sirri ilə çox maraqlandı. Zərrintac isə qardaşına bir söz demədi. Zərrintac Sərrafzadə zaqsda qeyd olunub, rəsmi surətdə Kamilova ərə gedincəyə qədər bu sirri açmaq, özünü sındırmaq istəmirdi...

## XXXVI

Mehman respublika prokurorluğunda, öz keçmiş məktəb və hüquq fakültəsi yoldaşlarından bir qrupla görüşdü. Gənc prokurorların hamısı bir-biri ilə mehribancasına salamlaşdılar, öz yoldaşlarının iş-gücündən soruşub əhvallaşdılar. Bir ay bundan qabaq hüquq fakültəsində respublika prokurorluğuna işlər müdiri vəzifəsinə keçirilən Katibə xala qoltuğunda dəftər qapıdan boylanıb:

– Yoldaş prokurorlar! – deyə onları öz yanına çağırdı. – Rica edirəm, bir mənim öz yanıma zəhmət çəkin!..

Gənc prokurorlar işlər müdirinin otağına girdilər. Katibə xala Mehmanla ayrıca olaraq görüşdü, bacısından və bacısı qızından hal-əhval tutmağı münasib bir vaxta qoydu. Sonra o, üzünü prokurorlara tutub:

– Yoldaş respublika prokuroru bu gün Xalq Komissarları Sovetində olacaqdır, – deyə rəsmi ahənglə, bir mənsəb sahibi kimi elan etdi. – Ona görə də sizin hesabat məruzəniz sabah saat 12-yə qalır. Rica olunur, düz 11 tamamda, əqrəb-əqrəb üstündə mənim yanımda hazır olasınız!.. Mən gərək qabaqca sizi birbəbir qeyd edib, respublika prokuroruna məruzə edim. Yoxsa ayrı cür burada nizam-intizam yaratmaq olmur. – O, papirosunu yandırıb tüstülətdi. – Respublika prokuroru özü şəxsən məndən xahiş edib ki, mən bu işlərdə dəmir intizam düzəldim! Elə bu şərtlə də mən bura, respublika aparatına köçürülmüşəm!

– Bəli, biz hiss edirik, – deyə rayon prokurorlarından bir nəfəri dilləndi. – Ümumi işlərdəki vəziyyət özü bunu göstərir!

– Zarafatsızmı? – deyə Katibə xala özündən razı bir əda ilə ucadan güldü: – Sizin hüquq fakültəsində yetişməyinizdə biz də az-çox iştirak etmişik!

– Az yox, çox!

– Lap çox!

– Bir az! – deyə Katibə xala şaqşaraqla güldü. – Hamınız burada öz uşaqlarımız, daha doğrusu, öz yetişdirmələrimizsiniz!.. Sizi belə müstəqil dövlət işində görmək bizə çox zövq verir... Belə deyilmi, uşaqlar? Yoxsa mən də bir işdə müqəssir deyiləm ki, sizdən qorxam, hə? – Katibə xala uzun gilizli papirosunu təkrar damağına aldı. – Vaxtında, vaxtında düz saat 11 tamamda, əqrəb-əqrəb üstündə, – deyə caydaraq boylu Katibə xala sağ ayağının ucunu döşəməyə vurmağa başladı. – 11 tamamda, əqrəb-əqrəb üstündə!.. – Katibə xala kəfkirli divar saatına, sonra öz qiymətli qol saatına baxdı. – Vaxt itməsin, vaxtında bizim respublika prokuroruna məruzə olunsun!..

Gənc prokurorlar hamısı bu neçə il ərzində Katibə xalanı çox əcəb tanıdıqlarından, keçən təhsil müddətində onun tapşırıqlarına əməl etdiklərindən daha ayrı bir söz demədilər, danışığı kəsdilər. Hamı çıxıb getdi, lakin Katibə xala Mehmanı buraxmadı. Prokurorlar, "Şərq" mehmanxanasının ikinci qatında lap girəcəkdəki otaqlarda, Mehmanı gözləyəcəklərini söyləyib çıxmışdılar. Katibə xala bacısı Şəhla xanımı, bacısı qızı Züleyxanı dönə-dönə Mehmandan soruşdu, bacısının, bacısı qızının ona kağız yazmadıqlarından xeyli gileyləndi. Sonra açarı çıxarıb Mehmana uzatdı:

– Evdən muğayat olmaq üçün bacımgilə yığışmışam! – deyə özünün harada yaşadığını bildirdi.

Mehman açarı almadı, Katibə xala təəccüblə:

– Niyə almırsınız? – dedi. – Gedin evimizdə istirahət edin, mən də işdən tez gələrəm. – O, bir qohum kimi qayğı göstərirdi. İşdən bir qədər tez çıxaram, gələrəm, o ətraflardan mənim üçün yaxşı-yaxşı danışarsız!..

– Qanun idarəsində oturub qanunu pozmaq olarmı?

Katibə xala güldü, papirosunu sümürüb tüstüsünü səqfə buraxdı.

– Sən yenə də qurusan! – Katibə xala boz tüstünü özündən kənara üflədi. – Qurudan da betər bir ana uşağısan, Mişa!

Katibə xala dönüb diqqətlə Mehmanın üzünə baxdı:

– Yox, üzündə bir az deyəsən dəyişiklik var. Prokuror! Yeznə, kürəkən! Vallah, əgər Şəhla bacım Züleyxanı bir istəyirsə, səni min istəyir. Gedərsən evimizə, xalan da gələr, səni bir yaxşı-yaxı qonaq elər, axşam da birlikdə teatra gedərik! Yoxsa fors satırsan ki, mən qocayam? Yox, əsla yox! Qoy axşam lampa işığında mən ət rəngli paltarımı geyim, sən də bir bax gör ki, xalan nədir? – Mehman əti ürpəşər bir sifətlə qayınanası Şəhla xanımın doğma bacısını süzüb:

– İşdən kənar nə söhbət ola bilər? – deyə, doğrudan da, çox quru və sərt cavab verdi.

– Ay prokuror! – Katibə xala özünü heyrətlə əsdirdi. – Utanırsan balam, öz xalandan?

– Mehman daha dayanmaq istəmədən əlini öz balaca çamadanına atıb:

– Mən getdim! – dedi.

Katibə xala təlaşla:

– Hara? – dedi. Açarı Mehmanın qabağına – stolun üstünə çırpdı. – Adam da heç özünün o cür səliqəli istirahətli evindən kənara qaçarmı?..

– Yox, mən anamın yanına, – deyə Mehman qərarını qohumuna bildirdi. – Hər quşun öz yuvası özü üçün daha istidir!

– Ay uşaq! – deyə Katibə xala buruq saçlı başını yırğaladı. – Bildim, bildim! Xatun arvadın qayıtdığını da eşitdim! O günləri yanına getdim. Halını soruşdum, ağzını burdu, məni dindirmədi. Bisavad qadındır, eyib etməz! Yanına dəy, ancaq tez qayıt, evə gəl! Amma işlə yanaşı dincəlmək də, istirahət də gərəkdir!.. Kənddən şəhərə gəlib, belə də istirahətsiz getsən, adına nə deyərlər?

Bu zaman Katibə xalanın başının üstə divardakı cınqırıq səsləndi. O cəld qalxdı və Mehmana:

– Bir anlığa məni gözlə, – deyib kabinetin qapısına tərəf yönəldi. – Görünür, prokuror o biri qapıdan xəbərsiz gəlib, heç mən də bilməmişəm! – Katibə xala papirosunun kötüyünü gilizlə dolan külqabının üstünə atıb içəri girdi.

Mehman onu gözləmədən çamadanı götürüb evlərinə yönəldi. Qapı qıfıllı idi. O, qapıçı Nurunu tapıb anasını soruşdu. Qapıçı Nuru, Xatun arvadın tikiş fabrikində işə girdiyini söylədi. Mehman çamadanını Nuru kişiyə verib həyətdən çıxdı. Qoca, çamadanı arvadına uzadıb, Mehmanın arxasınca deyindi:

– Bu da oğul! – Nuru kişi kədərləndi. – Yazıq arvad ömrünü-gününü çürüdüb bir tikəliyindən bunu böyütdü, başa çatdırdı, axırda da ömrünün yorğun çağında dönüb fabrikə əmələliyə getdi. “Anam hanı?” Yekə oğlan olub, utanmır da hələ soruşur, “Anam hanı?..” Bizim oğlan da belə elədi: oxutdum, oxutdum, incinar oldu, sonra bir burma tel aldı, mənim də əlimdə bu həyətdə bir süpürgə qaldı.

– İşləyib çörək yemək yaxşıdır, – deyə həyət süpürgəçisinin arvadı dilləndi. – Yoxsa şikəst kimi oturub bu beşgünlük ömründə özgə minnətinə çörək yemək istəyirsən?

– Sözüm onda deyil, Nuriyyə, sözüm övladın belə çürük vəfasındadır... Mən belə danışmaqla atalıqdan çıxmadım. Yenə də yarı canım uşağın yanındadır... Ayda aldığım o balaca maaşı da rahat xərcləyə bilmirəm, boğazımdan tikə keçmir, deyirəm, bəlkə uşaq borca, xərcə düşüb?..

Tələsik gedən Mehman bir də təzədən qayıtdı.

– Əmi, demədiniz bəs anam hansı fabrikdə işləyir?

– Gərək ki, "Əli Bayramov" deyirdi, hə, Nuriyyə?

– Vallah, Nuru, mən ömrümdə elə yerlərə getməmişəm. Gördüyüm bu şəhərdə bir bazar, bir də ömrümdə, bax, bu ev olubdur, birinci mərtəbə!

Qoca Nuru ağ saqqalını qaşıya-qaşıya:

– Hə, Əli Bayram, Əli Bayramov! – deyə qürurla cavab verdi. – Sağ olsun Şura hökumətini! O, hamınızdan etibarlıdır, oğul! O bizə qocalıqda təqaüd, həm də darıxmamaq üçün qarovulçuluqdan, gözətçilikdən bir parça iş verir!

Mehman altdan-yuxarı qoca Nuruya baxdı, qoca Nuru dilləndi:

– Bəli, biri də sənin yoldaşın incinar Nəriman! Adınızı yaraşdırıb rəhmətlik Muradla sevinə-sevinə qoşa qoymuşduq. Bax, sən orada anadan olmusan, Nəriman da burada, aranızda ikicə gün təfavüt olubdur. Nə qədər sevinmişik, oğlumuz olubdur!

Mehman ürəyində qocaya haqq verdi, ancaq bir cavab vermədən, yaxud cavab verməyə özünü haqlı saymadan təkrar qayıdıb getdi. Ağ, tutamsaqqal Nuru kişi üzünü arvadı Nuriyyəyə tutdu:

– Nəriman deyirdi, bu yaman danışan olub! Bəs hanı bunun o odlu dili?..

– Görünür, haqq sözü uşağı boğur, Nuru!

– Bu azdır, qarı!

– Bəs nə eləsin, qoca?

– Özü hüquqçudur, qoy haqqı müdafiə eləsin, düz sözə də düz cavab versin!

– Gəlin, gəlin, gəlin! Oğulu ana əlindən qarmalayan gəlin!.. – Nuriyyə qarı danışa-danışa qəhərləndi.

– Bəs bayaqdan oğluna havadar çıxırdın.

– Oğul ananın ürəyidir, onu atmaq olmur, Nuru!

– Bəs qız? Qızın olsaydı necə, Nuriyyə?

– Qız daha yaxın, daha vəfalı olur, oğulu gəlin bir qara qartal kimi çalıb, caynaqlarında Şahdağına qaldırır, sən də qalırsan altdan-yuxarı əli gözünün üstündə baxa-baxa, görəsən o hansı uçuruma qonacaqdır?!

## XXXVII

Bayaqdan yol gələn Mehman qan-tər içində özünü fabrikə çatdırdı, soruşub müdirin kabinetini tapdı. Qapıçı müdiri əvəz edən adamın otağını göstərərək:

– Bax, ora buyurun, – dedi, – müdir azarlıdır. Onu orada oturan əvəz edir, baş mühəndis!

Mehman gedib qapıda dayandı. Sonra qapını döydü, yavaşca açıb soruşdu:

– İcazə varmı?

– Buyurun, – deyə stol arxasında əyləşən xanım qız dilləndi.

– Mən baş mühəndisi axtarırdım!

– Buyurun!

– O tezmi gələcək? – deyə Mehman içəriyə girib salam verdi.

– Mühəndis mənəm!..

– Mən anamı görmək istəyirdim. Rayondan gəldim, onu evdə görmədim. Soruşdum, dedilər burada işləyir, sizin fabrikdə.

– Adı nədir?

– Xatun Ağadadaş qızı!

– Baş mühəndis əvvəlcə qolundakı, sonra divardakı saata baxdı:

– 25 dəqiqə gözləməli olacaqsınız!

– Mən çox tələsirəm!..

– Qanun var, işdən adamı yarımçıq çağırmaq qadağandır. Bura istehsalatdır. İş bir-biri ilə bağlıdır. 25 dəqiqədən sonra tənəffüs olacaqdır!

– Onu necə görə bilərəm?

– Biz onu bura çağırarıq. – Baş mühəndis dəftəri açdı: – Xatun Ağadadaş qızı Atamoğlanova. Çox gözəl bildim hansı sexdədir! – Dilguşa katibəni çağırdı:

– Mən gözləyim? – deyə Mehman çıxmaq istədi.

– Siz əyləşə də bilərsiniz!

– Axı siz çalışırsınız!

– Bəli bir az işim var. Ancaq sizin əyləşməniz işimizə o qədər də maneçilik törətməz!

Mehman təşəkkür edib həyətə çıxdı, qulaq verdi, çarxların səsi binanı titrədirdi. O gözlədi. Hər dəqiqə bir gün kimi gəlib keçdi. Fit verildi, işçilər tənəffüsə çıxdılar. Üstü ağarmış Xatun gəlib baş mühəndisin kabinetinə daxil oldu. Mühəndis qız özü çıxıb həyətə tərəf boylandı. Mehmanı səslədi:

– Ananız gəlmişdir!

Mehman dönüb gəldi, anasını görüb səssizcə əlini uzatdı. Xatun oğlunun uzanmış əlini tutdu.

– Nə olar ki, – deyincə Xatunun gözləri doldu: – Allah xeyir versin. Arzum bu idi ki... evin olsun...eşiyin olsun... balan olsun!

Mühəndis xanım Xatundan soruşdu:

– Yoxsa ana, oğlunuzdan küsmüsünüz? Mən sizin oğlunuz olaram! İndi qız, oğlan təfavütü nədir? Qızlar daha vəfalı olurlar!

– Məndə böyük bir vəfasızlıq olmayıb, – deyə Mehman baş mühəndisin bu söhbətə qarışmasını, ona kömək etməsini istəyirdi. Bu cəhəti dərk edən mühəndis qız söhbətə müdaxilə edib Mehmana:

– Görünür, siz ananın qarşısında xeyli müqəssirsiniz! – dedi. – Yoxsa ayrı cür ana belə danışmazdı!

Mehman anasının qarşısında öz qollarını yanlarına buraxıb, uşaq kimi gözlərini döydü.

– Şübhəsiz məndə təqsir olmamış deyildir!

– Müqəssir təqsirini boynuna alan yerdə onu bağışlarlar, ana! – deyə mühəndis xanım Xatunu dilə tutdu, ana başını qaldırıb:

– Təki bu körpənin sağ sədası gəlsin, – dedi, – özünü qəhərlənməkdən saxladı.

Mehman mühəndis xanıma müraciət edib, qoca anasını işdən azad etməyi xahiş etdi.

– Biz belə işçini istehsalatdan çətin buraxa bilərik!

– Rica edirəm, yoldaş mühəndis, – deyə Mehman mühəndis qıza üz tutdu. – Çox təvəqqe edirəm. Mən onu özümlə rayona, evimizə aparmaq istəyirəm!

– Yox, Mehman! – deyə Xatun oğlunu mənalı nəzərlə süzdü, – Yox!.. Heç zaman yox!

Mühəndis xanım Mehmana diqqətlə baxıb:

– Bağışlayın, adınız nədir? – deyə soruşdu.

– Adım Mehmandır!

– Haranı qurtarmısınız?

– Hüquq fakültəsini.

– Bəlkə atam deyən Mehman sizsiniz?

– Kim?

– Professor Məlikzadə!

– Professor? Mən onu mütləq görəcəkdim!

– O bərk xəstədir, yatır. Yuxuda neçə kərə “Mehman!” – deyə sizi çağırıbdır, – qızın ala gözləri həqiqətən birdən yaşla doldu. – Mən o vaxtdan, düzü, sizi görmək istəmişəm. O sizin adınızı çox çağırıb, lap çox!

– Siz üzr istəyirəm, onun nəyisiniz?

– Qızı!

– Onda icazə verin tanış olaq! Professorun mənim boynumda haqqı çox-çoxdur!

Hər ikisi bir-birinə əl verdi.

– Dilguşa!

– Mehman!..

Fit çalındı. Xatun cibindən açarı çıxarıb Mehmana uzatdı.

– Evə gedərsən!

Mehman açarı aldı.

– Düz evə!

Mehman təzim edər gözlə anasına baxdı, Xatun isə otaqdan çıxdı, dışarı axan izdihama qarışdı. Bir azdan yenə də tikiş fabrikinin güclü çarxları yeri titrətməyə başladı.

## XXXVIII

Axşam çıraqlar yananda Mehman qapıya yaxınlaşıb zəngi basdı. İçəridən ağsaçlı bir qadın gəlib qapını açdı. Mehman salam verdi, qadın onun salamını aldı.

– Mən professoru görmək istərdim.

– O bərk xəstədir!

– İçəri otaqdan səs gəldi.

– Kimdir o? – Professoru öskürək tutdu: – Arvad, onu buraya gətir!

Professor balışa dirsəklənib başını qapıya tərəf çevirdi. Mehman içəriyə girib təzim etdi. Professor hərarətli əlini uzatdı, sonra da bir qədər qalxdı:

– Bu qədər də vəfasızlıq?.. Mən sizdən quşqanadlı məktublar gözləyirdim, sizsə susmağı məsləhət görmüşsünüz!

– Professor, iş orada o qədərdir ki!.. – deyə Mehman professorun işarə etdiyi stulda əyləşdi. – İş, necə deyərlər, başdan aşır!..

Professor Məlikzadə dönüb üzünü arvadı Zivər xanıma tutdu:

– Mənim oğlumdur, Mehman!

– Yuxusunda da sizin adınızı çəkir bizim Məlik!

– Düzü, mən istəyirdim, – deyə hərarət içində yanan Məlikzadə çox da qayda-qanun gözləmədən ürəyini açdı... – Bir qızımız var, bir oğlumuz da olsun... Sonra Katibə xaladan bildim!.. Nə isə!.. Xeyirli olsun, xoşbəxt olun, heç bir söz ola bilməz. Ancaq heç biriniz mən deyənə baxmadınız. Nə Dilguşa hüquq elmi oxudu, nə də ki, sən bir elmi işçi olub, o elmin alimi olmaq istədin!.. Mən təcrübi işin əleyhinə deyiləm. Lakin mən istedadınıza görə, sizin elmi işçi olmağınızı ürəkdən arzu edərdim... Dilguşa də gündəlik təcrübi işi daha üstün tutur. Ağıl ilə elmə xidmət etmək özü də təcrübi işə işıq vermək, onun yoluna məşəl tutmaq deməkdir!..

– Təcrübi işlə elmi iş bağlansa, daha yaxşı olmazmı, professor?

– Əlbəttə, əgər bacara bilsəniz?.. Ancaq sizi bilmirəm Dilguşa təcrübi işdən əsla göz aça bilmir. O, istehsalata elə bağlanıb ki, oradan elə zövq alır ki, təəssüflər olsun ki, kitabı vərəqləməyə belə çox çətin macal tapır!

– Mən bu gün Dilguşa xanımı gördüm!

Anası yerindən tərpəndi və:

– Harada? – deyə soruşdu.

– Fabrikdə gördüm!

Professor arvadına tərəf dönüb:

– Çay – dedi: – Bir yaxşı mürəbbəli çay! Tələbəmlə söhbət etmək istəyirəm!

Zivər xanım dönüb çay hazırlamaq üçün gedincə professor yaxın stulda əyləşən Mehmana üzünü tutub:

– O vaxt çox utancaq idin, – deyə bir ata məhəbbəti ilə onu süzdü. – Bilmirəm indi necə?..

Mehman sükutla cavab verdi, professor Məlikzadə tələbəsinin nə üçün gəlməyi ilə maraqlandı. Mehman öz gəlişindən ona məlumat verdi.

– Yaxşı, nə olar?.. Olsun, işləyin, ancaq gündə-gündə oxuyub mütaliə də edin! Bilin ki, indiki zamanda gündə-gündə elm əxz etmədən inkişaf yoxdur!.. Bütün elmlər içində hüquq elminin xüsusi bir mövqeyi vardır!.. Lakin təcrübi işdə hüquqçu özünü daha müqəddəs və təmiz saxlamalıdır! Çünki hüquq elmi vətəndaşın hüququ ilə bağlıdır! – Professor bir qədər fasilə verib, quruyan dil-dodağını yalayıb soruşdu. – Deməli, sabah hesabatdır?

– Bəli, gördüyümüz işlər barəsində hesabat verməliyik, professor!

– Başqa uşaqlardan da hesabat üçün gələn varmı?

– Böyük bir dəstə gəlmişdir. Yenə təyin olunmuş cavan prokurorların altı aylıq hesabatıdır.

– Bəli, mən də çalışacağam ki, mütləq sizin hesabatda olum!.. Görək tələbələrimiz təcrübi işdə hüquq müqəddəsliyini necə mühafizə edirlər?.. – Məlikzadə Mehmanı məna ilə süzüb davam etdi. – Əlbəttə, həqiqi insanın hüququnu! İstismardan, qənimətdən, qətl-qarətdən, basqından, rüşvət-oğurluqdan uzaq olub, öz yaradıcı əlləri ilə, başları ilə bizim dünyanın maddi, mənəvi nemətlərini artıran, hər bir vətəndaşın hüququnu müdafiə etmək, onlar üçün dinc əmək şəraiti yaratmaq ən müqəddəs işdir! Əlbəttə, quru, qeyri-inandırıcı vaizlikdən artıq, kəskin bir ictimai xalq mühafizəsi olmaq daha ülvi bir vəzifədir. Bizim indiki keçid dövründə, keçmişin qalıqlarına qarşı mübarizə etmək – qurub yaratmaq deməkdir!.. Qanun həm müqəddəs, həm də möhkəm olmalıdır!

– Bəli, qanunu həm müqəddəs tutmaq, həm də möhkəm saxlamaq gərəkdir! – deyə Mehman, bir növ, müəlliminin sözünü təkrar etdi.

– Bəli, oğlum, elə, – deyə professor öz tələbəsini nəvazişlə süzdü. – Tamamən elədir! Mən bizim sovet elmi hüquq elmi nöqteyi-nəzərindən, yəni bax, əsl humanist cəbhədən demək istəyirəm!.. Mənim bu barədə barışmadığım heç bir cəhət, yaxud mənim ayrı bir "cəbhəm yoxdur" Buna görə respublika prokurorundan icazə alıb, sizin müşavirəyə gəlmək, bu cəbhədən təcrübi işlərə baxmaq, qanun müqəddəsliyinin necə mühafizə olunduğunu müşahidə olunduğunu müşahidə etmək istəyirəm!

– Çox da gözəl olar, professor!

– Yoxsa siz gənclər öz müəlliminizə "köhnə", ya "köhnəlmiş" demək istəyirsiniz?..

– Əsla... Bizim öz müəllimimizə qarşı olan ehtiramımız tükənməz və əbədidir! Köhnəlmək saçların ağarmasında deyil, təfəkkürün durğunluq və ətalətindədir!

– Bəli, əgər köhnəlik bir mühafizəkarlığa çevrilərsə, heç öz müəlliminə də güzəştə getmək olmaz!

Mehman gülümsədi, Məlikzadə gözlərini geniş açaraq:

– Bu gülüşlə demək istəyirsən ki, professorda azca mühafizəkarlıq vardır, eləmi?.. Mən özüm də bu nöqsanı az-çox özümdə hiss etməmiş deyiləm!.. Lakin köhnə quruluş və cəmiyyətin doğurduğu ləkələrə qarşı mübarizənin zəruriyyətini böyük Marks özü öz külliyyatında göstəribdir! – Professor dirsəyini möhkəmlətməyə çalışdı. – Birtərəfli olmamaq üçün, həm də əlbəttə, təcrübi iş gərəkdir! Mən nə cür xəstə olsam belə, mütləq sabah gəlməyə çalışacağam!

Professorun arvadı Zivər xanım öz ərinin, sabah iclasa getmək fikrinə etiraz edib:

– Heç doktor icazə verərmi? – dedi.

– Doktordan icazə almaq, qanuni-əsasidə yazılmayıb, biz onu poza da bilərik, arvad! – Professor həyəcan içində gülüb sonra öskürdü. – Sağ-sağ məhkum olmaq olmaz!

– Mən də ana deyənə şərik olmaq istərdim, professor!

– Niyə yoldaş prokuror?

– Biz nə qədər sizi görmək, dinləmək istəsək də, xəstə halınızda həkimə qulaq asmağınızı məsləhət görərdik! – Mehman ehtiramla gülümsədi. – Öz səhhətinə qəsd edənlər isə qanuni maddəyə düşürlər!

Professor da gülümsədi:

– Prokuror ki prokuror!..

Professor öz hərarət və ağrılarını unudub Mehmana məsləhət etməyə başladı. Sonra da əlini uzadıb stol üstündən bir kitab götürdü.

– Öz kitabımdır, sənə bağışlamaq istəyirəm!

Mehman təşəkkür edib:

– Böyük yadigardır, – deyə öz müəlliminin kitabını böyük məmnuniyyətlə aldı.

– Əlbəttə, kitab hər birimiz üçün göydəki gün, yerdəki su, ətrafdakı hava qədər gərəkdir! Mən əməkçi insanlıq və ədalət naminə yazılan kitabları çox müqəddəs tuturam, öyrənirəm, hey öyrənirəm! Öyrənmədən, müşahidə etmədən, çalışmadan, yuxusuz qalmadan, necə deyərlər, gözlərinin Nurunu elm yolunda vermədən kitab yazmaqmı olar? – Əsla!.. Əsla olmaz!.. – Məlikzadə sadəliklə gülümsəyib əlavə etdi: – Yoxsa siz, qalifedən çıxmaq istəmirsiniz, prokuror?.. Bir qədərdən qayıtmaq, mütləq kitabxanaya girmək, elmi işə başlamaq! Qoy, nə olar təcrübi iş sizin gələcək elmi-tədqiqat işlərinizə həyat qidası versin. Mən öz mülahizələrimə yenidən baxmaq, düz olmayan cəhətləri düzəltmək, necə deyir, gəncləşmək, pionerləşmək istəyirəm!.. Yoxsa hüquq elminin qoca əsgərinin qələmini daha titrəyən zənn edirsiniz?

– Bizim gəncləşmək istəyən ağsaçlı alimə hörmətimiz böyükdür! – deyə Mehman nəzakət qaydalarına riayət etməyə, xəstə professorla izafi və deyintili bir mübahisəyə girişib onu incitməməyə çalışırdı. Buna görə Mehman öz sözünün ölçü-biçisinə rəsmən fikir verir, sözlərini aydın və səlis ifadə etməyə çalışırdı.

– Əlbəttə, gələcək gəncliyindir, – deyə professor qeyd etdi. Onun dərinə düşmüş gözləri xəyal içində süzüldü. – Lakin bugünkü gənc özü də illər dolandıqca ağsaçlı olur!

– Xeyirli işlər yolunda ağaran saçlar müqəddəs və mənalıdır, müəllim!..

– Bəs xeyirsiz ağaran saçlar? – deyə professor, imtahan edər kimi, tələbəsindən soruşdu:

– Belə saçlar ağarsa da, mənasızdır. O, boş, dənsiz sünbülün vağanıması kimi bir şeydir!

– Mən çox şadam, – deyə professor öz balışına dirsəklənməklə, o biri qolunu Mehmanın boynuna hərləyib onun qara qıvrım saçları altında parlayan geniş alnından öpdü. – Alnıaçıq, ürəyitəmiz olmaq, bu yolda saç ağartmaq, əlbəttə, mənalıdır. Vay ondadır ki, alnında cinayət izləri damğalana... Belə adam, baxırsan ki, tabutda da xəcalət içindədir!.. Çox fikir vermişəm, ictimai faydalı adamlar – xalq xadimləri son səfərlərində sanki öz ətrafına nur saçır, lakin ictimai zərərli və təhlükəli adamların simasını isə ağır bir kəsafət basır... Sanki bu vaxt o özü tabutda, öz üzünü gizlətməyə bir yer axtarır... Sədaqətlə xalqa xidmət etmək, öz ürəyini xalq yolunda vermək bacarığı böyük bir səadətdir!

Bu danışıq zamanı çay gəldi, qapının zəngi tezcə çalındı. Ağsaçlı Zivər xanım asta-asta gedib qapını açdı. Dilguşanın səsi eşidildi:

– Qızım, buraya! – Professor əlini qaldırdı. – Buraya mənim yanıma, mənim qızım!..

Dilguşa gəlib salam verdi. Mehmanla təkrar görüşdü.

– Mən dedim ki, atam xəstədir!

– Yoxsa gəlməyəcəkdi? – Professor başını yırğaladı. – Bayaqdan burada ictimaiyyət dərnəyi açmışıq! Ancaq, görünür, Mehman üzə düşüb gəlibdir! Beləmi demək istəyirsən, qızım?

Mehman öz soyuq hərəkətləri üçün sıxılıb:

– Xeyr, mən anamı, bir də sizi görməyə bilməzdim, – dedi.

Dilguşa araya başqa bir söz salmaq istəyib:

– Mehman qağanın bir yaxşı anası var, – dedi.

– Bəs onu niyə buraya gətirmədin?

– O işdədir, fabrikdə ikinci növbədə!

Professor:

– Çox gözəl, – dedi. – Hünərli iş və yaradıcı əmək bu dünyanın bəzəyidir!.. Yoxsa yaradıcı əməksiz bu dünya bir meymunxana, xarabaxana, bir bayquşxana olub qalardı. Yaxşı da eləyib, iş gərəkdi insan üçün, iş!.. Hər nə ki, bu dünyada abadanlıq naminə görürsünüz, hamısı yaradıcı işin, əməyin məhsuludur! İnsan əli, insan zəka və hünəri olmasaydı, bu dünya ibtidai, vəhşi halında qalardı!.. Əldən düşməyibsə, qoy ana işləsin. Əgər qocalıbsa, qoyun qayıtsın, keçdiyi yollara baxsın!

Mehman Dilguşaya təkrar baxdı. O, bu baxışla Dilguşadan bu barədə daha söhbət açmamağı xahiş etdi. Dilguşa mətləbi anladı, qız atasının səhhətini soruşdu. Əyri-üyrü cızılmış kağızı götürüb, xəstənin hərarət dərəcəsini yoxladı.

– Bəs, axı doktor bu inadlı hərarətə nə deyir?..

– Heç bir şey, qızım!.. Kim hansı qəbiristanlıq üstündə hansı doktoru bir məhkəməyə çəkibdir?.. Bir də, insan öz dövranını sürüb bitirəndən sonra təbabətin sözü qurtarır!..

– Necə olsa da konsilium təşkil etmək lazımdır!

– Konsilium, ya məşvərət birdir!.. Hamısı səksəndəndir. – Professor balışda özünü bərkidib qeyd etdi: – Vaxt gələndə, heç bir dünya konsiliumu, heç bir dünya tibb elminin ali qərarı qocalığın qarşısına qılınc çəkə bilməz!.. Gənclik ölümün düşməni, qocalıq ölümün əsiridir. Yel ötdü, isti oldu, soyuq keçdi, qocalıq kənara buraxmadan, bir ahənrüba kimi öz qorxusundan xəstəliyi çağıracaq, tutub saxlayacaqdır. Körpə bir quzu qurdun yanan gözlərindən vahimələnib, ona tərəf yeriyən kimi, təəssüf ki, ölümlə üzləşəndə qocalığın əl-ayağı büzüşür.. Amma gənclik hər hansı bir xəstəliyə qarşı üsyankar qılıncını çəkir, onu döyə-döyə öz qabağına qatır!.. Belədir, qış gələndə, artıq bozaran göydən bu yerə ağ bir qar yağacaqdır, nə qədər döyüşsən, nə qədər vuruşsan, insan ömrünü bir əsr, əsr yarım, yaxud iki əsr belə uzatsan, nəhayət, o, insanı ağ bir kəfənə bürüyəcəkdir... – Professor hər iki gəncə – Mehmana və Dilguşaya baxıb xəyala getdi. – Bəli, qocalıq ömrün son pilləsində, sümük donduran şaxtalı bir qışdır!.. Qar yağacaq, qara torpaq da məhkum qocalığı qara bir pərdə kimi örtəcəkdir. – Professor danışa-danışa kədərləndi. – Bəli, bu özü də çox qəribədir! Dünya qanuni hökmünü sürür... Bir tərəfdən doğum, o biri tərəfdən ölüm... Gülmək, ağlamaq, kədər, nəşə daim gecə-gündüz kimi bir-birini təqib edir... Dünyanın yolu belədir, övladlarım!.. Lakin inkişaf dayanmır. İrəli doğru hərəkət bir an susmur, gün çıxır, batır, səyyarələr parıldaşır, təbiət öz ahəngini pozmur, insan oğlu ölümə baxmadan, addımını yavaşıtmadan yüksək zirvələrə doğru yol alır... Dünən arabada gedən, bu gün qatarı da geridə buraxıb sürət naminə, təyyarəylə qalxıb buludları yarıb, günəşə doğru yol alır... Bəli, maddi inkişafın gedişi, insan istedad zəkasının xariqüladə qüdrəti, vaxtilə mağaralarda, çılın-çılpaq yaşayan oğlunu yeni-yeni keyfiyyətli aləmlərə aparır... Yüksək mərtəbəli daş binalar, işıq-yaraşıq hər kəsi heyran edir... Bu mənada, övladlarım, həyat dayanmır, ömür özü də qocalığın məhkum bir əsiri də olsa, o gəncliyin varlığında, öz düşməni ölümlə daim həyat naminə döyüşür... Bəli, qocalıq getdikcə, gənclik daha gurultulu, güclü gəlir... dünya bir yerdə qərar tutub dayanmır. Lakin min təəssüf ki, qocalıq, əcəlin əsiri, ölümün müti bir yolçusudur... Bax, bu gedişdə dönməz bir hökm, əbədi bir qanun vardır! Odur ki, həyatda gə-

rəkli adam olmaq, gələcək nəsillərimiz üçün xeyirli işlər görmək gərəkdir ki, bizim nişanələrimiz itməsin!..

– Siz qocaldığınız üçün çox düşünür və çox kədərlənirsiniz, ata!

– Görünür, qızım, qocalıq bu dünyaya əlvida etmək üçün bir kədər məcmuəsidir!..

– Sizin kimi nikbin adam heç belə bir bədbinliyə qapılarmı, ata?

– Qızım, indi həyat çox şirin olduğundan, ondan qopmaq təhlükəsi daha şiddətli olmuşdur... Kim qocalığı nə qədər qınasa da, həqiqəti inkar etmək olmaz...

– Belə acı xəyalları qovmaq gərəkdir, ata!.. Həyat və səadət naminə ölümü odlamaq gərəkdir!..

– Mütləq, mütləq! – deyə qoca professor kədərli bir xəyal içində gülümsədi. – Heç şübhəsiz, həyat ölümə qalib gəlir! Biz gənc nəslimizlə yaşayırıq. – O, hər iki əlini gətirib Mehmanla Dilguşadan yapışdı. – Siz yaşayın!.. Lakin qoy hər bir kəs dediyim kimi, bu dünya və nəsillər üçün xeyirli işlər görsün, təmiz ürək, açıq alınla bu dünyadan getsin...

– Biz qalmaqdan danışırıq, ata!

– Biz acı da olsa, həyatda artıq qanun halını almış həqiqətin gözləri içinə dik baxmalıyıq, qızım... Kim deyə bilər ki ömrün faciəli yekununu mən toy-nağara ilə qarşılayıram!..

– Qəhrəmanlar ölümdən göz qırpmırlır!

– Həyat naminə ölümdən göz qırpmırlar, qızım! Ancaq o qəhrəmanlar əbədi yaşamaq, ölməz dastan naminə son yol olan ölümün üstünə zağlı qılıncla gedirlər... Qəhrəmanlarda həyat eşqi hər kəsdən daha güclüdür... Şairlərdə, alimlərdə, sənətkarlarda, əmək qəhrəmanlarında yaşamaq ehtirası daha coşqun olduğu üçün, onlar ömürləri uzunu ölümə qarşı vuruş aparır, insanlıq şüurunda bir hikmət kimi əbədi yaşamaq istəyirlər... Bəli, onlar ölməz iş, hünər və əsərləri ilə uzun əsrləri yara-yara gəlirlər!.. Əlbəttə, bu özü də ölümə qarşı susmaz, əbədi bir üsyandır!..

– Ata, belə bir bədbin fəlsəfədən nə nəticə?

– Qoy gənc hüquqşünas öz hökmünü versin, – deyə Məlikzadənin işıldayan gözləri Mehmana tərəf zilləndi. Mehman ağsaçlı müəllimini mehriban bir nəzərlə gözdən keçirib dayandı.

– Yoxsa bizim gənc prokuror qanun kitablarını vərəqləyib, mənim üçün bir maddə axtarır?

– Xeyr, professor!

– Bəs o niyə hərarət içində olan, yetmişi ötmüş bir qocanın qızdırmalı sayıqlamaları qabağında öz hökmünü vermir!

– Siz, professor, hələ uzun illər yaşayacaqsınız!

– Mən yaşamaq uğrunda qılıncımı qınına qoymayacağam... Ancaq namərd qocalıq mənim kürəyimə öz zəhərli xəncərini saplamasaydı?..

– Siz, professor, daim həyat deyirsiniz. Ancaq bilmirəm indi niyə belə bədbin mühakimələrə gedirsiniz?..

– Bəli, həyat naminə mühakimə gərəkdir. – Professor danışa-danışa gülümsədi, sanki qar içindən ölümə biganədir! Lakin ömrün qocalığı daim bu sualı doğurur: bəs insan həyatının əzəli?.. Bəs insan həyatının sonu?.. Bu məsələ mütəfəkkirlərin şüurunu daim məşğul etməmişdirmi?..

– Siz gəncləşin, ata!

– Mən gəncləşmək üçün qocalığa cəza hökmü yazmağa çalışıram...

– Bax belə, ata! – deyə Dilguşa qocanın ağ saçlarını oxşayıb, onun nazik göy damarları görünən alnından öpdü. İstər-istəməz qızın gözləri atasının qocalıq və xəstəlik kədəri qarşısında təəssürlü bir yaşla doldu. – Siz yüz yaşa yetişəcəksiniz, ata!

Mətbəxdən dönən Zivər xanım vəziyyəti belə görüb söhbəti dəyişdirmək, boş yerə doğan bu kədəri dağıtmaq, onu qovub bu evdən uzaqlaşdırmaq üçün mübahisəyə qarışıb:

– Bizim Məlik şaqqıltıdan səksənəndir, – deyə stula əyləşdi. – Biz Şüvəlan bağında olan zaman, qamışlar səslənəndə, bizim Məlik qulaq verib “nədir o!” deyərdi.

Professor ağ balış üzərində ağsaçlı başını bulayıb:

– Heç rəqibini uzaqda axtarmağına dəyərmi? – deyə Zivər xanımı süzdü, – bir zaman ki o səninlə birlikdə, sənin yanında yaşayır?..

Zivər xanım Mehmanı gözdən keçirib şəfqətli bir təbəssümlə:

– Yəni mən demək istəyirəm ki, daha bizim Məlikin başı ağrıyanda o, birbaş vəsiyyətə qaçır!..

– Vəsiyyət yüngüllükdür, arvad! – Məlikzadə əsəbiləşdi. – Adamın sirrini əgər arvad açmasa, heç Allah da aça bilməz!

– Bizim Məlikin, yəqin yüzüncü vəsiyyətidir...

– Yox, mininci – deyə professor qurcalanıb öz çarpayısı üzərində oturdu. Mehman ayağa qalxıb ağ köynəkli qocanın çiyinlərini nazik ipək yorğanla örtdü.

– Bizim bu arvad, daha adamı azarlamağa da qoymur... – Zivər xanım ağ və pərakəndə saçlarını qara qaşları üzərindən geriyə darayıb:

– Mən heç bir vəsiyyətə yoxam, – dedi, – Məlik!

– Belə çıxır ki, bu barədə daim daş kimi susmaq lazımmış?!.

– Xeyr, haysız-küysüz, vəssalam!

– Görünür, Zivər xanımın bizim müəllimə məhəbbəti böyükdür, – deyə Mehman uzun illər boyu yaşayıb əməkdaşlıq edən ağsaçlı insanları eyni ehtiramla süzdü. – Yoxsa məhəbbətsiz bu uzun yolu keçib gəlməkmi olardı?

– Bəli, Leyli-Məcnun, – deyə Dilguşa gözlərini xəlvəti silib atasının kədərini dağıtmaq istədi. – Anam mənə ötən günlərindən çox-çox danışıbdır!..

– Düzü, Leyli heç zaman Məcnunu o qədər incitməyib, nəinki bu arvad məni, – deyə Məlikzadə gülümsədi, onun qar kimi ağaran tutam saqqalı titrədi. – Özü də az yox, qızım, çox-çox incidibdir...

– Niyə bu qədər incitmisən, ana?

– Çünki atam bu Məlikə razı olmurdu. Heç axıra qədər də o, Məlikin bu kitabpərəstliyindən xoşlanmırdı!

– Bəs onda kim qoşun çəkib Leylini o əmirdən güclə aldı?..

– Mən özüm qara, qıvrımsaçlı, toqqası qotazlı Məcnunun dərya iztirablarına cavab verdim!

– Düzdür, arvad neçə il bundan qabaq? – deyə Məlikzadə əsəbilik və xəstəliyini unudaraq xəyal içində kövrəldi. – Düz haçan?..

– Düz qırx birinci ildir, Məlik!

Dilguşanın gözləri Mehmana tərəf çevrildi, onun uzun kirpikləri yanaqlarını döyürdü:

– Anam macəraya keçməyi çox xoşlayır!..

– Bizim Zivər macəranı niyə həqiqətdən artıq sevir? – deyə professor Mehmana nəzər yetirib soruşdu və özü də tez cavab verdi. – Niyə, oğul? – Çünki onun oxuduqları şirin-şirin nağıllar, bir də eşq dastanları olmuşdur...

– Yaxşı ki, o qanun kitablarının birini də vərəqləməmişəm, – deyə Zivər xanım otağın ara qapısını açdı, divar dövrəsi ucalan, rəflər boyu üst-üstə qalaqlanan bir kitab dəryası göründü. – Hamısı da qanun!

– Qanunsuz həyat bir hərc-mərclik olardı. – Professor ayağa qalxıb öz kitabxanasına keçmək istəyincə Zivər xanım qocanın qolundan yapışıb onu sakit etdi.

Söhbət təbii yolu ilə dəyişdi, Zivər xanım əlavə çay süzüb gətirdi. O, xəstənin könlünü almaq üçün onun çayına mürəbbə töküb, özü də qaşıqla qarışdırdı.

– Hamısına qocalıq müqəssirdir, Zivər... Bax, o vaxt gimnaziya geyimində olduğum zaman, mən heç ölüm-dirim haqqında bir söhbət açırdımmı?..

– O zaman da heç, Məlik, kitabdan qopmazdın!

– Kitabdan qopmazdımsa, heç səndən də üzülməzdim, Zivər!.. Ancaq indi qocalıq küləyi çox yamanca əsir!..

– Bu danışıqları yaddan çıxarmağa çalışaq, – deyə Dilguşa yenə də atasını bu düşüncələrdən uzaqlaşdırmağa çalışdı. – "Qocalıq küləyi?.." Atam şair olmaq istəyir!..

– Bu dönməz qanunu, qızım, biz yaddan çıxarmağa çalışsaq da, o dəyişməzdir. – Professor özünün haqlı olduğunu sübut edib, öz sözünü tamamlamaq istəyirdi. – Mən əsla heç bir Şüvəlanda, heç bir qamış şıqqıltısına səksənməmişəm, qızım!.. Mən durub şıqqıltıya doğru getmişəm.

– Səksənmirdinsə, niyə gedirdin, Məlik?

– Meynələr üçün, salxımlar üçün, Zivər... Öz əl qabarımın meyvələrini mühafizə etmək üçün... Ayaqyalın qumda çalışan bir adam üzüm bağında şıqqıltı olduğu zaman, heç gözünü yumub yata bilərmi?

Mehman divarda ağır-ağır hərəkət edən saata baxdı, o, ayağa durub professorun əlini ehtiramla tutdu.

– Mübahisəsiz, mühakiməsiz, xatiratsız, daş sükutu heç də yaramır, – deyə sinəsi qalxıb-enən professor fikirli alnını qırışdırdı. – Həyat təfəkkürü dərin, sualları isə min-mindir, oğlum!

– Bəli, sizin sözləriniz hikmətlidir, – deyə Mehman cavab verdi və daha xəstə müəlliminə başqa söz demək istəmədi.

– Elə də yox, oğlum, qeydsiz, şərtsiz bir ehkam kimi qəbul etmək yox!

– İcazənizlə getmək istərdik, professor...

– Bir qədər də qalsanız, atamla söhbət üçün, – deyə Dilguşa dilləndi, – nə olardı?..

– Anam işdən qayıdıb gözləyəcəkdir, – deyə Mehman, üzr istəyir kimi cavab verdi. – O işdən yorğun dönəcəkdir!..

– Bəli, ehkam kimi! – Professorun alnında saysız-hesabsız qırışlar dür-düyün oldu, Mehmanı ucqar rayona, təcrübi işə buraxmamaq barədə onu narahat edən bir düyünü açmaq istədi. – Mərhum Heraklit çox-çoxdan özü də əcəb demişdir: "Hər şey axır, hər şey dəyişir!" madam ki belədir, demək, hər kəsin, o cümlədən, mən Məlikzadənin də səhvi ola bilər! – Qocanın gərgin vəziyyət keçirdiyini görən Dilguşa atasının göy damarlı, aramsız əsən sağ əlini öz yumşaq əlləri arasına alıb:

– Sənə dinclik vacibdir, – deyə atasını sakit etmək istədi, – mütləq sənə rahatlıq gərəkdir!

– Mən mütləq rahatlığa, mütləq dincliyə, mütləq sükunətə zidd olmuşam, qızım!

– Demək istəyirəm ki, – Dilguşa öz soyuq əlləri ilə atasının hərarət içində yanan, titrəyən əlini sığallayırdı, – indi sənin harada necə səhv etdiyini səndən soruşan yoxdur!

– Vardır, qızım, vardır!

– Kimdir?

– Bax, mənim öz ürəyim! – Məlikzadə əlini qızının əlləri arasından çıxarıb sinəsinə gətirdi. – Ən ali hakim, güclü müstəntiq, bax insanın öz ürəyidir!.. Öz ürəyinin sorğularına özün doğru-düzgün cavab versən, sən ən ülvi varlığa, ən adil hakimə və müstəntiqə dürüst cavab vermiş olursan.

– Mənim əziz atam köhnə tolstoyçudur!

– Bəli, mən bir zaman o qocanın pərəstişkarlarından olmuşam!

– Əgər indi özün ehkamçılıq əleyhinə getdiyin zamanda, qocanın fəlsəfi təsirlərindən xilas ola bilmirsənsə?

– Ürək səsini, vicdan məhkəməsini dinləməkdə mən sabit insanam!

– Bəs nədə sabit insan deyilsiniz, ata?

– İctimai inqilab, sosialist inqilabı barəsində nə zamandandır ki, mən böyük sənətkarın dünyagörüşünə, Tolstoyun İsa fəlsəfəsinə ziddəm!

– Bəs onda bizim hörmətli qonağımız Mehmana hansı ehkamdan dərs demək istəyirdiniz?

– O ehkamdan ki, – deyə Məlikzadə başının altına qoyulan balışlara dirsəkləndi, arvadının üz-gözünü turşudub əsəbiləşdiyinə, qızının və hörmətli qonağının darıxmağına baxmayaraq içəridə, ürəyində baş qaldıran, onu narahat edən bir məsələ barəsində öz fikrini izah etmək istədi. – Etiraf etməli, tamamən düzünü deməliyəm ki, mən bizim tələbəmiz Mehman Atamoğlanzadənin elmi-nəzəri işdən ayrılıb, həyata – təcrübi işə getməyinə çox yamanca zidd idim... İndi etiraf etməli, sizin müqabilinizdə tamamən düzünü deməli, özüm-özümü dolaşıq mülahizələrimdən xilas edib açıq söyləməliyəm ki, indi də bu məsələnin nə dərəcədə düz, ya əyri olduğunu bütün dəqiqliyi ilə ağ-açıq aydın edə bilməmişəm?!. Ancaq çırpınan, döyünən, atlanıb qaçmaq istəyən ürəyimdə belə sual baş qaldırmışdır: – Mən Mehman barədə düzmü hərəkət etmişəm? Mehmanı həyata, işə-gücə buraxmayıb, onu kitabxanada, kafedrada "xalis elmi işdə" saxlamaqda yaxşımı iş görmək istəmişəm? Mehmanın ləkələnməyindən ehtiyat etməkliyimdə yanılmışammı?.. Bax, bu kimi dür-düyünlü suallar, qəti sorğular mənim ürəyimdə baş qaldırıb nə zamandır ki, məni narahat edir... Mən indi, bu an sizin şəhadətinizlə bu qərara gəlmək, bildirmək istəyirəm ki, hər hansı bir müddəa – ehkam köhnəlib dəyişilə bildiyi kimi, mənim də müddəam – ehkamım köhnəlib dəyişilə bilər. – Məlikzadə zahirən nə qədər rəvan danışsa da, daxilən çətinlik çəkir,

ancaq fikrini qırmaq istəmir, ürəyi ilə səsləşir, danışıb söylənib, öz dediyi kimi, özünü izafi ağırlıqdan xilas edib, ürəyini yüngülləşdirmək istəyirdi. – Bəli, mən ötüb-gəldiyim həyat yolunu araşdırmaq istəyirəm... Bəli, mənim görüşlərimdə heç də az ziddiyyət olmamışdır. – Qoca, döyünən ürəyini dinləyirmiş kimi, kəlmə-kəlmə danışmağa başlayırdı. – Mən, bu gün coşqun həyata atılan, mürəkkəb mübarizə yoluna düşən tələbəmə – Mehmana xeyir-dua vermək istəyirəm. – Məlikzadə gülümsədi, onun saralan sifətində qocalığın yaşaran gözləri göründü, ağ qaşları altındakı qara kirpikləri qırpıldı, mən bildirmək istəyirəm ki, "usta şagird davası" qədim davadır, bəli, qədim cəng-cidalıdır!.. Bəzən şagird irəliyə ötdüyü halda, usta onu ətəkləyib əyləndirmək, istər-istəməz inkişafdan geriyə salmaq istəyir. – Məlikzadə dirsəklənən əlini çəkdi, başını balışlarda rahatlayıb, xəyala getdi...

– Atam daha növbəti mühazirəsini qurtardı! – deyə Dilguşa qəhərlənən qocanın qar kimi ağaran, pərakəndəliklə balışlara səpələnən saçlarını tumarlayıb düzəltdi... Mehman ayağa qalxıb öz qara, qıvrımsaçlı başını ustadının qarşısında ehtiramla əydi.

– Mən hörmətli müəllimin müdrik kəlamları, unudulmaz tövsiyələri müqabilində, ona öz təşəkkürlərimi dönə-dönə bildirmək, onun icazəsi ilə evimizə dönmək istəyirəm!

– Sizi yorduğum üçün üzr istəyirəm! – deyə qəhərlənən, bəlkə də hıçqırtısını saxlamaqdan acizlik çəkən, bu yataqdan qalxmağa ümidi olmayan qoca, titrəyən dodaqlarını bərk-bərk bitişdirdi, Mehman qocanın sağ əlini qaldırıb öpdü.

– Anam məni gözləyəcəkdir...

Mehman professorun əlini hörmətlə sıxdıqdan sonra, dönüb Zivər xanım və Dilguşa ilə görüşdü. Dilguşa paltosunu çiyninə atıb Mehmanı darvazaya qədər ötürdü.

– Burada ikən tez-tez gəlmənizi xahiş edirik, – deyə mühəndis qız utana-qızara dilləndi, – çünki atam sizdən illər uzunu bizimçün o qədər danışıbdır ki!..

– Burada olduğum müddətdə, xəstə müəllimə baş çəkməyi özümə borc bilirəm, – deyə Mehman Dilguşa ilə təkrar görüşüb addımladı.

– Biz sizi gözləyəcəyik, Mehman!..

## XXXIX

Mehman yol uzunu Dilguşanın bu nəzakət və mehribançılığı barəsində düşündü. İstər-istəməz o, Dilguşanı Züleyxa ilə yan-yana qoyub müqayisə etdi. Getdikcə Mehman bu müqayisədə üstünlüyü mühəndis

qıza verdi. Ali təhsilli, açıq-aydın sifətli, mülayim baxışlı bu gənc qız nə qədər də cazibədar və hörmətə layiqdi. "Dilguşa birini sevirmi?.. Bu qız öz həyatını kimlə qurmaq istəyir?.." Belə bir adamın nə qədər məsul ola biləcəyini Mehman təsəvvürünə gətirirdi. – "Bəli, ailə tərbiyəsi... Evlənmək... Ailə həyatı qurmaq nə qədər də mürəkkəb məsələ imiş?" Professor qızdırmalı danışsa da, – Mehman yol uzunu adamların arası ilə keçə-keçə özünü mühakimə edirdi. Şəhla xanımın hərəkətlərində olan sünilik, "saat söhbəti" ilə əlaqədar olan bütün bir oyunbazlıq, təfərrüatına qədər bilməsə belə, artıq onun Şəhla xanıma qarşı doğan nifrətini artırırdı... – Bəs nə etmək, bəs necə etmək? – Bu məsələ Mehmanın şüur və mühakiməsində bütün ciddiyyəti ilə baş qaldırırdı. Bəli, gənc Mehman səmimiyyət axtardığı halda, Şəhla xanımın sifətində bir saxtakarlıq görürdü, Mehman bu cəhəti unuda bilmir, mübhəm bir şübhə onun ürəyini narahat edirdi...

Professor Məlikzadənin dediyi kimi, daxili ziddiyyət, köhnəliklə yenilik bu ailədə üz-üzə gəlirdi. Züleyxa nə qədər ucaboylu, qara qıvrımsaçlı, ətli-əndamlı, gözəl-göyçək olursa, güldüyü zaman onun ağ dişləri nə qədər işvəkar cərgələnirsə, bu zaman onun iri ala gözləri nə qədər cazibədar bir ehtirasla alışıb yanırsa, bütün bunlar Mehman üçün nə qədər biganə qalmırsa, yenə də Züleyxa öz anası Şəhla xanımla bağlı olduğu üçün Mehmanın nəzərində öz üstünlüyünü itirməyə başlayırdı. Züleyxanın öz anasına qarşı olan mütiliyi, bu ailə üçün nə kimi bir fəlakət doğuracaqdı?

Mehman adamların arası ilə keçib seyrək küçəyə keçdi, beləliklə o, dalğalı bir fikir içərisində evlərinə çatıb, anası verdiyi açarla tanış qapını açdı. Lampanı yandırdı, doğma ev onun üçün işıqlandı. Mehman professorun ona verdiyi kitabları vərəqlədi, sonra öz tələbəlik stolunun üstünə qoydu. O, fikir içində xeyli gəzindi, haçandan-haçana Xatun gəlib çıxdı. İş ananı yormuş olsa da, oğlunu öz doğma evində görməyi onu fərəhləndirdi. Bir də, hansı bir ana, uzun müddətə ayrıldığı övladını görəndə öz yorğunluğunu unutmaz?.. Xatun da öz yorğunluğunu unudaraq, dünəndən hazırladığı xörəyi qızdırdı. Mehman anasının qarşısında özünü bir müqəssir kimi hiss etdi. Dəmir əlüzyuyana yaxınlaşıb əllərini yudu, Xatun qızdırdığı xörəyi süfrəyə qoydu.

– İkimiz yeyək, – deyə Mehman anasına müraciət etdi. – Xatun əlini xörəyə uzatmadan stolun bir kənarında əyləşdi. Tutqun olsa da, Mehman isti xörəkdən böyük bir iştaha ilə yedi.

– Ana, bəs sən? – deyə Mehman anasını təkrar dəvət etdi və onun gözləri xüsusi bir iştaha ilə anası bişirən xörək üzərində gəzdi.

– Sən çörəyini ye, oğul, – deyə Xatun da oğlunu həsrətlə süzdü. Sən isti xörəyini ye!

Mehman xörəyini yeyib qurtardı. Xatun ayağa durub, maşınka üstünə qoyduğu saralmış dəmir çaynikdən isti bir çay süzdü.

– Axı, ev yiyəsi baxanda qonağın boğazından getməz?..

– Sən çayını iç, Mehman!

Mehman artıq kiridi, Xatun üçün oğluna baxmaq yeməkdən artıq idi. O, Mehmanın yorğun-düşkünlüyünü gördü, su qoyub qızdırdı, Mehmanın başını yudu, qurulayıb daradı, ağ bir dəsmalla onu bağladı. Mehman anasının bütün təkliflərinə bir uşaq kimi əməl elədi. Nəhayət, Xatun oğlu üçün yer salıb düzəltdi, Mehman soyunub, Murad kişidən qalma çarpayıda uzandı. Xatun lampanı keçirib yerinə girdi. Onların hər ikisinin fikri özünəməxsus yollarla, keçən günlərə qayıtdı. Mehman ilk məktəb illərini, həmin bu stolun başında oturub dərs hazırladığı çağları, körpəliyə məxsus şıltaqlığını xatırladı. "Niyə uşaq körpəlikdə şirin olur?.. Niyə körpəlikdə ana nəfəsi qızdırmasa, adam qıza bilmir?!"

Xatun da öz oğlunun körpəlik dəqiqələrini, evin içində hərlənib ayaqlara dolaşdığını, anasını şirin dillə çağırıb onun qıçlarına sırmandığını xatırladı. Xatun Mehmanı böyük ümidlərlə böyütdüyünü, gələcəyin şirin xəyalları ilə onu bəsləyib yetişdirdiyini gözləri qabağına bir-bir gətirdi. "Niyə bu dünyada insanların istədiklərini çarx tərsinə çevirir? Mən istəyirdim ki, Mehman böyüsün, boy atsın, mən onunla qanadlanım!.. İndi Şəhla xanım onun anası olmuşdur! Yəqin Mehman hər sözbaşı o yoğun arvada, – "ana" – deyir..."

Mehmanın uşaqlığı anasının xəyalında bütün təfərrüatı ilə canlanırdı. Budur, o, beşikdə zıqqıldayır, budur, O, yerdə sürünür, budur, o, ayağa durub yıxılır, budur, o, divardan tuta-tuta gəzir... Budur, Mehman çantasını götürüb məktəbə gedir. Budur, o, gözü gülə-gülə dərsdən qayıdır. Xatun qızğın bir ana məhəbbəti ilə onu qapı ağzında qarşılayıb boynunu qucaqlayır, yerlə sürünən çantanı oğlunun əlindən alır, onun qara qıvrım saçlarını əli ilə oxşayıb:

– Oğlum, bu gün necə oxudun, müəllim sənə nə dedi, dərslərini bəyəndimi, cavablarını xoşladımı? – deyə soruşur. Gözü çörək gəzən, iştahası tük aparan Mehman anasının suallarına tez-tələsik cavab verir, ana oğlundan razı qalır, onun boynunu qucaqlayıb o üz-bu üzündən öpür... Bütün dünyanın sərvəti anaya bağışlanmış kimi olur. Ana, Mehmanı süzüb onu oxşayır, uşağın istəyinə əməl etməkdən yorulmur... Hanı indi o ötən günlər, şirin saatlar, dəqiqələr?.. Onlar hamısı hara getmiş,

hansı soyuq külək canayatan, ılıq yaz havasını belə şaxtalı ruzigara çevirmişdir?.. Niyə bəs belə olsun?.. Xatunun burada bir təqsiri vardımı, yaxud o, əbəs yerə iztirab çəkir?.. Oğlundan bir gün belə ayrı yaşamağı təsəvvürünə gətirməyən ananı kim küsdürmüş, onun könül mülkünü kim tar-mar etmişdir?.. Mətləb dərin idi! Burada Mehmanın həyatı Şəhla xanım və onun tərbiyəsinin əsiri olan Züleyxa ilə necə bağlandığını ana öz müztərib hissləri ilə duyur, onun çarpan ürəyi döyünür, düşündükcə onun həyəcanları artır, ana fikrən düz-dünyanı dolanır, tikanlı yolları ayaqlayır, dərin kəşməkəşlər keçirir, yenə də analıq məhəbbəti ona güc gəlir, onu Mehmanla bağlayırdı: Xatun Mehmanın yuxuya getmədiyini, yerində qurcalandığını hiss edirdi:

– Niyə yatmırsan, bala? – Xatun oğlunun narahat olmasını istəmir, onun üçün heç bir pərişanlığı rəva görə bilmirdi. "Uşaq nə eləsin?.. Uşaq yaman bir tora düşübdür?!." deyə o, xəyalından nələr keçirmirdi?

– Ana, bəs sən niyə yatmırsan?

– Yuxum gəlmir, oğlum!

– Bəs sən axı yorğunsan, ana!

– Oğlum, mənim yorğunluğum dincəlməklə qurtarası deyil!

Mehman, yerə düşüb çarpayıları yanaşdırdı, yerinə girib anası ilə nəfəs-nəfəsə verdi:

– Niyə belə, ana?..

– Səbəb dərindir! – deyə ananın mehriban əli köynəyin altından Mehmanın kürəyində gəzdi.

– Öz oğluna da səbəbini açmaq olmazmı, ana?

– Oğlum bu barədə gücsüzsə?..

– Mən anamın xatiri üçün heç bir maneə qabağında dayanmaram!

– Mən bunu da istəmirəm!

– Bəs indi necə olsun, mənim mehriban, dünyalara dəyən anam?

– Özünü gözlə, oğul! Özünü, sənin yanına yığışıb gələn o xoruzpipik Şəhla xanımın baş yaran artıq tamahından gözlə! Bu hökumətin qabağında alnıaçıq dayan! Atan Murad bu şəhərin kənarındakı bez fabrikində işləyəndə, bu hökumətin yaranması yolunda öz canını əsirgəmədi. Belə olmasın ki, Murad Atamoğlan oğlunun tək bir oğlu, atası öz canını verən bir hökumətin qabağında başıaşağı, xəcalət təri içində boğulsun! Yadımdadır, Şura hökuməti qurulan illərdə, atanın ağır yaralandığı, can verən zaman onun mənə tapşırdığı sözlər. O mənim əlimdən yapışıb dedi: "Bax, Xatun, körpəni bəslə, özün də ərə getmə!.. Yekələndə Mehmana de ki, biz Şura hökumətini möhkəm əllə tutsunlar!.."

– Səni isti göz yaşları boğur, ana!

– Hə, oğlum, mən sənin aqibətindən çox qorxuram... O Zərrintac-gilə yol alan Züleyxa sənin üçün bir bəla gətirə bilər!

– Mən ayığam, ana!

– Lap ayıq-sayıq ol, oğlum! Mən qorxuram ki, onlar artıq tamah ucbatından səni batıralar. O Qaloşdan, o Murtuzdan, o Yavərdən – bütün onlardan ehtiyatlı ol! Çünki onlar səni hörümçək toru kimi bürümək istəyirlər. Prokuror deyilənin ixtiyarı böyükdür. "Artıq tamah baş yarar" sözü lap yerinə düşür, bala!

– Mən maaşımdan kənara əl atmaram, ana!

– Onlar səni ləkələyə bilərlər, oğlum! – deyə Xatun oğlunun başını qorxu içində sinəsinə tərəf çəkdi. Sanki ana öz oğlunu tamahkar və hiyləgər gözlərdən qoruyurdu.

– Oğlum, sən, canavar gözləri kimi, alışıb-yanan gözlərdən özünü gözlə!

Ana və bala həyəcanlı söhbət edir, gecə dərinlərə işləyirdi... Nəhayət, Mehmanın başı anasının taxta kimi quru sinəsinə söykəndi. Xatun Mehmanın başının çalmasını açdı, onun hələ qurumayan qıvrım saçlarını qoxuladı. Bir azdan Mehmanın mışıltılı nəfəsi Xatunun sinəsi üstündən gəldi. Xəyal, iztirab içində ananın gözlərindən daha güclü bir yaş axmağa başladı.

– Mənim körpə quzum, barı o qurd gözlər yeməsin!

## XL

Hələ düz saat səkkizdən Katibə xala respublika prokurorluğunun iclas salonunda hazırlıq görməyə başlamışdı. O, qrafinkaların suyunu təzələdir, sədrin stulunun əzilmiş örtüyünü çıxardıb, ütülənmiş örtüklə əvəz edir, qələmləri yoxlayır, qələm uclarını dəyişdirir, karandaşları qədlədirdi. Katibə xala fır-fır fırlanır, müxtəlif tapşırıqlar verirdi. Beləliklə, o, xeyli əlləşib salonu səliqəyə saldıqdan sonra öz otağına çəkildi, dəvət olunan adamlara bir daha zəng etdi. Əvvəlcə onların hal-əhvalını soruşdu, sonra deyilən vaxtda hazır olmalarını, iclasdan qabaq, ya iclasdan sonra şəxsən onu görmələrini xahiş etdi:

– Bəli, çox vacib iş var, mənə dəyməmiş getməyin!.. Bu yolla Katibə xala öz vəzifəsinin vacibliyini hər addımbaşı göstərir, katibəlikdə özünü əvəzsiz bir sima hesab edirdi. Belə idarəçilikdən Katibə xala xüsusi zövq alır, yerə-göyə sığmırdı. Bu gün Katibə xala öz rolunu ayrıca olaraq qeyd etmək, kürəkən Mehmana göstərmək istəyirdi. Bəli, belə müşavirələr

olan günlər Katibə xala özünü duru göldəki balıq kimi hiss edir, üzdükcə üzürdü. Aradabir Katibə xala boylanıb müşavirəyə baxır, gözlərini dolandırıb nəzarət edirdi.

Təşkil edilən müşavirə iki gün davam etdi. Xəstə olmağına baxmayaraq, həkimlərin məsləhətini pozan, canını dişinə tutub bu müşavirədə iştirak edən Məlikzadə, mübahisələr axıra çatan zaman əlini qaldırıb çıxış üçün söz aldı; qabağa gəlib xitabət kürsüsünə çıxdı, müzakirə edilən məsələlər barəsində ağır-ağır danışdı. Hamı onu diqqətlə dinlədi. Sözlərinin axırında o, Mehmanın hesabatı üzərində dayandı, onu tənqid etdi, bəzi məsləhətlər verdi. Sonra üzünü sıralarda əyləşən öz sabit tələbələrinə tutub:

– Lovğalıq pis şeydir, əzizlərim, – dedi, – ələlxüsus bizim anbaan inkişaf edən günlərimizdə!.. Mən bu məsələlər haqqında müşavirə fasilələrində çox düşünüb-daşındım... Hər bir nöqsanı öz vaxtında, öz məqamında göstərmək zəruridir! belə ki, nöqsanlar qol-qanad açıb şişib-şişib dözülməz üfunətə çevrilməsin... Tənqid özü ən doğru təlim, ən böyük bir ictimai tərbiyədir. Tənqid etmək, üfunət əmələ gəlməsinə yol verməmək irəliləməkdir! Yəni bax bu qədər çox azdır; kifayət deyil, o qədər, bax, o qədər gərəkdir!.. Sabahdan o qədər özü də azdır!.. Yox, lovğalanmaq, özündən xoşhal olmaq yaramaz! Yatmaq, xorhaxor yatıb gecəni-gündüzü bada vermək olmaz... Azdır, kifayət deyil, tərpən, hərəkətdə ol, çox-çox iş gör, özü də təmiz iş gör, istintaqa başladığın işi həm dərindən, həm də sürətlə apar, süründürmə!.. Belə deyilmi? – Professor Məlikzadə öz tələblərinə məsləhət verməkdən yorulmaq bilmirdi. – Bəli, yoldaşlar, bəzən acı sözlər dərmanı, şirin sözlər isə bala qatılmış bir zəhəri də andıra bilər... Mən üzr istəyirəm... Vaxt alsam da, bir qədər də danışmaq istərdim...

– Buyurun, müəllim, – deyə yerdən səs gəldi, müşavirənin sədri də etiraz etmədi, ancaq salona göz gəzdirdi.

– Hə, – deyə Məlikzadə dəxi kiçik salona nəzər salıb davam etdi. “Tələbələr” yenə də müəllimlərini dinləyirdilər. Bu hal isə içəridən professora zövq verir, xəstə olsa da, onun ürəyini hər hansı dərmandan yaxşı açırdı. Professor bu sözlərinin qiymətli olub-olmamasından artıq, həm də ona, bir sabiq müəllim kimi, ehtiram edildiyini görür, dərin yaşa dolduğu zaman, ömrünün azmı, çoxmu mənalı, bəhrəli olduğunu hiss edirdi. İndi o, zəhmətlərinin itib-batıb getmədiyini gördükdə özü də dönüb tələbələrinə minnətdar olur, saç-saqqalı ağarmış bir bağban öz məhsulunu görməklə bəxtiyar olduğu kimi, qoca da ona dikilən gözlərə

baxdıqca, xoşhal olur, yorucu görünsə belə, öz sözlərini bir tövsiyə kimi deyirdi. Qocalıqdanmı, xəstəlikdənmi ya bu münasibətlə olan ehtiyatdanmı professorun sözləri də sanki axıb gəlirdi: – Yarımçılıq özü, bilməzlikdən də böyük faciədir... Mən görürəm ki, bizim bəzi gənc hüquqşünaslarımız "işim başdan aşır", – deyib bax, burada qatladığı kitabları, hələ də o yerlərdə açmayıblar... Mən bunların biri ilə söhbət etdim, o, mənə "məktub yazmağa da vaxt yoxdur" dedi. – Mehman utanıb başını aşağı saldı. Məlikzadə birdən dəyişib əsəbilik içində, ciddi bir müəllim tələbkarlığı ilə sözlərinə davam etdi. – Dövlət işi əsaslı bilik, dolğun baş tələb edir!.. Bəli, xalq işi dolğun bilik, dolğun baş, dolğun ağıl tələb edir!.. Başı nə ilə doldurmaq olar? Mən deyirəm ki, kitab ilə!.. – Professor getdikcə əsəbiləşdi. O, əlini artıq qaldırıb kiçik salon üzrə uzatdı. – Kitabsız hər hansı adam olsa, başıboş qala bilər!.. Hər şeydən də xətalı, boş, ağılsız başın çıxardığı yersiz hökmdür!.. Belədir, mənim əzizlərim! Siz bağışlayın, mənim övladlarım! Siz gənc prokurorlar bəzək-düzəksiz də olsa, mənim sözümü dinləyin! Hər adam hər gün qarnına yediyi kimi, – professor hərarət içində güldü, – bəli, qarnına yediyi kimi, hər gün də başına qida verməlidir! Yeyib, yeyib, qarnını şişirtmək – başı doldurmaq deyil, əsla! Qarın şişəndə nə yeyim, deyə baş yaddan çıxa bilər?.. Boş baş iri gövdə üzərində olsa belə çürük qozdur...

Professor salonda əyləşən enli toqqa içində piyi itən Əbdülqədirə nəzər salaraq davam etdi:

– Bəs başın qidası? Ağıllı kitablar, böyük başların yaradıb bizə qoyduğu elm və hünər dastanlarıdır! Kitab bəşəriyyət dühasının, ümumən insan dimaq və zəkasının ölməz mənəvi sərvətidir. Uzun əsrlərin çovğunlu, fırtınalı, bəlkə də zəlzələli günlərini keçib bizə gələn nədir? Ölməz sənətin şah əsərləri, ölməz elmin məna dolu kitabları! Oxuyun kitabları, sevin kitabları, uşaqlar!.. – Professor sözünü qurtarıb, bir müqəssir kimi, ağsaçlı başını salon qarşısında əydi. Bütün salon bənizi saralmış, xəstə yatağından qalxmış qoca professoru hörmətlə alqışladı.

– Üzr istəyirəm, uşaqlar, – deyə o öz əyridəstə çəliyindən yapışa-yapışa xitabət kürsüsündən düşdü, yaşarmış gözlərini xəlvətə salıb sildi.

Respublika prokuroru onu öz yanına dəvət etdi, Məlikzadə başı ilə təşəkkür edib titrəmiş halda salondan çıxdı.

– Qoca son vəsiyyətini elədi, – deyə toqqasını piy basmış Əbdülqədir yan tərəfə deyindi və: – Bəli, vəsiyyət yüngüllükdür! – deyə o astanadan döşü ata-ata, yanar bir köz kimi, gözünün içinə qədər qızar-qızara güldü...

## XLI

Respublika prokuroru öz müavinləri ilə birlikdə bir sıra rayon prokurorlarını ayrı-ayrılıqda qəbul etdi. Növbə çatanda Mehman da içəri girib salam verdi.

Ortayaşlı, ortaboylu, qısa, qarabığlı respublika prokuroru Mehmana yer göstərdi. – Mehman yumşaq kresloda oturdu.

Respublika prokuroru:

– Tənqiddən qorxmaq lazım deyil, – deyə sözə başladı. – Sizin işlərdən o qədər də razı deyilik... Bilirsiniz, hələ kəsirləriniz çoxdur!.. Mən də bu mənada Məlikzadənin sözlərinə, qeydlərinə qüvvət verdim!.. Uzun da olsa, əsəbi də olsa, xəstə də olsa, qoca düz danışırdı. Bir az hirsli və dəymədüşər qocadır, ancaq vicdanı gün kimi təmizdir, – deyə respublika prokuroru şüşənin altında telefon siyahısına baxdı. Sonra əlini düyməyə basdı. Katibə xala ayaqlarının ucunda gəldi və əlindəki papirosunu yanında gizlətməyə səy etdi:

– Məlikzadənin ev nömrəsi? – deyə respublika prokuroru xəbər aldı. Bu şəhərdə yüzdən yuxarı telefon nömrəsini əzbərdən bilən Katibə xala heç bir çətinlik çəkmədən Məlikzadənin evinin telefon nömrəsini dedi. Respublika prokuroru özü Məlikzadənin evinə zəng edib:

– Professor necədir? – deyə soruşdu. – Halı nə təhərdir qocanın?

Məlikzadənin arvadı Zivər xanım həyəcanlı səslə:

– Halı çox pərişandır, – dedi. – Qayıdandan sonra qızdırması qırxa qalxıbdır!

– Bəs müalicəsi? Bəs kim aparır? Hansı həkim?..

– Həkimlər gəlmişdi... Huşu bir qədər qarışıqdır...

Respublika prokuroru professorun arvadı Zivər xanıma dil-ağız edib hər cür tibbi yardım təşkil edəcəyini vəd etdi; o, telefon dəstəyini qaytarıb yavaşca yerinə qoydu, əlini stolun bərabərinə tutub:

– Lap kiçik vaxtımdan, – deyə prokuror ehtiramla qeyd etdi, – mənə beş il dərs deyibdir! Adi müəllimlikdən belə professorluq dərəcəsinə qalxıbdır! Özü də o, danışdığı kimi də etmişdir. Şəxsi həyatında təmiz və vicdanlı olmuş!.. Bakı kapitalistlərinə qarşı mübarizə aparmış, o vaxtın mütərəqqi qəzetlərində fəhlələrin hüququnu müdafiə etmiş, bizim inqilaba sədaqət göstərmiş... Ədliyyə işçilərinin hazırlanmasında, tərbiyəsində qüvvəsini əsirgəməmiş... Bir uşaq sadəlövhlüyü ilə ürəyini gizləmədən öz nöqsan və kəsirlərinə də göz yummamış...

Respublika prokurorunun müavinlərindən, toqqasını piy örtmüş, qırxıq başı yağ bağlamış Əbdülqədir:

– Çox yamanca boşboğazlığı var, – dedi – bu Məlikzadənin!

Respublika prokuroru cavab vermədi, ancaq Mehman öz yerindən Əbdülqədirə nəzər salıb:

– Əsla! – dedi, – müqəddəs qocadır!.. Özünü işdən əsirgəməyən, səhhətini belə işə fəda edəndir!

Respublika prokuroru öz müavini, boynu piy bağlamış Əbdülqədirə bir nəzər salıb:

– Ağsaqqal alimdir, – dedi.

– Saqqalına nə söz, biz dilini deyirik bu qocanın! – Əbdülqədir deyintili cavab verdi.

– Görünür ki, sizə bu xəşəl qarın barəsində bir az toxunubdur! – deyə respublika prokuroru şişman vücudlu Əbdülqədirə kinayəli söz atdı, iki gün qabaq, bu adamın əli təmiz olmaması barəsində xüsusi şöbəyə daxil olan məktubu xatırladı. – Bəli, keçək mətləbə, – deyib işi dayandırmadan üzünü Mehmana tutdu.

– Mənim, yoldaş respublika prokuroru, – deyə Mehman papkasını açmağa başladı. – İkicə məsəlim var, biri müstəntiq Murtuzovun məsələsidir. Mən o müstəntiqə ardıcıl olaraq istintaq işi etibar edə bilmirəm. Doğrudur, iş tapşırmağa məcbur oluram, ancaq axıra qədər nəzər salmadan, etibar edə bilmirəm. Belə şübhə ilə də onunla işləmək mümkün olmayacaq, əlimizdə olan sənədlər göstərir ki, o, bizim qanunu az təhrif etməyibdir!..

– Bəs təklifiniz?

– Təklifim budur, əlimizdə möhkəm əsas var, onu hüquq işlərindən birdəfəlik kənar etmək lazım gəlir!

Şişman Əbdülqədir stola yayılıb seyrək qaşlarını çatdı:

– Mən keçən dəfə oraya yoxlamaya getmişdim, təcrübəli, işgüzar bir silistçidir!

– Ancaq təmiz adam deyil! Baxanda müstəntiqdən çox, qanlı kababa müştaq olan bir qəssaba oxşayır! – Mehman bu sözləri çox israrla dedi. Əbdülqədirin sallaq sifəti ağardı, onun gözləri qabağında Murtuz Murtuzovun qucağını dolduran bir cüt yağ-bal bəstisi dikəlib durdu.

– Yox, elə deyil! – deyə Əbdülqədir də, dostu Kamilov kimi, cavab verib qulluqbaz Murtuzu müdafiəyə qalxmışdı.

– Lap elədir! – Mehman, Kamilovla qarşılaşır kimi, bir az da dikəldi. Əbdülqədir işi haçalaşdırmamaq üçün yumşaqlığa gedib:

– Yoldaş Mehman, – deyə Kamilova bənzər nəsihətamiz bir sifət aldı. – Bu müşavirədə kadr məsələsi haqqında sizinlə çox danışdıq! Yoldaş respublika prokuroru şəxsən özü də ətraflı göstərdi, mən bu mənada deyirəm ki, Murtuz Murtuzov yoldaşı saxlamaq, tərbiyə etmək mümkündür!

– Həmişə çürüyü kəsib safı saxlamaq gərəkdir! – Mehman cavab verdi. – Yoxsa bütün orqanizm üçün təhlükə doğura bilər!

Şişman vücudlu, boynu qat-qat olan Əbdülqədir başını bulayıb:

– Məlikzadənin dəftərinizə yazdırtdığı bu formal sözlər, – deyə, o stulda eşələndi, – görünür, siz cavan uşaqlar üçün çox əzbər olubdur!

Respublika prokuroru Əbdülqədirə təkrar acıqlanıb:

– Xəstə Məlikzadəni bir daha bura qarışdırmayın! – dedi.

– Görürsünüz də, – deyə Əbdülqədir ətli əlini qaldırıb Mehmana tərəf yellədi. – Bu, bizə boşboğaz Məlikzadənin yazdırtdığı sözlərdən dərs demək istəyir!

Əbdülqədir:

– Lap Məlikzadənin sözüdür! – dedi.

– Əbdülqədir! – deyə respublika prokuroru zəhmli gözlərini ağartdı. – Siz özünüzü ələ almağı bacarın!..

Əbdülqədir əlini piyli başında gəzdirib fısıldadı.

Mehman, Murtuzovun barəsində təklifinin üstündə dayandı.

Respublika prokuroru Mehmana:

– Mən sizə etibar edirəm, – dedi, – siz həm də Məlikzadənin yaxşı bir tələbəsi olduğunuza görə mən sizə daha artıq arxayın oluram!

– Bəs Murtuzov barəsində konkret nə etmək? – deyə Mehman bir daha aydınlıq üçün sözünü çevirir.

– Əlinizdə maddi dəlil olduğu zamandan istintaqa buraxmayın, mənə teleqram vurun, nəticədə ölçü götürərsiniz!

Şişman Əbdülqədir indi də bütün vücudu ilə şişib, şişib birdən açılışdı.

– Mən qəti etiraz edirəm, – dedi. – Dövlət yolunda ömür-gününü verən, xidmətlər göstərib yerli ispalkomun hörmətini qazanan, təcrübəli bir müstəntiqin taleyinə belə barmaqarası baxmaq ədalətdən kənar bir iş olardı. – Bu təkliflə Əbdülqədir hərdən Bakıya gələrkən, ona hədsiz qulluq göstərən, bir məhrəm adam kimi ev-eşiyinin hər künc-bucağına bələd olan, xörək yeyilən zaman Əbdülqədirin özü kimi piylənmiş zər xələtli arvadı Gülbuta xanımla cınaq çəkişən, özü də qəsdən zər xələtli xanıma uduzan, dərhal şərtə əməl edib ona bahalı paltarlıq alıb gətirən Murtuzovu müdafiə edir, kələfin çözələnib açılmasından qorxurdu. Elə neçə gün bundan qabaq da rəsmən respublika prokurorluğunun xüsusi şöbəsinə

daxil olan sənəddə bu barədə danışılmırdımı?.. Bu sənəd qoşa bəstiləri və cınaq çəkişmələrini eynən, yerli-yataqlı göstərmirdimi?.. Əbdülqədir, nə qədər gizlətməyə, işin üstünü öyrətməyə çalışsa da, artıq xoruzun quyruğu görünürdü!.. Respublika prokuroru da sanki müavinini bu sübutlu sənədə tərəf çəkirdi. Əbdülqədir bir an içində rəng verib rəng alırdı:

– Bu birinci dəfə deyildir, – deyə respublika prokuroru şəhadət barmağını stolun bir kənarına çırpırdı. – Siz belə işlərdə az xəbərdar edilməmişsiniz, Əbdülqədir!

– Mənim də öz fikrim ola bilər, – deyə Əbdülqədir əlini yağlı başında gəzdirdi. Mehman bu piylənmiş kəlləyə baxdı. Bu başla o baş, bu Əbdülqədirlə o Murtuz nə qədər gövdəcə olmasa da, sifətcə, sur-suyumca bir-birinə oxşayırdı.

– Çürük fikirlərə biz haqq verə bilmərik, – deyə respublika prokuroru Əbdülqədirin üstünə təkrarən acıqlandı. – Mən sizi qanun sorğu-suala çağıracağam, Əbdülqədir!

Onlar bozarışdı, başqa müavinlər respublika prokurorunun sözlərinə qüvvət verməklə, Əbdülqədirin üstünə düşdülər. İndi daha Əbdülqədirin yağlı başı kimi sifəti də şişib qızarır, sanki köz kimi alışıb yanırdı. Belə olduqda Əbdülqədir alovlanmış ayağa qalxdı, kabineti tərk etdi.

– Deyirəm axı, balıq bu yağlı başdan necə pis iylənir?! – deyə respublika prokuroru hamının eşidəcəyi bir səslə qeyd etdi. – Məşğul olarıq! Mövqeyinə, bəzi-para gopbaz “xidmət”lərinə baxmadan yaramazı ifşa etmək – inqilabi qanunçuluğun müqəddəsliyini göz bəbəyi kimi qorumaq deməkdir!..

Mehman yazdığı təliqəsini və ona əlavə olunmuş çıxarışları respublika prokurorunun qabağına qoydu.

– İkinci məsələm də icraiyyə komitəsinin sədri Kamilov barədədir!..

Respublika prokuroru yanındakı meşin cildi açıb, Kamilovun vurduğu teleqramı götürdü, təkrar nəzərdən keçirib yerinə qoydu. Sonra Mehmanın təqdim etdiyi sənədləri diqqətlə oxuyub öz müavinlərinə də göstərdi:

– Məncə bu qərarlarda çox böyük qanunsuzluq var!

– Onda bu barədə Mərkəzi Komitəyə, Komissarlar Sovetinə və Ali Sovetə xüsusi məktub yazmaq, bu çıxarışların da surətlərini rəbt etmək lazımdır!

Mehman:

– Daha mənim başqa məsələm yoxdur, – deyə öz bloknotunu qatlayıb, papkasının arasına qoydu və: – Klub səhnəsinə çıxan bir qadına qəsd edilmişdir – deyə əlavə etdi.

– Bəli, məlumatlarınızı almışam, oxumuşam, xüsusi nəzarət altındadır!..

– Bəli, yoldaş respublika prokuroru! Görünür ki, bu cinayət tamamən qadın azadlığına qarşı çevrilmişdir!

– İstintaq qurtarar, – deyə respublika prokuroru ayağa qalxdı, – ali məhkəmənin səyyar heyəti gələr, xalq içində məhkəmə qurular, qatil üstündə göstəriş məhkəməsi olar!

– Murtuzov kimisi malalamaq istəsə, – deyə müavinlərdən biri Mehmanın kəskinliyini təqdir edər kimi əlavə etdi, – eləsini də inqilabi qanunun bütün ciddiyyəti ilə cəzalandırmaq gərəkdir!

– Bəli, biz öz sıramızda baş verən, yaxud baş verə biləcək hər hansı çürüklük əlamətlərinə qarşı bir cərrah kimi hərəkət etməliyik! – deyə respublika prokuroru Əbdülqədirin kölgəsini görər kimi qəzəbləndi, – rüşvətxorlara heç bir aman olmamalıdır!

– Bəli, elədir! – Mehman da respublika prokuroruna səs verdi.

– Ancaq sayıqlıq! Sıralarımızda inqilabi sayıqlıq bizə günəş, su, hava qədər gərəkdir! – Respublika prokuroru müşavirədəki çıxışının yekunu kimi danışırdı. – Bəli, ağzı açıqlıq yox, düşmənə, qatilə, cinayətkara, rüşvətxora qarşı rəhmdillik yox, qılınc kimi kəskinlik!.. Bizim vəzifəmiz oraq-çəkic nişanlı bu al bayrağın müqəddəsliyini qorumaqdır!.. Hər hansı ucqar bir kolxozda, ya bir kooperativ dükanında olsun, fərqi yoxdur: pozğunluğa yol verməк olmaz!.. Bunun üçün də ədliyyə işçisinin, hüquq işçisinin özünün vicdan təmizliyi birinci şərtlərdən birincisidir! Bəli, vicdanı ləkəli bir ədliyyə, ya hüquq işçisi, bizim qanunun müqəddəsliyindən, hansı bir sifət, yaxud hansı daxili bir cürətlə danışa bilər?!.

– Heç bir cürətlə!.. – Mehman həyəcanla dilləndi...

– Sənin Murtuzovun, ya bizim bu boynu qat-qat Əbdülqədirimiz qarğa kimi, qara ləkələrə bulandıqları halda, hansı sabun onların ləkələrini təmizləyə bilər?.. Paltar ləkəsini təmizləmək mümkün olduğu halda, ürək ləkəsini təmizləmək mahal işdir. – Respublika prokuroru üzünü müavinlərinə tutdu. – Belə bir üfunətli Əbdülqədiri neçə qəlib sabun təmizlər?..

– İstintaq etmək, sübut etmək, müqəssiri müttəhim kürsüsünə oturtmaq! – deyə Mehman sıxılıb çəkinməyi unudaraq, Murtuzovu görür kimi hökm oxuyurdu. – Mən də ayrı yol görmürəm, yoldaş respublika prokuroru!

– Bax, belə, dönmədən, sapmadan, ictimai əmlak və xalq əmniyyəti naminə mübarizə! – Respublika prokuroru əlini uzadıb Mehmanın əlin-

dən tutdu. – Özünün təmizliyi ilə yanaşı, yan-yörənin təmizliyi, ailənin, ətrafın təmizliyi!

Mehman qara, qıvrımsaçlı başını, özündən böyük prokurorun qabağında, bir ehtiram əlaməti olaraq əydi, sonra buradan çıxıb xəstə professorun yanına getdi, onunla görüşdü. Bu dəfə yüksək hərarət içində olan alim dil-dodağını yalayır, sanki mənalı baxışlarıyla Mehmana axırıncı vəsiyyətini edirdi. Mehman dərin bir kədər içində, Zivər xanım və xəstənin yastığının dibini kəsib, öz göz yaşlarını axıdan Dilguşa ilə görüşüb evlərinə yollandı.

– Bu ağsaçlı professorun axırıncı əlvida baxışları olmasınmı?..

## XLII

İstirahət günü olduğundan Xatun işə çıxmamışdı. O, Mehmanın rayona qayıdacağını bilib bikefləmişdi:

– Olmazmı, oğul, bu gün də qalasan? – deyə Xatun oğluna müraciət etdi. – Bircə gün də!..

– Olmuya ürəyin kövrəldi, ana? – Mehman anasına mehribançılıqla nəzər saldı.

Həqiqətən Xatun bu neçə gün ərzində yenə də oğluna isinmişdi. O, indi Mehmanı öz gözündən bir kənara qoymaq, daha doğrusu, Şəhla xanımın yanına buraxmaq istəmirdi. Nə isə, Xatunun ürəyinə daman şübhə fikirləşdikcə çoxalır və artırdı. O, oğlunu Şəhla xanımın ixtiyarına vermək istəmirdi. Onun ürəyi Şəhla xanıma qızmırdı. Əgər Mehman gedərsə, Şəhla xanımın artıq tamahı ucundan bir tələyə düşərsə, Mehmanın başına bir qəzavü-qədər gələrsə, onda Xatun öz oğlunun belə bir fəlakətinə necə dözə bilər? Xatunun iztirabı getdikcə artırdı. Mehman özü də bunu hiss edirdi.

– İstəyirsən, gedək! – Mehman bir uşaq kimi öz qolunu anasının boynuna doladı, – ikimiz birlikdə gedək, anacan!

– Getmək barədə heç bir söz ola bilməz! – deyə Xatun kədərli bir nəzərlə cavab verdi, – mən nə qədər qaynasam da, əsla Şəhla xanımla qovuşa bilmərəm!

– Nə üçün, ana?

– Çünki oğul, bizim xəmirimiz ayrı-ayrıdır!

Mehman bir daha dərin fikrə getdi: “Xəmirimiz ayrı-ayrıdır!..” Doğrudan da, Mehman özü də Şəhla xanımla bağlı bir ailədə vəziyyətin nə dərəcədə mürəkkəb olacağını artıq yəqin etməyə başlamışdı. Şəhla

xanım öz ikiüzlü hərəkətlərindən, “qızıl saatı mən özüm gətirmişəm” – deyə əsli olmayan sözlərindən əl çəkməyəcək, Züleyxa da öz anasından qopmayacaqdı. Mehman, dərinə getdikcə mühəndis qız Dilguşa Məlikzadə onun gözləri qabağında dolanır, özünün təvazökar hərəkətləri, mülayim rəftarı, ictimai faydalı işgüzarlığı ilə Mehmanın ürəyinə yapışırdı. Ötəri hissdən fərqli olaraq, sınaqdan çıxmış bir məhəbbət, ağıl-şüurla qurulan bir ailə nə qədər də xoşbəxtdir!.. Uyğunluq, bir-birinə ehtiram, mütəqabil əməkdaşlıq, ictimai işlərdə bərabər çalışıb, bərabər mühakimə etmək nə qədər də ürəkaçan, nə qədər bərabər bir əmniyyət doğurandır... Bir zərrəcə də olsa yalan, getdikcə böyüyüb arta biləcək bir peşəkar yalançılıq – bax nə dərəcədə bir dəhşətli uçurum əmələ gətirir!..

Xatun oğlunun yolu üçün yır-yığış edir, Mehman anasının açıq-açığına deyilən, “xəmir” sözündən sonra məsuliyyət hissi ilə düşünür, mühakimə edirdi. İndi nə etmək?.. Ayrılığa getməkmi?.. Bir övlad olarsa, bəs onun gələcək tərbiyəsi və taleyi?.. Bəs necə olsun?.. Belə bir körpə xilqət üçün, oğlan olsun, ya qız, nə cür münasibət bəsləmək?.. Hələ bir halda ki, övlad məhəbbəti meydana gəlmiş ola?.. Onun səadəti uçarsa, o, birtərəfli yetişib boy atarsa, ata üzü görməzsə, uşaqlar ona işarə edib töhmətləndirici atmacalar atarsa, bu sıxılan məsum günahsız olduğu halda, bəs günahkar kimdir? – Mehman nə qədər qızğın bir ürəklə ictimai dövlət işləri ilə yaşasa da, indi onun qarşısında belə bir mühüm sual çıxırdı... Bəs Şəhla xanımı nə yolla cilovlamaq? Züleyxa təbiət və fitrəti etibarilə mamasının balası olaraq qalarsa, bəs necə etmək?.. Çarə nədir? Bu özünü göstərən yaranı müalicə etmək mümkün olmasa, bu bir çürüntü, bir kəsafət verməzmi?.. Nə qədər üstüörtülü olsa belə gündə-gündə içəridən çürüyən bu yara, bu ailənin havasını pozmazmı? Getdikcə həyat özü də, Mehmanın qarşısına ciddi təzadlarla çıxırdı... Demək kəsərli olub, inqilabi qanun gücü ilə qanunsuzluğu kəsmək üçün ləkəsiz bir vicdan, daxili bir təmizlik gərəkdir!.. Çoxmərtəbəli, möhtəşəm binalar, möhkəm bir təməl üstündə durduğu kimi, inqilabi qanunun keşiyində dayanan bir adam da öz ləkəsiz vicdanı ilə yüksəlməli, günəş kimi parıldamalıdır! Özü rüşvətə gedən bir hüquq işçisi, oğru və rüşvətxorlara qarşı hansı bir daxili cəsarətlə mübarizə apara bilər?.. Oğru bir vicdan hansı bir əsasla doğruluqdan dəm vura bilər?.. Bu saxtakarlıq öz dilini öz ürəyinə təcavüz edən bir cihaza çevirmək demək olmazmı?.. Ürəklə dil arasında baş qaldıran ixtilaf, bir tufanlı üsyana çevrilməzmi? Yox, ləkəli bir ürək əsla düzgün ahəngiylə vura bilməz! Belə bir adam əgər öz vicdan zərrələrini tamam-kamal qeyb etməyibsə, heç bir zaman öz yorğanı al-

tında belə rahat yata bilməz. Onun yuxusuna haram qatılar, bu yuxu özü qara nağıllar, eybəcərlik və sıxıntılarla dolar. Yox, çətindir, çox çətindir! – deyə Mehman durub balaca evinin içində gəzindi.

– Deyəsən, oğul, mənim sözüm səni çox bərk tutdu, hə? – deyə oğlunun yolu üçün yuyulmuş göy-göyərti təmizləyən Xatun gəlib oğlunun qabağında dayandı.

– Tutaq ki, belədir, təzədən necə olsun, ana?

– "Yüz ölç, bir biç" deyiblər, oğlum!

– Tutaq ki, bir səhv etmişəm, bəs necə olsun?

– Bu barədə mən acizəm, bala!

– Bəs belə bir halda kimdən məsləhət almaq?

Xatun sağ əlinin şəhadət barmağını Mehmanın sol döşü üzərinə uzatdı:

– Ürəyin nə deyirsə?..

– O, çıxış üçün çırpınırsa, bir yol tutmaq, bir məsləhət almaq istəyirsə?

– Burada, oğlum, məsələ çox çətin, çox yaman çətindir!

– Kim adama öz anasından yaxın ola bilər?

– Heç kim!

– Bəs indi necə olsun?.. Mən də gedirəm! Orada heç bir şey dörd divar arasında bir sirr halında qala bilməz!

– Hər necə divar arasında olsa, zəhəri udmaq olmaz, oğlum!

– Bəs udulmuş zəhər?

– Ürəyi çürüdər!

– Sən amansız danışırsan, ana.

Xatun gözlərini qaldırıb oğlunun gözləri içinə dik baxdı:

– Mən dil açandan düz danışmışam, oğul! Sənin atan Muradla biz bir parça çörəyə möhtac olmuşuq, yaman ruzigarda səndən böyük iki bacını, bir qardaşını itirmişik, heç bir zaman mənim fikrimə belə namussuzluq, dilimə yalan gəlməyibdir!

– Mən də sənin oğlunam, ana!

– Sən mənim sonuncu körpəmsən, – deyə Xatun Mehmanın boynunu əyib onun alnından öpdü, dolan gözlərini sildi. – Sən oda düşmüsən, oda!

– Beləcə gizlicə yanmaqmı, ana?

– Yansan da, ləkəsiz yan, oğul!

"Anam bu gün müddəi-ümumi kimi ittihama keçibdir", – deyə həyəcanları artan Mehman susdu. – "Bəs necə olsun?" – Danışdıqca Mehmanın şübhələri artırdı. "O qızıl saatı Şəhla xanım gətiribmi?.. Ya burada bir qurğu vardır?" – Mehman dönüb öz yeri üstündə uzandı. – "Bəli, həyat ən gərgin mübarizədir!" – deyə Mehman düşünməyə başladı. – "Ən

mürəkkəbi, ən çətin daxili mübarizədir!.. Çünki burada heç kəs üzbəüz durmayıbdır, bir yerə qovuşubdur!..” – Mehman qara qıvrım saçlarını barmaqlarına dolayıb çəkişdirdi. Bir az sonra Xatun xırda bağlamanı gətirib ortadakı balaca stolun üstünə qoydu.

– Yolda açarsan, bala!

– Nə lazım idi, ana? – deyə Mehman səksənən kimi oldu. – Nə zəhmət idi?..

– Yolda açarsan, bir parça rahat çörək yeyərsən!

– Bəs orada?..

– Od içinə düşsən də, ləkəsiz ol! – deyə Xatun həm cürət, həm də daxili bir analıq həyəcanı ilə cavab verib əlacsız kimi boynunu bükdü. Mehman qol saatına baxıb:

– Vaxtdır, yarımca saat qalıbdır, – dedi.

Xatın pəncərədən bayıra nəzər salıb:

– Gün çoxdan əyilibdir! – dedi.

Mehman ayağa qalxdı.

– Mən gedim, ana?

– Yaxşı, gedərsən! – deyə Xatun da oğlu ilə evdən çıxıb qapını qıfılladı.

– Tək qayıtmaq sənə çətin olar, ana!

– Yox, olmaz!

– Onda bəlkə, ana, rayona birlikdə gedək?

– Mənim fabrikdə işim vardır, Mehman!

– Mən Dilguşa xanıma yazaram, o, qaydaya salar!

– Dilguşa xanım? Hansı?

– Mühəndis qız, mənim professorumun qızı!

– Bəs sənin gözlərin harada idi, oğlum? – deyə Xatun təəssüf dolu iniltili bir səslə soruşdu. – Bu bir cüt gözün!..

Mehman dinmədi və başını aşağı saldı.

– O sənə işdən azad olmaq barədə ixtiyar verər!

– Bəs mən özüm necə? Rəhmətlik Murad deyərdi, minnətsiz çörək baldan şirin olar!

Mehman, həqiqətən anasının onunla bərabər getməyinə, evdə göz və həyan olmağına böyük ehtiyac hiss edirdi.

– Mən sözümü demişəm, oğul!

– Sən inad edirsən, ana! Bir salım duz üstündə acıq edirsən! Bir sıxma duz üstündə!

– Bəs gərək o sıxma duz bir duz dağına çevriləydi?

Mehman anasının bu barədəki qətiliyini, onun ulduzunun o ana-bala ilə barışmayacağını gördü. Mehman nə qədər möhkəm olsa da, bax, bu nöqtədə acizlik çəkdiyini duydu. Bəli, bu maneəni adlamaq daha çətindir!

– Gedək, oğlum, qatar tərpənər!

– Gedək, ana!

Onlar evdən çıxıb, tramvaya oturub danışmadan, dinmədən vağzala gəldilər. Xatun oğlu ilə olan ilk səfərlərini xatırladı. Şəhla xanımın durduğu yerə baxıb hiddətləndi. "Lap dünya dəlləyinin birisidir, Züleyxadan da artıq, bu yetimi tovlayan da, bax, bu lotu Şəhla oldu!.."

Mehman anasının, Bakı küləyi altında qıvrılıb-açılan ağ saçlarından öpüb vaqona qalxdı. Bir azdan qatar hərəkət etdi. Mehman pəncərədən başını çıxartdı. Qatarı yola salan hər bir kəs əlini qaldırıb yelləyirdi. Xatun isə əlini qaldırmadan göz yaşlarını aramla axıdır, oğlunun gələcəyini düşünür, onun yellənən əlinə baxırdı... Mehman gözdən uzaqlaşınca ana külək altında yellənən öz qara yaylığının ucunu gözlərinə gətirib, heç kəs bilmədən için-için hıçqırdı, dönüb izdiham içindən ötdü, daş pilləkənlərlə aşağı düşdü...

## XLIII

İkinci günü Mehman rayon mərkəzinə çatdı. Qaloşlu adam əl-ayağa düşdü. Murtuzov eşidən kimi arvadı Yavəri də götürüb Mehmanın görüşünə gəldi. Mehmanın başdansovdu sözündən, soyuq söhbətindən sonra onlar dağılışıb getdilər. Şəhla xanım balaca çamadanı açıb onun içini yoxladı. Burada yalnız bir ətir şüşəsi var idi. Bunu da yəqin ki, yol üçün almış, unutduğundanmı, ya nədənmi, başını açıb tərpətməmişdi. Bu tək şüşə sanki bir gülləyə çevrilib, Şəhla xanımın ürəyindən keçdi:

– Həri, əl üçün yarar, – deyə Şəhla xanım pərtliyindən qızardı. – Bu miqrof-zad üçün, bəd olmaz!..

– Barı qayıdan baş xalamı görəydin, – deyə saralmağa başlayan Züleyxa dəxi dilləndi. – Onu görsəydin!..

– Mən onu hər gün görürdüm, – deyə Mehman deyintili bir səslə Züleyxaya cavab verdi. – Özü də neçə dəfə istəsən!..

– Heç inanmıram ki, xalam bizə pay göndərməsin?..

– Pay almayan Katibə xala, hansı əsasa görə bacısı qızına pay göndərməli olacaqdı?

– Bizlərdə elə ürək yoxdur ki, oğul evinə gələ, ana öz gəlininə pay göndərməyə, – deyə Şəhla xanım özünü qabağa verib buradan oraya Xatunun kölgəsini qılıncladı, Mehmanın soyuq sifətini anası Xatunun

bu səfərki öyrətməsində gördü. – Bir cür sosur analar da olur ki, oğul böyüdüb evli olanda, gözü iynəulduzu kimi daralır...

Mehman bu sözlərə cavab vermədən divan üstündə uzanıb bir az dincəldi, sonra durub idarəyə getdi. Milis rəisi Cabirov prokurorun qayıtdığını eşidib zəng etdi, durub toqqasını çəkə-çəkə gəldi. Gör-görüşdən sonra o, Zərrintac Sərrafzadənin bağça işlərindən israfçılığından məlumat verib:

– Çox işlər açılır, yoldaş prokuror, – deyə Cabirov yanıxdı. – Ancaq iş bir qədər bərkə düşür...

– Bizim qanun qabağında nə bərki ola bilər? – Mehman cavab verdi. – Dərindən yoxlayıb ətraflı istintaq etmək, müqəssir olarsa, məsuliyyətə cəlb etmək!

– Sözüm istintaqın bərkində-boşunda deyil, – deyə milis rəisi əyləşdiyi stulu bir az da irəliyə çəkdi. – Sözüm o bərkdədir ki, Zərrintac toy eləyib, ikicə gün qabaq yoldaş Kamilova ərə gedibdir!

– Bəs Kamilovun öz ailəsi?

– Deyir çoxdan aralanıblarmış!

– Bəs uşaqları?

– Deyir oğlu evlənib, iki qızı da ərə gedib, arvadı da neçə il qabaq xırda qızının yanında ölübdür!

– Bu ki olmadı...

– Bəli, bunlarda belədir! Külfət yığcam olmayan yerdə nə desən baş verər.

– Orası elədir! – Mehman öskürüb boğazını arıtladı. – Bəlkə Kamilov Zərrintacın cinayətkar hərəkətlərindən bixəbərdir?

– Necə? – deyə milis rəisi gözlərini geniş açdı. – Lap özünün köhnə aşnasıdır, onu da, qardaşını da o bura gətirib işə qoyubdur! Qardaşını katib götürüb, bacısını bağçaya keçiribdir. Bəs gecə-gündüz Kamilov orada yeyib-içib buğlananda bilmirdimi ki, bağça müdirəsinin maaşı neçə manatdır?

– Deməli, sizcə sədr arvadı üçün qanun yazılmayıbdır, hə?

– Belə çıxır, yoldaş prokuror! Heç də yaxşı olmadı, ərini iş başında qoyub, arvadını dustaqxanaya qatasan?!

– Həqiqəti aramaq gərəkdir, naçalnik!

– Bəli, ancaq həqiqət, – deyə milis rəisi cavab verdi. – Düzü, nəfəs təngişir, yoldaş prokuror!..

– Döşlü olmaq üçün işin içərisinə girmək gərək! Cinayətkar hansı cildə girmiş olsa, o cildi cırmaq gərək!..

Milis rəisi iri ayaqlı çəkmələrini döşəməyə vura-vura:

– Çox çətin olacaqdır, – deyib çiyinlərini çatdı. – O qalın, özü də yekə cildi qırmaq çox çətin olacaqdır!..

– Bəlkə bu yaxın günlərdə iş asanlaşdı, cild cırıldı, onda bəs necə?..

Milis rəisi yerindən qalxıb qulağını Mehmanın ağzına tutdu:

– Mən ölüm, necə, yoldaş prokuror?.. Pıç-pıç da olsa, yavaş-yavaş bir az!.. Bu zorakı adamın qanunsuz hərəkəti mənim də canımı lap xirtdəyimə yığıbdır!

Mehman acı-acı gülümsəyib:

– Pıçıltı pis şeydir, – dedi, – yoldaş naçalnik!.. Salamatov barədə bizə nə oldu?.. Vaxt çatanda qanun yolunda gur səslə danışmaq, müqəssiri ifşa etməklə, hamıya gur səslə göstərmək gərəkdir!..

– Ay pir olmuş, sən lap hər şeyi qanuna salırsan ki, – deyə rəis Mehmanı süzüb başını buladı. – Əşi, on beş ildir cəhənnəmə kötük yumalayıram, məndən də sirr saxlayırsan? – Cabirov rəncidə olub qaş-qabağını tökdü. – Düzü, mən təzə-təzə xəbər maraqlısıyam, yoldaş prokuror!

– Dövlət işi həm də sirr istəyir, naçalnik!

– Yoldaş prokuror, acığınız tutsa da, ağır adamsınız, – deyə milis rəisi gileyləndi. – Vallah, ağır!.. Əşi, məndən, Cabirdən, daşyonan oğlundan, iyirminci ildən silahdan yapışıb hələ də yerə qoymayandan nə gizlin?

– “Sirrini dosta demə, dostun da bir dostu var”. Bu məsəli də heç olmazsa eşitmisənmi, kitabda oxumusanmı, naçalnik?

– Başınız üçün onları oxumaq çox çətindir! – Naçalnik başını buladı. – Lap o zəncirini qırmış mamırlı adamı tutmaqdan da çətindir!.. Çox qırıq-qırıq yazılır və hekayət kitabları, yoldaş prokuror!.. Düzü, mən çox kəmhövsələyəm. Bu mamırlı köpək balası məndə nerv qoymayıb!.. O gün özün də əcəb gördün. Hələ ağzıbirdə üzünə şax durub deyir ki, on min dərzi məni odlayıb, Qaraqayının dibindən alovuna tamaşa eləmişəm... Daha bu oda-alova, bu on beş il ərzində bir nerv yazıq nə qayırsın?.. Ona görə, başın üçün, yoldaş prokuror, bu nağılabənzər kitabçaları vərəqləyəndə, bu qırıq-qırıq sözlərdən yana hirsim vurur kəlləmə! Hövsələm darıxır, yenə də qəzet oxuyanda sətri boya-boydu, barı!

– Deməli, siz bədii ədəbiyyat oxumursunuz?

– Nə bədiisi, yoldaş prokuror, mən ölüm?

– Roman, hekayə, şeir!..

Əşi belə şeylər eşqə düşən qızların işidir! – deyə güldü. – Mən hara, ”Leyli Məcnun” hara?.. – Milis rəisi ağac qoburlu tapançasına nəzər

salıb: – İtdən qorxan belə kitabları əlinə alıb gün uzunu gəzdirər, – dedi, – o ki qaldı məsəl barəsində, onun min dənəsini mən sinədəftər bilirəm. "Keçmə namərd körpüsündən, qoy aparsın sel səni, yatma tülkü kölgəsində, qoy yesin aslan səni!"

– Bax, bu çox yaxşı məsəldir, naçalnik. "Yatma tülkü kölgəsində, qoy yesin aslan səni!"

– Bəli, – "aşına, aşına, çıxdı ocaq başına!" Ya da ki, "burda mənəm, Bağdadda kor xəlifə".

– Yaman məsəllər bilirsən, naçalnik! "Burda mənəm, Bağdadda kor xəlifə". Bax, bu söz çox əcəbcə Kamilovu tutur. – Mehman qayıdıb soruşdu:

– Məcəlləni necə, bilirsənmi?

– Hamısını əzbər, – deyə milis güldü. – Neçə-neçə dəfə milis kursu qurtarmışam, sonra da naçalnik kursu. Əvvəl-əvvəl olmuşam milis, lap iyirminci ildən, revkom zamanından! Sonra olmuşam starşı, belə-belə gəlib çıxmışam bu naçalnikə. – Cabirov gülə-gülə əlavə etdi. – Elə eşq kitabları adamın kişiliyini əlindən alar... Yox, canım, mən qız olub, ya təzədən qız saçlı oğlan olub, şeir-meir əzbərləyə bilmərəm! Bax, şura gələn gündən mənimki bu dəstəsi yazılı mauzer olub, bir də o mamırlı köpəklər! Lap kəndir götürüb, yer ölçüb, torpaq bölüşdürəndən bəriyə, bu kolxoza qədər!..

Milis rəisi tapançasının yazısını göstərmək üçün hərlərkən Mehman əlini qaldırıb:

– Bəli, göstərmisiniz, – dedi, – oxumuşam!

– Bax, belə, mənimki atüstüdür! Yox, yoldaş prokuror, mən ölüm bu "Leyli-Məcnun" barədə məni qısnama dara!.. O, eşqnaməni tapşırın zaqsa, çünki onun peşəsi evləndirmək, boşamaqdır! – Cabirov sadəliklə uzun-uzadı gülüb: – Əşi, təzədən məni şerə salmış, şair qayırmayacaqsan ki! – dedi. – Hərənin bir peşəsi var. Sən mənə elə qulağıtüklü mamırlı banditdən danış... Bu zağlı tapança ilə onların atalarını yandırmaqdan danış!.. Keçi oğrusunun dərisini sivirib öz boğazından çıxarmaqdan danış!.. Sosializm əmlakını göz bəbəyi kimi qorumaqdan danış! Elənçik qolçomağın boynunu eşib, onu ufum-ufum ufuldatmaqdan danış!.. At səyirdib səngər almaqdan danış!

Kefi açılan Mehman gülümsəyib:

– Bir də Zərrintacdan danış, – dedi.

– Yox, o barədə yoldaş Kamilov danışsın, çünki o, zaqsı barmağı ilə kabinetinə çağırıb oradaca kəbinini kəsdiribdir!

Mehman əlini alnına qoyub o biri əli ilə milis rəisinin qabağında olan qovluğu götürüb gözdən keçirməyə başladı:

– Mən özüm bu istintaqı əcəbcə davam etdirərəm! – deyə Mehman qəzəblə qeyd etdi: – Kamilovla mən özüm yaxşıca bacara bilərəm!..

– Yox, yox, yoldaş prokuror, – deyə Cabirov, ona toxunan kimi cavab qaytardı. – Mən, mamırlılarla vuruşan Cabir elənçik suyu üfürə-üfürə içən kişilərdən deyiləm!

– Mən özüm şəxsən istintaqı davam etdirərəm! – Mehman israr etdi. – Mütləq mən özüm bu işi axıracan apararam!

– Əlbəttə, siz özünüz bu işi axıracan aparsanız, daha yaxşıdır... Mən də kömək etsəm, lap yaxşı. – Cabirov son sözlərini də sadəliklə əlavə etdi. Onu da bilin ki, mən özümü sizlə oda ataram, özüm ölüm, yoldaş prokuror, heç gözümü də bir kərəm qırpmaram!..

## XLIV

Mehman barəsində Kamilovun respublika prokurorluğuna göndərdiyi narazılıq teleqramına baxmayaraq, onun belə tez qayıdıb gəlməyi, prokurorluğun işinə birbaş girişməyi Kamilovu narahat edirdi. – "Necə ola bilər ki, mən boyda dağın teleqramı nəzərə alınmasın?" – Kamilov vurnuxur, heç bir yanda özünə yer tapa bilmirdi... Buna görə də o, hər hansı bir kağızı öz qabağına sərsə də, onu yarımçıq buraxır, bir sətir belə başına girmirdi, cinlənir, az qala durub daş-divarı gəmirmək istəyirdi. – "Bu nə işdir ki, heç mən özüm də baş tapmıram?" – deyə o gəzinirdi. Kamilov əsəbiliklə dartıb pəncərəni açsa da, yenə hava ona azlıq edir, hövlündən ürəyi az qala ağzına gəlirdi. Bu qayda ilə iş vaxtı qurtarınca Kamilov öz kabinetində gəzindi, evinə döndü, geyinib-kecinib yol gözləyən Zərrintaca baş ağrısından şikayətləndi. Cavan arvad qocanın bu halına yanıb təcili həkim çağırmaq istədi, ancaq Kamilov razı olmadan əlini qaldırıb yellədi... Kamilov öz əsl mərəzini Zərrintaca açmaq, onun yanında öz gücsüzlüyünü göstərmək istəmirdi. Axı bu neçə vaxt ərzində Zərrintac Kamilovu dağ boyda bir adam saydığı halda, o durub öz paxırını necə açsın, özünü alçacıq bir təpəcik kimi göstərsin?.. Yox, əsla belə şey ola bilməz!.. Heç bir zaman Kamilov kimi bir dağ bu işə getməz, öz şəstini əyib sındırmazdı?!. Axı heç bilmək olmur, bu cavan oğlan haradan prokuror olub bura gəldi, Kamilovun bu möhürlü qərarlarını araq-varaq eləyib, onun ovqatına belə acı soğan doğradı?..

Axı nə üçün Vahidov bu Mehmandan belə bərk yapışıb, öz hərəkəti ilə ona ürək-dirək verir?.. Raykom katibi Mərdan Vahidov rayon prokuroru Mehman Atamoğlanovla bax gör necə də qoşa gəzir, vağzala getmək üçün katib özü prokurorun qapısına öz maşınını göndərir, o, Kamilov kimi bir rütbə sahibini burada qoyub, dünənki bir uşağa bel bağlayır, onun sözünə qüvvət verir?.. Bəli, deyəsən axı Kamilovun nüfuzu bir zəlzələyə düşür?.. Niyə bəs belə?.. Kamilov özünün laxladığını hiss edirdi!.. Bu zəlzələdən necə çıxmaq?.. O, bu hissləri özünə yaxın buraxmaq, bacardıqca özünü sındırmaq istəmirdi. Kamilov düşündükcə az qala özü də özündən çəkinir, öz gücsüzlüyünü özündən belə gizlədirdi... Zahiri bir bağırtı-çığırtı, hədə-hərbə gəlmək, beləliklə də öz günlərini başa vurmaq, özünü məğlubedilməz, kürəyi yerəgəlməz, Rüstəm-Zal hesab etmək də ona kömək etmirdi. Axı necə ola bilərdi ki, o öz dolaşdığını boynuna alsın?! – Heç belə şey olardımı?.. Kamilov yatdığı yerdə eşələnir, dağ boyda iri gövdəsi ilə oyan-buyana aşır, dəmir çarpayını titrədirdi... Qəflət yuxusuna qapılıb yatmaq olmazdı!.. Durmaq, ağır addımlarla öz kabinetinə getmək, telefon dəstəyindən yapışmaq, ora-bura zəng etmək, işdən-gücdən söz salmaq gərək idi!.. Qoy hər bir kəs, o cümlədən Kamilovun özü də görsün ki, o dağ boyda bir adam necə də gur-gur guruldayır, onun səsi necə də güclü və qulaqbatırıcı bir heybətlə çıxır!.. Yox, qapanıb evdə oturmaq heç də yaramazdı. Bu hal Kamilov üçün indi hər şeydən qorxulu görünürdü. Kamilov öz kabinetini, niyə indi hər vaxtda olduğundan artıq sevir, buranı heç tərk etmək belə istəmirdi. Axı irəlicə o qədər də xoşlamadığı bu kabinet indi Kamilov üçün niyə belə qəşəngləşir... Bax, divar saatı, boyun-boyuna verən stullar, üstü örtüklü stollar, yumşaq divanlar, xüsusən sirr və güc əlaməti olaraq küncdə dayanan o polad kassa, stol üstünə düzülmüş telefonlar, bu pəncərələrdən görünən yal-yamaclar, dağ-daşlar indi hamısı, bax, bir gör nə dərəcədə Kamilovun xoşuna gəlir?.. Axı niyə indiyə kimi bu kabinet Kamilova belə göyçək görünmürdü? Hələ ki, ortalıqda elə bir şey olmadığı halda, niyə bəs Kamilov belə bir təşvişə düşübdür? Özü də bunu dərk edə bilmirdi. “Axı ürəyim niyə belə qurğuşun kimi ağırlaşsın?” Görünür, hamısı o Mehmandan, o Salamatov kimiləri haqqında olan qərarları qurdalayıb tərpətməyindən gəlir?!. Axı olmazdımı ki, Kamilov öz qaba və səhv hərəkətlərinə bir nəzər salsın?.. Onda Kamilovun şəstinə dəyməzdimi? Yox, tezcə kabinetə dönmək, stoldan yapışmaq, telefonçuların üstünə bağırmaq, öz gücünü sınamaq!.. Kamilov

ayağa durub fısıldaya-fısıldaya geyindi, Zərrintaca bir söz demədən qapıdan çıxdı, özünü təngnəfəs kabinetə saldı, lampanı yandırdı, buradakı müxəlləfatı diqqətlə gözdən keçirdi. O, stula əyləşib telefon dəstəyindən yapışdı, zəngi zəng üstdən çaldı, doğrudan da o, hər yana səs saldı, hər dəfə ona "bəli-xeyr"lə cavab verildi. Bəs belə isə, bu nə vəlvələdir ki, Kamilovun canına düşübdür? O ayağa durub astadan fit çaldı, özünü toxtadıb ələ almağa çalışdı, gəzindi, sonra Murtuzova zəng vurdu.

– Murtuz, bir bura gəl, oğul!..

Kamilov "baş üstə" sözünü gözləmədən dəstəyi aparatın üstünə qoyub əllərini, ütüdən sürtülüb parlayan qalife şalvarının cibinə qoydu. Kamilov yoğun və kötük qılçalarına baxa-baxa gəzindi. Bir azdan döşü atlanmış Murtuzov başını içəriyə salıb:

– Salam, – deyə ehtiyatla soruşdu, – gəlmək olarmı?

– Buyurun, Murtuz!..

– Bəli!.. Buyruq sizindir, qulluq bizim!

– Nə var, nə yox, Murtuz?..

– Sağlığınız, yoldaş Kamilov!..

– Bəs döşün niyə elə atlanır?

– Bir qədər yeyin gəldim!..

– Çox da əcəb elədin, Murtuz. – Kamilov qayıdıb öz yerində oturdu, şirlənmiş şəkilli ağac qutusunu çıxarıb açdı, bir papiros götürüb kibritlə yandırdı. – Yaxşı da elədin ki, yeyin gəldin, Murtuz! – Kamilov qurcalanıb: – Hə, prokuror necə qayıdıbdır? – deyə papirosunu çeynəyə-çeynəyə çəkdi. – Sənin o yekəxana naçalnikin?..

– Naçalnikin kefi kök görünür!

– Nə barədə kefi kök görünür?..

Kamilov çırtması ilə papirosun külünü vurub külqabıya tökdü.

– Hansı tərəfdən kefi kök görünür, sənin naçalnikinin?

– Məlum olur ki, işi yaxşı çıxıbdır!

Kamilov Mehman barəsində "yaxşı" sözünü eşitmək istəmədiyindən:

– "Yaş" çıxıbdır? – deyə sözü azdırmaq istədi.

– Yaxşı! – deyə Murtuz təkrarən qeyd etdi, – görünür, çox yaxşı.

– Eyib etməz, biz də onu elə bu meydanda yaxşıca sındırarıq ki, qulaqlarının cingiltisi qırx ilə çəkər. – Kamilov papirosunu təkrar çırtmaladı. Bu dəfə papiros külqabıdan tüstülənməyə başladı. – Heç eyib etməz!.. – O bir papiros daha çıxarıb qutunu örtdü, qapağına döyəcləməyə başladı: – Hə, necə?..

– Görünür, bu Mehman yaranan gündən komsomol yaranıbdır, yoldaş Kamilov!

– Necə komsomol?

– Belə ki, əsla usanmaq, yorulmaq bilmir. İşləri hey dərindən-dərinə qurdalayır!..

– Deməmk, sən də üzdə üzürsən? – Kamilov ətli və əsəbi barmaqlarını qoşalayıb gözləri qabağında oynatdı.

– Mən deyirəm bu günün sabahı da vardır, Kamilov!

– Ona görə də bu qədər prokurorun dalından dəymisən, hə?

Murtuzov heysizcə gülüb daz başını buladı, diz üstündə saxladığı günlüyü bozarmış kepkasını övkələdi.

– Məndən çox siz dəymisiniz, yoldaş Kamilov!

– Rüstəm-Zalınmı? – Kamilovun kefi bir az açılan kimi oldu. – Onunmu?.. O, pəhləvanınmı?.. O, xortumlu şalvar təkəşinmi?..

– Çoxusu da Zərrintac xanım üçün! – deyə Murtuzov qorxudan çıxmaq, ürəkaçan bir söz danışmaq istədi... – Rüstəm-Zal Zərrintaca qurban getdi. Küştüyə tab gətirməyib, kürəyini yerə verdi, hə, hə, hə!..

– Zərrintac niyə?.. – Kamilov yeni yandırdığı papirosunu var gücü ilə sümürdü. – Öz-özünə quyu qazdı o Rüstəm-Zal... – Kamilovun saralan ətli sifəti, öz papirosunun tüstüsü içində itdi. – Quyunu qazan özü düşər, eşitməmisənmi bu məsəli?..

– Ancaq güclü bir barmaq da oldu!

– Güclü, ya gücsüz, barmaqsız şey olarmı? – Kamilov iri gövdəsini çəkdi. – O bizə ling qoymaq istəyirdi, deyirsən, yəni biz ona heç bir çeçələ barmaq da uzatmayaydıq?..

– Sizin çeçələ barmağınız, dünyanın hər bir lingindən canlıdır, yoldaş Kamilov!

– Keçinin əcəli gələndə çobanın çomağına sürtüşər. – Kamilov, ona bir qüvvət gəlmiş kimi, gəzindi. Murtuzov Kamilovu gözdən keçirib:

– Ancaq bu prokuror çox yaman bir girəvədən yapışıbdır, – dedi, – çox yaman yerdən!..

– Baxma, bu xamır hələ çox su götürər, – deyə Kamilov Mehmanı gözləri qabağına gətirib hirsləndi. – Özü də az yox, çox su, Murtuz!..

– Düzü, mənim gözüm bu Atamoğlanovdan heç su içmir, – deyə Murtuzov ayağa qalxdı.

Kamilov əlini Murtuzovun çiyninə qoyub onu yerə oturtdu. – Yoxsa familiyası səni qorxudubdur? – “Atam-oğlan-ov!”

– Familiyası nə üçün? – Murtuzov stulda yerini bərkitməyə çalışdı. – Özünün hər yanı qurdalamağı, hər yana burun uzadıb baş salmağı, düzü, hələ Vahidovdan başqa, sizin yolunuzu saxlamayıb, kölgənizi qılınclayan, son zaman dil-boğaza qoymayıb sizi bu kommunxozun yarıtmaz işləri barəsində dilə-dişə salan komsomol katibi Əhmədovla kluba qoşa getməyi, forma cəhətdən sizə müavin sayılan, ancaq gecə-gündüz sizin bu stola göz dikən torpaq şöbəsi müdiri aqronom Cabbarzadə ilə ülfət etməyi, düzü, adamın kürkünə birə, ürəyinə üşütmə salır.

– Siz ki bəs o Mehmanla birevlisiniz, balam? – deyə Kamilov əlini-əlinə vurub birləşən gücün qabağında xofa düşdü, ancaq özünü sındırmamaq üçün istehza ilə güldü, onun qanıqaçıq dodaqları arasında kütləşmiş dişləri göründü. – Bircan, birqəlb!..

– Bu dəfə Bakıdan dönəli, mən ayağımı o Mehmangildən birdəfəlik kəsmişəm!

– Niyə bəs ayağını kəsmisən?.. Bəs nə üçün kəsmisən?.. Bəs, biz içəridən, bağırsağı doğranmaqdan danışmadıq?.. Sən, azca bir fınxırtıdan yana bir cırtdan kimi atılıb bayıra düşürsən!

– Çünki Mehman, o biri tərəfə üz göstərdiyi halda, mən tərəfə üz çevirib yamanca açılışdı... Dedi ki, mənim evim, sənin üçün su yolu deyildir! O dedi ki, nə sənə, nə də sənin əyalın Yavərə bura oyun-əyləncə yeri deyildir!

– Yəni bu qədər də çörəyi dizinin üstündədir?

– Bəli, elədir, qayınanası nə qədər yumşaqsa, kürəkəni bir o qədər sərtdir!

– Bəlkə səni o yumşaq qayınanasına qısqanır, – deyə Kamilov göz qapaqlarını qaldırıb Murtuzova həris bir nəzərlə baxdı. – Belə bir əhvalat da ola bilməzmi?

– Yox, elə əhvalat deyildir! – Murtuzov qurcalandı, papiros çəkən olmadığı halda Kamilovun üstü şəkilli qutusundan bir papiros götürüb çəkmək istədi, ona baxıb-baxıb çəkindi. – Qayıdandan bəri Muradoğlunun üzü dönübdür!

– Bəlkə səndən yana orada bir şey-zad var, – deyə Kamilov şəhadət barmağını çiynindən geriyə uzatdı, – yuxarıda?..

– Əbdülqədir olan yerdə heç bilmirəm, – deyə Murtuzov da çiyinlərini çatdı, – nə ola bilər?..

– Doğrudur, – deyə Kamilov da nəfəsini təəssüflə dərdi. – Ancaq dostumuzun başı çox yamanca yağlanıbdır!

– Alapörtdək qoyun quyruğu yeyən bir qəssaba oxşayır, – deyə Murtuzov, uzun zəhmət və xidmətlərini bada verən Əbdülqədirə qarşı hiddətləndi. – İşi-peşəsi quyruqlu içalat tıxmaqdır.

– Doğrudan da Əbdülqədir bu içalat cızbızının çox yaman müştaqıdır!

– Beş girvənkə çörəklə bir teşt iç-içalatı üst-üstdən cızhacız yeyir, özü də doydum demir!

– Hələ arvadı Gülbuta ondan da yaman yeyəndir!

– Bu ötən dəfə məni evinə çağırmışdı. – deyə Kamilov Əbdülqədirgilə getdiyini nağıl etməyə başladı. – Düz üçümüz, üç dənə iç-içalat yedik! Mən nəfəsimi güclə alırdım. Əbdülqədir dedi. – "Hələ, aşna, bu harasıdır?.." Gördüm kafəroğlu məndən əl üzəsi deyil, birbaş durub qaçdım. O, pilləkənin başında, əlində nəlbəki boyda başsoğan dayanıb ki, "mən ölüm hara?.." Mən əlimi geriyə yelləyib küçəyə çıxdım, gördüm ki, hərifin başı darvaza ağzında işıldayır.

– Görünür ki, Əbdülqədirin də bəxt ulduzu daha batır?..

– Niyə batır bəxt ulduzu?..

– Çünki respublika prokurorunun onu görməyə gözü yoxdur!

– Belə çıxır ki, biz ulduz-mulduz olasıyıq, hə? – deyə Kamilov özü bilmədən bu sözləri ağzından çıxartdı, öz sözünü tezcə də çevirdi. – Cücəni payızda sanarlar, oğul!

– Mən bu Mehman barədə o Əbdülqədirə xüsusi bir məktub yazmışdım... Yazmışdım ki, "çarə et, qardaş!.." Hələ Gülbutaya da işarə kağızı göndərmişdim ki, bəs ayıq ol!

– Bəs cavab? – deyə Kamilov birdən-birə, çaya düşüb axan adam kimi, əlini oraya-buraya atdı. – Bəs cavab? Əbdülqədirdən...

– Hər iki kağız elə bil ki, bir daş bir quyuya düşən kimi oldu!

– Görünür ki, o dağı da orada təntidiblər!

– Belə başa düşürəm, əsl mənasında Əbdülqədirin işi yaşdır!

– Yaş!.. Daş!.. Baş!.. – Kamilov ayaqlarını döşəməyə döydü. – Neynəməz!.. Ölməmişdən kəfəni saraltmaq da olmaz, Murtuzcan!..

– Ölüm söhbəti deyil, yoldaş Kamilov. İndi bir parça çörəyi hər yanda tapmaq olar!

– Meydandan qaçmaq olmaz, Murtuz!

– Hazır ol, cahada, Murtuz! Özü də şeytan sənin gözünə balaca göstərən o Qaloşdan yapış, çünki o, çox gəmiləri daşa çırpıbdır. Qoy o Qaloşlu adam bu Mehmanın da, belə saymazyana köpüklü dalğalarda şarhaşar üzən gəmisini bir qara qayaya çırpsın!

– Mənim də ümidim onadır!
– Mən də Qaloşa elə işarə vermişəm!..
– Bəs sözü, vədi?..
– Sağ əlini qaldırıb sol gözünün üstünə qoyubdur!
– O içəri adamıdır, bizim adam! Özü də belə qanıram ki, nə isə bu Mehman hərifin əlini dodağının üstünə qoyub: – "səbir... sus!.." deyir.
– Bəs nə vaxta qədər, səbir-susss?!.
– Deyir ovu bərədə atarlar!..
– Demirsənmi, bəs, zalımoğlu, daldan atılan daş topuğa dəyər?!.
– Deyir ki, mən də heç bu yaşda çağa deyiləm!
– Yox, Murtuz, – deyə Kamilov hərlənib əlini onun çiyninə qoydu. – Biz o Mehman Atamoğlanovun başını burada əkməsək, o bizim başımızı əkəcəkdir. – Kamilovun gözləri lampa işığı altında saralan Murtuzovun daz başında gəzindi, – özü də birinci növbədə sənin, bax, bu noxudu keçəl başını əkəcəkdir!..

**XLV**

Gecə uzun yol gələn Vahidov gün çeşit yerinə qalxınca evinə döndü. Aşırılıb atdan düşdü, katibin dönəcəyini gözləyən xidmətçi kişi kəhər atı şəhərin kənarındakı tövləyə apardı. Vahidov pilləkənyuxarı qalxdı. Əynindəki boz şinelini və gün bozartmış papağını çıxarıb koridordakı asmadan asdı. Balaca oğlunu yatırdan Səlimə ayaq səsinə durub qapını açdı və:
– Haradasan, Mərdan? – deyə ərini süzdü. – İki gündür zəng etmirsən.
– Dağlıq kolxozlarda idim, Səlimə, – deyə Vahidov uzun hörüklərini başının dövrəsinə dolamış Səliməyə cavab verdi. Səlimə də ərini diqqətlə gözdən keçirdi. Vahidovun qara saçları bir-birinə qarışmış, onun sarımtıl saqqalı qıvrılıb ağbəniz sifətində yapıxmış, qısa bığları yana doğru uzanmışdı. O, rayon mərkəzindən iki həftə bundan əvvəl çıxmışdı. Raykomun büro qərarına əsasən rayon fəallarının qabaqcıllarından otuz nəfəri səfərbərliyə alınaraq, kolxozlarda başlanacaq yaz əkini üçün yerlərə göndərilmişdi. Vahidov özü də katib müavini Cəlilovu öz yerində qoyub, bir gün sonra rayonun dağlıq kolxozlarına çıxmış, bu ətrafda həm yaz əkininə hazırlıq işlərini yoxlamış, həm də arıçılıq fermalarının təşkili ilə məşğul olmuşdu. Raykom katibi Vahidov, bu işlər arasında vaxt tapıb ilk partiya və komsomol təşkilatlarının işlərini də nəzərdən keçirməklə, partiyaçı və komsomolçularla müsahibə etmiş, onlara göstərişlər vermişdi. Vahidov həm də bu səfəri zamanı iki məktəbin sinif otaqlarına

girərək, burada gedən dərslərə qulaq asmış, tənəffüs zamanı müəllimlərlə müsahibə etmiş, öz fikrini onlara söyləmiş, məktəblərin ehtiyacları barəsində yerli sovet və partiya təşkilatlarına tapşırıq vermişdi. Beləliklə, Vahidov bu iki həftə içərisində yerlərdə gedən işlərlə qaynayıb qarışmış, belə bir vaxtda saqqalının uzanmasına fikir verməmişdi. İndi bu cəhət, Səlimənin diqqətini özünə cəlb edir, o, yorğun-arğın düşmüş ərini süzməyə başlayırdı:

– Nə belə çox diqqətlə baxırsan, Səlimə? – deyə Vahidov gülümsər sifətlə arvadından soruşdu:

– Saqqal sənə əcəb yaraşır, Mərdan, – deyə Səlimə ərinin qolundan tutub birinci otağın qapısını açdı. – Yoxsa evindən yadırğamısan, yoldaş?..

– Uşaqların haradadır, qızların! – deyə Vahidov uşaqların küncdə qoyulmuş yazı stoluna göz gəzdirdi. – Nəcibə, Rəfiqə haradadır?..

– İkisi də bir az əvvəl məktəbə yollandılar. Özləri də axşam gec yatmışdılar, yolunu gözləmişdilər.

– Bəs böyükdən nə xəbər var? – Bakıdan, Salmandan?

– Məktubu dünən gəlibdir, – deyə Səlimə qızların stoluna yaxınlaşıb, başı açılmış zərfi gətirdi. Vahidov zərfi açıb məktubu çıxartdı. Məktub iki səhifəlik, cızıqlı poçt kağızında yazılmışdı. Salman öz məktubunda dərslərindən yazır, tələbələrin çox sevdikləri professor Məlikzadənin ağır surətdə xəstələndiyini təəssüflə qeyd edirdi. Məktubu diqqətlə oxuyan Vahidov qaytarıb onu zərfə qoydu.

– Bəs, sonbeşiyin necədir?..

– Bu evi bir-birinə qarışdırmaqda misli yoxdur, sənin bu qılınc-qalxanlı oğlunun...

– Bəs nə əcəb görünmür? Yoxsa qırraşıb yəhərdən düşmək də bilməzdi!..

– Çox tezdən durmuşdu, mən başını birtəhər tovlayıb əlim-qolum açılsın deyə, səndən bir az qabaq otaqda yatırtdım!

Vahidov ara qapını açıb ikinci otağa keçdi. Elxan kiçik çarpayıda mışıl-mışıl yatmışdı. Onun toppuş əlləri yanlara sərilmiş, balaca taxta qılınc, kiçik karton qalxan da bir kənara atılmışdı.

– Bu çox igid və qəhrəman olacaqdır, – deyə ata, oğlunu gülümsər sifətlə oxşadı. – Sənin bu Elxan oğlun igid olacaqdır, Səlimə!

– Qılınc tovlamağına, qalxan oynatmağına nə söz ola bilər? – deyə Səlimə ərinin yanına gəldi. – Bir də görürsən ki, şüşəni sındırıb parçalarını araşdırır!

Ata oğlunun qara qıvrım saçlarını tumarladı, əyilib alnından öpdü. Uşaq üzünə batan "tikanlı saqqal"dan diksindi, qurcalanıb hər iki əlini yumruqladı, sonra, hər iki əli ilə burnunu ovuşdurdu, ata və ana geriyə çəkildilər.

– Daha nə var, nə yox Səlimə? – deyə Vahidov birinci otağa dönüb stulda əyləşdi: Səlimə ayaq üstə dayanaraq:

– Bakıdan dönən prokuror səni soruşurdu, – deyə o, ərinə məlumat verdi. – Bir də, bu iki-üç gündür Kamilovun zəngi ara verməyibdir!..

– Aydındır, – Vahidov sarımtıl saqqalını qaşıdı. – Sonra nə var?

– Üç dəfə gecə saat birdə Bakıdan sənə zəng vurublar!

– Hansı idarədən?

– Dedilər Mərkəzi Komitədəndir!

– Bəs nə cavab verdin?

– Dedim Vahidov ucqar kolxozlardadır. Katib müavini Cəlilov onun yerindədir.

– Bir müavin də ki, buradadır, – deyə Vahidov əlini atıb Səlimənin biləyindən yapışdı. – Şəfqət bacısı! – deyə onun əlini dodaqlarına gətirib öpdü. – Mərhəmət bacısı!..

– Şəfqət, ya mərhəmət bacısı sənin bu Elxanından yana hər gündə güclə "yarım günlüyə" göz açır!

– Mən bütün günə də etiraz etmirəm, Səlimə!

– Adı "yarım gün"dür, ancaq özü bütöv gündən də çox çıxır, – deyə Səlimə Mərdana yaxın stulda əyləşdi.

– Demək, sənin davan donluq üstündədir, Səlimə xanım! – deyə Vahidov qısaca darağını cibindən çıxarıb pırtlaşıq saçlarını daradı. – Dava yorğan üstündədir!..

– Ondan da başqa, bu "yarım ştat" sözündən əsla xoşlanmıram... "Yarım ştat", "yarım adam" görün heç bu da sözdür?!.

– "Elxan Biləgənlini" bağçaya ötürsən, "bütün ştat" olarsan, Səlimə!

– Zərrintac Sərrafzadə olan yerə heç Elxan Biləgənlini götürmək olar?.. O dəvədəlləyinin əlinə heç uşaqmı vermək olar?

– Bu yaxın zamanlarda oranın işi ilə əsaslı surətdə məşğul olacağıq, – deyə Vahidov nəfəsini dərdi. – Gərək Cabirov özü də oranı yoxlamağa başlamış olsun!

– Yoxlama başlayıbdır, – deyə Səlimə eşitdiyini xəbər verdi. – Zərrintac da hər yana səs salıb ki, bəs Səlimə xanım mənim bağçama göz dikibdir... Özü də Kamilovun adı ilə bizə yamanca hərbə-hədə gəlirmiş!..

– Bəs sən? – deyə Vahidov diqqətlə və tələbkar bir nəzərlə Səliməni süzdü. – Neçə dəfə tapşırmışam ki, kənar işə qarışma, Səlimə!

– Mən əgər Mərdanı mülahizə etməsəydim, bir partiya namizədi kimi, Cəlilova şikayətə gedərdim. Nə üçün axı, hansı əsasa görə o Sərrafzadə Zərrintac məni dilə-dişə salmaq istəyir?!. Bağçasını yoxlamağa başlayan gündən lap ağzını Allah yoluna qoyubdur, o pörtüb-partdıyan, yeriyəndə yeri yırğalayan arvad!..

– Təqsir Kamilovdadır, – deyə Vahidov ayağa durub saqqalını qırxmaq üçün ayna qabağına yönəldi.

– Nə üçün sən təqsiri öz üstündən atırsan, Mərdan? – deyə Səlimə ərinin üzünü qırxması üçün ülgücü və sair şeyləri stolun gözündən çıxartdı.

– Bəli, təqsir həm də bizdədir, məndə! – deyə Vahidov etiraf etdi. – Ümdə təqsir məndədir!..

– Ah, o Zərrintac, o Zərrintac!! – deyə Səlimə yanıxa-yanıxa söyləndi. Bir budaqda oturub min budağı yırğalayandır, özü də prokurorun arvadı Züleyxa ilə bacılıq olubdur, hər yerdə Züleyxadan, onun anası Şəhladan söz salır, əl-qolunu ölçə-ölçə danışır, adam olanın gözünə kül üfürüb astadan orda-burda pıçı-pıçı eləyir ki, bax – “açsam, prokuror ovcumda, yumsam, prokuror yumruğumdadır”.

– Prokuror çox təmiz adamdır, Səlimə!

– Ancaq qayınanası cilov gəmirən, dərisinə sığmayan, gözləri yeri-göyü seçməyəndir! Kürəkəni Bakıya gedəndən qayıdana kimi qızını da yanına salıb, bu aranı sallana-sallana gəzir, üzünü göyə tutub ulduza danışırdı!..

– Mehman təmiz vicdanlı bir prokurordur, Səlimə!

– Əgər dişi Kamilova batsa idi, o Sərrafzadənin bağçasını özü öz əli ilə bir yaxşı-yaxşı ələk-xəlbirdən keçirsə idi, əcəb olardı!

– Onlar ələk-xəlbirdən keçirdərlər, – deyə Vahidov hazırlıq görüb üzünü qırxdı, dodaqlarını örtmüş bığlarını qayçı ilə kəsib düzəltdi... Cüzi yeməkdən və istirahətdən sonra o, ayağa durub geyindi, raykoma yönəlmək istəyəndə telefon zəng etdi. O, dönüb telefon dəstəyini götürdü. – Bəli, salam, – dedi, – gəlmişəm!.. Prokurorun gəlməyinimi?.. Eşitdim... Raykoma gələ bilərsiniz. Bir azdan, – Vahidov dəstəyi qaytarıb aparatın üstünə qoydu!

– Yəqin ki, Kamilovdur! – deyə Səlimə soruşdu.

– Özüdür, bəli!

– Nə isə çox döşü atlanmış danışır, – deyə Səlimə raykom katibinin sifətində əmələ gələn qətiyyəti hiss etdi. – Axı elə də yaxşı deyil ki,

o dərisinə sığmayan Zərrintac bu dağ zorbalıqda kişinin qəyyumluğunu eləyir, axırda da durub atası yerdə bir ağsaqqalın evinə dürtülür?.. Axı ad birdir, belə doydaq hərəkətlər adama toxunur, adam istəmir ki, burada katibdən sonra adı gələn sədrin adına bir şey deyilsin?..

– Doğrudur, Səlimə adı çox-çox təmiz saxlamaq gərəkdir!

– Axı, o zorbalıqda adam: "dəvə başını pambığa soxub, heç kəs görmür" deyə güman eləyən kimi, niyə bəs o da ötüb-keçəni, yayları buraya gələn nəvələrini mülahizə eləmir?.. Niyə bəs bu Kamilov oturduğu yerin hörmətinə fikir vermir?.. Mərdan, bəs sən, bir yoldaş və raykom katibi kimi, demirsənmi ona, niyə belə yaramaz-yaramaz işlər görürsən, Kamilov!..

– Demək, sinən dolubdur, Səlimə! – deyə Vahidov açmaq istədiyi qapını təkrar qapayıb ayaq saxladı.

– Sinəmdə söz çoxdur, ancaq sən deyirsən qarışma, mən də qarışmıram, Mərdan!

– Yox, Səlimə, sən öz yerində, öz şəfqət bacılığında olsan, orada öz işlərinizə qarışsan yaxşı olar!..

– "Yarım ştat", "yarım adam!" eləmi?

– Yox, bütün adam ol, ancaq öz işində, şəfqət bacısı ol! – deyə Mərdanın sifəti allandı. – Bizim məsul işçilər, heç bir zaman vəzifə işlərini ev işləri ilə dolaşıq salmamalıdırlar! Yoxsa bilməzsən maarif müdiri, kimdir, müəllimləri təyin edən kimdir?

– Onu da maarif şöbə müdirinin özünə demək gərəkdir!

– Demişik, başa salmışıq, Səlimə!

– Sözü nə olub o maarif müdirinin?

– Raykomda üzr istəyibdir!

– Üzrlə günah yuyulsa üzr istəyən çox olardı!

– Yox, Səlimə, hər bir günahı da şişirdib gücləndirmək olmaz, işin tərbiyəvi tərəfi də vardır! – Mərdan Vahidov boz bir sifət aldı: – "Bütün ştat"a sözüm ola bilməz! Ancaq təvazökarlıq lazımdır, bildinmi? Heç bir zaman münasibətləri qarışıq salmaq olmaz!..

– Bəli, Mərdan!..

– Aydındır, ya yox, Səlimə?

– Aydındır, bizim iyirmiillik həyatımız gün kimi aydındır, Vahidov!

– Daim aydınlıq! – deyə Vahidov təkrar qapını açdı, – hər zaman aydınlıq, ev ilə xidmət işlərini qarışıq salmaq olmaz!

– Belə çıxır ki, Mərdan, biz...

– Nə cür çıxsa da, şəfqət bacısı, Səlimə xanım, raykomun birinci katibi vardır! – deyə Vahidov cəld eyvandan düşüb raykom binasına tərəf

yol aldı. Səlimə yol gəlib, yorğun düşən ərini əsəbiləşdirdiyi üçün təəssüf edib:

– Bizim həyatımız həmişə aydın olubdur, – deyə əlini başına dolanmış qara hörüklərində gəzdirib, doluxsunmuş gözlərini sildi. – Bu aydınlıq daim olacaqdır, Mərdan!.. "Elxan Biləgənli"nin doğma atası!

## XLVI

Vahidov kəndlərdə olduğu zaman qeydlər edib yazı apardığı balaca bloknotlarını nəzərdən keçirdi, kimə nə tapşırıq vermək lazımsa, ayrı bir vərəqdə qeyd etdi. Rayon üzrə görülmüş işlər nə qədər çox olsa da, görüləsi işlər daha artıq idi. Bu işlər və mübarizələr içərisində Kamilovun, doğrudan da, qayda-qanuna sığmaz hərəkətləri Vahidovu daha çox düşünməyə başlayırdı. Bir də, prokurorla sədr arasında başlayan ixtilafa qarşı raykom katibi artıq öz açıq münasibətini göstərməli idi. Belə bir vaxtın çatdığını Vahidov görürdü. "Burada kim daha haqlıdır?" – deyə Vahidov öz-özünə sual verir, bir yanlışlıq olmasın deyə öz mühakiməsindən təkrar-təkrar keçirirdi. Bu axtarışda Vahidovun nəzərləri bir övlad məhəbbəti ilə qara qıvrımsaçlı Mehmanın üzərində dayanırdı. Mübarizə və gərginlik indi hər yerdə vardır, özü də dərin və kəskindir! Yeni həyat ciddi müqavimətlərdən, sinfi düşmən qalıqlarının fitnəkar qarğularını qırıb dağıtmaqdan, üz-üzə döyüşüb vuruşmaqdan keçib inkişafa doğru getməkdir! Bəli, baxanda keçən illərdəkinə nisbətən, bu kolxoz daha möhkəmlənir, o biri kolxozda ötən ildəkinə nisbətən məhsul daha çoxalır, məktəblərin sayı ilbəil artır, yeni həyat qaynayır, yüksəlir... Ancaq köhnəlik yenə inkişafa azmı mane olur? Baxanda Kamilov kimisi geriyə qalır, istər-istəməz köhnəliklərin qalıqlarına əsir düşür.

Vahidov düşünür, qeyd və mühakimə edirdi:

– Axı mən neçə kərə özüm ona demişəm ki, Kamilov, ipə-sapa yatmaq gərəkdir. Axı mən onu demişəm ki, sizə dövlət ixtiyarı etibar edilmişsə də, qanunu oyana-buyana istədiyiniz kimi əymək deyilməmişdir!.. Axı bu nə xudpəsəndlik azarıdır ki, sizin iliyinizə işləyibdir, Kamilov?.. Bu nə "mənəm-mənəm"likdir?.. Axı, bu nə üsuldur ki, Murtuz kimisi sizdən qopmur?.. Axı bunlar hamısı necə olan işdir, Kamilov?.. – Mehmanın Bakıdan qətiyyətlə döndüyünü hiss edən Vahidov, müəyyən bir qərara gəlmək üçün fikirləşir, bu məsələni necə həll etmək üçün yol arayırdı. – Əlbəttə, rayon icraiyyə komitəsi sədrliyi vəzifəsinə, rayon torpaq şöbəsi müdiri Cabbarzadəni də rahatca çəkmək

olardı!.. Niyə olmur axı? Ali təhsilli aqronom, raykomun büro üzvü, neçə illik iş təcrübəsi, axı niyə olmasın?.. Cabbarzadənin camaatla rəftarı mülayim, özü də axşama qədər işlə məşğul olur. – Vahidov əlini alnında gəzdirir, düşünürdü. – Yaxud mənim müavinim Cəlilovdan sədr olmazmı?.. Cəlilov bu gün raykomun birinci katibliyi üçün yetişmiş, ali partiya məktəbini bitirmiş, neçə illik partiya işində bişmiş bir işçidir. Olmazmı? Olar da, keçər də!.. – Vahidovun gözləri bir-bir rayon aktivini və şöbə müdirlərini araşdırırdı. – Kamilovu yüz qat əvəz edəcək adamlar bizdə azmıdır? Bu illər içərisində nə qədər kadr yetişmişdir; adam var, az deyildir!.. Ancaq bəs Kamilov?.. Bəs o necə olsun?! Bəs nə üçün Kamilov bu dərəcəyə qədər tənəzzülə uğrasın?.. "Mənəm-mənəm" deyən bu adam cilov gəmirən atının üstündə şəst-pəstlə dayansın?!. Bəli, görünür ki, Kamilovda bir çürüntü baş veribdir?.. Bəs nə eləmək?.. Çürüntünün qabağını necə almaq?.. Bəli, o müqəssirsə, cəza verməli, əgər islahı mümkünsə, axırıncı bir təcrübə olaraq sıravi işə göndərməli!.. Ayrı bir çarə hanı?.. – Vahidov bloknotlarını sərili qoyub durdu və öz kabinetində asta addımlarla gəzindi. – Ayrı bir yol yoxdur!.. Kamilov artıq özü öz əli ilə zorba gövdəsini götürüb düzgün yoldan bir kənara salıbdır! – Vahidov təlatümlü fikir içində xeyli gəzinib dolandı, ilk gəldiyi günlərindən Mehmanla Kamilov arasında başlayan çəkişmə yenə də onun gözləri qarşısında dayandı... – Bəli, azalmır, artır. Xırdalmır, böyüyür... Demək, qəti olaraq münasibəti aydın etmək!.. İcraiyyə komitəsi sədri vəzifəsinə bəs kimi tövsiyə etmək?.. Cabbarzadənimi, ya Cəlilovumu?.. Günü çatdıqda hər iki namizədi Mərkəzi Komitəyə təqdim etmək!.. İcraiyyə komitəsinin plenumuna vermək... Hansı biri daha layiq görülərsə elə də olsun!.. Yaxud bəlkə, Mərkəzi Komitə başqa bir adamı məsləhət gördü?.. Elə də olsun!.. Hər halda bu çəkişməyə son qoyulmalı, gənc prokurorun qanuni və ədalətli hərəkətləri müdafiə olunmalıdır!.. – Vahidov şəhadət barmağını qaldırıb, öz-özü ilə danışır kimi, yenə də asta-asta yeriməyində davam etdi. – Bəli, inkişaf belə də gedir, kim şişib yəhərə yerləşmirsə, yıxılır, kim şişmirsə, gözləri ayaqlarının altını seçirsə, bütün gecəni-gündüzü işlə-güclə məşğul olub özözünə tələbkar yanaşırsa, o yəhərdə möhkəmləşir, ümumən hörmətinə layiq olur... Bəs nə etmək ki, Kamilov belə şişmişdir?.. Görünür ki, bunun xəstəliyi öz-özündən başlamışdır! – İşdən – kəndlərdən dönən Vahidov, öz kabinetində gəzə-gəzə rayonun bütün məsələlərini gözləri qarşısına gətirib, vacib məsələlərdən biri kimi Kamilov üstündə dayanır, bəli, getdikcə sədrin dözülməz hərəkətləri artıq raykom katibini

əsəbiləşdirirdi... Onu qəti bir qərar çıxarmaq yoluna gətirirdi... Əgər Mehman, Kamilovun qanunsuz hərəkətləri haqqında, özünün dediyi kimi, mərkəzdə məsələ qaldırmışsa, onda bəs necə etmək?.. Onda bu qərara tamamən şərik olmaq!.. Kamilovun bu ağzı tuşuna hərəkətlərinə ayrı cür təhəmmül etmək mümkün deyildir! Yol çəkmək, inşaat işləri aparmaq, kolxozları möhkəmlətmək, nə qədər də iş vardır!.. Bunların hamısına da birlikdə başçılıq etmək, rayon fəallarını işlətmək tələb olunduğu halda, Kamilov kimi bir adamın hərəkətləri bizim işlərimizə artıq nə qədər də əngəl törətməyə başlayır? – Vahidov addımını qətiyyətlə atırdı. – Yox, bu kötüyə çevrilmiş əngəl qalxmasa olmayacaqdır!.. Bəlkə bu məsələni daha əvvəl qoymaq lazım imiş?.. Əlbəttə, bu məsələni hələ əvvəldən həll etmək gərək imiş!.. "Bəlkə islah olar?" – deyə etdiyimiz səbir tükənmişdir!.. İş islahatdan keçib təşkilati nəticəyə çatmışdır... Ayrı bir yol görünmürdü!.. Kamilov öz nüfuzunun "əfsanəsi" ilə nə qədər yaşasa da, içəridə çürümə başlamışdır. Artıq güclü bir təkan onu yerə sərəcəkdir. Özü də lap üzü üstə!

Vahidov gülümsədi, irigövdəli palıdın qüvvətli küləyin zərbindən necə yerə sərildiyini təsəvvürünə gətirirdi. Vahidov orada əyilib bu sərili ağaca çox diqqətlə baxmışdı. Bəli, o ağac içəridən çürümüşdü, yoxsa heç yıxılardımı? Vahidov bu ağacı bu dəfə dağlıq hissəyə, çıxarkən görmüş, atdan düşərək onun yıxılmasına diqqət etmişdi. Bəli, o ağac yıxılanda, bir neçə yan-yörə şiv ağacı azmı-çoxmu əzmişdi. Ancaq gövdəli ağac yerə dönməz dərəcədə sərilmişdi. Ətrafdakı şivlər isə, bəlkə bu ağacın öz tumlarından əmələ gəlməyə, yaşıllaşmağa başlamışdı... Axı nə üçün belə bir müqayisə Vahidovun təsəvvüründə indi canlanır?.. Vahidov fikirləşir, öz-özünə müştaq kəsilən, içəridən çürüyüb yerə sərilən Kamilovu görür, onun sərilisinə acısa da, yenə onu istehzalı gülümsəmə tuturdu. Vahidov bu fikir içində ikən qapının açılması onu düşüncə və fikrindən ayırdı.

– Gəlmək olarmı? – deyə rayon komsomol komitəsi katibi Əhmədov, qoltuğunda dolu bir iş qovluğu içəriyə girdi. – Neçə gündür ki, sizin qayıtmağınızı gözləyirdik!..

– Cəlilov burada idi, – deyə Vahidov komsomol komitəsi katibi ilə görüşüb ona yer göstərdi. Komsomol katibi əyləşərək qovluğun bağlarını açmağa başladı.

– Cəlilov yoldaş iş planımıza baxdı, ancaq belə məsləhət verdi ki, onu sizə də təqdim edim!

– Çünki iş bölgüsündə komsomol mənim payıma düşüb, eləmi?

– Bəli, görünür ki, – deyə komsomol katibi əlini geriyə daranmış saçlarında gəzdirdi, – elədir!

Vahidov iş planını götürüb diqqətlə oxudu, sonra əlini qırmızı karandaşa atıb bəzi qeydlər etməyə başladı.

– Etiraz etmirsiniz ki, yoldaş katib? – deyə Vahidov göz qapaqlarını qaldırıb soruşdu.

– Xeyr, xeyr, bizim üçün gözəl məsləhətiniz çox xoşdur! – deyə Əhmədov cavab verdi, – çox xoşdur! –

– Komsomol partiyanın doğma övladıdır!

– Bəli, biz bununla fəxr edirik, yoldaş Vahidov!

– Bu da belə! – deyə Vahidov danışa-danışa yazdığı cümləni qurtardı. "Məktəb müdirləri ilə ilk gənclər təşkilatı katiblərinin rayon müşavirəsi"nə necə baxırsınız?.. Özü də tədris ilinə yekun vurulanda, necədir?

– Bəli, biz bu cəhəti unutmuşduq, yoldaş Vahidov!

– Məktəb və maarif məsələsini yuxuda da unutmaq olmaz! – deyə Vahidov karandaşını işlətdi. – Geniş kütlələrin maarif və mədəniyyət məsələsi, xüsusən gənclik ilə əlaqədar olan yeni nəslin tərbiyəsi məsələsi bizim gündəlik işimizdə öz əksini tapmalıdır!..

Vahidov bu sözləri yazınca qapı yelli açıldı. Kamilov içəri girdi.

– Salam, yoldaş katib! – deyə o əlini uzatdı. Vahidov onun əlini tutub:

– Əleykəssalam! – deyə sədrə yer göstərdi.

– Nə yazırsınız? – Kamilov əli işləyən Vahidovdan soruşdu.

– Bizim komsomol üçün!..

– Özləri cavan ola-ola bizi işlədirlər, – deyə Kamilov yumşaq kresloda yayxandı.

– Bizim gələcəyimiz üçün! – deyə Vahidov karandaşını iş planından çəkmədən cavab verdi. – Çünki gənclik bizim gələcəyimizdir! Gənclik bizim həmişə baharımız, həmişə sabahımızdır!..

– Bəli, gəncliyin müqəddəs vəzifəsi – partiya tapşırıqlarını canbaşla yerinə yetirməkdən ibarətdir, – deyə komsomol katibi Əhmədov, Kamilovun turşuyan sifətini görüb özü söhbətə qarışdı.

– Bəli, bu da belə!.. Pionerlər məsələsi! – deyə Vahidov öz mülahizəsini yazdı.

– Bu cəhətə də gərək biz fikir verək, – deyə Əhmədov özündə olan iş planını açdı, üzərində qeydlər etməyə başladı.

– Bax belə, yoldaş komsomol, aydın, konkret yazmaq!.. Ayını, gününü, saatını göstərmək!.. Çünki iş yazmaqdan çox öz icrasını sevir!

– Axı əlindən tutub əlifbey də yazdırmaq yaxşı deyil! – deyə Kamilov dodağını dişləyərək Əhmədova tərəf döndü. – Raykom katibinə hörmət gərəkdir, yoldaş Əhmədov! Axı elə yazın, elə gətirin ki, daha bu kişi sizə mirzə olub, min işin içindən sizin bu pioner məsələsi ilə də məşğul olmasın!..

– Əlbəttə, raykom katibi gərək pioner işi ilə də məşğul olsun, – deyə Vahidov yaza-yaza Kamilova cavab qaytardı. – Lap məktəbli balaların yazı-pozu dəftəri ilə də!..

– Ancaq bu komsomol özü də gərək bir iş görsün, ya yox? – deyə yenə də Kamilov öz gücünü göstərmək üçün suyu bulandırmaq, özünün həlledici bir mənsəb sahibi olduğunu komsomol katibi Əhmədova göstərmək istədi.

– Komsomol da az iş görmür, – deyə Vahidov başını qaldırıb işləyən karandaşını dayandırdı. Qapı açıldı, Vahidovun köməkçisi ara qapının ağzında göründü.

– Prokuror Atamoğlanov yoldaş gəlmək istəyir!

– Buyursun! – deyə Vahidov karandaşı stolun üstünə atdı.

Mehman daxil oldu, Vahidova əl verib, onun əlini möhkəm-möhkəm sıxdı, Vahidov ona yer göstərdi. Belə bir səmimi görüş Kamilova yaman toxundu, elə bil bir qayıq ona sancılıb, yeddi qatından keçdi. O, ağappaq ağardı. Mehman Bakıya gedərkən Vahidovun onu dəmiryola qədər öz maşınında yola salmağı sanki Kamilovun qaysaqlanmış yarasını cırmaqlayıb təzələdi. Buna görə Kamilov titrəyən barmaqlarının ucunu Mehmana könülsüz olaraq uzatdı. Mehman yenə də öz əlinin içində barmaqlardan artıq, xəmirə oxşar bir şeyin birləşdiyini hiss etdi.

– Salam, – deyə Kamilov dilləndi, elə bil, bu söz onun ağzından çıxıb, gərəksiz bir şey kimi yerə düşdü. Mehman bu soyuq münasibəti hiss etdi. "Eyib etməz" – deyə o, Kamilovun etinasızlığına qarşı sadəcə cavab verdi. Komsomol komitəsi katibi Əhmədov da Mehmanla görüşüb Vahidovun nəzərdən keçirdiyi, qeydlər etdiyi iş planını aldı.

– Bütün qeydlərinizi nəzərə alarıq, – deyə komsomol katibi təşəkkür etdi, sonra bloknotunu nəzərdən keçirib, altından qoşa cızıq çəkdiyi bir məsələni də Vahidovun qarşısında qoymaq istədi.

– Axırıncı xahişimiz, yoldaş Vahidov, budur ki, – deyə Əhmədov raykom katibinə müraciət etdi, – bizim nəzəri hazırlıqlı partiyaçılarımız, gərək komsomolun siyasi təhsil və tərbiyə işlərinə ciddi fikir versinlər!

– Təklifiniz bu barədə nədir, yoldaş Əhmədov? – deyə Vahidov soruşdu.

– Təklifimiz, yəni xahişimiz budur ki, yoldaş Vahidov, gərək bizim rəhbər işçilər komsomol yığıncaqlarında, kommunist əxlaq və şüuru haqqında nəzəri məruzələrdə bulunsunlar! Bu növ ilə komsomolun siyasi təhsil-tərbiyə işləri bizim partiya təşkilatının diqqət mərkəzində dayansın!..

– Doğru sözdür, – deyə Vahidov etiraf edərək əlavə etdi. – Həm də komsomolda olmayan gənclərin tərbiyəsinə, siyasi təliminə ciddi fikir verilməlidir!.. Mən sizin iş planınızda bu cəhəti də ayrıca qeyd etmişəm.

– Bəli, – deyə komsomol komitəsi katibi, Vahidovun qeydlərinə baxıb barmağını iş planında qoşa cızıq üzrə apardı. – "Xüsusən gənc qızların təhsil-təlimi".

– Agitprop gərəkdir, agitprop, bala! – deyə Kamilov söhbətə müdaxilə edib öz sarsılan hünərini özlüyündə bir daha yoxlamaq üçün, münaqişəyə girişdi. – Təbliğat müdiri o Cəlalzadə, axı nə danışandır?.. O, hər kəlməni deyəndə bir dəfə boğazını arıtlayıb, sözünü saqqız kimi çeynəyir!

– Cəlalzadə çox bilikli yoldaşdır! – deyə komsomol komitəsi, Kamilova cavab qaytardı. – Sakit danışan, adamı yaxşı-yaxşı başa salandır! Yoxsa kommunxoz müdiri kimi dəhnəni düzəltmədən, boş-boşuna basıb bağlamaq kimə gərəkdir? – Kamilov, kommunxoz işini araya gətirmək istəməyərək, yenə də Əhmədova dost saydığı Calalzadəyə tərəf hücum edərək:

– Təbliğatçıda ağız gərəkdir, – dedi, – alovlu bir dil, oğul!

– Calalzadə sakit və mahir təbliğatçıdır, – deyə Vahidov atmacalı cavab verdi. Ancaq ki, hayı-küyü, bağırtısı yoxdur! Necə deyərlər, onun boğazı bəzi para adamın boğazı kimi kotanla açılmamışdır!

Kamilov Murtuzovun son xəbərlərini xatırlayaraq, həm də Vahidovun bu tutarlı sözü müqabilində udqundu. Raykom katibi əlavə etdi:

– Biz Calalzadə özü burada olan zaman, üzbəüz onun sözünü danışa bilərik!

– Doğrudur, – deyə Əhmədov raykom katibinin sözünə yenə qüvvət verdi. – Bolşevik gərək hər nöqsanı üzə desin!

Vahidov Kamilovu təkrarən dərindən süzüb ayağa qalxdı, stulu stol tərəfə itələyib yuxarıdan ona söykəndi:

– Tərbiyə işi, təbliğat işi tək bir şöbə müdiri Calalzadənin yox, bütün partiya fəallarının işi olmalıdır, – deyə Vahidov divara vurulmuş rayon xəritəsinə nəzər salıb, yavaş-yavaş ona yaxınlaşdı, şəhadət barmağını burada gəzdirə-gəzdirə:

– Nə bu şəlalə altında tikilən elektrik stansiyası, – deyə o göstərdi: – nə, bax, bu kəndlərdə tikilən məktəb binaları, nə də dağlararası çəkilən yollar, hətta sıldırım qayalıqlar arasında gedən mədən kəşfiyyatı işlərini bizim gündəlik təbliğat-təşviqat işlərindən aralı saymaq olmaz!.. – Vahidov işarələrlə dolu rayon xəritəsi üzərində dayandı. – İnqilabi nəzəri bilik, sönməz, güclü bir məşəl kimi dağlararası kəndlərdəki quruculuq işlərimizi işıqlandırmalıdır!.. Nəinki tək partiya təbliğatçı, təşviqatçılarını, hətta müəllim, həkim, aqronom qüvvəsini də bu quruculuq işlərimizin mühazirəçilərinə, onların alovlu təbliğatçılarına çevirmək gərəkdir!

– Bəli, əlbəttə! – deyə komsomol katibi Əhmədov xəritəyə tərəf maraqla boylanıb, öz fikrini izah etdi. – Təhsil-təlim işi bizim gənclik üçün günəş, hava, su qədər gərəkdir!.. Rayonun bütün kəndlərindən bizim gənclər elmə, biliyə can atır! Keçən il bu dağlar arasından iyirmi nəfərdən yuxarı, Bakıya ali təhsilə adam göndərmişik!.. Bunların içərisində birinci dəfədir ki, buradan beş nəfər qız da ali təhsil almağa gedibdir!..

– Bax belə, çox gözəl! – deyə Vahidov xəritə qabağından dönüb stula söykəndi. – Bu təhsil ilinin axırında gərək iki o qədər də göndərək, yoldaş Əhmədov!

– Əgər öz yerindən çıxan öz yuvasına qayıtsa, – deyə Kamilov Vahidovun tərtib etdirdiyi rayon xəritəsinə tərəf iştibahla baxıb fısıldadı. – Hamısı da şəhərdə qalır, o dənizqırağı bulvarda, Bakıda!

– Bakı da bizimdir, Şəki də, – deyə Vahidov daha böyük bir xəritənin qabağına yeridi. – Bax, Moskva!.. Bu böyük bir məmləkətin hər yeri bizimdir!.. Əgər o böyük şəhərlərdə qalan bir gənc elmi biliklə məşğul olursa, eyni zamanda o bizim bu ucqarlarda da xidmət etmiş olur!..

– Bəli, əsl mənasında elədir! – deyə bayaqdan Vahidovu sakit-sakit dinləyən Mehman raykom katibinin sözlərini təsdiq etdi. – Heç bir zaman elmi işi həyatdan, həyati işi elmi işdən qoparmaq olmaz!

– Bəli, indi şəhərlə kənd yeni əsas üzərindədir, doğma bir gözdədir, – Vahidov dönüb qayıtdı və Mehmanın dediyini təqdir etdi. – Daha şəhər kənd üçün ögey, yaxud kənd şəhər üçün bir "çöllü" deyildir! İndi, ötənlərdə olduğu kimi, çöllünü barmağına dolayıb – "ay xoruz vay xoruz!" deyib rastabazar uzunu ağız-ağıza bağıran tacirlər yoxdur! İndi şəhər kəndlərə maşın, işıq və yaraşıq verir!.. Bax, bizim mühazirəçilər, təşviqatçılar bu maddi əyani vəsaitlərdən istifadə edib, bizim gün kimi həqiqəti hər kəsə apaydın göstərməlidirlər!

Vahidov, axan bir xəyal və yüksəlişə gedən bir arzu içində danışa-danışa dönüb Mehmana yaxınlaşdı, əlini onun çiyninə qoyub:

– Onu bilmək lazımdır ki, biz sinfi düşmən üzərində dönməz qələbə çalsaq da, yenə onun qalıqları bizə əngəl törətmək, hətta o köhnə dünyanın tör-töküntüsünü insanların şüurunda yaşatmaqla, bizim inkişafımızın sürətinə müqavimət göstərmək istəyirlər! Buna görə də şüura təsir edən təbliğat-təşviqat işlərini gücləndirmək, nəinki şöbə müdiri Calalzadənin vəzifəsidir, bizim hamımızın, o cümlədən prokurorun özünün də gündəlik vəzifəsidir!

– Mən lap o Calalzadənin eyiblərini öz gözünün içinə, şax söyləyərəm! – deyə Kamilov üzünü Mehman tərəfə tutub əlavə etdi: – Doğrudur, təbliğat hamının işidir, ancaq hər kəsin maaş cədvəlində bir imzası var, ya yox?.. Mən lap o Calalzadənin nəinki gözünə, lap bəbəyinin ortasına deyərəm ki, bizim bu rayonda təbliğat işi bərbad haldadır! Yoxsa düzünü demək yaramır, balam?!.

– Daşan tökülər, – deyə Vahidov səsini, öz yan-yörəsini cırmaqlayan Kamilovun üstünə qaldırdı. – Özün bir iş görmədən başqalarının zəhmətini lax bir yumurtaya çevirib divara çırpmaq kifayətdir, Kamilov! Don-Kixot kimi yel dəyirmanı ilə buynuzlaşmaq olmaz!

– Sözün doğrusunu demək buynuzlaşmaqsa mən bilmirəm, yoldaş Mərdan?..

– "Sözün doğrusunu deməklə" ancaq öz nüfuzunu saxlamaq üçün daim başqalarına qara yaxıb onları borclu çıxarmaq, diligödək, gözükölgəli etmək heç də yaramaz!..

– Daşan tökülər! – deyə Vahidov gəzindi. – Dolan mütləq tökülər!..

– Sözün doğrusunu demək buynuzlaşmaqdansa, daşmaqsa, dolmaqsa...

– Özü də yeniliyin qabağını almaq, onu ikiəlli boğmaq deməkdir!

– Onda biz əldən düşüb geriyə qalmışıq ki!.. Ona-buna qara yaxıb özümüz özümüzü qalaylayıb parıldadırmışıq ki?!

– Çünki fikir köhnəlib, baş dayanıb, mənəvi bir çürüntü beyindən başlayıbdır!

– Baş, çürüntü, ya yel dəyirmanı deyir ki, yoldaş Mərdan, sən dünən yumurtadan çıxan cücəni mənim başıma çıxarma, mən ağırlıqda dağı da büdrəyən bir yabı belinə qaldırıb gəzdir, onu-bunu maşına mindirib yelləndir?

– Sizdən maşın əsirgəyən olmamışdır, Kamilov!

– Mənim maşınım köhnəlib dayanandan bəri, bu barədə heç mənə bir kəlmə də deyən olmamışdır!

– Dolan tökülər! – Vahidov otaq boyu var-gəl edir, onun qəti addımlarının səsi eşidilirdi. – Daşan tökülər!..

– Mənə hədə-hərbə gəlməyin, yoldaş Vahidov, mən nə daşmamışam, nə də tökülməmişəm! Mən polislərə, jandarmlara yumruq-yumruğa döyüşən bir adamam!

– Sizin tərcümeyi-halınızı oxumuşuq! – Bəs siz niyə belə bir hörmətli adamı "yel dəyirmanı" tozanağına basırsınız, Mərdan?

– "Qudurmuş əyana" öz yerini göstərmək gərəkdir! – deyə Vahidovun gözləri küncə tərəf zilləndi. – Əsl öz yerini!

– Mən nə sən deyən, nə də əyan deyiləm, Mərdan!

– Siz indi daha dəhşətli pozulmuşsunuz! Siz indi qızınız yaşda Zərrintacla toy büsatı qurub neçə il hələ bundan qabaq öz ailənizi uçurub dağıtmışsınız!..

– Axı bunun buraya nə dəxli?

– Mən bir partiya komitəsi katibi kimi, sizi intizama çağırıram!

Kamilov qara şirli qalstukunu çıxarıb bir papiros götürdü, giliz tərəfini üstü şəkilli qutusunun qapağına döyüb, sonra damağına aldı və Mehmana tərəf çevrildi:

– Siz araya girməyin, bala! – deyə o, papirosunun tüstüsünü səqfə doğru üfürdü. – Siz bilirsinizmi, heç bir zaman "fili cələyə salmaq olmaz".

Vahidov Kamilova tərəf əlini yelləyib:

– Dəvə oynayanda qar yağar, – dedi. – Fil cələyə düşməsə də!

Bu misallar Kamilovu karıxdırdı. Vahidov mühazirə mövzularını araşdırdı, nəhayət, onun mənəviyyatı haqqında məruzə etməyin vacib olduğunu irəli sürdü.

– Yoldaş Mehman belə məruzəni etməyə necə baxır?

– On beş gündən sonra mən bu məruzəni etməyə söz verirəm, yoldaş Vahidov!

Komsomol komitəsinin katibi Əhmədov ayağa durub:

– Mən xahiş edirəm ki, yoldaş Mehman bu məruzəni üç gündən sonra etsin!

– Belə təcili məruzəni mən bacarmaram, yoldaş Əhmədov!

– Gördünüzmü, yoldaş Vahidov, iş nağda gələndə, necə də bu gün-sabaha düşür?..

– On altıncı gün olsun, – deyə Vahidov qət etdi. – Ancaq məruzə yüksək keyfiyyətdə olsun... Mən burada yeni sovet adamını deyəndə, birinci növbədə bizim gəncliyi nəzərdə tuturam. Burada, bir mühazirəçi kimi, tərbiyə, əxlaq haqqında müfəssəl danışmağınızı xahiş edirəm!

– Mən bu kluba beş yüzdən yuxarı komsomol toplayacağıma söz verirəm, – deyə Əhmədov vəd etdi.

Vahidov:

– Yalnız komsomolçuları yox, bitərəf gəncləri də, – dedi. – Komsomol bizim gəncliyin qabaqcıl dəstəsidir!.. Qabaqcıl dəstə isə heç zaman kütləni unuda bilməz!

– Çox doğru sözdür, bitərəf gəncləri də cəlb edirik, kəndlərdən, kolxozlardan çağırarıq, çoxlu-çoxlu!

Kamilov qəzəbdənmi, ya boğulduğundanmı dinmədi. Əhmədov ayağa durub getmək üçün Vahidovdan icazə aldı, otaqdan çıxıb getdi.

## XLVII

Kamilov yenə də üstü şəkilli qutusunu çıxarıb bir papiros da çəkdi, boz tüstüsünü üzüyuxarı səqfə doğru buraxdı. Demək, Kamilov münaqişəyə girib, hər kimə bir söz demək istəyirsə, o, Vahidovu əsəbiləşdirir, acığını tutdururdu. Kamilov münasibətləri seçməyə çalışır, bu son neçə gün ərzində, ürəyinin bərk sıxılmağının səbəbini özü üçün aydın etmək istəyirdi. Görünür, Kamilov özünü yuxarıya çəkərək Sərrafzadə kimisi ilə bağlanmaqla, Murtuzov kimisini özünə əlaltı etməklə, Qaloşlu adama hüsn-təvəccöh göstərməklə bu qaynar, mübariz hərəkətdən yavaş-yavaş qopub aralanmış, bəlkə də özünü bu hərəkətə qarşı qoymuşdu! Öz xudpəsəndlik mərəzi ilə yaşayıb, gözü yan-yörəsini seçməyən Kamilov, indi daha özünü təklənən görürdü. Onun komsomol komitəsi katibi Əhmədova, təbliğat şöbə müdiri Calalzadə haqqında dediyi sözlərin Vahidov tərəfindən geriyə qaytarılması, indi də elə bil ki, bir top kimi Kamilovun başına dəyirdi! Bu danışığın son dəqiqələrində Vahidov əlini yelləyərək Zərrintacla bağlanmaqda onu müttəhim etmiş, "dəvə oynayanda qar yağar" demişdi... "Bu dəvə kimdir, bu qar nədir?" – Kamilov öz papirosunu çeynəyə-çeynəyə sümürür, sanki güclü bir qarın başına ələndiyini görürdü. Kamilov düşündükcə gizli, giziltili bir üşütmə onun əsəbiləşən vücudunda atlı qarışqa kimi gəzinirdi. Sanki Kamilov qorxunc bir qızdırma keçirir, ağızdolusu əsnəyib ayılmaq üçün vaxt gözləyirdi... Axı, Kamilov öz ömründə az-çox bərkdən-boşdan çıxmışdı?.. İndi birdən-birə o, tərk-silah olub öz boynunu əyə bilərdimi?.. Kamilov papiros çəkə-çəkə çalxanırdı. – İndi görəsən, Vahidovun kabinetindən əli dəstavüzlü çıxan Əhmədov, bu söhbəti bu şəhərdə kimə, hətta telefonla bütün kəndlərə necə yayacaq, bu danışıq üç mindən yuxarı

komsomolun dilində görəsən necə dolanacaqdır?.. Görəsən, hələ bu kabinetdəki deyişmə və bozarışma hansı ucqar kəndlərə çatacaq? Oralarda nələr danışılacaqdır?.. Bəs niyə belə olur?.. – deyə Kamilov özlüyündə axtarış edirdi. – Bəli, onlar mənə qarşıdır, – deyə o, qaşqabağını sallayıb fikirləşirdi. – Üstüörtülü bir narazılıq olsa da, görünür ki, bunların hamısı bu teliburma prokurorun, o Salamatov kimilər haqqında olan qərarları qurdalayıb tərpətməyindən, həbsxananın ağzını açıb elələrini sərbəst buraxmağından, fağır Murtuzov demiş, yorulub usanmadan bu işləri qurcalamağından üzə çıxmışdır?.. "Fili cələyə salmaq olmaz!" – Bu sükut zamanı Kamilovun fikri çözələnib dolanır, papirosundan uzanan boz tüstü içində gəzinirdi. – Bəli, bu bir cələdir!.. Ancaq Kamilov bir fil, bütün bu əhvalatlar da bir cələdirmi?.. Yox, əsla yox!.. – Kamilov papirosunu sümürdükcə, duman kimi boz tüstü onun başı üzərində dolandıqca o öz vəziyyətinin ağırlaşdığını, nəfəsinin təngləşdiyini hiss edirdi. İrəlicə ona elə gəlirdi ki, daha Kamilov barəsində bir dil tərpədib heç bir söz demək olmaz!.. Bəli, lap az qala ki, Kamilovsuz bu dağlara belə gün çıxmazdı?!. Ancaq gör indi iş nə yerə çıxıb ki, yollar belə haçalanıbdır?.. Axı, deyəsən, indi Kamilov, öz sınıq-salxaq dəstəsi ilə sürətlə gedən böyük bir axından qoparılıb bir kənara atılıbdır?! – Kamilov papirosunu çəkə-çəkə dönüb Vahidovun başı üzərindən asılan rayon xəritəsinə baxdı, udqunub özünə bir sual verdi: "Bəs bu neçə ildə mənim burada işim nə olmuşdur?" – Onun qulağına ancaq öz bağırtısı gəlirdi... Hərə bir iş görmüşdür! O isə hey bağırmış, bu bağırtılar içində də bu dağgövdəli adama hamıdan artıq bir iş gördüyünü güman etmişdi. İndi işdən qaçmaq, aralanmaq, bir kənara tullanıb atılmaq qorxusu onun qabağına çıxınca soyuq bir üşütmə keçirir, görürdü ki, o, nəinki qurub-yaradan qaynar adamlardan, hətta iş yerlərindən, bu təbiətin özündən belə qopub aralanmışdır!.. Bəs Kamilov bu iş yerlərinə getməmişdirmi? Getmişdir, az da yox, çox getmişdir! Ancaq bəs Kamilov bu iş yerlərində nə etmişdir?.. O, burada bir kəsi dinləmədən söyüb-söylənmiş; çığır-bağır salmış, şişə-şişə, köpə-köpə oradan geriyə dönmüşdü. Kamilov öz gövdəsini xəyali bir sürətlə gözləri qabağından keçirib, sanki özünü olduğu kimi birinci dəfə görürdü. Lakin bu hal Kamilov üçün çox müdhiş görünürdü... Kamilov elə güman edirdi ki, bu həqiqət bir məngənə kimi onu sıxcalayır, bəlkə də onu heç eşitmək istəmirdi!.. – Getməyinə mən getmişəm, bəs necə ola bilər ki, mən Kamilov, heç bir şey etməmişəm?!. Heç ola bilməz ki, mən heç bir şey etməyim?! Görünür, bu özü də məni gözügötürməyənlərin, mənim bədxahlarımın sözləri-

dir ki, mənim özümü belə öz gözümdən salmaq istəyirlər?!. "Bağça müdirəsi Zərrintac Sərrafzadə sənin qızın yerindədir!" Azdımı belə cavan gəlin alanlar? "Qocalıqda yorğalıq", balam, kimə nə? Bu paxıllıq kimin ürəyinə nə azar salıbdır?.. Görün heç bu da bir işdirmi?.. Cavan arvad alanlara, "dəvə oynayanda qar yağar" desən, onda nəinki qışda, yayın qızmar günlərində də göydən gələn ağ papaqlamalar kəsməz!.. – Kamilovun fikri xəyal surətinə çevrilir, öz ailəsinə tərəf dönürdü, o düşünürdü. – "Onlar bir neçə aydan sonra yenə də bura yaylağa gələndə mənə nə deyərlər?.. Deməzlərmi ki, baba, bu nə əhvalatdır?.. Bəs mənim qızlarım?.. Bu Zərrintaca onlar nə cür baxarlar?.. Deməzlərmi ki, atacan, niyə bəs, belə?.. Hər nə cür baxsalar, hər nə desələr, qoy onlar bu aləmə göz gəzdirib barmaqlarını qaldırıb göstərsinlər ki, mən təkəm! Bir də günah öz deyingən analarında olub ki, külfəti söküb-dağıdıb, özü də hirs-hikkəsindən torpağa gedibdir... – Kamilovun gözləri Vahidovun stol üstündə açıq qoyduğu "Hophopnaməyə" zilləndi.

"Dudkeş kimi bir papaq başında,
Lap çox qocadır, babam yaşında..."

"Yox, bu sözlərin indiyə nə dəxli? Yox, bu, altı pudluq Zərrintac, rəhmətlik Mirzə Ələkbərin göstərdiyi kimi, ağzından süd qoxusu gələn bir kukla-gəlin deyildir!.. Əbəs yerə Mərdan qızışanda, öz əlini bu kitaba atmaq, açıb oxumaq istədi. Ancaq hər şeyi beləcə şişirdirlər!.. Heç o ötüb keçmişin mənim bugünkü ailə vəziyyətimə nə dəxli? "Köhnəlmisən, geriyə qalmısan", niyə geriyə qalmışam, balam? Niyə sən yox, mən?.. Görünür, burada bir dolaşıq var. Bir qurğu var, ayrı cür bir şey yoxdur. – Kamilov ikinci papirosu götürüb birinci papirosunun oduna yandırdı, yenə əyləşib mütaliə edənlərə göz gəzdirdi. Vahidov da, Mehman da başlarını aşağı salıb qabaqlarında açdıqları kağızları oxuyur, lazımi yerlərə cızıq çəkirdilər. – Bunlar mənim əleyhimə düzələn yazılar olmasınmı?.. Necə edim ki, qıraqdan görüm nə yazıblar, şübhədən çıxım?.. Yox, bunların hamısı mənim əleyhimə hazırlanan sənədlərdir! Yoxsa söhbəti dayandırıb bu kağızlara belə səssizcə baxardılarmı?.. Yaxşı, mən olmasam, onda burada məni əvəz edən kim olar? – Birdənbirə Kamilovun beynində bu sual doğdu, gözləri qabağında bu cavab dayandı. – Heç kim, heç kəs!.. Bəs Vahidov mənə güc gəlsə, onda sədr kim ola bilər?.. Kim prezidium iclası apara bilər?.. Heç kim, heç kəs!.. Deyək ki, lap güc gəlsə, onda necə?" Kamilovun gözləri otağı dolandı,

Cabbarzadə ilə Cəlilov onun gözləri qabağında yan-yana dayandı. Kamilov özünə baxdı. – "Onların ikisini də bir-birinə qatıb yoğursan, yenə də mənim yarım çıxmaz, – deyə onun dodaqları qaçdı... – Onların ikisi hələ nazik şivə oxşayır; iyirmi səkkiz-otuz yaşlı adamlardır. Demək, Sovet hökuməti qurulanda bunların hər birisinin neçə yaşı varmış?.. Bəlkə komsomolda da yoxmuşlar!.. Amma nədi?.. Heç belə şeymi olar? Necə ola bilər ki, on beş il at üstündə mürgüləyəsən, indi piyadalanıb uzaqdan buraya boylanasan? Ancaq o vaxtlar mənim qılıncımın dalı da kəsərdi, qabağı da... İndi bəs necə?.. – deyə Kamilov sürətlə mətləbdən keçirdi. – "Kitab oxumur, dəftər oxumur" deyirlər. Niyə, bəs bu yuxarıdan gələn kağızlara kim baxır? Kim bu kağızların qulağında yazı yazır?.. Əgər mənim öz yazı fikrim olmasa, o qızbənizli Kamal heç bircə barmaq kağız yaza bilərmi? "Hansı kitabı oxumusan? – Kamilov öz-özünə sual verdi, onun gözləri öz evindəki üst-üstə qalaqlanmış kitablarda, icraiyyə komitəsinin özündəki kitab şkaflarında gəzdi, o heç bir kitab göstərə bilmədi, götürüb bir kənara qoya bilmədi... – Bax, o kitabı mən açmışam, bu kitabı vərəqləmişəm, o biri kitabdan bir səhifə oxumuşam, yuxum gələndə başımın altına qoymuşam, bir ay bu kitab mənim yastığımın altında əzilibdir, ancaq macal olmayıbdır... Belədirmi?.. Bunun bugünkü söhbətlərə nə dəxli? Axı, nə olsun, oxumamışam? Hər şeyi bilirəm ki... Görünür, mən zorbalıqda adamı günün günortaçağı qara-qura basır, əsəbilik mənim taqətimi kəsir, mən də asanlıqla bu meydanı tərk etmək istəyirəm?! Yox, heç bir zaman!.. Bütün bu fikirlər mənim bədxahlarımın fikirləridir ki, orda-burda o qədər deyib-danışıb, ağızdan-ağıza yayıblar ki, axırda mənim öz başımda da damcı-damcı doldurublar, guya ki, mən geri qalmışam, əyan, filan və peşməkan olmuşam?!".

"Siz özünüz geri qalmısınız". – deyə Kamilov şirli qutudan üçüncü papiros çıxarıb ikincisinin oduna yandırdı... Altdan-altdan baxan Vahidov Kamilovun bütün hərəkətlərinə göz qoyur, onun ah-ufunu duyurdu: "Bəlkə Kamilov öz hərəkətlərindən peşmandır?.. Bəlkə o, içəridən tərk-silah olur!.." – Mehman da Kamilovu nəzərindən qaçırmırdı. Arada-bir onların baxışları bir-biri ilə toqquşurdu. Axırıncı bir baxışda Kamilov sanki ona: "Bütün bu işləri doğuran sən, dünənki uşaq, sən oldun!" – deyirdi. Kamilov papirosunu sümürüb tüstüsünü dodaqları arasından yuxarı buraxdı: – "Yox, belə tirtap olub üzüqoylu uzanmaq, dibindən uçan bir dağ kimi zəlzələyə düşüb dağılmaq, neçə yüz ilin qollu-qanadlı bir palıdı kimi, kökündən qopub yerə sərilmək olmaz!" – Kamilov ayağa durub, özünü sınayır kimi tərpəndi, divardan asılmış rayon xəritəsinə tərəf ağır-

ağır addımlarla yeridi. “– Vahidov bu xəritəni düzəldib ki, elə bütün işləri də öz ayağına yazsın!.. Sabah mən o portfelli mühəndisi çağırıb bundan da iri bir kart düzəltdirərəm, deyərəm ki, mənə də belə bir kart çək, vəssalam! Əvvəlcə mən özüm planını ağ kağızda çəkərəm, sonra deyərəm çıxart çeşnisini!.. Xalq gördüyü işi gözə verə bilər, mən yox!.. Nə iş görmüsən? – Nə iş görməmişəm?!. Görün bu da heç bir sualdır, yəni? Əgər mən bu neçə ildə boş-boşuna danışmışamsa, bəs bütün bu işləri kim hərəkətə gətiribdir? – Kamilov öz qollarına baxdı, əsnəyib ağzını çuval kimi açdı. Onun ağ, qıvrımtüklü sinəsi hava ilə dolub boşaldı.

Bu zaman ara qapı açıldı, xüsusi şöbə müdiri əlində şifr teleqram içəri girdi. Vahidov teleqramı alıb oxudu... Burada Kamilovun işdən kənar edilib mərkəzin sərəncamına çağırılması, onun yerinə isə rayon fəallarından bir nəfər namizədin verilməsi göstərilirdi. Vahidov bir neçə dəqiqə bayaqkı qayda üzrə sədrliyə yeni namizədlər haqqında düşündü. – “Cabbarzadəmi, ya Cəlilovmu?” O, hər ikisinin adını öz bloknotuna yazdı, ətraflı fikirləşmək üçün bloknotu örtdü. – “Hər ikisi də yüz dəfə bu “əyan” dan yaxşıdır”, – deyə Vahidov teleqramı Kamilovun özünə uzatdı. Kamilov teleqramı alıb bir neçə dəfə hərf-hərf oxudu. İsti bir tər, çeşmə kimi göz verib, onu tamamən bürüdü. O, gözlərinə inanmırmış kimi teleqramı gözləri qabağına bir daha gətirdi, daha heç bir hərf görə bilmədən geriyə qaytardı.

– Nə eybi var? – deyə Kamilov dərindən köks ötürüb dilləndi. – Bizim də bəlkə bir sözümüz oldu, nə eybi var?..

Vahidov mərkəzin bu qərarından razı qalmaqla, başqa işlərə keçmək üçün başını qaldırıb Mehmandan soruşdu:

– Deyirəm, söhbəti qurtaraq? Bəs o nədir, o qalın iş?

– Bağça müdirəsi Zərrintac Sərrafzadənin işidir!

– Sərrafzadənin işi?! Cabirov sizə adladıbdır?

– Bəli, Sərrafzadə Zərrintac məsuliyyətə cəlb olunur, yoldaş Vahidov!

– Axı kişi təzə toy eləyib, – deyə Vahidov acınacaqlı bir nəzərlə Kamilovu süzdü.

– Mən də heç belə istəməzdim, ancaq təəssüf ki, belədir, yoldaş Vahidov!

– Fikriniz nədir, prokuror?

– Müqəssiri məsuliyyətə cəlb etmək, qanun üzrə hərəkət etməkdir. Çünki bizim sovet qanunu müqəddəsdir, onun qarşısında bütün vətəndaşlar tutduqları vəzifələrindən asılı olmayaraq, eyni dərəcədə məsuldurlar!

– Arvadımızı da əlimizdən almaq? – deyə Kamilov tər yandıran gözlərini əlində saxladığı dəsmalla sildi.

– Siz özünüz bilməliydiniz, "dəvə oynayanda necə qar yağar?" – Vahidov bayaqkı misalını bir daha təkrar edib əlavə etdi. – Taylı-tayın tapmasa, pis keçər axır günü!"

– Bəlkə məni də bir məsuliyyətə alasınız?

– İşdə qanuni əsaslar olduqda, hər bir vətəndaş qanun qabağında eyni dərəcədə məsuldur!.. – deyə Mehman pörtüb, pırçım-pırçım tər tökən Kamilova cavab verdi.

– Olsun, nə olar olsun! – Kamilovun dili dolaşdı. – Mən, indi bu neçə ildə bir vedrə ilə gedirəmsə, görün siz özünüz bir ildən sonra neçə vedrə ilə gedəcəksiniz?

Kamilov əllərini stola dayayıb ayağa qalxdı; onun ağzı birdən köpükləndi, beyninə qan vurmuş kimi xırıltılı bir səslə:

– Biz də bu aləm uğrunda az qılınc çalmamışıq, – dedi. – Biz də az can çürütməmişik. – Kamilov bu sözləri desə də, Vahidovun baxışlarından çəkindi, o, Mehmana tərəf qayıtdı.

– Bala, sən hələ yumurtadan təzə çıxmış bir yeni cücəsən, amma özünü şişirdib mənim gözümdə bir əjdahaya oxşatma ha!.. Heç belə də şeymi olar? Çağırmamış, üzbəüz yoxlamamış, neçə ilin Fərhad kimi külüng çalanını vəzifədən geri çağırsınlar, hə?..

– Bu neçə ildə qanunla oynamaq sizə nə qədər asan olubsa, indi görün bu oyundan çıxmaq sizə nə qədər çətin olacaqdır! – deyə Kamilova cavab qaytardı.

– Mən nə etmişəm, bala? – deyə Kamilov iki əlini də açıb irəli uzatdı, – yol kəsmişəm, poçt dağıtmışam?

– Bunların heç birisini etməmişsiniz!..

– Bəs onda?.. Bəs onda, oğul?..

– Çoxlu-çoxlu qanunsuz hərəkət etmişsiniz! Mən də həmin sənədləri qaldırıb adi orqanlara çatdırmışam!

– Axı adi orqanlar bir məndən soruşmazmı belə filan, hə?

– Sənədlər heç bir şübhə doğurmadığı halda, artıq sorğuya ehtiyac yox idi!

– Belə çıxır ki, kiminsə öyrətməsi ilə siz quyunu, öz atanız yerində bir qocanı salmaq üçün qızmışsınız, hə?

– Heç bir kəsin öyrətməsi ilə, mən heç kəsə quyu qazmamışam! Mən ancaq öz qanuni borcumu yerinə yetirmişəm, nə artıq, nə də əskik!

– Bəs yoldaş Vahidov? Bəs bu böyüklükdə, burada duran kişi? Bəs bu məsləhət-məşvərət? – Kamilov sanki üzü üstə düşüb bir az əvvəlki cod hərəkətləri üçün Vahidovdan bağışlanmasını istəyir, partiya biletini itirəcəyinin vahiməsini keçirir, Zərrintac xanımla etdiyi toyun bir yasa çevrilmək mənzərəsini görürdü. – Mən bu böyük ştabın, qoca da olsam, balaca bir əsgəriyəm, yoldaş Mərdan! – Kamilov birtəhərlə bu vəziyyətdən çıxmağa əl atdı. – Mənim beynim kürə kimi qızışmışdır, indi mən üzr istəyirəm, – Kamilov danışa-danışa hirsindən avazıdı:

– Bir stəkan su istəyirəm!

Vahidov qrafindən stəkana su töküb ona verdi. Kamilov qurtaqurt içib qaytardı.

– Bir stəkan da, xahiş edirəm, Mərdan!

Vahidov ikinci dəfə stəkanı su ilə doldurdu. Kamilov bu stəkanı da boşaldıb Mehmana tərəf çevrildi.

– Divin canı şüşədə olan kimi, mənim də canım bu ştabdadır, – deyə o üzünü Vahidova tərəf döndərdi. – Ancaq siz prokuror kimilərinə gələndə, mən sizi də, dünyanı da öz buynuzlarıma götürə bilərəm ha!.. “Dəvəyə navala bir şey deyildir!” deyiblər.

– Dünyanı buynuzlarına götürmək, ya o kütü – navalanı udmaq yox, hələ ki, qanunsuz qərarları çıxarmaq, qanunu təhrif etmək üçün qanun qabağında cavab vermək lazım gələcəkdir!..

– Görürsünüzmü, yoldaş Vahidov – deyə Kamilov öz dərisini qorumaq üçün iri gövdəsi ilə sanki kəndir üstünə çıxırdı. – Atası yerində bir qocaya gör necə də amansız bir qılınc siviribdir, bizim bu oğlan!

– Mən yoldaş Mehmana haqq verirəm! – deyə Vahidov Kamilovun hiyləyə keçib vaxt udmaq üçün ora-buranı cırmaqlaması müqabilində qəti və aydın bir cavab verdi.

– Bəs bizə? Biz külüng çalan, əlində qabar qalan Fərhada?..

– Siz özünüz özünüzü itirmişsiniz, Kamilov!

– Səhvimi boynuma alıb bu əyri qərarlarımı özüm öz əlimlə dəyişdirsəm necə?

– Əgər səmərə versəydi, güzəştə getmək olardı!.. Ancaq deyərlər “qozbeli qəbir düzəldər!”

– Tamam təslim olsam necə? Çünki mən elə də “qozbel” olmamışam, Mərdan!

– Təslim olmaqla, on min manatların oğurluq və israfçılığı bağışlana bilməz! – deyə Mehman təzə dolmağa başlayan əlavə bir qovluğu götürüb stolun üstünə qoydu.

– Görünür, sən tamamən Şümür olmusan, bala!
– Mən inqilabi qanunçuluqdan danışıram!
– Bəs bağça işində mənim cinayətim nədir?
– Bağça müdirəsi Zərrintacla birlikdə kef küləyinə verdiyiniz yüz min manat dövlət pulu!
– Bəyəm bu bağça nə böyük bir dəvəymiş ki, mən də yüz min manatı bir dəvə navalası kimi udum, hə?
– Düz üç il içərisində bir yüz min? Əlli minini isə siz qeyri-qanuni yolla büdcədən bağçaya ötürmüşsünüz!
– Bunu da yuxarıya təqdim etmişsiniz?
– Xeyr, ancaq Salamatov kimiləri barədə olan qanunsuz qərarlarınızı təqdim etmişəm!
– Mən bilmirəm heç bu büdcədən əlli min necə pırtdayıb bağçaya düşübdür?
– Onu vətəndaş Kamilovdan ayrıca soruşacağıq!
– Mən nə yaman cinayətkar imişəm?! – deyə Kamilov qəribə bir gülüşlə qapıya yaxınlaşdı. – Vurun yıxılana baltanı!.. – O birtəhər qapını açdı. – Mən də, axır nəfəsdə, öz dişimə qılınc götürərəm!..

## XLVIII

Şəhər kənarındakı klub oğlanla dolmuşdu. Bu gün burada mühazirə olacaqdı. Komsomol komitəsinin katibi Əhmədov bu mühazirəyə qulaq asmaq üçün aktivdən ətraf kəndlərə göndərmiş, komsomolçularla birlikdə başqa gənclər də çağırtdırmışdı. O bu yığıncağı xüsusi səylə təşkil etmişdi. Əhmədov hamının toplandığını görərək salon tərəfdən pilləkən yuxarı səhnəyə qalxıb, stolun arxasına keçdi, əvvəlcə qırmızı örtüyü çəkişdirib onun ora-burasını düzəltdi, dolu su qrafinini ortadan bir kənara qoyub balaca zınqrovu əlinə alıb səsləndirdi:
– Yoldaşlar! – deyə komsomol katibi göz gəzdirib salonun diqqətini topladı, sonra əlini geriyə daranmış şəvə saçlarında gəzdirib səsini ucaltdı: – Bizim bugünkü mühazirəmiz yeni sovet adamının, daha doğrusu, gənclərimizin mənəvi saflığı haqqında olacaqdır!.. Ancaq mən, mühazirədən qabaq sizin bura toplanmağınızdan istifadə edərək, bir müqəddimə kimi, sizə bir neçə kəlmə demək istəyirdim!.. Bizim raykom komsomol, son zamanlar özünə görə bir neçə təşəbbüslər etmiş, gələcəkdə də edəcəkdir. – O, qrafindən stəkana su tökdü, içmədən bir kənara qoyub davam etdi. – Biz məhəlli təsərrüfat şöbəsinin, yəni kommunxozun işinə, mütəşəkkil surətdə, dörd yüz yetmiş nəfər gəncin ongünlük, sa-

bahdan axşama qədər fədakar köməyini düzəldib hov vermişik! Belə ki, stansiya arxını dəhnədən düzəldib, o sıldırım göy qayanı çarpanaq-çarpanaq çapıb, əbədilik daş novu salmışıq ki, su da o nova gəlir! Bizim komsomol da elə bir yoldaş olub ki, Fərhaddan da yaxşı külüng çalıbdır!.. Nədən ki, hər ilin selli baharında bu şəhər ayağı qıjıltılı çay köpüklənib kükrəyir, dağlar aşağı qollu-budaqlı ağacları süpürrəyib gətirir, bu dəhnəni də sil-süpür eləyib Araza aparır... Amma indi əgər bütün Qafqaz dağlarının seli toplanıb bura gəlsə, bu dəhnənin yanından qanadlı bir yel olub ötə bilməz? Niyə? Çünki bizim komsomol ordusu tər töküb zəhmət çəkmişdir! Niyə? Çünki demişik ki yoldaşlar, qoy bizim bu şəhərimizin gecəsi də gündüzü kimi çıraqban olsun!.. Qoy hər bir yandan kəndlər boylanıb bura baxanda görsünlər ki, doğrudan da bizim şəhərin gecəsi necə də çilçıraqban içində parıldaşır!..

– Doğrudur, düzdür! – deyə arxın dəhnəsində çalışan, bu gün burada toplanan gənclərdən bir dəstəsi guruldadı, səs salon boyu dalğa-dalğa yayıldı, romantik bir vüsətlə danışan Əhmədovu xüsusi bir şövq götürdü:

– Belədir, yoldaş komsomolçular! – deyə yenə də o, əli ilə saçlarını geriyə daradı. – Biz demişik ki, şəhərimizin gecəsi ulduzlu göy kimi yaraşıqlı olsun!

– Bizim Əhmədovun təbi gəlməsinmi?

– Şairliyi də var!..

– Deyir, yaman ədəbiyyatçıdır!

– Orada sakit! – deyə komsomol katibi asta gedən bu danışıqları eşitməsə də, başları bir-birinə yaxınlaşan gənclərə tərəf əlini uzatdı:

– Belə ki, yoldaşlar, biz istəyirik ki, indi bu ilin yazından başlamış, rayonumuza yaradıcı əmək təşəbbüsləri gətirilsin. Dağdan axıb gələn sulardan istifadə edilib, elektrik stansiyaları tikilişinə başlansın. Qoy bu qayalardan üzüaşağı ağara-ağara tökülən şəlalələr gələcəkdə daha havayı yerə axıb getməsin!.. Qoy lap neçə il çəksə də, bu işıq işinə hər yerdə möhkəm bir qədəm qoyulsun!.. Qoy bizim İliç lampaları hər bir ucqar dağ döşündəki kolxozun evinə girsin, orda dil açıb desin ki, mən, bir bəxt ulduzu kimi, əbədi olaraq sizin evinizi işıqlandırmağa gəlmişəm!..

Bütün salon, qəribə arzu və xəyal içində danışan gənc katibi diqqətlə dinləyir, qabaq cərgədə oturub, öz bloknotunu vərəqləyib qeydlərinə baxan Mehman məruzə üçün tələssə də, komsomol katibi öz giriş sözünü yarıda kəsmək istəmirdi:

– Belə ki, komsomolçu yoldaşlar, gərək işıq bu şəhərdən o kəndlərə yayılsın. Ayrı cür necə ola bilər? Bəs niyə biz, – komsomol katibi

əlini salona doğru uzatdı, – kommunxoz dura-dura, öz qollarımızı çirməyib, soyuq çaya girib sal-sal buzların arasında işləmişik? Biz demişik ki, qoy yaz selinin qıjıltısına qədər bu işıq dəhnəsi düzəlsin! Çünki siz bilirsiniz ki, neçə vaxt idi, bizim bu şəhərdə işıq kəsilmişdi. Doğrudur, bu, yaz selindən deyil, bu, ötən payız selindən olmuşdu, ancaq dəhnə uçubbatıb getmişdi. Baxanda stansiya suyu sovulmuş bir dəyirmanı andırırdı! Bəs kommunxoz nə eləyirdi? Onlar bu gün arxı alayarımçıq düzəldir, sabah dəhnə uçurdu. Niyə? Çünki yarımçıq iş yarıtmaz olur. İş gərək ürəkdən gəlsin, sinədən, bax belə!.. Bu gün də, elə bu barədə bizim sovet gəncinin bu yeni keyfiyyəti barəsində məruzə qoymuşuq! Özü də mühazirəçi bizim prokurordur. – Komsomol komitəsi katibi öz yaşıdı Mehmana tərəf baxıb sözü uzatdığı üçün, ondan üzr istəyir kimi, gülümsəyib davam etdi. – İttifaqdan kənar gəncləri də biz bu işə qoşduq! – Möhkəmcə, komsomolcasına hamımız işə girişdik! Fərhad kimi külüng çalıb, dediyim kimi, çayın üstündəki sıldırım göy qayanı parça-parça eləyib yardıq, belədir, elədik, ya eləmədik, yoldaşlar?

– Elədik! – deyə sakitləşən salon bir ağızdan eyni səslə guruldadı. Mehman öz məruzə materiallarını möhkəm tutub yerini rahatladı. İndi o öz yaşıdının qəribə müqəddiməsini dinləyir, o biri tərəfdən də öz məruzəsinin bu salona necə təsir edəcəyini düşünürdü. Mehman görürdü ki, hər hansı bir təzad və müqavimətə baxmayaraq, bu rayonda həyat qaynayır, qatlar qalxır, yeni qüvvələr işə qoşulur, onlar qurub-yaradır, güclü yaz selinin qabağına çıxır, yeni həyat işığını göy qayadan keçirir. “– Bəli, gələn qüvvə qalib, gedən qüvvə məğlub olacaqdır”, – deyə Mehman öz yazdığı bir vərəqi qaldırıb gözdən keçirtdi. Əhmədov məruzəçinin bu vəziyyətlə hesablaşdığından istifadə edərək, çapılan arx dəhnəsindən qopmur, fikrən onun ətrafında dolanır, sanki bu iş indi də axıb gedirdi.

– Buradakı bütün komsomolçular təsdiq edə bilərlər ki, o dəhnədən düzələn göy qayanın ortasından keçən arx uçmazdır, ömrü də yüz-yüz ildir, yoldaşlar! – Əhmədov əlini yuxarı qaldırdı. – Hə, bu xüsusi bir təşəbbüsdür, ya yox, uşaqlar? – O, stəkanı götürüb suyunu içdi, boş stəkanı bir də doldurdu. – Yaxşı, ikinci təşəbbüs nədir?.. İkinci təşəbbüsümüz “Daşqınçay” üstündən körpü salmaqdır!.. Sel zamanı, siz də bilirsiniz ki, bu “Daşqınçay” neçə adamı aparırdı?.. Biz, komsomolçular, görün ildə neçə nəfəri “Daşqınçay” selindən qurtarmışıq! Bu da özünə görə bir işdir, təşəbbüsdür, ya yox?

– Çox xeyirli bir işdir!

– Hələ bu körpülərdən çox salacağıq!

– Mən görülən işdən danışıram, – deyə katib yerdən danışanlara nəzər salıb barmağını qatladı. – Bir də, bizim kolxoz komsomolçuları neçə kəndə arx çəkmişlər?

– Düz altı kəndə!

– Qapılarda, həyətyanı yerlərdə göy-göyərti üçün bu da bir işdirmi? – Katib arada bir məruzəçiyə nəzər yetirdi, Mehman isə ümumi dalğalanma içərisində həyəcan keçirir, bu qədər adamın həyat quruculuğu naminə necə qaynadığını görürdü.

– Hə, yoldaş komsomolçular, bizim gənclər, – deyə Əhmədov davam etdi: – Bundan başqa, indi siz bilirsiniz ki, biz "Qalaçaçay" üstündən də körpü salmaq üçün bərk-bərk hazırlaşırıq!

– Qalaçaçay üstündən körpü lazımdır!

– Hamısı da birdən olmaz!..

– Birdən olmasa da, iş sürətlə aparılmalıdır!

– Yoldaşlar, yoldaşlar! – deyə Əhmədov öz sözünü yekunlaşdırmağa çalışdı. – Biz kəndarası yolları da düzəldirik! Bütün kənd, klub, qiraət komalarına rayon partiya komitəsinin göstərişi ilə kömək edib onları hamiliyə götürürük!.. Qaldı bizim sayıqlıq barəsində, onu da deyə bilərəm ki, nəinki bizim komsomolçularımız, hətta pionerlərimiz belə, kolxoz əmlakına xain gözlə baxan sinfi düşmən qalığının ifşasında az fəaliyyət göstərməmişlər!.. Hansı ki, indi məruzə edəcək yoldaş prokuroru Mehman Atamoğlanov özü də bu sözümü təsdiq edə bilər! – Əhmədov Mehmana tərəf baxıb:

– Belədir, yox, yoldaş prokuror! – deyə soruşdu.

– Düzdür, gənclər bizə çox böyük yardım göstərirlər, – deyə Mehman təsdiq etdi.

– Yoldaşlar, biz komsomolun müvəffəqiyyətlərini qeyd etməklə, heç bir zaman onun işində olan ciddi nöqsanları da unuda bilmərik! Bu barədə yoldaş Vahidov bizim üç aylıq iş planını nəzərdən keçirəndə, lap pioner işinə qədər bizə göstərişlər verib, özü öz əli ilə yazıbdır! Nöqsanlarımız var, özü də az yox, çox-çox var!.. Ancaq bizim gənclər istəsə, o nöqsanları rəf edər, dağı dağ üstə qoyarlar. – Əhmədov məruzəçinin artıq darıxdığını görüb, birdən öz sözünə tələsik xitam verdi:

– Təvəqqe edirəm mühazirəyə yaxşı-yaxşı qulaq asasınız, – deyə bugünkü yığıncağın işinə girişdi. – Məsələ yeni sovet adamının, daha doğrusu, gənclərimizin mənəvi saflığı haqqındadır! – O, əlini qabaq cərgəyə uzatdı. – Məruzə üçün sözü hüquq fakültəsini bitirmiş prokurora, Mehman Atamoğlanov yoldaşa verirəm, – deyə giriş sözünü bitirdi.

Mehman yeyin addımla səhnəyə çıxdı və xitabət kürsüsünə gəldi. O, qanun-əsasidən başlayaraq sovet vətəndaşlarına verilən böyük hüquqlardan danışdı. Mehman qədim quldarlıq, feodallıq, sonra kapitalizm cəmiyyətlərindəki insan hüquqsuzluğundan xeyli bəhs etdi, o bu cinayətlərdəki dözülməz istismar formalarından, əməkçi insanların ağır güzəranlarından bəhs açdı. Sonra Mehman yeni sovet adamının azad kalam, azad əmək, azad vicdan hüquqlarından, gənclərin, yeni sovet adamının kapitalist cəmiyyətlərinə görə müqayisəedilməz böyük üstünlüklərindən söz açdı... Salon mühazirəçini diqqətlə dinləyir, komsomol katibi özü də hüquqşünası maraqla süzür, onun natiqlik məharətinə heyran qalırdı. Mehman danışıqarası həyatdan misallar gətirir, öz ilk təcrübi işlərində təsadüf etdiyi qanunsuz hərəkətləri göstərirdi:

– Bizim yeni adamlarımız yeni əxlaqla tərbiyə olunmalıdırlar, yoldaşlar, onlar yaltaqlıqdan, qorxaqlıqdan, xəsislikdən, paxıllıqdan, namərdlikdən, ikiüzlülükdən, fitnəkarlıqdan, böhtançılıqdan uzaq olmalıdırlar! – Mehman bu sözlərdən sonra yenə də ötən cəmiyyətlərə qayıdaraq, tarixdə azlığın necə də çoxluğun qanını zəli kimi sormağını göstərirdi. O, Yer kürəsinin altıda bir hissəsində Oktyabr inqilabının böyük bəhrələri nəticəsində istismarın necə ləğv olunduğunu deyirdi. Məruzəçi istehsal qüvvələrinin inkişafını, cəmiyyətin tərəqqisini və gələcəyini qeyd edirdi. Mehman, yaranan və yaranmaqda olan maddi əsaslardan misallar gətirib məruzəsini zənginləşdirməyə çalışırdı:

– Bəli, bizim yeni adamların əxlaqı, daha doğrusu, mənəvi aləmi mütəqabil dostluq, etibar, mərdlik, cəsarət və bu kimi gözəl sifətləri özündə cəm etməlidir! Biz, inkişafımıza maneçilik törədən hər hansı bir adama qarşı, hər hansı köhnə nüfuz və hazırkı mənsəbinə baxmadan mübarizə aparmalı, bu, ya digər şəkildə özünü göstərib qarşıya çıxan müqavimətləri, əngəlləri qırmalıyıq! – Mehman nəzərini salondan çəkib səhnədə, stol arxasında tək əyləşib əlini çənəsinə dayayan, sakitliklə məruzəçini dinləyən Əhmədova tərəf baxıb qeyd etdi. – Bəli, dəhnələri qranit kimi möhkəmlətməli, onları aylar, illər üçün yox, əsrlər və nəsillər üçün etməliyik! – Mehman onu dinləyən beş yüz nəfərlik salona tərəf dönüb inamla davam etdi. – Bunlar hamısı, yoldaşlar, daxili bir saflıq, təmizlik tələb edir!.. Zahiri geyim, zahiri mədəniyyət əgər daxili aləmlə təmiz vicdan, ürəklə bağlı olmazsa, o, sabun köpüyü kimi boş olacaqdır. Bir adamın əxlaq qaydaları onun daxili, zəngin mənəvi aləmi ilə bağlı olmazsa, o, nə qədər təmtəraqlı olsa, yenə də qum üstündə kartondan qurulan bir evciyə bənzəyəcəkdir!..

– Doğrudur, düzdür! – deyə yerdən səslər gəldi, gənclər içində danışıq getdi.

Sədrlik edən Əhmədov sakitlik tələb etdi, məruzəçi davam etdi:

– Bəli, yoldaşlar, ürək təmiz olmazsa, ləkəli olsa, dil nə qədər hərarətli, şirin olsa, yenə də ürək ahəngsiz işləyəcəkdir! Əgər daxili aləmdə bir çürüntü varsa, o özünü mütləq göstərəcəkdir! Bizim hər hansı hünərimiz, bax, elə yaradıcı yeni bir dünya, yeni bir dəhnə, yeni bir aləmdir!.. Bizim qurub-yaradan nəsillərimizin mənəvi aləmi ayna kimi şəffaf olmalıdır!.. Bir adam təsadüfən bir əzasını, deyək, əlini qolunu, hətta gözlərini belə itirsə, yenə də o yaşayıb yarada bilər!.. Əgər bir adam öz ürəyini ləkələr içində itirsə, cismən yaşasa da, mənən yaşayıb yarada bilərmi? – Mehman danışdıqca vaxtilə bu sözləri ona tövsiyə edən ağsaçlı adamların simaları gözünün qarşısında görünürdü. – Bəli, komsomolçu və gənc yoldaşlar, gərək bizim ürəklərimiz həyat eşqi üçün, xariqüladə işlər görmək üçün tükənməz bir cürətlə dolmuş olsun!.. Gərək ürəkdə heç bir ləkəli, kölgəli cəhətlər olmasın!.. Əgər bir ürəyə bir iynə ulduzu qədər balaca bir ləkə düşərsə, o, adamın gözəl sifətlərinə də kölgə salar. Ləkəli bir ürəkdə nə təmiz bir adamla üz-üzə gəlib danışmaq, nə də düşmənlə çarpışmaq üçün bir cürət ola bilər! Heç kəs bilməsə də, oğru hansı bir cürətlə doğruluqdan danışa bilər?..

– Doğrudur, düzdür! – deyə yerlərdən səs yayıldı.

Əhmədov:

– Sakit olun, yoldaşlar! – dedi.

Mehman davam etdi:

– Hə, yoldaşlar, heç kəs bilməsə də, satqın bir ürək hansı bir üzlə sədaqətdən danışa bilər? – Mehman məruzəsinin bu yerini ağır-ağır oxumağa başladı. – Deməli, bizim gəncliyin, bir sözlə, bizim yeni nəslin əxlaq aləmini bir təmizlik təşkil etməlidir! Məncə hər bir yeni adam – gənc nəsil əxlaq məsələsində, bu xüsusiyyətləri nəinki dilində əzbər etməlidir, o, bu yeni keyfiyyətləri, fövqəladə bir saat kimi mütəmadiyən işləyən ürəyində hifz etməlidir!.. Mənim ağsaçlı bir müəlliməm vardı – Məlikə xanım, mən onillik məktəbi qurtaranda mənə demişdi: “Hər hansı sənətə gedirsən get, ancaq ürəyini ləkələmə!” – Mehman son sözləri dediyi zaman pəncərənin laxlayan şüşəsi cingilti ilə yerə düşüb çilik-çilik oldu. Hamı boylandı, salon ağzınacan dolu olduğundan, qapıdan içəri girə bilməyən Qaloşlu adamın başı pəncərədən içəri, xitabət kürsüsünə tərəf uzandı. O, Mehmana şübhəli, istehzalı bir nəzərlə

baxırdı. Onun dodaqları aramsız tərpənirdi: "Qəşəng danışıq?! Təmizlik?! Ləkə!.." Qaloşlu adam bu sözləri pıçıltı ilə söyləyirdi...

Kamilov və Murtuzovun bir az bundan əvvəl Qaloşlu adamla görüşmələri onu gətirib buraya çıxarmışdı. İndi isə Qaloşlu adam dayanmadan hərəkət etməli, atdığı torun dəstəsindən yapışıb onu özünə tərəf çəkməli idi... Mehmanın irəlicə burada, sonra Bakıda müşavirə zamanı keçirdiyi şübhəli həyəcan, anası Xatunun qayğı və iztirabları Mehmanı bir daha şübhə ilə bürüməyə başlayırdı... Qırışıq sifətli Qaloşlu adamın tərpənən dodaqları, hansı bir sirri bu salon qarşısında açmaq istəyirdi?.. – Bəli, Qaloşlu adamın istehzalı baxışları, saymazyana bir əda içində tərpənən qansız dodaqları Mehmanın fikrini dağıdırdı. İndiyə qədər Mehmanın qabağında ikiqat əyilən, yer-yurddan kağız qırıntılarını toplayan bu adam, nə üçün bu gün burada özünü belə naqqal aparır?.. Nə üçün Qaloşlu adam çəkinib utanmır. Üzüsusuz bir həyasızlıqla, döşünə döyən bir uğursuzluqla öz qırışıq burnunu göstərir? "Bəlkə Qaloşlu adam; möhkəm bir düyünü əlinə keçirmişdi?"

Mehmanın fikri dolandı, istər-istəməz onun ilk şübhələri bir daha təsəvvüründə canlandı. Mehmanın gözlərinə həmin aynaya əks salan "sarı saat" sataşdı.

– Yoldaşlar, ağsaçlı müəllimə deyirdi ki...

Sədr məruzəçiyə tərəf baxıb, zınqrovu yuxarı qaldırdı:

– Yoldaşlar, nə oldu, dünya-zad uçmadı ki? Bir göz şüşədir, sındı, sındı, sabah saldırarıq!

O, zəngi çalıb üzünü Mehmana tutdu:

– Buyura bilərsiniz, yoldaş mühazirəçi!..

– Hə, elədir, yoldaş Əhmədov, mən ləkə məsələsindən deyirdim!.. Ləkəni yaxın qoymamaq!.. Ayıq olmaq!.. Hər yerdə, hər zaman ayıq olmaq lazımdır, yoldaş cavanlar!

Mehman əl atıb katibin doldurduğu stəkanı götürdü, son qətrəsinə qədər içdi. O, sözlərini bir yerə yığıb qurtardı. Sədr iclası qapadı. İzdiham danışa-danışa bayıra çıxdı. Mehman kənar kəsmə bir yol aldı.

– Qəşəng danışırdınız, – deyə Qaloşlu adam mühazirəçiyə yanaşdı. – Siz prokuror oğlan, təmizlikdən yaxşı danışırdınız!.. Ancaq belədirmi, dəm vurduğunuz kimidirmi?..

Mehman dirsəyi ilə vurub nə qədər rədd etmək istəsə də, Qaloşlu adam Mehmandan üzülmür, bir addım belə olsun geri qalmırdı:

– Su ilə boğaz yaşlayıb doğruluqdan danışmaq olmaz, – deyə o xırıldayır, girəvəni əlinə keçirən namərd qatil kimi, sanki xəncəri xəncər üstündən saplamaq istəyirdi.

– Əgər biz deyən olmasa, özündən küs!.. Balışa nə olub, cəhənnəmə, gora ki, kluba gedib! Qol götürüb diringi oynamıyaydı?!. Zərrintac da gərək qurtarsın!.. Kamilov üçün topladığın daşı ətəyindən yerə tök! Gərək o Murtuzov deyən kimi hərəkət eləyəsən!.. Yoxsa Züleyxa xanımın qolunda... parıldayan "arı" açılacaq, özün də rüsvayi-cahan olacaqsan!..

## XLIX

Mehman Qaloşlu adamı o qədər də eşitmədən aralandı. Lakin Qaloşlu adamın ağzından çıxan bu qırıq-qırıq sözlərin, kinayəli və istehzalı pıçıltıların müqabilində o özünü ələ ala bilmirdi. Mehmanın ürəyi ömründə birinci dəfə idi ki, belə çapar kimi çapır, ağır-ağır döyünürdü. "Nə üçün bu sözləri eşitməzdən qabaq Qaloşlu adamın başı görünməklə mənim sözlərimin daxili məntiqi elə qırılsın?". Mehman ağır-ağır düşünürdü. O, qurğuşun kimi ağırlaşan ayaqlarını güclə sürüyürdü. Zil qaranlıq, sanki ayrı bir zəhmlə göydən yerə enirdi. "Ağsaçlı müəllimə. Ağsaçlı, balışa dirsəklənmiş xəstə professor... Ağsaçlı, iztirablı, kədərli ana!.. Mehmanın sözlərinə qüvvət verən, onu hörmətlə dinləyən, boynu piyli, başı yağlı Əbdülqədirə qarşı onu müdafiə edən respublika prokuroru!.. Hələ düz on altı gün bundan qabaq rayon partiya komitəsində Vahidovun onu Kamilovdan müdafiə etməyi... Onun məruzəsini böyük maraqla dinləyən beş yüz nəfərə yaxın gəncin qaynar gözləri!". Bütün bunlar bir xəyal sürəti ilə Mehmanın təsəvvüründə canlanır, bir-birini təqib edərək tez-tez ötürdü, Mehmanın nəzərində yeni-yeni qanada qalxan bir şahin yerə gəlirdi. Mehman dönüb buludlu göyə, zil, sal qaranlığa baxırdı. Yuxarıda, qaranlıq içində sanki ağ saçlar ağarır, bu adamların simaları heyrət və təəccüb içində görünürdü... Mehman birdən büzüşüb üşütməyə başladı. O, qılçaları qırılmış kimi taqətsiz dayandı.

– Mən niyə birdən-birə, – deyə Mehman əlini sinəsinə gətirdi. – Axı nə üçün belə oldu? – Sanki onun atlanan ürəyi yerindən qopmaq, hara isə uçmaq istəyirdi. Birdən Mehman qaranlıq içində səndələyib soyuq divara söykəndi. Uca, qarlı dağlardan başlayıb yavaş-yavaş əsən yel Mehmana əsrarlı bir sərinlik gətirdi... Mehman dayanıb qulaq verdi. Ürəyindən bir səs gəlməyə başlayırdı. – Bu nədir?.. Bu çıqqıltı nədir? – Xırdaca saatın əqrəbi ahəstə-ahəstə hərəkət edir, sarı saat sürətlə çıqqıldayırdı... Parıltısı aynaya düşən qızıl saat Mehmanın təsəvvüründə böyüyürdü. Mehman başının ağrısından gözlərini yummaq, bu mənzə-

rəni görməmək istəyirdi... Lakin bu qızıl saat kənarda yox, Mehmanın öz ürəyində çıqqıldayırdı... Elə bil ki, gözlənilmədən ətraf dağlar bir-bir öz yerindən qopub, onun başına tökülürdü:

– Ev xəyanəti!.. Qara bir ləkə!.. Arxadan kürəyə saplanan zəhərli bir xəncər!..

İndi Mehman iclasın sonuna yaxın yaranmış vəziyyətin əsl səbəbini anlayırdı. Balaca, qara bir xal, kiçik bir ləkə düşmüş ürəkdən kinayəli pıçıltılara bürünmüş bir uğursuz səs gəlirdi, – çıq... çıq... çıq... çıq...

– Bu səs nədir? Bu çıqqıltı nə üçün bu qədər də özünü dərinə vermiş, orada özünə bir yuva salmışdır?.. Nə üçün bu çıqqıldayan sarı saat, bir sarı ilan kimi orada qıvrılıb yatmışdır?.. Axı, nə üçün bu ilan öz zəhərli dişlərini belə göstərsin?.. O öz dilini çıxarıb istehza ilə oynatsın, bədheybət, murdar gözləri ilə gülsün? – Mehmanın həyəcanları artır, onun iztirabları dalğa-dalğa çoxalırdı. O, heç bir zaman şəxsən müqəssir olmadığı halda bu işin əzab və ağırlığını keçirir, onun ürəyi üzərinə bir dağ yıxılmış kimi əzilirdi. Demək, Mehmanın bütün cidd-cəhdlərinə baxmayaraq, xain bir əl bu gənc ailədə gəzmiş, Şəhla xanımsa bu fitnəkar əli gizlətmişdir!.. “Axı, bəs Züleyxa? Bəs o məni sevmirmi?.. Nə üçün o açıb hamısını mənə deməsin, bax, o zaman oxunu atıb yayını gizlətsin?!” – Bu vaxt Mehmanın gözlərinə Züleyxanın tərpənən dodaqları üstünə qüvvətli bir əlin gəldiyini, onun ağzını yumub qapamaq istədiyi görünürdü. Bəli, Züleyxa məsələni açmaq istədikdə, Şəhla xanım öz ətli əli ilə qızının ağzını qapamış, bu barədə onu cıqqır çıxarmağa qoymamışdı. Şəhla xanımın bütün ömrü tamahkarlıq içində axıb getdiyi bir zamanda belə bir hadisə onu həyəcana sala bilərdimi? Yox, Şəhla xanıma görə həyat belə olmalı, “yaman gün” üçün gizlin saxlanmalıdır! Çünki Şəhla xanım nə qədər bəzəkli-düzəkli, nəzakətli görünsə də, öz ərinə qarşı daim ikiüzlü hərəkət etmişdi... Şəhla xanım üçün öz ərinin qarşısında düz danışmaq, əyri danışmaqdan çətin olmuşdu. Ötən zamanlarda, bu ailənin bütün gəlirinə, varına, sərvətinə baxmayaraq, Şəhla xanım həmişə öz ərindən xəlvəti hərəkət etmiş, əlinə keçirdiyi pul-paranı, çəkidə yüngül qiymətdə ağır daş-qaşa çevirməklə öz ömür-gününü əyrilikdə keçirmişdi. Əvvəlcə tədrici olaraq başlayan bu hal sonra getdikcə Şəhla xanım üçün bir vərdiş halına gəlmiş, onun məişətinə daxil olan bir mərəzə çevrilib, onun iliyinə tərkedilməz dərəcədə işləmişdi. Şəhla xanım bu barədə öz qızı Züleyxaya açıqdan-açığa təlim verməsə də, istər-istəməz o, bu xasiyyətləri öz qızı Züleyxaya aşılamamış qalmamışdı.

– Nə olsun? – deyə Mehman Bakıya gedən zaman, o, qızını danlamışdı. – Guya ki, böyük bir xata olmuşdur? – deyə Şəhla xanım hikkələnmişdi. – Guya göydən yerə qar yağmışdır?.. Guya ki, kiçik saat böyük od olub, bu qızı yandırmağa başlayıbdır?.. Burada nə böyük bir mətləb var idi, sən ürəyini yeyəsən, özünü də saraldasan?..

– Axı, ana, mən özümə sığışdıra bilmirəm, yuxum göyə çəkilir, – deyə Züleyxa dilləndikdə, Şəhla xanım nəinki onun ağzını bağlamaq, az qala nəfəsini belə kəsmək istəmişdi.

– Əgər mən o zaman özümə bir gün ağlamasaydım, bu gün biz küçələrdə sərgərdan qalardıq... Heç bir zaman hökm deyil ki, ərə gələn gündən hər sözü cütlüyüb kişinin ovcuna qoyasan. – Şəhla xanım əllərini qoşalayıb ölçmüşdü. – Məgər kişi bütün addımlarını sənin arşınınla ölçür ki, sən də ondan heç bir şey gizləməyəsən?.. Hansı kişidir ki, bütün hərəkətlərini olduğu kimi arvadına desin?.. Vaxta ki kişi demir, sən niyə deyəsən? Vaxta ki kişi gizləyir, sən niyə gizləməyəsən?!

– Axı çətindir, ana, gizləmək...

– Çətindir, öyrənərsən!..

– Mən öyrənmək istəmirəm, ana, sən məni bədbəxt eləmə, ana!.. Mən Mehmanın qarşısında hamısını açmaq bu Qaloşlu adamın qoyun cildini cırıb, onun qurd sifətini göstərməklə, öz ürəyimi yüngülləşdirmək istəyirəm!..

– "Öz ürəyimi yüngülləşdirmək istəyirəm", – deyə Şəhla xanım qızının ağzını əyib onun üstünə düşmüşdü.

– Axı, ana, yadındadırmı mən Mehmanı necə dəlicəsinə sevmişəm!..

– Dəlicəsinə sevmisən, ya ağıllıcasına boynuna sarınmısan, bu sözlər mənim beynimə batmır! Ancaq onu deyirəm ki, bəri başdan özünə bir gün ağla, vəssalam!.. Yoxsa bu gündən belə mən öz gizlincimdən sənə bir zərrə də yedirdən deyiləm!

– Ana, mən səndən heç bir quruş istəmirəm!

– Ac qalanda gərək mən sənin dərdini çəkəm! Üstünə gəlməyən bir şeyin üstündən gedər!

– Ana, mən əsla... Ana, mən Mehmanın qarşısında, öz məhəbbətimin qarşısında günahkaram, mən müqəssirəm!..

– "Mən günahkaram, mən müqəssirəm". Kiri, qız, ud getsin!.. Yoxsa özünü rüsvayi-cahan eləmək istəyirsən?.. Baxanda o bu dəvəni sarbanı ilə udur, sən bir quş yumurtası boyda bir sarının əlində aciz-avara qalırsan!

– Ana, mənim üçün çox çətindir, mən Mehmanın üzünə baxa bilmirəm!

– Alışarsan, baxarsan!..

– Ana, axı?.. Axı, məhv olarıq!..

– Heç bir şey də olmaz!.. Sən o sarını bir dərman kimi ud, qurtardı getdi, vəssalam!..

– Axı, Mehman həmişə deyir ki, gərək vicdan təmiz, ürək ləkəsiz olsun, ana!

– Mehman oxuduğu kitablardan beş-üç söz əzbərləyibdir, sabah uşaq-muşaq üstünüzə töküləndə, onlar ağızlarını cücə kimi açıb "mənə yemək ver" deyəndə, bu gen dünyada, bir iynə ulduzu kimi, başınıza daralacaqdır!

– Ana, təmizlik hər şeydən müqəddəsdir, Mehman həmişə belə deyir!..

– Kiri, qız! – deyə Şəhla xanım Züleyxanın üstünə hindtoyuğu kimi qabarmışdı: Yoxsa bu əllərimlə səni həlak edərəm!.. Yoxsa sən bu qərib eldə bizi alabaydaq eləmək istəyirsən?..

– Nəticədən qorxuram, ana! Alabaydaq olmaqdan qorxuram!

– Nəticədə qorxmaq yox, bu bir parça sarını öz gələcək günün üçün ört-basdır eləmək lazımdır. Yoxsa sənin Mehmanın əgər kişi olsa, siz burada iki ilin içində özünüzə iyirmi ilin gününü ağlayarsınız!

– Mehmanın təhsili, biliyi, etibarı, qulluğu bizə bəsdir, ana!

– Bəlkə Mehman lap sabahdan yıxıldı öldü, sonra?.. Onda yəqin Qaloş kimi süpürgəçilik edərsən! – Şəhla xanım bütün bu danışıqlardan sonra qızının üstünə çox bərk çəmkirmiş, saat boyda bir zəhər də olsa onu udmağı, axırıncı dəfə barmaq hədəsi ilə qızına tapşırmışdı. – Yoxsa ayrı cür hamının yaxasını, o cümlədən də öz Mehmanının yaxasını da ələ vermiş olarsan, qız!

Bəli, susmaq, udmaq, boynundan atmaq, – deyə Şəhla xanım öz qızına möhkəm-möhkəm tövsiyə etmiş, Züleyxa onu həzm etməsə də, boğazında saxlamağa məcbur olmuşdu.

Züleyxa bir tərəfdən, öz yaxasını Şəhla xanımın bu dəhşətli təsirindən qurtarmağa çalışsa da, o biri tərəfdən acizlik göstərmişdi. Buna görə də Mehman saat barəsində aydın bir şey bilməsə də, şübhəyə çoxdan düşmüş, Züleyxadan müəyyən dərəcədə soyumuş, bu hal isə Züleyxanı üzməyə başlamışdı. Mehmanın ürəyini gəmirən şübhə artıq onun üçün açılmışdı. Qaloşlu adamın pıçıltılı sözləri Mehmanı qətiliyə çağırırdı. "Udmaqmı, açmaqmı?" Gizləmək, üstünü örtmək, basdırmaq, Mehmanın mənəvi aləmi üçün nə qədər də yad və biganə idi!.. Mehman göz açıb ağlı

kəsdiyi gündən öz təvazökar, sadə ailəsində heç bir şeyi başqa cür, ikiləşmiş görməmişdi. O, hər şeyi olduğu kimi görmüşdü. Ona daim təmizlikdən, sədaqətdən danışılmış, ona yüksək mənəvi təlim verilmiş, belə hisslər onun qanına aşılanmamışdı... İndi Mehman gözlənilmədən bir dolaşığa düşmüş, onun şübhəsi belə bir istənilməz, acı nəticə verməyə başlamışdı. Bəlkə Mehman ciddi ölçülər götürsəydi, Züleyxa heç də belə bir hörümçək toruna düşməzdi?.. Demək, iş və həyat təcrübəsi Mehman üçün azlıq etmiş, o, bu gün xoşlamadığı acı bir hadisə qarşısında dayanmışdı. – "Bəs nə etmək?" – deyə Mehman öz fikrini toplamağa, indi öz beynini ayazıtmağa çalışırdı. – "Bəs, bir prokuror kimi, necə etmək?.. Doğrusunu hərəkət etmək, heç bir tərəddüdə yol vermədən, bir prokuror kimi, düzünə, qanuni ölçü götürmək!" – deyə Mehman həyətə girib, qısa pilləkəni tarap-turupla başa çıxdı, dartıb qapını açdı. Mehmanın avazımış sifətini görən Şəhla xanım özünü irəliyə verib:

– Yəqin yoruldun, oğlum, hə? – deyə Mehmanı dərin bir nəzərlə süzdü, – yoxsa çox incidin!..

Mehman Şəhla xanımın sorğusuna cavab vermədiyindən, dərin həyəcanlar keçirən, pərişan bir hala düşən Züleyxa:

– Məruzən necə keçdi, Mehman? – deyə titrək səslə soruşdu.

– Çox pis keçdi, Züleyxa xanım!

– Niyə pis? – Züleyxa titrək əlini stulun söykənəcəyinə atdı, – niyə sənin məruzən pis olsun?

– Niyəsi də, pisi də budur ki, ləkəli adamlar, heç bir zaman təmizlikdən danışa bilməzlər, Züleyxa xanım!

– Yoxsa o komsomolçular alt-üst vurdular? – deyə Züleyxa öz doğru hisslərinin əleyhinə hərəkət etmək, qorxunc hisslərini özündən uzaqlaşdırmaq istədi. – Elə ona görə də mən də məktəbdə, bu komsomolun qapısını bir kərə də olsun heç açmadım!

– Komsomol elə onda xoşbəxt olubdur!

– Mən də heç bədbəxt olmamışam, – deyə Züleyxa, gözü anasında cürətsiz cavab verdi, Şəhla xanım əsəbiliklə göz basıb, "ud! ud!" işarəsini etdi.

– Saatı haradan almısan? – deyə Mehman birdən Züleyxanın üstünə düşdü. – O saatı, o qızıl saatı!

– Dedim ki, – Züleyxa çəkinən səslə cavab verməyə başladı, – dedim ki, anam gətirmişdir. – Züleyxa dəhşətlər içərisində yenə də yalan deməyə başladı. – Anam özü gətirmişdi dedim!..

– İndi düzünü de, o saatı haradan almısan? Bir zaman Füzulinin eşq divanından gözüyaşlı danışan Züleyxa xanım! – Mehman heybətli bir səslə bağırdı, onun boğazındakı damarlar şişib gömgöy göyərdi. – Saatı haradan almısınız, cənabi Mamayevalar!!.

Şəhla xanım astalıqla stəkanı su ilə doldurub:

– İç, hövsələn yatsın, oğul! – dedi: – Züleyxa bir ilə yaxındır ki, Atamoğlanovadır!..

Mehman dolu stəkanı qapıb bütün gücü ilə divara çırpdı:

– Düzünü de, saatı hapadan almısan, Züleyxa Mamayeva!

Şəhla xanım bu bağırtılı səsin küçəyə çıxmasından çəkinərək:

– Oğul, eyibdir, – deyə pəncərələrin taxtasını içəridən bərk-bərk örtdü. – Mən də axı bir adamam!.. Mədəni adamlar öz evlərində heç bir zaman belə bağırtı salmazlar!..

– Deyin görüm, bu sarı saatı haradan almışsınız, "mədəni adamlar?!"

Şəhla xanım acıq edib o biri otağa keçərək mırıldandı: "Qız oğlan bəyənib?.. Lapçınlı Xatun arvaddan da ancaq belə mərifətdə oğul çıxar?!"

– Saatı sənə kim veribdir, Züleyxa? – prokuror müqəssirdən bütün ciddiyyəti ilə düzünü deməyi tələb edir, onun sifəti kinlə dolurdu. – Düzünü de, ürəyimə soxulan bu saatı!..

– Mehman!

– Aç, əmr edirəm, aç!.. Cinayətkar, xəyanətkar!..

– Mehman, axı...

– Aç, aç, qolunda qıvrılıb yatan sarı ilanı!.. Cinayətkar yastığında xain bir ürəklə yaşamaq, hər hansı ilanlı-əjdahalı uçuruma düşməkdən dəhşətlidir!..

Şəhla xanım o biri otaqda kağız kimi ağardı, Züleyxa yıxılıb özündən getdi. Mehman əyilib saatı Züleyxanın qolundan açınca, Şəhla xanım gəlib çıxdı, bu mənzərə qarşısında o, ömründə birinci dəfə kal və qart səslə:

– Oğul, barı bir həkim! – deyə hönkürüb ağladı. – Barı ana bətnində yenicə çırpınan öz balana rəhmin gəlsin!.. Axı, bu qız səni sevirdi?..

– Axır ki, sən onu uçuruma apardın! – deyə Mehman Züleyxanı yerdə sərili qoyub birbaş evdən çıxdı. – Kürəyimə xəyanətin sarı zəhərli xəncərini saplayan Şəhla xanım Mamayeva!..

Gecənin zil qaranlığında Mehmanın öz evindən hirsli-hikkəli çıxıb getməsi Şəhla xanımın ürəyinə zağlı bir xəncər kimi saplandı. Qızı Züleyxanın boşalan qollarını ovdu, onu birtəhərlə özünə gətirdi. O, Züleyxaya bir piyalə su içirdib ayağa qaldırdı, kürsüdə əyləşdirdi. Züleyxanın

sifətində bir damcı da qan qalmamışdı. Qızının düşdüyü vəziyyətdən, bu işin son rüsvayçılığından xofa düşən Şəhla xanım öz paltarını toqqalı çamadanlarına tələm-tələsik yığdı, sonra da qızının geyim-kecimini onun öz çamadanlarına doldurdu. Hamısını birbəbir sürütləyib qapı ağzına düzdü.

– Gedək, xanım, gedək! – Şəhla xanım dönüb qızının yoğun biləyindən yapışdı. – Ayağı lapçınlı Xatuna gəlin olmaqdansa, sən qaragünlüyə dilənçi olmaq min pay yaxşıdır!

– Mən gedə bilməyəcəyəm! – deyə Züleyxa tir-tir titrədi, bir daha yıxılıb yerə sərilməmək üçün kürsüdən ikiəlli tutdu. – Mən heç zaman, heç yana getməyəcəyəm!

– Demək, qorxursan?.. Qorxursan ki, Xatunun oğlu əmr edib, fərman yaza, səni tüfəng-tapançalı milisionerlə geriyə, qanun qabağına qaytardı?!

– İndi mən daha Mehmandan qorxmuram!

– Onda sən bu böyük dünya üzündə bəs nədən, kimdən qorxursan, ay lapçınlı Xatunun nazəndə gəlini?

– Yalandan!?.. Yalan söyləməkdən, yalan danışmaqdan!

Şəhla xanım qızının çiyinlərindən yapışıb, onu var gücü ilə dartışdırdı. Züleyxa qırraşıb yerində qaldı.

– Mən müqəssirəm, küll-kainat qarşısında müqəssirəm! – deyə Züleyxa birdən özü ayağa qalxdı, burada duruş gətirə bilmədən yan mətbəxə keçdi, qapını çəkib sürütməsini sürdü, özünü qırmızıpipik Şəhla xanımın cəngindən xilas etmək istədi. – Mən, ancaq mən günahkaram! Mən, ancaq mən müqəssirəm! Mən, ancaq mən yalançıyam!..

Şəhla xanım boş otağın içində gic-gic gicəlləndi, dönüb dövrəsinə dolandı. O, nə qızından əl çəkmək, nə də qalıb burada sabahı açmaq istəyirdi.

– Gedək bu evdən, bu xarabadan! – deyə Şəhla xanım bağlı qapını hər iki əli ilə yumruqladı: – gedək, qoy Mehman olsun, bir də anası, lapçınlı Xatun!

– Mən heç zaman, heç yana yollanmayacağam! – deyə Züleyxa anasına bağladığı, qırraşıb asıla qaldığı qapı arxasından cavab verdi: – Mən heç bir yana getməyəcəyəm.

– Mehman da səni məsuliyyətə alacaqdır, qız!

– Alsa da məsuliyyətə, almasa da, mən düz birbaşa ancaq onun məhkəməsinə gedəcəyəm! – Züleyxa boğula-boğula əlavə etdi: – Gözətlədiyimiz övladı da mən ancaq Mehmanın əllərinə tapşıracağam!

– Uşağı özümüz saxlarıq, – deyə Şəhla xanım qapını dartışdırıb çəmkirdi. – İtdən küçük tutmuş olsaq da, yazıq körpəyə özümüz göz olarıq!

– Özümüz göz ola bilmərik, Şəhla xanım!

– Onda sənin lapçınlı Xatunun göz olar, eləmi?

– Xatun körpəyə yaxşı göz olar! – deyə qapıdan sallaşa qalan Züleyxa hıçqırdı: – Xatun öz oğlu Mehmanın balasına yaxşı göz olar!

– Mən də göz olub görürəm ki, sən bu görməmişlərə elə bitişmisən ki, heç pəhləvan da qapını açıb səni qopara bilməz! – Qıpqırmızı qızaran, sönməz qəzəblə dolan, sifəti get-gedə qapqara qan ləkələri ilə xaldarlanan Şəhla xanım dönüb çamadanlarından yapışdı. – Bir qız olmasın, yüz qız olsun, – dedi, – əbəsdən əbəsə dul oturub kefimin lələsinə korluq çəkdirmişəm!

O, pilləkəni tarap-turupla düşdü, qaranlığı yara-yara yeridi.

## L

Mehman arxasına baxmadan prokurorluğa tərəf addımladı. Qaloşlu adam lampa işıqları altında Mehmanı bir kölgə kimi təqib etdi... Mehman Qaloşlu adama etina etmədən idarəyə çatdı, cibini əlləşdirib açarı çıxartdı, kassanı açdı, balaca sarı saatı qulağına gətirib onu dinlədi, sonra qaytarıb kassanın bir küncünə atdı, qapını çırpıb bağladı:

– Ləkə! – deyə o hikkələnib, məsum bir uşaq kimi, yavaş-yavaş doluxsundu, sonra birdən boğuq-boğuq içində ağladı. – Düzdür, ana, dediyin düz çıxdı, Şəhla xanımın xəmrəsi ayrı cür yoğrulmuşdur... İndi bəs bu rüsvayçılıq ləkəsini necə silmək?.. Bütün bu ağsaçlı adamlara, tay-tuşlara, bütün bu müqəddəs qanunlara hansı üzlə, necə cavab vermək? – Mehmanı ağır kədər bürüdü, sükut içində, sorğu qarşısında dayanan müttəhim kimi, o sakit dayanıb qulaq verdi. Yenə də həmin saat asta-asta çıqqıldayırdı. “Bu harada çıqqıldayır?.. Bu kassadan gərək bir səs çıxmasın?.. Bəs bu səs haradan gəlir?.. Nə üçün bu səs susmur?” – Mehman döyüş meydanına qədəm qoyub, müqəddəs amal uğrunda cürətlə çarpışdığı halda sanki onun kürəyinə sarı zəhər suyuna çəkilmiş bir iti xəncər saplanmışdı. Mehmanın vücudu getdikcə düşündükcə ağrı içində gizildəyir, öz namərd ailəsi tərəfindən oxlandığını görürdü, – “Axı, mən ilk dəfə şübhəyə düşdüyüm andan, niyə də dərinə getmədim?..” “Saatı anam gətirib, mən zarafat edirdim”, – deyə Züleyxanın sözünə niyə inandım?

– “Bəs bizdə sat azmıdır, oğul? Mən özüm qız üçün gətirmişdim...” – Bəs indi kim gətirib, Şəhla xanım?.. Nə üçün axır mən bütün işdə, hər yerdə dərindən-dərinə getdiyim halda, burada dərinə getməmişəm?.. Nə üçün mən yarımkönül bir ailə toruna düşdüm?.. Kimlə, hansı qızla həyatımı qurmaq, hansı ailə ilə bağlanmaq, nə qədər də mürəkkəb imiş! Mən Kamilovla vuruşub Zərrintac Sərrafzadə əleyhinə cinayət işi qaldırdığım halda, gör hələ özüm nə qədər dolaşığa düşmüşəm?.. Ax, namərd Züleyxa!.. Ax, satqın fitrətli Şəhla xanım!.. Şəhla xanım!.. “Barı ana bətnində yenicə çırpınan balana rəhmin gəlsin!”

Yerə sərilmiş Züleyxa ölü sifəti almış, onun bətnində balaca bir vücud səyriməyə başlamışdı. Mehmanın fikri sürətlə dolanır, bir vəziyyətdən başqa bir vəziyyətə düşürdü. Bəlkə, hava çatmadığından, o heç bir şeydən xəbərsiz vücud çırpınır? Bəlkə, o balaca xilqət qara qıvrımsaçlı bir oğlan, yaxud gülbənizli bir qızdır?.. O özü bilmədən nənəsinin tamah dünyası torunda can çəkişdirir? Bir an əvvəl Mehmanın quruyan gözlərində yenidən bir cüt yaş gilələndi... O, anası Xatunun iztirab və həyəcanlarını indi əsl mənasında duymağa başlayırdı... Mehmanın qəlbində doğan övlad məhəbbəti bir qığılcım kimi orada şöləl期ənib yanır, Züleyxaya qarşı olan kin içində öz şüasını boğurdu. – “Ata, bəs mənim təqsirim nədir? – deyə sanki çırpınan körpə dilə gəlirdi. – Gərək sən, necə də olsa, insanlıq naminə, Züleyxaya kömək edəydin!.. Çünki o kömək məni də dardan qurtarardı!.. Özün də bilirdin, mən necə bir dardayam!.. Bax, mənim aldanmış, tora düşmüş bədbəxt anam gör necə yerə sərilmişdir?” Mehman, bax, gör Züleyxa həm özünü, həm də məni bir dara salmışdır”. – Mehmanın qara qıvrım saçları bir-bir dikəlib açıldı, sakit, batıq səslə üzüyuxarı qabardı, burada, sapa bənzər çox nazik ağ liflər göründü. Sanki Mehman cinayət toru içində ağır dəqiqələr keçirən, ana bətnində çırpınan körpəni görür, belə sorğunun içəridən doğub gəldiyini eşidirdi... Cinayət səsi ilə övlad məhəbbətinin mehriban, sarsıdıcı iniltisi bir-birinə qarışırdı... – Bəli, təmiz vicdan! – Mehman yeni dən düşmüş başını kədərli halda yırğalayırdı. – Vicdanı saf saxlamaq, dəhşətli ləkələrdən onu qorumaq gərək! – deyirdi. – İndi bəs nə etmək?.. Əl-qolunu yanına salıb mat-məəttəl dayanmaqmı?.. Bu fitnəkar qurğulara təslim olmaqmı?.. Ya tərpənib hərəkət etməkmi?.. Bu cinayət torlarını açmaq, həyat mübarizəsinin ilk müqəddiməsini yazıb başa çatdırmaqmı? Necə də kör-köhnəlik əl atıb yenilikdən yapışır, ölü diridən qopmaq istəmir?.. Bəs belə olduqda nə etmək? – Mehman əzablar içində əzilir, dərindən nəfəs alır, otaqboyu gəzinirdi.

– Çıxış yolu bəs haradadır? – deyə yenə özlüyündə təkrar edib, birdən o, dik dayandı, xeyli sükutdan sonra: – qanuni hərəkət! – deyə cavab verib addımladı. – Nə özünü, nə də başqasını gizlətmədən qanunun qüdsiyyəti ilə rəftar etmək!.. Bəs o çırpınan körpəyə bir sədəmə toxunarsa, onun qatili kimdir? Köhnə, xəbis dünyanın tamahkar qalığı, Şəhla xanım, sən!.. Qoy olsun, mən bütün bu işi təfsildən yuxarıya yazaram, qoy respublika prokuroru özü aydın bilsin!.. – Mehmanın təzə dən düşmüş qara, qıvrım saçlarında ağ liflər daha açıqca görünməyə başlayırdı... – Sabah rəqiblərin qısa dili uzanacaq, vəzifədən kənar edilmiş, yerində yeni sədr Cabbarzadə əyləşmiş olsa da, yenə də öz ayaqlarını sürüyüb hələ də buradan getməyən, "dişinə qılınc götürən" Kamilov, teleqramı teleqrama calayacaq, bütün aləmi küyləkələklə, tufanla-boranla dolduracaq, çıqqıldayan sarı saat bəlkə də əlbəəl gəzəcək, bir maddi-sübut kimi, pambığa bükülüb kağıza sarınacaq, işlə bərabər hərəkət edəcəkdir!.. – İllər uzunu Mehmanın bəslədiyi arzuları sanki qəfil bir şaxtaya düşür, solğun çiçəklər kimi, boynunu bükürdü...

– Bəs nə etmək? – Mehman özünü ələ almaq üçün eşidilə biləcək dərəcədə yenə də özünə aydın bir sual verdi:

– Özünü itirmədən, qanunun qüdsiyyəti ilə hərəkət etmək! – O özözündən belə aydın cavab aldı. – Bir prokuror kimi, qanun gücü ilə istintaqa başlamaq! Hər şeyi aydın etmək, hər şeyi dərindən-dərinə araşdırmaq!.. Mehman qapıya yanaşıb, bir neçə dəqiqə əvvəl Kamilovun yanından gəlib, özünü yan otağa dürtən müstəntiqi səslədi:

– Murtuzov!..

– Bəli, yoldaş prokuror! – O, səksəkəli cavab verdi. – Bəli, mən buradayam!..

– Məmmədxanın işini buraya gətirin!

Murtuzov qalınlaşmış iş qovluqlarını qucaqlayıb tələm-tələsik gətirdi, onları stolun üstünə tökdü. Sonra o özünü toxtadıb, heç bir qurğuya əl atmamış kimi, Mehmanın qabağında dayanıb gözlərini matmat döydü.

– Əyləşin, Murtuz Murtuzov!..

Murtuzov əyləşdi, Mehman özü hiss etmədən yenə də pərişanlığa gedib, əllərini yavaş-yavaş gətirib qoynuna qoydu:

– Bu qətl işi haraya gedir, Murtuzov?

– Məmmədxanın işinimi buyurursunuz?

– Bəli, qətl işi, Balışın qan işi!..

Murtuz Murtuzov qaşlarını ədabazlıqla dartıb, çox ağır zəhmətlər çəkdiyini öz qəribə hərəkətləri ilə göstərməyə çalışıb:

– Düzü, bütün istintaqın gedişi göstərir ki, – deyə o, təfsili bir izahata girişdi, – yazıq Məmmədxanı nahaq yerə ləkələmək istəyirlər. – Murtuzov əlini qaldırıb üst-üstə qalaqlanmış qalın qovluqların üstünə qoydu. – Görünür, bu Balış qız lap avaranın biri, bəd əmələ vərdiş edənin əvvəlincisi imiş!.. Bəli, bu qadın görür ki, nəhayət, küll-aləm içində rüsvay olacaq, cəmiyyətin məzəmmətindən qorxub özü özünə qəsd edir, yəni şəxsən intihar edir. – Murtuzov sərbəstcəsinə danışaraq əlini qovluğa çırpdı, öz-özündən razı bir sifət aldı, sanki Mehmanın belə düyünə düşüb dolaşmağından yana, onun içi də gülməyə başlayırdı:

– Bəli, ərz etmək istəyirəm ki, bu çox mürəkkəb məsələ idi... yoldaş prokuror, – Murtuzov öz seyrək qaşlarını dartdı. – Bəli, xoşbəxtlikdən ümumi ədalət naminə, bu iş çox qəribə də açıldı... Başın üçün, yoldaş prokuror, bu həyat təcrübəsi çox böyük bir kəşf imiş! – Murtuzov, prokurorun düyününü daha öz əlinə keçirmiş kimi, gözlənmədən özünü şax tutdu, vacib bir adam kimi sağ əlini daz başına aparıb irəliyə-geriyə gəzdirdi. – Bu neçə ilin içində biz də bir şey əxz edib, bir şey qazanmışıq, – Murtuzov çox yuxarıdan üzüaşağı baxıb çopur burnunu qovluğa tərəf salladı. – Düşürsən istintaqın izinə, baxırsan ki, elə dolaşıb, lap balıq toru kimi... Min düyün bir düyünə calanıb... Çalışırsan, çapalayırsan, adamları dara qısnayırsan, baxırsan ki, hərəsi balıq kimi bir yana şütüyüb quyruğunu əldən çıxarır... Burada da təzədən min-min düyün vurulur. – Murtuzov gənc adamın hələ də içəridə vurnuxduğunu hiss edir, işi udmuş, sürtük portfelli bir vəkil, yaxud əfsanəyə qapılmış bir əyyaş kimi özündən sökməyə, danışıqlarını bir macəraya çevirməyə başlayırdı.

– Belə, belə ki, baxırsan ki, bu düyün, o düyünə calandı, göz işlədikcə bütün aləm düyünlə doldu... Çirməyirsən yavaşca öz qolunu, götürürsən cırıldayan, gödəkquyruq qələmi, başlayırsan axtarışa bu düyünlərə düşmüş həqiqəti!.. Axtarırsan sağa, axtarırsan sola, bəzən bir il gecəli-gündüzlü əlində fənər qaranlıq dalğaları dolanırsan, dalğalardan-dalğalara, köpüklərdən-köpüklərə keçirsən, axırda ağlagəlməz bir yerdə, bəzən də çox dayaz bir məkanda kələfin ucunu əlinə keçirirsən, başlayırsan yavaş-yavaş çözələməyə... Nəhayət, keçirirsən düyünləri ələ!.. Elə ki yoldaş prokuror, bax, bəri başdan bir düyün açılır, baxırsan ki, o biri başdan düyünlər açılmağa başlayır, hər bir şey də güzgü kimi görünür. – Murtuzov danışıb qızışdığından, öz sözləri özünə xoş gəldiyindən,

bir də fürsəti ələ keçirmişkən Mehmanın üstünə kəkələnmək xəyalına düşdüyündən söylənir, dayanmaq bilmirdi. Mehman da öz daxili aləmi ilə məşğul olduğundan, Murtuzovu dayandırmadı. Kim bilir, bəlkə də bu sözlərin çoxunu Mehman eşitmir, sözlər də, gərəksiz qarğalar kimi, qarıldaya-qarıldaya uçub, kim bilir hansı yana gedirdi? Murtuzov isə ağzından dürr tökülür kimi şişir, öz dərisinə sığmaq bilmirdi. Yaxud bəlkə də Murtuzov artıq, Mehmanı öz ovuclarında hesab edib, öz olmayan şənindən dəm vurmaq, Kamilov kimi, öz gücünü yoxlamaq istəyirdi. Murtuzov danışdıqca yan-yörəyə baxır, lampa işığı altında haldan-hala düşən, saralan, ağaran, bəzən qaralıb-qızaran adamı görürdü. Mehmanın bu ana qədər olan yüksək qüruru hara, indiki üzü üstə gəlmək istəyən ağır vəziyyəti hara?. Murtuzov səpilən fəsad toxumunun cücərdiyini, sürətlə yetişib bəhrə verdiyini güman edirdi. Lakin Mehman keçirdiyi dalğalı vəziyyət içində necə məğlubiyyətə uğramağı deyil, bu çətin vəziyyətin içindən necə dikəlib qalib gəlmək yollarını hələ də yaxşı-yaxşı axtarırdı. Mehman dolaşmaq deyil, bu qurğulardan çıxmaq istəyirdi. Mehman bu həyəcanlar içində səbirlə hərəkət etməyi, "meydan son gülənindir", deyə axır nəticədə öz rəqiblərini özünə güldürməməyi də unutmurdu. Murtuzov isə şüşə cingiltisindən bu ana qədər özünü kefi kök, damağı çağ aparır, böyük bir məclisdə, beş yüz nəfərlik bir salonda, Mehmanın axırıncı dəfə sındığını, onun yıxıldığını, bir də nə qədər əllərini yerə dayasa da, qalxa bilməyəcəyini güman edirdi... Bəlkə buna görə də Murtuzov qabiliyyət məstliyi keçirir, sözünə haqq-hesab vermir, köpüklü-köpüklü sözləri söküb tökürdü. – Bəli, yoldaş Mehman, elə ki bərk-bərk tutursan müqəssirin boğazından, deyirsən tərpənmə, balıq kimi dartıb atırsan qırağa, qumun üstünə, o başlayır öz quyruğunu oynadıb atılıb düşməyə, özün də belə üzbəüz oturub ona baxırsan, nəfəsini dərib dincəlirsən. – Murtuzov Mehmanı da balıq kimi tutub qəm üstə atdığını zənn edərək, içini çəkə-çəkə güldü. – Mən özüm uşaqlıqda torçulara qoşulub çaylara balığa gedərdim. Bu təcrübədən də bilirəm ki, müqəssirin ki boğazından tutub beləcə atdın quma, qurtardı getdi!.. O nə qədər çapalasa da, axırda sənin qabağında ölü düşəcəkdir... Çünki balıq sudan quma düşübdür, hə, bəli, sən baxıb-baxıb doyunca nəfəs alırsan, o gün şadlığın yerə-göyə sığmır... Niyə?.. Çünki torçu kimi, balıq yox, həqiqəti tapmısan, özü də şax, lap bəbəyinin içinə deyirsən!.. Düzü, bu barədə siz hələ çox-çox uşaqsınız, həqiqətdən dəm vurmaq başqa, həqiqəti belə, bax, bu qaydada tapmaq bir başqadır!.. Həqiqət

üzdə olsaydı, onda daha niyə ona həqiqət deyərdilər? – Murtuzov məzəliliklə irişdi. – Bu dünyada həqiqət var, ancaq ərz etdiyim o dalğalarda, bax, belənçik düyünlərdədir... Bax, öz gözünün qabağında cinayət eləyir, döşünə döyür ki, mən həqiqətəm!.. Gəl indi sən bu həqiqət cildinə girmiş cinayətkarı çıxart! – Murtuzov pərişanlıqdan xilas ola bilməyən Mehmanı istehza ilə süzüb güldü. – Bəli, kişi evində oturduğu yerdə bir də görürsən ki, bir vicdansızın böhtanına düşür! Düşür böhtana, başdan-ayağa olur bir ləkə! Gəl indi sən bir qəvvas ol, bu dəryaya baş vur, buradan həmin həqiqət gövhərini tap, çıxart!.. Bilirsiniz, bu zaman adam nə qədər darıxır?.. Doğrudan da, adam belə cinayətkara baxdıqca cini vurub düz kəlləsinə çıxır!.. İndi bizim işimiz belədir, istintaq işi həqiqət axtaran işdir! – Murtuzovun kinayəli hərəkətlərini artıq-açıqca müşahidə edən Mehman, bu təlxək kimi görünən adamın nə qədər dişi qarnında olduğunu görür, bu eybəcərin ürəyində gizlənən pis niyyətləri sezirdi. Demək, Murtuz Murtuzovda iki xasiyyət vardı: Vaxtına qədər təlxəklik, vaxtından sonra qəddarlıq! Murtuzov ləngərini əlindən buraxmır, bu və o biri cəhətini unutmurdu. Bütün bu gediş içində Mehman daxilən öz yaxasını çıqqıldayan saatdan qurtarmağa çalışır, Murtuzovun sifətindəki bu hərəkətləri daha olduğu kimi izləyirdi. Murtuzov isə Qaloşlu adamın köməyi ilə Mehmanı çıxılmaz tora saldıqlarını, guya həqiqəti tapdığına görə öz döşünə döyür, Mehmanın pərişanlığının əsl səbəbini bilərək, özünü nağıllarda olan dəmir dəbilqəli, iri toppuzlu bir pəhləvan kimi görmək istəyirdi.

– Bilirsiniz, həmin bu işdə mən deyən həmin bu düyünlərdən heç də az-azacıq deyildir!.. – Murtuzov, müqabil tərəfin susduğunu, atmacalarının bir ox kimi hədəfi tutduğunu yəqin edərək, yenə dolayı yolla eyni mətləbə qayıdır, buradan uzaqlaşmağı lazım bilmirdi. O, şövqə gəlirdi. – Mən desəm bir min düyün, siz deyin iki min, bəlkə də çox! Bəli, qatdım toppuzun qabağına açdım bütün düyünləri!.. Siz nəzəriyyəni bəlkə də belə atüstü keçmisiniz, bir də, axı nəzəriyyə yazıq da öz kitabının hansı qırağını bu düyünlərlə doldursun?!. Amma bu təcrübə ki var, çox qəribə bir şeydir, bax, təcrübə hər bir şeyi, tozsuz bir güzgü kimi, göz qabağında əl içi kimi apaydın göstərir! Əyrini əyri, düzü düz! – Murtuzov əlini döşünə gətirib daz başını qaldırdı. – Mən bu neçə ildə başımın tüklərini, məhz bu rəvayətlərdə tökmüşəm! – Murtuzov şadlıq hissinə nə qədər qapılmış olsa da, birdən dərindən göz qoyub gördü ki, bu cavan oğlan daha artıq saralıb-solmaqdan çox, özünü toxtadır, nə isə

qəti bir hücum etmək halına düşür, qabaqkı sifətini alır... Mehman sarsıdıcı bir zərbə üçün hazırlaşır. Belə olduğu halda Murtuzov ağacın iki başını görürdü. "Birdən belə olmadı, elə oldu?" – Belə bir sual içəridən baş qaldırırdı. Murtuzov ehtiyat üçün sapma-supmaya getmək, göz yayındırıb döngə vermək qərarına gəldi. Birdən bir göz qırpımında onun şadlığı güclü küləyə rast olan zəif bir toz kimi silindi. "Birdən bu iti xəncər biz tərəfə çevrilsə?" – deyə onun gözləri böyüməyə başladı. Yox, yox, bir az əvvəl qızışıb özündən çıxan, Mehmanı "toppuz qabağına qatan" pəhləvan gerilədi, toppuzu əlindən yerə düşdü. Murtuzov addımını geriyə qoyaraq, ehtiyatı əldən buraxmamaq üçün, Mehmana yaranmağa, hər hansı ehtiyata qarşı özünü xırdalayıb kiçiltməyə başladı.
– "İstintaq insan müqəddəratıdır" – siz demisiniz, mən də öz dəftərimə yazıb altından cızıq çəkmişəm. Mən, elə bayaqdan bəriyə bunları demək, sizə ərz etmək istəyirdim!.. Bu nəzəriyyə işində, bu neçə ay içərisində mən sizdən də heç az şey əxz etməmişəm. – Bilmirəm, yoldaş prokuror, heç bir fikir vermisinizmi?.. Hə, mən sizin məruzənizi ac adam kimi uduram... Bu axşamkı məruzə də mənə ləzzət verdi... Heyif ki, axırına yaxın gəldim... Elə o zaman ki, şüşə zəhrimar cingildəyib işi korladı.
– Murtuzov işarə ilə yenə də Mehmanın yayını əlləmək, onu kölgəli tərəfə sürmək üçün yenə cəhd etdi. – Ancaq, görünür, qabaqca məruzənin əvvəli daha yaxşı imiş... Odur, fikir dağılanda baxırsan ki, gözlənilmədən işin içindən, süd içindən milçək çıxan kimi, küçə ilə gedəndə də bir şüşə cingildəyib yuxarıdan, beşmərtəbədən adamın başına düşür, çilik-çilik olur!.. Baxırsan ki, deyib-gülən bir adam, bir göz qırpımında, əbədən torpaqda qalır... Mən özüm küləkli gündə şəhərdə belə cingilti ilə sınan şüşə görmüşəm. – Murtuzov Mehmanın bir qətiyyət topladığını görərək məzəlilik edib, onun qılığına girmək, kəndirini isə ayrı cür içəridən çeynəmək istəyirdi. – Hə, bəli, – deyə o quruyan dodaqlarını marçıldatdı, qırışıq sifəti ilə hiyləgərcəsinə irişdi. – Bu keçən yayda, hələ az qala bir yekəsi də cingildəyib düşmüşdü Əbdülqədirin başına!.. O da mənim kimi dazdır. Amma yayın burnu görünməmiş o ağ paltar geyinib başını açar, mənsə heç zaman küçədə başımı açmaram, lap yayın qora bişirəni də ola!.. Niyə?.. Çünki məndə saç-birçək yoxdur. Elə bir şüşə düşdü, necə deyər:

"Keçəlin hindi başı,
O tayda dava düşdü.
Bu tayda sındı başı".

– Olsun, bəli!.. – Murtuzov bu dəfə daha aciz bir yaltaqlıqla hırıldadı: – baxırsan ki, sən gözləmirsən, ancaq yuxarıdan fələkdən nagahani bir şüşə gəlib sənin başında cingildəyir!.. Bu zaman dili dinc durmaz adam da pıç-pıç başlayır, niyə bəs şüşə belə cingildədi?! Sən sayırsan belə, fələk qət eləyir elə!

“Axşam hökm edən sərdar başı, sabah təpiklər altına düşür...”

– Mən sizdən sərdar başı yox, bu istintaqı soruşuram, – deyə Mehman özünü dönməz, axırıncı və qəti sarsıdıcı zərbə endirmək üçün toplaşdırdı, – çərən-pərən yox, “it gəldi çarıq apardı” yox!..

– Mən misal üçün deyirəm, prokuror!

– Uzunçuluq, təlxəklik, nağılbazlıq yox!.. – deyə Mehman əlavə etdi: – Suala cavab! Aydındırmı? Bu istintaqın gedişindən danışın, nala-mıxa vurmaq yox, Balışın qətlini söyləyin!..

– Mən də elə bu istintaqdan, bu Balış barəsindən təfsilən danışmaq istəyirdim. – Murtuzov Mehmanın bərk əsəbiləşdiyini görüb vahimə içində öz ayağının altını bərkitməyə, lakin daxilən üşütməyə başladı. – Bu istintaq çox çətin, çox mürəkkəb bir yol ilə getmişdir, – dedi. – Əgər hər özünü intihar edən, özü ilə bir nəfəri də bu dünyadan dartıb o dünyaya aparsa, heç daha adam qalmaz! – Murtuzov qalın qovluğun birini götürüb əli əsə-əsə yellədi. – İş çox qəribə açılır, vərəq-vərəq!.. İntihar edən qadın özü müqəssir çıxır... Heyif ki, burada qanun gücsüzdür... Niyə? Çünki ölən haqqında heç bir cəza hökmü çıxarmaq mümkün deyil!..

– Biz hökm çıxarırıq, – deyə Mehman qovluqları özünə tərəf çəkdi, – biz cinayətkarı tapıb, hər hansı intriqa, qurğulara, sənin kimi oyunbaz təlxəkliyə əl atmış olsa belə, onu qanunun müqəddəsliyilə rüsvay edəcəyik!

– Bəlkə bunlar lap təzə nəzəriyyədir? – Murtuzov qeyri-müəyyən vəziyyətdə kəkələdi. – Düzü, adam yenilikdən də geri qalmaq istəmir!.. Maddəsi nədir görəsən, bəndi hansıdır?

– Maddəsi də, bəndi də tor qurmaq yox, işi düzünə açmaqdır, Murtuz Murtuzov!

– Əlbəttə, tor qurmaq yox, işin düzünü açmaq!.. Yoxsa bu neçə il ərzində yola düşən prokurorlar kimi mən də getmişdim?! Əlbəttə, tor yox, düzünə!.. Ancaq hər şeyi dildə yox, həqiqətdə! O qalınlıqda işə gələndə, bir zərrə qədər də şübhə yeri yoxdur, ancaq...

– Başdan-ayağa şübhə olan yerdə daha onu axtarmağa ehtiyac varmı? – Mehman artıq geriyə baxmadan hərəkət etmək, əlinə qılınc götürüb hər

hansı yaranı, lap öz vücudunda baş vermiş olsa belə kəsmək, götürüb tullamaq istəyirdi. Düzlük, ədalət naminə onu intiqama çağırır, nahaq yerə qurban gedən Balış sanki dikəlib Mehmana baxırdı.

Mehman əlini əsəbiliklə yumruqlayıb qovluqlara vurdu və ayağa qalxdı.

– Min fırıldağa əl atıb, yüz cildə girsəniz də, bu iş sizin ittiham aktınız olacaqdır! Sizin hiylənizin qurbanı Balışın qanı yerdə qalmayacaqdır! Uzun illər boyu etdiyiniz cinayətlərin ağır daşlarını biz sizin öz boynunuzdan asacağıq!..

Birdən Murtuzovun boynu əyildi:

– Böyük yoldaş qabağında boynum qıldan da nazikdir!

– Cani əyilməklə də öz canını qurtara bilməz!..

Murtuzov boynunu düzəltməyə çalışsa da, sanki ağır daşların döşündən sallandığını hiss etdi. O, istintaq apardığı gecələrdə də sanki Balış gəlib qapıda dayanır, boynunu bükür, Murtuzova baxırdı... Lakin Murtuzov onu Məmmədxanın qiymətli xalıları müqabilində rədd edir, bu xalılar üçün iştahası tük aparan Yavərin ürəyini sındırmaq istəmirdi... Daha doğrusu, çiçək kimi açan xalılar, heç yuxuda da Murtuzovun gözləri qabağından çəkilib getmirdi... Murtuzov kor-kobud xalıları divardan düşürüb ayaq altına atır, həmin bəzəkli xalıları divara vurur. Balış nə qədər astanada dayanıb baxsa da, Murtuzov, kefi çatlamış kimi, fıştırıq çalırdı... İndi o, bütün qurğularının, tər tökə-tökə oradan-buradan sorğu edib, düzəldib yandıqlarının uçub getdiyini, öz boğazının balıq kimi ələ keçdiyini, sudan çıxardılıb qum üstə atıldığını görüb, açıq naqqallığa keçməyə girişdi.

– Mən də hamısını güzgü kimi apaydın açaram! – deyə Murtuzovun sifəti eybəcər şəkildə əyilirdi. – Səsim dolusu bağırıb deyərəm: “ay el, ya oba, buraya gəlin!..”

Mehmanla Murtuzovun danışığına qapı arasından qulaq verən Qaloşlu adam bir addım geri çəkilib:

– Daha Murtuzovu heç Araz da apara bilməz! – dedi. Yenə qapıya yanaşıb, qulağını buraya yapışdırdı. Murtuzov isə qorxu içində Mehmana tərəf qabardı.

– Məni boğmaq olmaz, Muradoğlu!..

– Sən öz cinayətlərinin burulğanında boğulacaqsan! – deyə Mehman onun üstünə qabarıb qışqırdı. – Siz hamınız qazdığınız quyuya düşəcəksiniz!

– Baxarıq! – deyə Murtuzov ayağa durub, saralmış halda qapıdan çıxmaq istərkən Mehman onu əyləndirib:

– Siz uzağa getməyəcəksiniz, – dedi, – Murtuz Murtuzov!

– Mən sabahdan ala-qaranlıqdan, kəndlərə çıxmalıyam!..

– Bu andan heç bir istintaq sizə etibar edilmir!

Son məğlubiyyətini görən, güclü çaya düşmüş saman çöpü kimi axdığını təsəvvürünə gətirən Murtuzov haray salıb bağırdı:

– Mən sizin qulunuz deyiləm!.. Mən bu dərələrdə, o dağlarda cinayət toru açanda, yəqin ki, siz divardan tuta-tuta gəzirdiniz!.. Boğazınıza xalta vurub, "hüquq elmi" deyib gözlərimizə kül üfürməyin, bizi kor eləməyin!

– Sizin "torçu" dəstənizin məhkəməsində özüm ittihamçı olacağam!

– Baxarıq, kim-kimin məhkəməsində ittihamçı olacaq, – deyə Murtuzov ağzı əyilə-əyilə cavab verdi: – Görək hansı torçu müttəhim kürsüsündə boynuburuq əyləşəcəkdir?

– Baxarıq!..

– Mən də heç sizin kül-külfətdən az şey bilmirəm, baxarıq! Bu düyünlər açılanda, "sarı" üzə çıxanda baxarıq, tor qurmaq nədir, ya düyün salmaq nə?..

– Boğulanlar saman çöpündən yapışırlar!.. – deyə Mehman ayağa durub Murtuzovu yan otağa saldı. – Qanunun bütün gücü ilə mən sizə əmr edirəm!

O biri qapı arxasında dayanan Qaloşlu adamın dizləri titrədi, onun kirli ayaqları üstüörtülü, köhnə burunlu qaloşdan çıxmaq istədi.

Murtuzov Kamilovun evinə zəng etmək məqsədilə telefona baxdı.

– Heç yana, heç bir zəng vura bilməzsiniz, vətəndaş Murtuz Murtuzov! Mən sizin də məsələnizi respublika prokurorluğunda qanun üzrə həll etmişəm!

Murtuzov udquna-udquna:

– Respublika prokurorluğu qızıl saatın yerini bilirmi? – dedi. – Axı, birtərəfli iş ki olmaz?!

– O saat ağzıbirə salınmışdır. – Mehman qayıdıb kassanın qapısını açdı, saatı çıxarıb ara qapını ona göstərdi. – Təmiz vicdanı heç bir "sarı" ləkələyə bilməz!

Mehman təkrar dönüb bu saatı, gərəksiz bir qoz kimi, kassanın küncünə atdı. Mehman oturub beş yüz vərəqdən ibarət qovluqları araşdırıb oxumağa, qeydlər götürməyə başladı. Mehman bu qayda ilə bu zil qa-

ranlıq gecəni evinə dönmədi. Sabaha yaxın o yorğun düşüb, işləri stol üstündə sərili qoyub, divan üstündə mürgülədi. Dan yeri sökülüb gün çıxdı, yavaş-yavaş üfüqdən üzüyuxarı qalxdı. Bütün gecəni ayaq üstə girlənən Qaloşlu adam əvvəlcə idarə həyətinə tökülən kağız qırıntılarını topladı, sonra da ora-buranı süpürdü. Günəş pəncərədən içəri doldu, yuxuya getmiş Mehmanın həyəcanlı sifəti işıqlandı. Qaloşlu adam qapını açıb içəri girdi. Mehman qalxıb divanda oturdu, gözlərini ovdu. İndi Mehman ötən axşamkı qırışıq sifətli adama ayrı bir gözlə baxdı. Qaloşlu adamın əyri-üyrü kölgəsi eybəcər bir ləkə kimi yerə nəqş olunurdu. Mehman onunla bir kəlmə kəsmədən ayağa qalxdı, əsəbi əllə zəng edib milis rəisi Cabirovun evini aldı:

– Bir milis nəfəri göndərmənizi xahiş edirəm!

– Nə var sabah-sabah, yoldaş prokuror? – deyə rəisin kal səsi gəldi. – Mən də elə sabaha yaxın telefon qulağımda çarpayıda mürgüləmişəm!

– Bir milis nəfəri!

Mehman öz sözlərini təkrar etdi. Qaloşlu adam tərpənmək istərkən prokuror əlini qaldırdı:

– Siz dayanın!..

– Külfətlə bağlı olan bir sirri açmaq, özünü dibsiz bir dənizə atmaqdır, oğlan! – deyə Qaloşlu adam üzə gəldi.

– Lap ümmana atmaq olsa da!..

Mehman oturub qəti imkan tədbiri yazmağa başladı, bir qədərdən döşü atlanmış milis nəfəri gəlib çıxdı:

– Naçalnikin əmrinə görə gəlmişəm!

Mehman öz hökmünə imza etdi.

– Bu vətəndaşı həbsə!

– Kimi? – deyə milis nəfəri, öz gözlərinə inanmırmış kimi, ətrafa boylanıb heyrətlə soruşdu. Mehman Qaloşlu adamı şəhadət barmağı ilə göstərib:

– Bu cinayətkarı! – dedi.

– Ağır otur, batman gəl, oğul!..

– Aparın məhbusu! – Mehmanın cingiltili səsi ucaldı. – Allah da olsa bizim qanunun müqəddəsliyi qabağında diz çökməlidir, lap belə bir şeytan da!..

Qaloşlu adam xüsusi bir zəhm almış prokurora baxdı, onun tərpənən dodağı qurudu.

Lakin o, bir cinayət mücəssəməsi kimi, yerə bitişib buradan tərpənmək istəmədi:

– Oğlan, ağlını başına topla, bir gör ki, məhkəmə qabağında sənin kimlərin dayanacaqdır?

– Artıq-əskik yox!.. Hər bir kəs müqəssirsə, öz cəzasını alacaqdır!

Milis nəfəri Mehmanın tələbkar baxışları qabağında əlini böyründəki silahına aparıb:

– Birbaş həbsə! – deyə Qaloşlu adamı bayıra itələdi.

Qaloşlu adam çiyni üstündən Mehmana tərs-tərs baxıb lappır ayaqlarını sürüyə-sürüyə qapıdan çıxdı.

Günəş bu adamın izi ilə onun ləkəsini sanki döşəmədən təmizləyir, əyri-üyrü kölgəsi sanki yerdən silinirdi. Mehman onun ardınca baxıb stolun arxasına keçdi:

– Bu hələ mürəkkəb mübarizə kitabının müqəddiməsidir, – deyə fikir içində qələmini işə saldı. – Bizim böyük qanunun bu sabah günəşi kimi parlayan qüdsiyyətinə and içirəm ki... – O nəfəsini dərindən dərdi, – hər kim olsa da, mənim barmaqlarım titrəməyəcəkdir!.. Doğruya zaval olmadığı kimi, əyriyə də aman olmayacaqdır!..

*1944*

**SÜLEYMAN RƏHİMOV**

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

**İKİ CİLDDƏ**

**II CİLD**

"ŞƏRQ-QƏRB"

BAKI-2005

| | |
|---|---|
| Buraxılışa məsul: | *Əziz Güləliyev* |
| Texniki redaktor: | *Rövşən Ağayev* |
| Tərtibatçı-rəssam: | *Nərgiz Əliyeva* |
| Kompyuter səhifələyicisi: | *Ələkbər Kərimov* |
| Korrektor: | *Ceyran Abbasova* |

Yığılmağa verilmişdir 13.10.2004. Çapa imzalanmışdır 14.04.2005.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 19,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 78.

Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.